1) bərq vurmaq, parıldamaq, şəfəq saçmaq; 2) tel vurmaq, teleqrafla xəbər vermək, teleqram göndərmək

- أَبْرَقُ [1] q. بَرْقَاءُ c. بُرْقٌ əbləq, ala (*at rəngi*), ala-bəzək, ala-bula, alaca

- أَبْرَقُ [2] c. أَبَارِقُ dərə-təpəli yer, təpə

- إِبْرِيقٌ *bax: əlifba sırası ilə*

- بَارِقَةٌ 1) qara bulud; 2) *məcaz.* işıltı, parıltı, işartı, işıq; الرجاء ~ *yaxud* الامل ~ ümid işığı, ümid işartısı; برقت له الـ~ ona bir ümid yeri göründü

- بَارُوقٌ *bax: əlifba sırası ilə*

- بُرَاقٌ 1) الـ~ a) ağlama divarı (*Qüds şəhərində*); Buraq (*Məhəmməd peyğəmbər Məkkədən Qüdsə Buraq adlı əfsanəvi heyvanın belində isra etmişdir*); 2) *tibb.* nevralgiya

- بَرَّاقٌ parlaq, parıltılı; işıqlı, gözqamaşdırıcı, çox gözəl

- بَرْقٌ c. بُرُوقٌ 1) ildırım, şimşək; بسرعة الـ~ ildırım sürətilə, ildırım kimi; الـ~ الخلّب boş gurultusu olan ildırım, yağışdan xəbər verməyən ildırım; *məcaz.* ondan yaxşı bir şey gözləmə!; الـ~ المغيث yağışdan xəbər verən ildırım; 2) bəzək-düzək; parıltılı şeylər; bafta; 3) teleqraf; ~ سلكى simli teleqraf; ~ لا سلكى *yaxud* ~ غير سلكى simsiz teleqraf; بالـ~ teleqrafla

- بَرْقَاوِيٌّ Kirenaika sakini

- بَرْقِيٌّ teleqraf -i/-ı; رسالة ~ـة *yaxud* اشارة ~ـة teleqram

- بَرْقِيَّةٌ c. ـات – teleqram, təcili məlumat

- بَرِيقٌ parıltı, parlaqlıq, işıltı

- مَبْرَقٌ c. مَبَارِقُ çıxma, qalxma, doğma, doğuş; الفجر ~ şəfəqin doğması

- مُبْرِقٌ teleqrafçı

- مُبْرِقَةٌ teleqraf cihazı

بَرْقَشَ rəngləmək, bəzəmək; rəngbərəng, ala-bəzək etmək

- بَرَاقِشُ Bəraqiş (*zərbi-məsəl olmuş itin adı*); على اهلها جنت ~ *yaxud* على اهلها دلت ~ *zərbi-məsəl.* başına iş açmaq (*hərf. Bəraqiş öz adamlarına qarşı cinayət işlətdi və ya Bəraqiş öz adamlarının yerini göstərdi*)

- بِرْقِشٌ c. بَرَاقِشُ yalançı bülbül, alacaqanad; *həmç.* ابو براقش alacəhrə

- بَرْقَشَةٌ rəngləmə; bəzəmə; alabəzəklik

- مُبَرْقَشٌ rəngarəng, ala-bəzək

بَرْقَعَ üzünü örtmək (*örtüklə*); تَبَرْقَعَ örtülmək (*örtüklə*); انه هو هو و لو ~ بألف برقع *At.sözü.* min örtüyə bürünsə də, özüdür ki, var

- بُرْقُعٌ c. بَرَاقِعُ 1) çadra, örtük; 2) pərdə; الجنين ~ ana qarnındakı uşağın köynəyi, dölün örtüyü

- بُرْقُوعٌ c. بَرَاقِيعُ = بُرْقُعٌ

بَرْقُوقٌ *topl.* gavalı

- بَرْقُوقَةٌ c. ـات – gavalı

I بَرَكَ (u) بُرُوكٌ diz çökmək, yerə çökmək (*dəvə haqqında*); II بَرَّكَ 1) diz çökdürmək, yerə çökdürmək (*dəvəni*); 2) بارك الله فيك sözlərini demək; bərəkəllah demək, *bax:* بارك; 3) gölməçə əmələ gətirmək (*su barədə*); III بَارَكَ 1) xeyir-dua vermək (*kimə*), xeyir-bərəkət diləmək (*kimə* لـ, على, فى); الله فيك ~ Allah səni mübarək qılsın; Allah sənə xeyir-bərəkət versin!; *məch.* بورك فيك Allah versin! (*dilənçiyə pul vermək istəməyəndə deyilən söz*); 2) təbrik etmək (*kimi* لـ); IV أَبْرَكَ diz üstə çökdürmək (*dəvəni*); V تَبَرَّكَ 1) təbərrük almaq (*nə vasitəsilə* بـ); 2) xeyir-dua diləmək; VI تَبَارَكَ xeyir-dua, xeyir-bərəkət almaq (*kimdən* بـ); X إِسْتَبْرَكَ 1) diz üstə çökdürməyə çalışmaq (*dəvəni*); 2) xeyir-dua almağa çalışmaq; 3) səadət axtarmaq



- بَارُوكَةٌ sikkə, (*xeyir-bərəkət gətirən*) bir şey

- بَرَّاكَةٌ c. ـات – barak

- بَرَكَةٌ c. ـات – 1) xeyir-dua; 2) bərəkət; Allahın bərəkəti; على بركة الله Allah naminə; قلة الـ~ bərəkətsizlik; uğursuzluq; حلت الـ~ sizi görməyimizə şadıq!; الحركة بركة *məsəl.* hərəkət bərəkət gətirər; səndən hərəkət – məndən bərəkət; حبة الـ~ *bot.* qarazirə, qaraçörəkotu

- بِرْكَةٌ c. بِرَكٌ 1) gölməçə; nohur; 2) göl; su hövzəsi

- تَبَرُّكٌ təbərrük, xeyir-dua diləmə; حفلة الـ~ xeyir-dua diləmə mərasimi (*yola çıxmazdan qabaq*)

- تَبْرِيكٌ c. ـات – xeyir-düa arzulama, bərəkət diləmə; təbrik etmə

- مُبَارَكٌ mübarək, bərəkətli qılınmış

- مُبَارَكَةٌ 1) xeyir-dua arzulama; mübarəklik diləmə; təbrik etmə; 2) xeyir-dua; mübarəklik; نظم هذا الامر بـ~ـه o bu işi filankəsin xeyir-duası ilə görmüşdür

- مَبْرُوكٌ 1. mübarək qılınmış; çiçəklənən; bol, firavan; !~ mübarəkdir! (*yeni bir şey barəsində*); 2. *xüsusi ad. k.* Məbruk

بِرْكَارٌ pərgar

بِرْكَالٌ perkal (*pambıq parça*)

بُرْكَانٌ c. بَرَاكِينُ vulkan; ~ ثائر püskürən vulkan; ~ خامد sönmüş vulkan; مقذوفات الـ~ *yaxud* مقذوف الـ~ vulkan püskürməsinin tullantıları; فوهة الـ~ krater

- بُرْكَانِيٌّ vulkanik; النشاط الـ~ vulkanik fəaliyyət; مقذوفات ~ـة vulkan püskürməsinin tullantıları, lava

بَرْكِيَّةٌ parket

بَرْلَمَانٌ c. ـات – parlament

- بَرْلَمَانِيٌّ parlamaent -i/-ı

- بَرْلَمَانِيَّةٌ parlamentarizm

بِرِلْيُومٌ *kim.* berillium

I بَرَمَ (u) بَرْمٌ (برم) 1) burmaq, eşmək, əyirmək; hörmək; 2) təsdiq etmək; icazə vermək; 3) hərlənmək, fırlanmaq, dolanmaq; بَرِمَ (ə) بَرَمٌ 1) narahat olmaq, həyəcanlanmaq; 2) narazı qalmaq; dilxor olmaq; pərt, məyus olmaq; ovqatı təlx olmaq (*nədən* بـ); 3) ikrah etmək (*nədən* من); IV أَبْرَمَ 1) eşmək, əyirmək; 2) qəti qərara gəlmək; təsdiq etmək; 3) bağlamaq (*saziş, müahidə*); 4) bezikdirmək; usandırmaq, təngə gətirmək; V تَبَرَّمَ 1) narahat olmaq, həyəcanlanmaq; 2) narazı olmaq; pərt, məyus olmaq (*nədən* من); üzülmək, sıxılmaq (*nədən* بـ); 3) bəla çəkmək, dərd-qəm çəkmək; ehtiyac çəkmək; VII إِنْبَرَمَ 1) burulmaq, eşilmək, hörülmək; 2) təsdiq edilmək

- إِبْرَامٌ 1) əymə, eşmə; 2) bağlama (*saziş, müahidə*); 3) təsdiq etmə; icazə vermə; ratifikasiya; قرارات الـ~ ratifikasiya fərmanları محكمة النقض والـ~ kassasiasiya məhkəməsi

- بَرْمٌ 1) əymə, eşmə; 2) təsdiq, təsdiq etmə; ratifikasiya

- بَرَمٌ pərtlik, məyusluq, narazılıq; بـ~ narazılıqla

- بَرِمٌ məyus, narazı, pərt

- بَرْمَانِيٌّ *bax:* بَرٌّ

- بَرْمَةٌ c. بَرَمَاتٌ burum, bir burum; dövrə, dairə

- بُرْمَةٌ c. بُرَمٌ ، بِرَامٌ 1) qazan; güvəc; 2) مسمار ~ vint, burma mismar

– بَرِيمٌ qaytan; bağ; ip

– بَرِيمَةٌ c. بَرِيمَاتٌ , بَرَارِيمُ 1) tıxacaçan; 2) burğu, matqab; 3) bur, burov, qazma maşını العملاقة ~الـ nəhəng burov

– تَبَرُّمٌ 1) narahatlıq, həyəcan; 2) narazılıq, pərtlik, məyusluq

– مُبْرَمٌ 1) qəti qərara alınmış; dönməz; danılmaz; قضى عليه قضاء ~ـا bir şeyi qəti ləğv etmək; 2) ratifikasiya edilmiş, təsdiq edilmiş

– مِبْرَمٌ c. مَبَارِمُ iy, mil, ox

– مَبْرُومٌ 1) eşilmiş, hörülmüş; burulmuş; 2) dairəvi, girdə

– مَبْرُومَةٌ c. مَبَارِيمُ burma bilərzik, qolbağı

بَرْمَجَ planlaşdırmaq; proqramlaşdırmaq

– بَرْمَجَةٌ planlaşdırma; proqramlaşdırma; لجنة للدولة ~الـ dövlət planlaşdırma komitəsi

– مُبَرْمَجٌ planlaşdırılmış, plana daxil edilmiş; plan -i/-ı; planlı; غير مبرمج planlaşdırılmamış, qeyri-planlı; الاقتصاد ~الـ planlı təsərrüfat; بشكل ~ planlı şəkildə

بَرْمَقٌ c. بَرَامِقُ sürahı; 2) mil, barmaq (*təkərin*)

بَرْمَكِيٌّ c. بَرَامِكَةٌ 1) *tar.* Bərməki; 2) qaraçı

بَرَمْهَاتُ bərəmhat (*qibti təqviminin 7-ci ayı*)

بَرَمُودَةُ bərmudə (*qibti təqviminin 8-ci ayı*)

بِرْمِيلٌ c. بَرَامِيلُ 1) çəllək; بارود ~ barıt çəlləyi; ضلع الـ~ çəllək taxtası; طوق الـ~ çənbər, qurşaq; الفارغ يرن ~الـ *məsəl.* boş çəllək səs çıxardar; 2) barrel

– بَرَامِيلِيٌّ c. بَرَامِيلِيَّةٌ *yaxud* بَرَامِيلْجِيٌّ c. بَرَامِيلْجِيَّةٌ çəlləkçi

بُرُنْجُكٌ krep (*parça*)

بُرُنْزٌ tunc

– بُرُنْزِيٌّ 1) tunc; tuncdan qayrılmış; 2) tunc rəngində, tunc rəngli

بُرْنُسٌ c. بَرَانِسُ burnus, başlığı olan plaş; الحمام ~ hamam xələti

بِرِنْسٌ c. ـات – prins

– بِرِنْسِيسٌ , بِرِنْسِيسَةٌ c. بِرِنْسِيسَاتٌ prinses

بَرْنَطَ , تَبَرْنَطَ şlyapa qoymaq, şlyapa geymək

– بُرْنَيْطَةٌ c. بَرَانِيطُ şlyapa; ləçək; اللمبة ~ abajur

– بَرَانِيطِيٌّ şlyapaçı, şlyapatikən, şlyapa ustası

– مُبَرْنَطٌ başına şlyapa qoyan, şlyapalı

بَرْنُوفٌ *bot.* birəçiçəyi

بَرْنِيقٌ hippopotam, kərgədan

بَرْنِيَّةٌ c. بَرَانِيُّ gil qab, küvəc

بِرَهْمَا Brəhma

– بَرَهْمَنٌ c. بَرَاهِمَةٌ brəhmən

– بَرَهْمِيٌّ , بَرَهْمِيٌّ , بِرَهْمِيٌّ = بَرَهْمَنٌ

– بَرَهْمِيَّةٌ , بِرَهْمِيَّةٌ brəhmənizm, brəhmənçilik

بَرْهَنَ sübuta yetirmək, isbat etmək (*nəyi* على); dəlil gətirmək; تَبَرْهَنَ sübuta yetirilmək, isbat edilmək

– بُرْهَانٌ c. بَرَاهِينُ dəlil, sübut; əsas; dəstavüz

– بَرْهَنَةٌ sübuta yetirmə; dəlilgətirmə; əsaslandırma

– مُبَرْهَنٌ: عليه ~ sübuta yetirilmiş, isbat edilmiş

بُرْهَةٌ c. بُرْهَاتٌ , بُرَهٌ an; ləhzə; qırpım; göz qırpımı; برهة من الزمان bir an içində; في كل~ istənilən anda



بِرُوتُوبْلَازْمْ protoplazma

بِرُوتُوكُول c. ـات – protokol

– بِرُوتُوكُولِيٌّ protokol -i/-ı

بُرُوتُونٌ , بِرُوتُونٌ c. ـات – proton; مُتَعَادِلٌ ~ neytron

بِرُجْرَامٌ proqram

بُرُوجِيٌّ c. بُرُوجِيَّةٌ şeypurçu, şeypurçalan

بَرْوَزَ çərçivəyə salmaq, çərçivələmək

– بِرْوَازٌ c. بَرَاوِزُ , بَرَاوِيزُ çərçivə

– بَرْوَزَةٌ çərçivələmə

بِرُوسِيَانِيٌّ prus

بِرُوش c. ـات – yaxa sancağı

بِرُوجْرَامٌ = بِرُوغْرَامٌ

بَرُوفَةٌ c. ـات – 1) sınaq, yoxlama, təcrübədən keçirmə; geyib ölçmə; 2) korrektura; صحح بروفات korrekturanı düzəltmə; 3) məşq (*məs., pyesin*)

بِرُولِيتَارِيَّةٌ , بِرُولِتَارِيَا proletariat

– بِرُولِتَارِيٌّ 1. proletar; 2. proletar -i/-ı

بُرُومٌ , بِرُومٌ *kim.* brom

– بِرُومِيدٌ bromid

بَارُومِتْرٌ c. ـات – barometr

– بُرُونْزٌ , بِرُونْزٌ tunc

– بُرُونْزِيٌّ , بِرُنْزِيٌّ 1) tunc (*sif.*); 2) tunc rəngində

– بَرْوَةٌ c. بَرَوَاتٌ qalıq; الصابون ~ sabun qırığı

بُرُوَّةٌ burun (*gəminin*)

I بَرَى (i) بَرْيٌ 1) itiləmək, yonmaq, çərtmək (*karandaşı*); 2) üzmək, taqətdən salmaq; yormaq; 3) sıyırmaq, sürtmək, sürtüb yara etmək (*ayağı*); III [illegible] 1) yarışmaq

(*kimə* ضد); VII إِنْبَرَى 1) qarşı çıxmaq (*kimə* لـ); 2) başlamaq; 3) itilənmək, çərtilmək, ucundan nazikləşdirilmək

– بَرَّاءَةٌ c. ـات – 1) cib bıçağı; 2) karandaşyonan

– بَرَّايَةٌ = بَرَّاءَةٌ

– بَرًى 1) torpaq; 2) toz

– بَرْيٌ 1) itiləmə, yonma, çərtmə; 2) *geol.* abraziya

– بَرِيَّةٌ *bax:* برا

– بَرِيَّةٌ = بَرٌ

– مُبَارَاةٌ c. مُبَارَيَاتٌ 1) yarış, müsabiqə; المُبَارِيَاتُ النِّهَائِيَّةُ final yarışları; الـ~ علي كأس... ...kuboku uğrunda yarış; الشطرنج ~ şahmat turniri; 2) təqlid

– مِبْرَاةٌ c. مَبَارٍ cib bıçağı

– مَبْرِيٌّ itilənmiş, yonulmuş, çərtilmiş

بِرِي بِرِي *tibb.* beri-beri

بَرِيتُونٌ periton; الـ~ إلتهاب *tibb.* peritonit, qarın boşluğu divarlarını örtən seroz qişanın iltihabı

بِرِيطَانِيٌّ 1. Britaniya -i/-ı; 2. britaniyalı

بَرِيتُونٌ = بَرِيطُونٌ

بِرِيلِيُومٌ *kim.* berillium

بَرِيمُوس c. ـات – primus

بَرِيُومٌ *kim.* barium

I بَزَّ (ə/u) بَزٌّ 1) almaq, əlindən almaq, oğurlamaq; 2) üstün gəlmək (*kimə* على), qalib gəlmək, məğlub etmək, ötmək, geridə buraxmaq (*kimi* على); VIII اِبْتَزَّ almaq, əlindən almaq; oğurlamaq; aldadıb almaq

– بَزّ c. بِزَاز 1) döş (*qadın döşü*); ~ ولد علي südəmər körpə; 2) yelin, əmcək; 3) budaq

– بَزَّاز bəzzaz, arşınmalçı, parça satan tacir

– بَزَّازَة c. ات - əmzik

– بِزَّة c. بِزَّات 1) paltar, geyim; رسميّة ~ rəsmi geyim; العمل ~ iş paltarı; 2) qiyafə, görkəm; boy-buxun, əndam

– مُبَزَّز düyünlü, düyün-düyün

بَزْبُوز c. بَزَابِيز 1) burun (*çaydanın*); 2) çıxış dəliyi; kran

I بَزَر (i, u) بَزْر səpmək; II بَزَّر toxum vermək (*bitki haqqında*)

– أَبَازِير c. ədviyat, xuruş

– بَزَّار toxumsatan, toxum alverçisi

– بِزْر *topl.* c. بُزُور toxum; الكتّان ~ kətan toxumu; قَطُونا ~ *bot.* bağayarpağı; أَبْزَار c. ədviyat, xuruş

– بَزَّارَة çoxdoğan qadın

– بِزْرَة c. بِزْرَات toxum, tum; الثمرة ~ toxum, dən, dənə; القطن ~ pambıq toxumu

– بُزَيْرَة c. ات – *bot.* spor, büzeyrə (*bəzi bitkilərdə cinsiyyətsiz çoxalma orqanı*)

بَزْرَمِيط düdəmə, mələz, qatışıq, hibrid

I بَزَغ (u) بُزُوغ doğmaq, çıxmaq, görünmək (*günəş, ay*)

– بُزُوغ doğma, doğuş, çıxma, qalxma (*günəşin, ayın*)

I بَزَق (u) بَزْق tüpürmək; II بَزَّق tez-tez tüpürmək

– بُزَاق 1) tüpürük, çırt; 2) tüpürcək, ağız suyu

– بَزَّاقَة c. ات – tüpürcəkqabı; 2) ilbiz; mollyusk; 3) Misir kobrası

– بَزْق tüpürmə

– بَزْقَة c. بَزَقَات tüpürük, çırt, tüpürcək

– مِبْزَقَة , مَبْزَقَة c. مَبَازِق tüpürcəkqabı

I بَزَل (u) بَزْل dəlik açmaq, dəlmək, deşmək; الزجاجة ~ şüşənin ağzını açmaq; البرميل ~ çəlləyin tıxacını açmaq

– بُزَال 1) dəlik, deşik, yırtıq; 2) ağız (*çəlləyin*)

– بَزَّال tıxacaçan, burğu

– بَزْل *tibb.* suyun çəkilməsi

– بَزْلَة = بِسِلّة

– مِبْزَل c. مَبَازِل 1) *tibb.* troakar; 2) kran

بِزْمُوت *kim.* vismut

أَبْزَى *q.* بَزْوَاء toyuqsinə

بَزِيّ süd qardaşı

إِبْزِيمٌ = بِزِيمٌ

بَسّ , بَسَّة c. بِسَاس pişik

– بِسْ pişt!

– بَسّ *xalq dil.* yetər!, bəsdir!, kifayətdir!

بَسَارِيَة xırda şey, xırda balıq; qurd-quş

بَسْبَاس *bot.* cır havuc; şüyüt (*Məğrib*)

بَسْبُوسَة busbusə (*buğda unu, şəkər və yağla bişirilmiş şirin yemək*)

بَسْتَر pasterizə etmək

بُسْتَان c. بَسَاتِين bostan, bağ

– بُسْتَانِيّ bağban, bostançı

– بُسْتَنَة bağçılıq; bostançılıq

بِسْتَك bifşteks

بِسْتَم c. بَسَاتِم *tex.* porşen

بِسْتُون , بِسْتِن c. بَسَاتِن porşen, piston

بَسْتُونِيّ *kart.* qaratoxmaq

بَسْتِيلِيَة şirinçörək, kökə; yastı həb, tablet

I بَسَر (بسر) [1] (u) بَسْر (*nəyisə*) vaxtından əvvəl etmək, danışmaq; بَسَر [2] (u) بُسُور qaşqabağını tökmək, sımsırığını sallamaq, üz-gözünü turşutmaq; tərs-tərs baxmaq; VIII اِبْتَسَر 1) (*nəyisə*) vaxtından əvvəl etmək, danışmaq; 2) vaxtsız olmaq, vaxtından qabaq olmaq; 3) *məch.* qaşqabaqlı olmaq

– بَاسِر qaşqabaqlı; acıqlı, hirsli



– بَاسُور c. بَوَاسِير babasil; şiş; ur, fır, törəmə

– بَاسُور = بَاسُور

– بُسْر *topl.* c. بِسَار kal, dəyməmiş, yetişməmiş xurma

– بُسْرَة c. بُسُرَات kal xurma dənəsi

– مُبْتَسِر : الاسارير ~ qaşqabaqlı

– مُبْتَسَر 1) vaxtsız, vaxtından qabaq; فمن ... أن ~الـ ... indi vaxtı deyil; 2) kal, dəyməmiş, yetişməmiş

I بَسَط (بسط) (u) بَسْط 1) sərmək; döşəmək, açmaq (*qəzeti*); 2) yaymaq; 3) açmaq; ذراعه ~ qolunu uzatmaq; المساعدة يد له ~ kiməsə kömək əlini uzatmaq; 4) təmizləmək; düzəltmək, hamarlamaq; 5) uzatmaq, uzun-uzadı danışmaq; izah etmək, aydınlaşdırmaq; 6) sevindirmək, ləzzət vermək; 7) uzadıb-yığmaq, döymək, cəzalandırmaq; 8) döymək (*dəmiri*); 9) üstünlük vermək (*kimə-nəyə təsirlik halda, kiminlənə iləsə müqayisədə* على); يده ~ əlini açmaq; يده في الانفاق ~ gen-bol, qənaət etmədən xərcləmək, bədxərclik etmək; نفسه ~ əylənmək, fikrini dağıtmaq; المائدة ~ süfrə salmaq, süfrə açmaq; بَسُط (u) بَسَاطَة sadə, asan olmaq; II بَسَّط 1) sadələşdirmək, asanlaşdırmaq; sadə dildə şərh etmək; 2) yaymaq; hamarlamaq; III بَاسَط 1) sadə rəftar etmək; 2) əyləndirmək, məşğul etmək, vaxtını keçirtmək; V تَبَسَّط 1) genişlənmək, yayılmaq; 2) dərinə getmək (*nədəsə* في); الكلام في ~ başı söhbətə qarışmaq; 3) sadə rəftar etmək (*kiminlə* ـل); VII اِنْبَسَط 1) uzanmaq, yayılmaq, sərilmək, döşənmək; 2) genişlənmək, artmaq; 3) sevinmək; məmnun olmaq; 4) açılmaq; düzəldilmək (*məs., əl*)

– إِنْبِسَاط 1) genişlənmə; القلب ~ *tibb.* diastola; التمدد و ~الـ قابلية gərilmə qabiliyyəti; müxtəlif cür mənalandırılma qabiliyyəti; 2) sevinc; razılıq, məmnunluq; xoş əhval-ruhiyyə

– بِسَاط c. بُسُط , أَبْسِطَة palaz, xalça; الرحمة ~ rəhmət örtüyü; الريح ~ *folk.* uçan xalça; البحث ~ على (وضع) طَرَح *məcaz.* müzakirəyə təqdim etmək, müzakirəyə çıxarmaq

– بَسَاطَة sadəlik; sadəlövhlük; ~ في bəsit, sadə; sadəcə

– بَسْط 1) uzun-uzadı izah etmə; 2) döşəmə, yayma, sərmə; 3) döşənəcək; 4) əyləndirmə, şənləndirmə; sevinc; məmnunluq; 5) *riyaz.* surət; 6) bəst (*çətənə toxumundan hazırlanan narkotik maddə*); اليد بسط əliaçıqlıq; قلم ~ qələm

– بَسْطَة 1) genişlik, uzun-uzadılıq, müfəssəllik; ~بـ تكلم uzun-uzadı, ətraflı danışmaq; 2) həcm; 3) bolluq, çoxluq; 4) *həmç.* الكف ~ firavanlıq; zənginlik; من ~ في حيي العيش و يسر eninə-boluna yaşamaq, firavan yaşamaq; 5) səki, kandar (*qapının qabağında*); 6) bəstə (*un, süd, yumurta və şəkərdən hazırlanan pirojna*); 7) müfəssəl (*ətraflı*) təsvir (*nəyin* عن)

– بَسْطِيّ bəstəçi, narkotik alverçisi

– بَسِيط c. بُسَطَاء , بُسُط 1. 1) sadə, bəsit; 2) sərilmiş, döşənmiş; 3) sadə, sadəlövh; 4) mötədil (*ödəniş haqqında*); اليدين ~ əliaçıq, səxavətli; 2. bəsit (*əruz vəznində şer ölçüsü*)

– بَسِيطَة c. بَسَائِط *q.* بَسِيط - dən 1. ~الـ torpaq, aləm; العلم بسائط elmin bəsit məsələləri

– تَبْسِيط bəsitləşdirmə; hamı üçün anlaşıqlı dildə izah etmə

– إِنْبِسَاط bax: *əlifba sırası ilə*

– مُبَاسَطَة (*kiminləsə*) çəkinmədən, sıxılmadan rəftar etmək;

– مُبَسَّط sadələşdirilmiş; hamı üçün anlaşıqlı şəkildə şərh edilmiş

– مَبْسُوط 1) genişləndirilmiş, geniş, uzunuzadı; 2) məmnun, razı; 3) firavan

– مُنْبَسَط *c.* ات – genişlik, açıqlıq; geniş meydan

– مُنْبَسِط döşənmiş, sərilmiş; sərili; 2) yastı, düz; 3) məmnun, xoş əhval-ruhiyyəli; 4) kefli

بَسْطَرُ alebastr, kəc, kirəc

بَسْطَرْمَة basdırma

بَسْطِيلَة bəstilə (*un, toyuq əti, badam, şəkər, yağdan hazırlanmış yemək*)

I بَسَقَ (u) بُسُوق 1) uca, hündür olmaq; yüksəlmək (*nəyə qədər* إلى); qalxmaq; 2) üstün gəlmək (*kimə* على); II بَسَّقَ yüksəyə qaldırmaq (*nəyi*)

– بَاسِق *c.* بَوَاسِق uca, yüksək; الاخلاق ~ nəcib, alicənab

بَسْكَوِيت *topl.* biskvit, peçenye

– بَسْكَوِيتَة *c.* ات – biskvit

I بَسُلَ (u) بَسَالَة igid, qorxmaz, cəsur olmaq; V تَبَسَّلَ qaşqabaq tökmək; X إِسْتَبْسَلَ fədakarlıq etmək; şücaət göstərmək; ölümdən qorxmamaq; إِسْتَبْسَلَ في القتال döyüşdə rəşadət göstərmək

– إِسْتِبْسَال fədakar igidlik; ölümə məhəl qoymama

– بَاسِل *c.* بُسَّل, بَوَاسِل igid, şücaətli, qorxmaz, cəsur, şanlı, rəşadətli

– بَسَالَة igidlik, cəsarət, cəsurluq, rəşadət

– بِسِلَّة, بِسِلّى noxud; خضراء ~ yaşıl noxud

I بَسَمَ (i) بَسْم gülümsəmək; gülmək; əylənmək; له الحظ ~ bəxti gətirmək; V تَبَسَّمَ gülümsəmək; təbəssüm etmək; VIII إِبْتَسَمَ = V

– إِبْتِسَام, إِبْتِسَامَة *c.* ات təbəssüm, gülümsəmə; ~ التكلّف yalandan gülümsəmək

– بَاسِم gülümsəyən; gülən

– بَسَّام gülümsəyən; güləyən; üzügülər; şən

– بَسْمَة *c.* بَسَمَات gülüş, təbəssüm

– تَبَسُّم = إِبْتِسَام

– مُبْتَسِم gülümsəyən

– مَبْسَم *c.* مَبَاسِم ağız; dodaq; السجارة ~ müştük

بِسْمِ : الله ~ = بِاسْمِ الله bax: سمو

بَسْمَلَ «bismillah» باسم الله الرحمن الرحيم «Rəhmli və Mərhəmətli Allahın adı ilə» demək; تَبَسْمَلَ = بَسْمَلَ

– بَسْمَلَة «bismillah» demə

بَسِيسَة bəsisə (*un, yağ və baldan hazırlanmış şirniyyat*)

بسيكولوج psixoloq

– بسيكولوجي psixoloji

– بسيكولوجيا, بسيكولوجيّة psixologiya

بَسَنَ bax: إِتْبَاع

بُسَيْنَة *c.* ات – *xalq dil.* pişikciyəz

I بَشَّ (ə) بَشّ, بَشَاشَة gülümsəmək; sevincək, sevinə-sevinə qarşılamaq (*kimi* بـ); gülər üzlə, mehribanlıqla rəftar etmək; xoş münasibət bəsləmək (*kimə* لـ)

– بَاشّ güləruz; mehriban; şən

– بَشّ güləruz; səmimi; mehriban; هشّ بشّ güləruz-xoşsifət

– بَشَّاش xoşüzlü; mehriban

– بَشَاشَة 1) gülüş, gülümsəmə; 2) mehribançılıq, üzügülərlik, xoşüzlük; nəvaziş

– بَشُوش = بَشّ

بَشْرُوش = بَشَارُوش

بشاميل bişamil (*sous, xörək şirəsi*)

بَشْبَشَ islatmaq; isladıb yumşaltmaq; yaş etmək; suya salmaq; تَبَشْبَشَ islanmaq, yaş olmaq



– بَشْبَشَة islatma; yaş etmə; suya salma

بِشْت *c.* بُشُوت 1) bişt (*bürüncəyə bənzər geyim*); 2) kofta

بِشْتَك passiv pederast

– بَشْتَخْتَة *c.* ات – 1) piştaxta; 2) sinif lövhəsi; 3) kiçik kamod

I (بشر) بَشَرَ [1] (i, u) بَشْر qabığını soymaq; təmizləmək, qazıb təmizləmək; ovuşdurmaq, ovxalamaq, sürtüb təmizləmək; بَشِرَ (ə) بَشَر , بُشُور yaxud بَشَرَ [2] (u) بَشْر , بُشُور sevinmək (*nəyə* بـ); II بَشَّرَ 1) xoş xəbərlə sevindirmək; müjdələmək; 2) qabaqcadan xəbər vermək (*nəyi* بـ); بالخير ~ xeyir müjdəsi vermək; بالدين ~ dini təbliğ etmək, missionerlik fəaliyyəti ilə məşğul olmaq; III بَاشَرَ 1) aparmaq, yeritmək; yerinə yetirmək; həyata keçirmək; 2) idarə etmək, müdirlik etmək; 3) girişmək (*nəyəsə*); məşğul olmaq (*nə iləsə*); işlətmək, tətbiq etmək, məşğul olmaq; التجارة ~ ticarətlə məşğul olmaq; الصناعة ~ sənətkarlıq etmək; التحقيق ~ təhqiqat aparmaq; السلطة ~ hakimiyyəti həyata keçirmək; الإمرأة ~ cinsi əlaqədə olmaq; IV أَبْشَرَ 1) sevinmək; 2) sevindirmək (*nə ilə* بـ); VI تَبَاشَرَ bir-birinə xoş xəbər vermək; bir-birini təbrik etmək (*nə ilə* بـ); VII إِنْبَشَرَ təmizlənmək, qabığı soyulmaq; X إِسْتَبْشَرَ 1) sevinmək; yaxşı bir şey gözləmək; yaxşı bir şey görmək (*nədəsə*); فه خيرا ~ (*nədəsə*) xeyir görmək; 2) sevindirmək (*kimi nə ilə* بـ)

– بَاشُورَة sıxı; tıxac

– بَشَارَة *c.* ات – kəpənək

– بُشَارَة *c.* بَشَائِر muştuluq

– بِشَارَة *c.* بَشَائِر 1) xoş xəbər, müjdə; عيد ~ال bişarət bayramı (*xristianlıqda*); 2) İncil; 3) yeni bir şey; novbar; التمر بَشَائِرُ ilk xurmalar; الحياة بَشَائِرُ həyat müjdəçiləri, həyatın ilk əlamətləri

– بُشْر müjdə

– بِشْر şənlik; sevinc; وايناس ~ في şən və mehribanlıqla

– بَشَر 1) insan; ~ كأنّه لم يمسسه sanki ona insan əli dəyməmişdir; 2) bəşər; insanlar; ~بنو الـ bəşər övladı; ~أبو الـ Adəm; ~أمّ الـ Həvva; 3) *anat.* cinsiyyət orqanı

– بَشَرَة *c.* بَشَر dəri, qabıq, epiderma; ذوو ~الـ السوداء qaradərililər, qaralar; ذوو ~الـ البيضاء ağdərililər, ağlar

– بُشْرَى *c.* بُشَر = بُشْر

– بَشَرِيّ 1) bəşəri; ~المجتمع الـ insan cəmiyyəti; 2) dəri -i/-ı; dəriüstü

– بَشَرِيَّة 1) bəşəriyyət, insanlıq; 2) insan təbiəti

– بَاشُورَة = بَشُورَة

– بَشِير *c.* بُشَرَاء 1. xoşxəbər; الوجه ~ xoşsifət; 2. 1) sevinc müjdəçisi; 2) müjdəçi; 3) incilçi

– تَبَاشِير *c.* 1) ilk bəhrələr, ilk nəticələr; 2) xoş əlamətlər, müjdələr; الصبح (الفجر) ~ sübhün müjdəçiləri

– تَبْشِير 1) xoş xəbər vermə; müjdələmə; 2) dini təbliğ; missionerlik fəaliyyəti; جمعية ~الـ missioner cəmiyyəti

– تَبْشِيرِيّ missioner -i/-ı; الارساليات الـ~ـة missoner missiyaları; ~النشاط الـ missioner fəaliyyəti

– مُبَاشِر 1. 1) yerinə yetirən, həyata keçirən; 2) birbaşa, dolayı; غير ~ vasitəli; bilvasitə; 2. müdir; baxıcı, gözətçi, nəzarətçi

– مُبَاشَرَة 1) yerinə yetirmə, aparma, həyata keçirmə; 2) məşğul olma (*nə iləsə*); 3) cut-

ləşmə; cinsi əlaqədə olma; مُبَاشَرَةً birbaşa, bilavasitə, vasitəsiz

– مُبَشِّر 1) missioner, din təbliğçisi; 2) incilçi; incilçilər sektasına mənsub adam

– مِبْشَرَة c. مَبَاشِرُ sürtkəc

بَشْرُوش *zool.* flaminqo; qızılqaz

بَشْرَف c. بَشَارِف *mus.* müqəddimə; uvertüra

I بَشِعَ (ə) بَشَع , بَشَاعَة 1) çirkin, iyrənc olmaq; pis, xoşagəlməz olmaq; 2) ikrah doğurmaq (*nəyə qarşı* بِـ); ~ بالطعام yemək-dən çiyrənmək; ~ o bu işdən bezib, cana doyub, təngə gəlib; V تَبَشَّعَ = I; X إسْتَبْشَعَ çirkin, iyrənc hesab etmək; çiyrənmək, iyrənmək

– بَشَاعَة çirkinlik, iyrənclik, pislik

– بَشِع , بَشِيع çirkin, iyrənc, pis, xoşagəlməz; nifrətdoğuran, ikrahlandıran, mənfur, çiyrəndirən

بَاشِق bax: *əlifba sırası ilə*

I بَشَكَ (i) بَشْك yalan demək, yalan danışmaq; VIII إبْتَشَكَ = I

بَشْكَارِي c. بَشَاكِرَة , بَشْكَار qəssab köməkçisi

– بَشْكَرَة : ~ الذبائح heyvanı kəsib doğrama

بَشْكُور c. بَشَاكِير odçəkən, atəşkeş

بَشْكِير c. بَشَاكِير dəsmal, məhrəba; salfet; ~ الحمام hamam dəsmalı; qətfə

بَشْلِك *tar.* beşlik (*xırda türk pulu*)

بَشْلَة c. ات – basil (*çöpşəkilli mikrob*)

بَشْلُوش = بَشْلَة

I بَشِمَ (بَشَم)[1] (ə) بَشَم 1) çox yemək; toxluq etmək; yediyini həzm edə bilməmək; بَشِمَ[2] (ə) بَشَامَة nifrət bəsləmək (*nəyə* من); ~ من الامر bu iş onu təngə gətirib; o bu işdən bezib; IV أَبْشَمَ həddən çox yedirtmək; toxluq edənə qədər yedirtmək

– بَشَام *topl. bot.* Məkkə balzamini, xına-çiçəyi

– بَشَامَة nifrət, ikrah

– بَشَم 1) həddən artıq çox yemə; 2) tox-luq; həzm edə bilməmə

– بَشْمَة bəşmə (*xoş ətirli ağac, çöplərin-dən diş təmizləmək üçün istifadə edilir*)

بَشْمَلَة *bot.* əzgil ağacı; əzgil

– بَشَنْس bəşənsu (*qibti təqviminin 9-cu ayı*)

(بَشْنَق) بَشْنَق başını bağlamaq

– بَشْنُوقَة , بَشْنِيقَة yaylıq, örpək, baş örtüyü

– بَشْنِين Misir şanagülləsi; suzanbağı; لا يعجبه الـ~ و من زرعه *At. sözü*: onu razı sal-maq olmur (*hərf. nə zanbaq xoşuna gəlir, nə də zanbaq əkən*)

I بَصَّ (ə/i) بَصّ , بَصِيص 1) parlamaq, parıl-damaq, titrək parıltı vermək, sayrışmaq; 2) baxmaq, boylanmaq (*haradan* من); II بَصَّصَ 1) gözünü açmaq (*küçük haqqın-da*); 2) quyruğunu bulamaq (*it haqqında*); V تَبَصَّصَ izləmək, güdmək, casusluq etmək

– بَص c. بَصَّات avtobus

– بَصَّاص 1) güdən, izləyən; 2) casus, xəfiyyəçi

– بَصَّاصَة c. ات – göz

– بَصَّة 1) baxış, nəzər; 2) yanar kömür; köz; kösöv

– بَصِيص parıltı, işıltı, işarantı; ~ من الامل işıqucu, işıq yeri

بَصْبَصَ 1) quyruq bulamaq (*it haqqında*); 2) göz vurmaq; göz eləmək; süzmək (*kimisə*); ~ بعينه gözaltı baxmaq; 3) şorgöz-lük etmək; eşqbazlıq etmək; تَبَصْبَصَ güd-mək, baxmaq; izləmək (*kimi* على)

– بَصْبُوص c. بَصَابِيص qızarmış kömür; köz

– بَصْبَصَة 1) quyruq bulama; 2) göz vurma; 3) eşqbazlıq etmə



I بَصِرَ (ə) بَصَرَ yaxud بَصُرَ (u) بَصَارَة 1) görmək, sezmək (*nəyi* بِـ); 2) başa düşmək, bilmək; bacarmaq; II بَصَّرَ 1) gös-tərmək, izah etmək; 2) maarifləndirmək; öyrətmək (*nə* بِـ); 3) Bəsrəyə yollanmaq; 4) qabaqcadan bilmək, duymaq, sezmək (*nəyi* بِـ); IV أَبْصَرَ 1) görmək; 2) başa düş-mək ~ النور في باكو o, Bakıda doğulub (*hərf. işıq üzü görüb*); V تَبَصَّرَ 1) fikirləşmək, mühakimə yürütmək; düşünmək (*nə barədə* في); ağıl-fərasət, dərrakə göstərmək; 2) görmək (*nəyi* بِـ); X إسْتَبْصَرَ 1) yaxşı-yaxşı baxmağa çalışmaq; 2) anlamağa, bil-məyə çalışmaq; 3) baxmaq, müayinə etmək; ~ المريض xəstəni müayinə etmək; 4) bəsirətli, fərasətli, dərrakəli, açıqgözlü olmaq; 5) aydın olmaq, göz qabağında olmaq

– إبْصَار 1) görmə; baxış

– إبْصَارِي optik

– إسْتِبْصَار nüfuz etməyə, anlamağa, bil-məyə çalışma; 2) baxma, yoxlama, müayi-nə etmə; 3) bəsirət, fərasət; intuisiya

– بَاصِرَة c. بَوَاصِر göz

– بَصَارَة 1) görmə; 2) dərketmə, yaxşı bilmə

– بِصَارَة bisarə (*doğranmış paxla, gülxət-mi, nanə və başqa ətirli şeylərdən bişiril-miş yemək*)

– بَصَّارَة c. ات – baxıcı, falçı qadın

– بَصَر c. أَبْصَار 1) görmə, göz; صحيح الـ~ normal görən; طول الـ~ uzağı yaxşı görmə; uzağı yaxşı görən; قصر الـ~ uzağı görmə-mə; قصير الـ~ uzağı yaxşı görməyən; uzaq-görməz; تحت سمعه ~ و *bax*: على مدي سمع; ~ الـ göz işlədikcə; كلمح الـ~ bir anda, bir göz qırpımında; كل ذي ~ و بصيرة gözü və bəsirəti olan hər kəs; غاب عن الابصار gözdən itmək; وقع ~ ي على ... gözümə dəydi, gözümə sataşdı; أنه يُرْمَى بالابصار *məch. məcaz.* o çox məşhurdur, tanınır; 2) ayırd etmə, fərqləndirmə; 3) qavrama; 4) başa düşmə, anlama, bilmə; رجال الرأي و الـ~ ağıllı adamlar; له ~ في هذا o bunu daha yaxşı bilir; 5) bəsirət, fərasət; 6) baxış, nəzər

– بَصْرِي 1. Bəsrə -i/-ı; 2. 1) Bəsrə sakini; bəsrəli; 2) *tar.* Bəsrə qrammatika məktəbinin nümayəndəsi

– بَصَرِي 1) görmə (göz) -i/-ı; gözlə görü-nən; əyani; الوسائل الـ~ـة əyani vəsait; 2) göz -i/-ı; 3) optik

– بَصَرِيَّات c. *həmç.* علم الـ~ optika

– بَصِير c. بُصَرَاء 1) yaxşı görən; görə bilən; gözlü; 2) fərqləndirən; العين ~ ة و اليد قصيرة *At. sözü:* göz görür, əl çatmır; 3) ağıllı, fərasətli, bəsirətli

– بَصِيرَة c. بَصَائِر 1) ağıl; 2) dərrakə; سداد الـ~ yüksək dərrakə; 3) bəsirət, fərasət, uzaqgörənlik; هو على ~ من هذا o bunu yaxşı bilir

– تَبَصُّر 1) düşünmə, fikir yürütmə; 2) düşün-cəlilik, dərrakəlik, mühakiməlilik

– تَبْصِير izah etmə, aydınlaşdırma; gözü-nü açma, gələcəyi görmə

– مُبَاصَرَة televiziya

– مِبْصَار televizor

– مُبْصِر görən, gözlü

– مُسْتَبْصِر bəsirətli, ağıllı-fərasətli

بَسْطَرَ = بَصْطَرَ

I بَصَقَ (u) بَصْق tüpürmək

– بُصَاق 1) tüpürük, çırt; 2) tüpürcək; ağız suyu

– بَصَّاقَة c. ات – tüpürcəkqabı

– بَصْقَة tüpürük, çırt

– مِبْصَقَة c. مَبَاصِق = بَصْلَقَة

(بصل) II بَصَّلَ soyundurmaq; soğan kimi soymaq; kefinə soğan doğramaq

– بَصَل topl. soğan; الزِّير ~ giasint (zanbaq fəsiləsindən ətirli bitki); ماء الـ~ soğan suyu; ميناء الـ~ İskəndəriyyə şəhərində məhəllə adı

– بَصَلَة c. ـات – soğanaq; bir baş soğan; baş, bir baş; الزهر ~ gül soğanağı; الفأر ~ bot. dəniz soğanı; المحبّ خروف ~ Ət. sözü: yarın yara sovqatı bir dəstə bulaq otu (hərf. yardan bir baş soğan da quzudur); لا يسوي ~ heç nəyə dəyməz; bir qəpiyə dəyməz

– بَصَلِيّ 1) soğanaqlı; 2) soğanabənzər

– بُصَيْلَة c. ـات – soğanaq; البيضاء الـ~ bot. Alp amarillisi (soğanaqlı bəzək bitkisi); الشعر ~ tibb. tük soğanağı; 2) bot. giasint (Suriya)

I بَصَمَ (u) بَصْمٌ 1) ştempel vurmaq; damğa vurmaq; ştamplamaq; بختم ~ möhür vurmaq; 2) basmaq, çap etmək; üzünü çıxarmaq; القماش ~ parçaya naxış vurmaq; 3) barmaq basmaq (imza əvəzinə); الدرس ~ dərsi əzbərləmək

– بَصْمَة c. بَصَمَات 1) basma, ştempel, ştamp, möhür, damğa; 2) ottisk, üz, iz; الاصبع ~ barmaq izi

بُصْمَة = بُوصَة [2]

بَصْوَة yanar kömür, kösöv

I (بض) بَضَّ [1] (e/i) بَضِيض simləri bir-bir seçib yoxlamaq; kökləmək, sazlamaq (musiqi alətini); بَضَّ [2] (e/i) بَضِيض xəfif-xəfif axmaq, gilə-gilə axmaq; damcılamaq; بَضَّ (e/i) بَضَاضَة yaxud بُضُوضَة incə, zərif dərili olmaq; IV أَبَضَّ az-az vermək; V تَبَضَّضَ az-az almaq; حقّه ~ haqqını az-az almaq

– بَضّ , بَاضّ , بَضِيض zərif dərili

– بُضُوض c. بَضَاضِين suyu az olan

I بَضَعَ (ə) بَضْع 1) kəsmək, yarmaq; kəsib atmaq; 2) amputasiya etmək; II بَضَّعَ bazarlıq etmək; mal almaq; III بَاضَعَ cütləşmək; cinsi əlaqədə olmaq; V تَبَضَّعَ = II; X إِسْتَبْضَعَ 1) alver etmək; mal gətirmək (haradan من); mal almaq (kimdən من)

– بِضَاعَة c. بَضَائِع mal, alış-veriş predmeti; بضائع كمالية zinət predmetləri (mal kimi); قطار الـ~ yük qatarı; هو قليل الـ~ onun bilik yükü azdır

– بَضْع 1) kəsmə, yarma; kəsib atma; 2) amputasiya

– بُضْع c. أَبْضَاع qadın cinsiyyət orqanları

– بِضْع , بِضْعَة bir qədər; bir neçə (3-dən 10-a qədər); ـة عشر بيتا ~ on neçə ev

– بِضْعَة c. بِضَع parça, tikə (ətin, çörəyin)

– تَبَضُّع , تَبْضِيع alış, alqı

– مِبْضَع c. مَبَاضِع tibb. lanset, cərrah bıçağı; neştər

I بَطَّ (e/u) بَطّ açmaq, yarıb açmaq; içalatını təmizləmək; II بَطْبَطَ döymək; yastılatmaq; başını əzmək; əzişdirmək, kötəkləmək

– بَطّ topl. c. بُطُوط ördəklər; بَرِّيّ ~ çöl ördəkləri; شماليّ ~ zool. şimal dəniz ördəkləri; ذكر الـ~ yaşılbaş, erkək ördəklər; فرخ الـ~ عوّام Ət.sözü: ördək balası üzgüçü olar

– بَطَّة c. ـات – 1) ördək; بَرِّيَّة ~ çöl ördəyi; ذكر ~ yaşılbaş, erkək ördək; أنثى ~ dişi ördək; 2) ördək şəklində qab; الساق ~ yaxud الرجل ~ baldır (ayaqda); يا ~ ! qəşəng qız! (adətən nəvazişlə müraciət üçün işlədilir)

– مُبَطَّط yastı; zolaq



– مُبَطْوَط yastı

بَطَّارِيَّة , بَطَارِيَّة c. ـات – 1) el. batareya; الجيب ~ cib fənəri üçün batareya; جافّة ~ quru batareya; سائلة ~ maye batareya; شمسية ~ günəş batareyası; كَلْوَانِيَّة ~ qalvanik batareya; كيمائية ~ kimyəvi batareya; 2) hərb. batareya

بَطَاطِس topl. kartof

– بَطَاطِسَة c. ـات – bir baş kartof

– بَطَاطَة c. حلوة ~ batat, şirin kartof

I بَطُؤَ (u) بُطْء ağır, yavaş, asta tərpənmək; ləngitmək, yubatmaq; II بَطَّأَ gecikdirmək, yavaşıtmaq, sürətini azaltmaq; IV أَبْطَأَ 1) yubatmaq, uzatmaq; 2) gecikdirmək, süründürmək (nəyi بـ); ما ~ بك عنّا؟ niyə yanımıza gec gəlmisən? V تَبَطَّأَ ləngimək; yavaşımaq; VI تَبَاطَأَ 1) astagəl olmaq; ağır, ləng tərpənmək; 2) uzanmaq; sürəti azalmaq; X إِسْتَبْطَأَ 1) ağır, ləng hesab etmək; 2) səbirsizliklə gözləmək

– إِبْطَاء ləngimə, gecikmə; yubanma; بلا ~ (دون) yubanmadan; الأمر لا يحتمل الـ~ bu iş təxirə salına bilməz, bu işi gecikdirmək olmaz

– بُطْآن : ... بُطْآنَ ما nə qədər ləng...

– بُطْء astalıq, ləngilik; بـ~ ləng, asta

– بُطُوء astalıq, ləngilik

– بَطِيء c. بِطَاء 1) asta, ləng; الحركة ~ ağır tərpənən; ağır hərəkət edən; 2) tənbəl

– مُتَبَاطِئ yavaşıyan, yubanan; uzunçəkən, uzunsürən, uzun davam edən

بَطْبَطَ 1) vaqqıldamaq; 2) baş vurmaq, suya dalmaq; sualtı üzmək; şappıldatmaq, sıçratmaq

– بَطْبَطَة 1) vaqqıldama; 2) baş vurma, suya dalma; şappıldatma, sıçratma

I بَطَحَ (ə) بَطْح 1) açmaq, uzatmaq, sərmək; aşırmaq, yıxmaq; 2) yaralamaq (başından); III بَاطَحَ yıxmaq, çevirmək, devirmək; V تَبَطَّحَ uzanmaq; sərilmək; arxası üstə yıxılmaq; VII إِنْبَطَحَ 1) sərilmək, arxası üstə uzanmaq; 2) yerə sərələnmək; على وجهه ~ (على بطنه) qarnı üstə uzanmaq (tüfəng atanda); 3) yaralanmaq (başından)

– أَبْطَح c. أَبَاطِح = بَطْحَاء

– بُطَاح 1) sayıqlama (qızdırmadan); 2) tibb. quru plevrit

– بَطْحَاء q. c. بِطَاح , بَطْحَاوَات 1) çayın geniş məcrası; vadi; 3) savanna

– بَطْحِيّ c. بَطْحِيَّة ilk başlayan; başçı, qabaqda gedən

– بَطْحَة c. بَطَحَات 1) düzənlik; 2) yara (başda); اللي على رأسه ~ يحسّس عليها zərbi-məsəl. hər kəs öz dərdindən danışır (hərf. kimin başında yara varsa, əli daima yarasında olar)

– بَطِيحَة c. بَطَائِح = بَطْحَاء

– مُنْبَطِح 1) sərilmiş, sərələnmiş; 2) yastı

بَطِّيخ , بِطِّيخ həmç. أحمر ~ topl. qarpız; أصفر ~ topl. yemiş

– بَطِّيخَة , بِطِّيخَة c. ـات – qarpız; العجلة ~ təkər poyrası / göbəyi

– مَبْطَخَة c. مَبَاطِخ bostan

I بَطِرَ (ə) بَطَر 1) narazı olmaq; 2) naşükür, nankor olmaq; yaxşılıq bilməmək; لن أبطر بنعمة الله mən Allahın nemətinə naşükürlük etmərəm (nədə بـ , في); 3) lovğa, təkəbbürlü, dikbaş olmaq; IV أَبْطَرَ 1) əzizləmək, ərköyün böyütmək; nazlamaq, korlamaq; 2) lovğa, dikbaş, təkəbbürlü etmək

– بَطَر narazılıq; 2) naşükürlük, nankorluq; 3) lovğalıq, təkəbbürlülük, dikbaşlıq

– بَطِر lovğa, dikbaş, təkəbbürlü

– بَطْرَان 1) narazı; 2) naşükür, nankor; 3) lovğa, dikbaş, təkəbbürlü

بَطْرَخ *c.* بَطَارِخ , بَطْرُوخ kürü
– مُبَطْرَخَة : سمكة ~ kürülü balıq
بُطْرُس *xüs. ad, k.* Pyotr
بَطْرَق *c.* بَطَارِق patriarx
– بَطْرَكْخَانَة *c.* ات – 1) patriarxın evi; 2) patriarxiya
– بَطْرِيَرْك = بَطْرَك
– بَطْرِيَرْكِيّ patriarx -i/-ı
I بَطَش (u/i) بَطْش 1) hücum etmək (*kiminsə üzərinə* ـب); vurmaq (*kimi* ـب); 2) tutmaq; ələ keçirmək (*kimi* ـب); yerə vurmaq (*kimi* ـب)
– بَطَّاش 1) qüdrətli, güclü; 2) qəddar
– بَطْش qüdrət, qüvvət, güc; مارس سياسة الــ~ والنهب zorakılıq və soyğunçuluq siyasəti yürütmək
– بَطْشَة hücum; 2) zorakılıq; 3) zərbə
بطاقة *c.* بَطَائِق , بطاقات 1) kağız; məktub; البريد ~ poçt açıqcası; الدخول ~ giriş bileti; (اثبات) الشخصيّة (الهويّة) ~ şəxsiyyət vəsiqəsi; الزيارة ~ *yaxud* شخصيّة ~ vizit kartı, kartvizit; الاعاشة (التموين) ~ ərzaq kartı; 2) yafta, damğa; etiket
I (بطل) بَطَل (u) بَطَلَ , بُطُول , بُطْلَان 1) yalan, boş, əsassız, tutarsız olmaq; heçə çıxmaq...

maq (*işi*); 3) yalan demək; boşboğazlıq etmək; V تَبَطَّل avaralanmaq, tənbəllik etmək, heç bir iş görməmək, işsiz gəzmək
– إِبْطَال ləğv etmə; yox etmə; aradan qaldırma
– أُبْطُولَة *c.* أَبَاطِيل əbəslik, bihudəlik, mənasızlıq; boş-boşuna vurnuxma, dünya təlaşı, dünya vurnuxması
– بَاطِل 1. 1) batil, yalan, doğru olmayan; əsassız; qüvvəsini itirmiş; 2) boş, mənasız, əbəs, faydasız; بالــ~ a) yalandan, uydurma; b) hər cür yalanla; haqsız yerə; boş yerə, əbəs yerə; ــًا~ əbəs yerə, boş yerə; 2. *c.* بَوَاطِل 1) yalan, hiylə, fırıldaq, kələk, saxtakarlıq, cəfəngiyat, olmazın, mənasızlıq; 2) haqsızlıq, ədalətsizlik; 3) şeytan!; يا له من ~ *xalq dil.* elə pis adamdır ki!; 4) *c.* بَطَلَة sehrbaz, ovsunçu; ~ ذو zarafatçı, masqaraçı
– بَطَّال 1) avara, tənbəl; 2) işsiz; 3) pis, sarsaq
– بَطَالَة qəhrəmanlıq, igidlik, cəsurluq
– بِطَالَة 1) avaralıq, tənbəllik; 2) işsizlik; 3) tətil
– بَطَل *c.* أَبْطَال 1) cəsur, qəhrəman; الــ~...



– بُطُولَة 1) qəhrəmanlıq, cəsurluq, igidlik; بـــ~ qəhrəmancasına, qəhrəmanlıqla; 2) birincilik, çempionat; ... باكو في ~ ... üzrə Bakı birinciliyi; العالمية في الــ~ ...üzrə dünya birinciliyi; *yaxud* ... العالم في ~ ... üzrə dünya çempionatı
– بُطُولِيّ qəhrəmanlıq -i/-ı; المأثرة الــ~ـة qəhrəmanlıq dastanı
– تَبَطُّل avaralıq, tənbəllik
– مُتَبَطِّل 1. avara, veyil, mənasız; 2. boş, bikar, vecsiz
بَطَالِسَة , بَطَالِمَة *tar.* Ptolemeylər
بُطْم *topl.* terpentin (*qatranlı şəffaf şirə verən iynəyarpaqlı*) ağacları
– بُطْمَة *c.* بُطْمَات terpentin ağacı
I (بطن) بَطَن (u) بُطُون içində olmaq; gizli olmaq; gizlənmək; علم بما ~ و ظهر *məcaz.* hər şeyi təfərrüatı ilə, hərtərəfli bilmək; cikini-bikini bilmək; بَطُن (a) بَطْن dolu olmaq; dolmaq (*mədə*); بَطِن (u) بَطَانَة yekəqarın olmaq; II بَطَّن 1) doldurmaq (*məs., pambıqla*); astarlamaq, astar vurmaq, astar salmaq; 2) yuvanı döşəmək (*quş haqqında*); IV أَبْطَن 1) gizlətmək, gizli...

*yaxud* الكف ~ ovuc, ovucun içi, əlin içi; القدم ~ ayağın altı; السهل ~ düzənliyin ortası; الامور بَوَاطِن işin məxfi tərəfləri; sirlər; ~ في الامر əslində, həqiqətdə, işin mahiyyətinə görə; من ~ــه أَجَّرَ vasitəli icarəyə vermək; icarəçidən icarə haqqı ilə icarəyə vermək
– بَاطِنِيّ 1) daxili; امراض ~ـة daxili xəstəliklər; 2) gizli, məxfi; تلا في صوت ~ آيات القرآن Quran ayələrini öz içində oxumaq; a) içəridən, daxildən; daxilən
– بَاطِنِيَّة : الــ~ batiniyyə (*Quranda gizli mənalar axtaran dini-fəlsəfi yönüm*)
– بِطَان *c.* أَبْطِنَة 1) qarınaltı (*qoşqu hissəsi*); 2) tapqır
– بِطَانَة *c.* بَطَائِن 1) astar; *anat.* endokardit, ürəyin daxili qişası; القلب ~ التهاب *tibb.* ürəyin daxili qişasının iltihabı, endokardit; 2) ətraf, mühit, saray adamları, yaxın adamlar; dostlar; əlaltılar, həmfikirlər; 3) fon, yerlik (*mücridə qiymətli şeylər üçün*)
– بَطَّانِيَّة *c.* بَطَّانِيَّات , بطاطين yorğan, ədyal
– بَطْن *c.* بُطُون 1) qarın; mədə; اخذه بطنه onu qarınağrısı tutub, qarnı ağrıyır; ولدت في ~ اثنين واحد bir qarında ikisini doğub, əkiz doğub; 2) iç, orta; في بُطُونه nəyinsə içində;

– بَطِينٌ 1. qarınlı; yekaqarın; 2. qarınqulu, acgöz

– بُطَيْنٌ mədəcik (*ürəyin*)

– مِبْطَانٌ 1. qarınlı, yekaqarın, qarnıyoğun, şişman, şişqarın; 2. qarınqulu

– مُبْطَنٌ gizli; məxfi; ~ بِشَكْل gizli surətdə, məxfi olaraq

– مُبَطَّنٌ 1) astar çəkilmiş; 2) üz çəkilmiş (*parçadan*); 3) döşənmiş (*yuva*)

– مُبَطَّنَةٌ *c.* ات – mubattana (*astarlı üst paltarı*)

– مُسْتَبْطَنٌ : الكلام ~ sözün gizli mənası

بَاطِيَةٌ *bax: əlifba sırası ilə*

I بَظَّ (ə/u) بَظٌّ tökülmək, axmaq, axıb tökülmək; II بَظَّظَ tökmək, axıtmaq; عينه ~ gözünü vurub çıxartmaq

بَظْرٌ *c.* بُظُورٌ *anat.* klitor

بَظْرَمَةٌ *xalq dil.* boş danışıq, cəfəngiyat, boşboğazlıq; ~ بلاش bəsdir boşboğazlıq etdin!

بَظْرَمِيطٌ düdəmə, mələz, qatışıq

بَعْبُوضٌ *c.* بَعَابِيضُ *xalq dil.* şış

بَعْبَعَ 1) boşboğazlıq etmək, çərənləmək, naqqallıq etmək, laqqırtı vurmaq; çənə vurmaq; 2) qorxutmaq, vahiməyə salmaq (*kimi* علي); 3) *xalq dil.* deyinmək, mırtıldanmaq

– بُعْبُعٌ *c.* بَعَابِعُ uyuq, qorxuluq; «xoxan», «xoxu» (*uşaqları qorxutmaq üçün işlədilən söz*)

– بَعْبَعَةٌ 1) boş danışıq, cəfəngiyat; 2) qorxutma; 3) *xalq dil.* deyinmə, mırtıldanma

I بَعَثَ (ə) بَعْثٌ 1) göndərmək, yola salmaq (*nəyi*), bəsət etmək; ezam etmək (*kimi* بـ *və ya təs.hal*); 2) təhrik etmək, qızışdırmaq (*nəyə* علي); təlqin etmək, doğurmaq, bey-

... bu هذا الوضع يبعث علي القلق (الخوف) (في) vəziyyət təşviş (*qorxu*) doğurur; 3) buraxmaq, çıxarmaq; ~ من فمه صفيرا ağzından fit səsi çıxarmaq; 4) oyatmaq; dirçəltmək, canlandırmaq, diriltmək; ~ من الموت ölünü diriltmək; ~ من نومه yuxudan oyatmaq; VI تَبَاعَثَ النظرات ~ nəzər salmaq (*kimə* الي); VI تَبَاعَثَ 1) bir-birini təhrik etmək; 2) bir yerdə gəlmək (*haradan* من); VII إِنْبَعَثَ 1) göndərilmək, bəsət edilmək; 2) dirçəldilmək, dirildilmək; yenidən canlanmaq, təzədən meydana çıxmaq; 3) görünmək, meydana çıxmaq (*haradan* من); yayılmaq, çıxmaq, gəlmək (*nədən* من - *iy, qoxu haqqında*); 4) tələsmək; 5) başlamaq, girişmək; ~ يبكي o, ağlamağa başladı; VIII إِبْتَعَثَ 1) yadına salmaq, yaddaşında canlandırmaq; canlandırmaq; təzədən oyatmaq; 2) göndərmək

– إِنْبِعَاثٌ 1) canlanma, dirçəlmə, yüksəliş; bərpa olunma, yenidən yaranma; 3) keçmə, axıb keçmə

– بَاعِثٌ *c.* بَوَاعِثُ səbəb, motiv; təhrik

– بَعْثٌ *c.* بُعُوثٌ 1) göndərmə, yola salma; 2) missiya, vəzifə; 3) dirilmə, canlanma, yenidən oyanış; حزب الـــ~ Bəəs partiyası; يوم الـــ~ *din.* dirilmə günü; عصر الـــ~ İntibah dövrü; 4) ekspedisiya dəstəsi

– بَعْثَةٌ *c.* بَعَثَاتٌ 1) göndərmə, yollama, yollanma; ezam etmə; 2) ekspedisiya; kəşfiyyat dəstəsi; 3) missiya; nümayəndə heyəti; سياسيّة (دبلوماسيّة) ~ diplomatik missiya; تعليميّة ~ tədris qrupu, xaricdə təhsil almaq üçün göndərilən bir qrup tələbə; الـــ~ Məhəmməd peyğəmbərin bəsəti, peyğəmbərlik risaləsi ilə göndərilməsi; عهد الـــ~ bəsət dövrü, Məhəmməd ...



– مَبْعَثٌ 1) göndərilmə vaxtı və ya yeri; Məhəmməd peyğəmbərin risalə ilə bəsəti, ona peyğəmbərlik verilməsi; 2) yaranma, doğma, törəmə yeri; mənbə; الوحي ~ ilham mənbəyi; 3) səbəb, əsas, dəlil

– مَبْعُوثٌ 1) göndərilmiş; 2) elçi, nümayəndə, müjdəçi; deputat; مجلس الـــ~ـان التركي Məclisi-məbusan (*köhnə Türkiyədə Deputatlar palatası*)

بَعْثَرَ 1) səpmək, səpələmək; töküşdürmək; 2) sovurmaq, israf etmək, dağıtmaq (*pulu*); 3) çevirmək, aşırtmaq; تَبَعْثَرَ 1) səpilmək, səpələnmək, sovurulmaq; 2) itmək

– بَعْثَرَةٌ 1) səpmə; səpələmə, sovurma; 2) çevirmə, aşırma; 3) israf etmə, dağıtma; الثروة ~ sərvətin dağıdılması

– مُبَعْثَرٌ 1) səpələnmiş, dağıdılmış; dağınıq, pərakəndə; 2) çevrilmiş, aşırılmış

I بَعَجَ (a) بَعْجٌ 1) açmaq, sökmək, yırtmaq, yarmaq; 2) batıqlar etmək (*dəmir məmulat üzərində*); VII إِنْبَعَجَ 1) batıqlar almaq (*dəmir məmulat haqqında*); 2) sıxılmış, yumulmuş, yastılanmış olmaq; 3) əyilmək, qarılmaq

– بَعْجَةٌ *c.* بَعَجَاتٌ batıq, əzik yer

I بَعُدَ (u) بُعْدٌ 1) uzaq olmaq; aralı olmaq; ...dan/-dən (من) ... məsafədə yerləşmək; ابعدْ عني! məndən uzaq ol!; الشرّ عنك! ~ şər səndən uzaq olsun! 2) ağlasığmaz, qeyri-mümkün olmaq; لا يبعد ان ... tamamilə mümkündür ki...; II بَعَّدَ uzaqlaşdırmaq; III بَاعَدَ 1) ayrı olmaq (*kimdənsə*); uzaqda olmaq (*kimdənsə*); 2) bir-birindən uzaqlaşdırmaq; ayırmaq (*kimi kimdən* – بينه وبين); iri addımlar atmaq; بين خطاه ~ iri ad-

gün etmək (*haradan* من); 4) kənar etmək, kənarlaşdırmaq (*nədən* عن); rədd etmək; istisna etmək; VI تَبَاعَدَ 1) tədricən bir-birindən uzaqlaşmaq; yavaş-yavaş ayrılmaq, uzaqlaşmaq (*nədən* عن); 2) bir-birindən uzaqda olmaq; 3) fərqlənmək ت طرائقنا في الحياة ~ bizim həyat yollarımız ayrılmışdır; VIII إِبْتَعَدَ uzaq olmaq, uzaqlaşmaq (*nədən* عن); çıxıb getmək, tərk etmək; X إِسْتَبْعَدَ 1) uzaq hesab etmək; 2) qeyri-mümkün, ağlasığmaz hesab etmək; 3) çəkilmək, uzaqlaşmaq, yox olmaq (*haradan* عن); 4) kənar etmək, istisna etmək; çıxarmaq; الموضوع من جدول الاعمال ~ məsələni gündəlikdən çıxarmaq

– إِبْعَادٌ 1) kənar etmə, çıxartma, aradan qaldırma, istisna etmə; 2) təcrid etmə; 3) köçürtmə, sürgün etmə

– إِبْعَادِيَّةٌ *c.* أَبْعَادِيَّاتٌ , أَبَاعِدُ ferma, xutor

– أَبْعَدُ 1) ən uzaq, ən aralı, ən kənar; 2) mən, sən, o (*adbaad çağırmaq əvəzinə eyhamla*)

– بِعَادٌ ayrılıq

– بُعْدٌ[1] uzaqlıq, ayrılıq; هو بعيد عن ... بُعدَ السماء عن الارض o ...-dan/-dən göylə yerin uzaqlığı qədər uzaqdır; 2) uzaq yer علي الـــ~ uzaqda, uzaqlarda; ~ عن (مِن) uzaqdan النظر ~ uzaqgörənlik; الـــ~ الكليّ *mus.* oktava; ~ا له onu görüm, yox olsun!; ~ا لك! it!, yox ol!, rədd ol!

– بُعْدٌ[2] *c.* أَبْعَادٌ 1) məsafə; علي~ ثلاثة اميال üç mil məsafədə; هو علي~ حجر من... *məcaz.* o, filan şeyə çox yaxındır (*hərf. o, filan şeyə atılan daş məsafəsindədir*); 2) ölçü; أبعاد احداثيّة *riyaz.* koordinatlar; tayın ölçü-

– بَعْدُ sonra; hələ; لم يبلغ ~ الثامنة عشر o hələ on səkkiz yaşına çatmamışdır; اما بعد sonra, sonra isə; ~ فيما sonralar, axırda, nəticədə; ~ من قبل و من əvvəl və sonra

– بَعْدَ sonra; keçəndən sonra; ardınca, arxasında; ~ بكرة birigün, bir gün sonra; ~ الظهر günortadan sonra; ~ قليل من الزمان bir azdan, bir qədər sonra; واحد ~ الآخر bir-birinin ardınca; يوما ~ يوم gündən günə, günbəgün; ... ما ~ yaxud ... ان ~ yaxud ... من ~ ان ... -dan/-dən sonra; اللتيا و التي ~ bax: اللتيا ; وقوع الامر ~ əvvəlki (köhnə) tarixlə; postfaktum; حماقة ليست بعدها حماقة! axmaqlığın son həddi!; هو في حرمان ما ~ه حرمان o, təsəvvürə gətirilməyəcək dərəcədə ehtiyac içindədir; و بعد اخذ و ردّ و سين وجيم تبيّن ان ... çox sual-cavabdan sonra aydın oldu ki...

– بَعْدَيْن *xalq dil.* sonra

– بُعَيْدَ üstündən çox keçmədən; الثورة ~ inqilabdan bir az sonra

– بَعِيدٌ *c.* بُعَدَاءُ 1) uzaq; غير ~ uzaq olmayan, yaxın; كل البعد عن... ~ çox uzaq, olduqca uzaq; النظر ~ uzaqgörən; الأثر ~ çox təsirli; المنال ~ çətin müyəssər olan, çətin əldə edilən; من ~ uzaqdan; 2) çoxdankı, əvvəlki, köhnə, sürəkli, uzun (*müddət*); çoxdan bəri, qədimdən bəri; 3) و غير ~ ان ... ola da bilər ki...; 4) yad, qohumluq əlaqəsi olmayan adam

– تَبَاعُدٌ bir-birindən uzaqlaşma; ayrılıq, ayrılma; الـ ~ شُقّة böyük fikir ayrılığı

– مُبْعَدٌ uzaqlaşdırılmış, sürgün edilmiş

– مَبْعَدَةٌ uzaq, uzaqlıq; وقف على ~ من ... ...dan/-dən uzaqlıqda dayanmaq; يوجد على ~ كيلومترين o, iki kilometr uzaqda yerləşir

– مُسْتَبْعَدٌ qeyri-mümkün, ola bilməyən; من الـ ~ ان ... ola bilməz ki...

– مُسْتَبْعَدَاتٌ *c.* (*becərmək üçün*) naqolay, münasib olmayan torpaqlar

(بعر) II بَعَّرَ peyin tökmək (*heyvan haqqında*)

– بَعْرٌ *topl. c.* أَبْعَارٌ peyin

– بَعِيرٌ *c.* أَبْعِرَةٌ , أَبَاعِرُ , بُعْرَانٌ dəvə; اهل الـ ~ bədəvilər

– مَبْعَرٌ *anat.* gödən

بَعْزَقَ 1) səpələmək, dağıtmaq; 2) israf etmək

– بَعْزَقَةٌ 1) səpələmə, dağıtma; 2) israf etmə

– مُبَعْزِقٌ israfçı, bədxərc

(بعض) II بَعَّضَ hissələrə bölmək; V تَبَعَّضَ bölünmək

– بَعْضٌ *c.* أَبْعَاضٌ 1) hissə; منذ سنة و ~ السنة bir ildən artıq olar ki; 2) bəzi, bəziləri; الناس ~ a) bəzi insanlar; b) bəziləri; لـ ~ ـ ~ bir-birinə; ـهم ~ ـا bir-birini; في ~ الأيام bəzən; bir dəfə; الأوقات ~ bəzən; الشيئ ~ bir az, bir qədər; الفهم ~ فهمه onu bir təhər, güc-bəla ilə başa düşdü; و عراه ~ الخجل o bir az utanır; اصاب ~ النجاح في ... o ...-da/-də bəzi uğurlar qazandı; زيّ بعضه *xalq dil.* fərqi yoxdur! eyni şeydir! eyb etməz!

– بَعُوضٌ *topl.* ağcaqanad; mığmığa

– بَعُوضَةٌ *c.* ات – ağcaqanad; mığmığa

بَعْلٌ *c.* بُعُولٌ 1) ər; 2) sahib, ağa; 3) *Bibl.* Bəəl; 4) dəmyə torpaqlar; dəmyə əkin

– بَعْلَةٌ arvad

– بَعْلِيٌّ dəmyə; الارض الـ ~ ـة dəmyə torpaqlar, dəmyə; زراعة ~ ـة dəmyə əkini

بَعْلَزَبُول *din.* Bəlzəbul, şeytan

بَعْنِينَانٌ *c.* ات – tutuquşu

I بَغَتَ (ə) بَغْتٌ 1) baş vermək, gözlənilmədən meydana çıxmaq; 2) heyrətə salmaq, təəccübə salmaq; III بَاغَتَ 1) gözlənilmədən, birdən, lapdan etmək (*nəyi*—بـ); 2) gözlənilmədən hücum etmək; qəfildən haqlamaq; VII إِنْبَغَتَ 1) qəfildən haqlanmaq; 2) təəccüblənmək, heyran qalmaq



– بَاغِتٌ gözlənilməz, qəfil

– بَغْتَةٌ gözlənilməzlik, qəfillik; بَغْتَةً gözlənilmədən, qəfildən, lapdan, birdən

– بَغْتِيٌّ = بَاغِتٌ

– مُبَاغِتٌ gözlənilməz, qəfil

– مُبَاغَتَةٌ 1) gözlənilməz hücum, hadisə; 2) gözlənilməzlik, sürpriz

بُغَاثٌ *topl. c.* بِغْثَانٌ quşcuğaz; الطيور ~ balaca quşlar; الـ ~ هناك يَسْتَنْسِرُ *At. sözü*; orada sərçələr qartala dönürlər (*milçəkdən fil düzəltmək mənasında*)

– بُغَاثَةٌ quşcuğaz

بُغَاذَةٌ torta

(بغدد) تَبَغْدَدَ özünü çəkmək, lovğalanmaq, təşəxxüs satmaq; naz etmək, əzilib-büzülmək; Bağdad şəhərinə mənsub olmaq; özünü Bağdad əhlinə oxşatmaq

– بَغْدَادِيٌّ 1. Bağdad -i/-ı; 2. bağdadlı; ~ خشب çiləkən, nazik, ensiz taxta

– تَبَغْدُدٌ özünü çəkmə, lovğalanma, təşəxxüs satma; naz-qəmzə etmə, əzilib-büzülmə

بُغَازٌ *c.* بَوَاغِزُ boğaz

– بُغَازِيٌّ *c.* بُغَازِيَّةٌ losman

I بَغَشَ (ə) بَغْشٌ çiskinləmək, çiləmək, damcılamaq; بغشت السماء الارض çiləyirdi, xırda-xırda yağış yağırdı

– بُغَاشَةٌ *c.* ات – buğaşə (*xırda qutab*)

– بَغْشَةٌ xırda yağış, çiskin

I بَغُضَ (ə) بَغَاضَةٌ *yaxud* بَغِضَ (ə) بُغْضٌ zəhlətökən, nifrət oyandıran olmaq; II بَغَّضَ nifrət doğurmaq, ədavət doğurmaq, kin oyandırmaq; III بَاغَضَ bir-birini görməyə gözü olmamaq; bir-birinə kin bəsləmək; IV أَبْغَضَ görməyə gözü olmamaq, nifrət bəsləmək; VI تَبَاغَضَ bir-birini görməyə gözü olmamaq; bir-birinə nifrət bəsləmək

– بَغَاضَةٌ nifrət, kin, ədavət

– بُغْضٌ , بِغْضَةٌ , بَغْضَاءُ ədavət, nifrət

– بَغِيضٌ mənfur, nifrət oyandıran, nifrətə layiq

– تَبَاغُضٌ qarşılıqlı nifrət, bir-birini görməyə gözü olmama

– مُبْغِضٌ = بَغِيضٌ

– مَبْغُوضٌ = بَغِيضٌ

I بَغَلَ (u) بُغُولَةٌ 1) ağılsız olmaq; axmaq olmaq; 2) doğmayan, qısır olmaq (*dişi heyvan*); II بَغَّلَ *biol.* cütləşdirmək, məlezləşdirmək

– تَبْغِيلٌ cütləşdirmə, məlezləşdirmə, hibridləşdirmə

– بَغَّالٌ çarvadar *yaxud* qatır sahibi

– بَغْلٌ *c.* بِغَالٌ 1) qatır; 2) ağılsız, axmaq, sarsaq

– بَغْلَةٌ dişi qatır; القنطرة ~ körpü özülü

I بَغَمَ (ə) بُغَامٌ mələmək (*ahu, ceyran*)

I بَغَى (i) بُغْيَةٌ , بُغَاءٌ , بَغْيٌ 1) arzulamaq, istəmək; can atmaq; 2) niyyətində olmaq, qəsdində olmaq; 3) qəsd etmək (*nəyə* على); 4) incitmək, zülm etmək, əziyyət vermək, sıxıntı vermək (*kimə* على); 5) pozğunluq etmək; fahişəlik etmək; IV أَبْغَى 1) əldə etməyə, tapmağa (*nəyi*) kömək etmək; 2) vermək, tutmaq, göndərmək; VII إِنْبَغَى : ينبغي ان... gərəkdir ki...; lazımdır ki...; zəruridir ki...; ينبغي عليه ان ... gərəkdir ki...; فينبغي الآ ننسى ان.... unutmamalıyıq ki...;

mək; 2) xoşlamamaq, acığı gəlmək; 3) ağır olmaq

- أثقل daha ağır; ~ من الهمّ على القلب *məcaz.* bu çox ağırdır

- تثاقل 1) ağırçəkililik; ağırlaşma; 2) ləng-lik, ağırlıq, süstlük; ~في a) ağır-ağır, yavaş-yavaş; b) könülsüz, istəməyə-istəməyə; في شيء من الـ~ bir qədər ağır tərpənərək; könülsüz

- ثقل *c.* أثقال qiymətli şey

- ثقل *c.* أثقال ağırlıq; çəki, vəzn (*həmç. məcaz.*); siqlət; البلاد الدوليّ ~ dövlətin beynəlxalq (*nüfuzu*) vəzni, siqləti; الرأس ~ başda ağırlıq; أثقال الارض *məcaz.* yeraltı sərvətlər; أثقال الرياضة *idm.* idman daşları; ştanq; رياضة رفع الاثقال *idm.* ağır atletika; نوعيّ ~ xüsusi çəki; 2) yük, ağırlıq

- ثقل ağırlıq, çəki, vəzn

- ثقلان: الـ~ *təsn.* ins və cin

- ثقلة , ثقلة 1) ağırlıq; 2) çətinlik; 3) yük, səfər yükü, bilik, məlumat

- ثقليّ cazibə -i/-ı

- ثقيل *c.* ثقال , ثقلاء 1) ağır, vəznli; 2) əziyyətli, zəhmətli, yorucu; 3) usandırıcı, darıxdırıcı, bezikdirici, xoşagəlməz; pis, yaman; ~ مزاح pis zarafat; 4) tünd (*məs., çay, siqaret*); الدم ~ tündməcaz; qanıacı; xoşagəlməz, yaraşıqsız; الروح ~ darıxdırıcı, dözülməz; السمع ~ ağıreşidən, qulaqdan ağır; الظل ~ ağır, dözülməz; الفهم ~ kütbeyin, küt

- متثاقل ağır, ağıryüklü; ləng; könülsüz, istəmədən

- مثقال *c.* مثاقيل misqal (*24 karata və ya 4,68 qr. bərabər çəki ölçüsü*)

- مثقل 1) ağır; 2) ağırlaşdırılmış; yüklənmiş (*nə ilə* بـ)

- مثقلات *c.* idman daşları

- مستثقل 1) ağırlaşmış (*məs., göz qapaqları*); 2) dərin (*məs., yuxu*)

ثقة *bax:* وثق

I ثكل (ə) ثكل , ثكل uşağını, *yaxud* sevdiyi adamı itirmək (*qadın haqqında*); IV أثكل anadan ayırmaq, anasının əlindən almaq (*uşağı*); V تثكل = I

- ثاكل[1], ثكلى *c.* ثواكل , ثاكلات balasını və ya sevdiyi adamı itirmiş (*qadın*)

- ثاكل[2], ثكلان *c.* ثاكلون , ثكالى uşağını itirmiş

ثكنة *c.* ثكنات , ثكن kazarma

I ثل (ə/u) ثل , ثلل 1) dağıtmaq; məhv etmək; 2) yıxmaq (*hökmdarı*); VII إنثل 1) dağıdılmaq; yıxılmaq, dağılmaq; 2) yıxılmaq, devrilmək (*hökmdar haqqında*)

- ثلل dağıtma, məhv etmə

- ثلة *c.* ثلل 1) yığın, dəstə; 2) *hərb.* komanda, dəstə, bölmə

- ثلة = ثلل

I ثلب (i) ثلب böhtan atmaq, şər atmaq, ləkələmək, qara yaxmaq, bədnam etmək

- ثالب ləkələyən, qara yaxan; böhtan atan

- مثلبة *c.* مثالب 1) böhtan, şər hədəfi; 2) qüsur, nöqsan; 3) böhtan, şər

I (ثلث) ثلث (u) ثلث üçdən birini götürmək; ثلث (ə) üçüncü olmaq; II ثلث 1) üç dəfə artırmaq, üç qat artırmaq; 2) üçə bölmək, üçləmək, üç-üç bağlamaq, üç qat artırmaq; الفرس ~ at yarışı üçüncü başa vurdu; 3) *geod.* trianqulyasiya aparmaq; 4) *qram.* üç nöqtə qoymaq (*hərfin üstündə və ya altında*)

- تثليث 1) üç dəfə artırma, üç qat artırma; 2) üçə bölmə; 3) *geod.* trianqulyasiya

- تثليثيّ triqonometrik

- ثالث 1) üçüncü; ~ـة الاثافي هي ... *bax:* أثفية; ~ـا üçüncüsü; 2) *mus.* tersiya



- ثالوث 1) üçlük; عبث به ~: الفقر والجهل والمرض o, üç şeydən əzab çəkirdi: yoxsulluq, cahillik və xəstəlik; 2) الـ~ المقدّس *din.* müqəddəs üçlük; زهرة الـ~ *bot.* alabəzək bənövşə

- ثلاث , ثلاثة üç; ~ عشر *yaxud* ~ عشرة on üç; ثلاثا üç dəfə, üç kərrə, üç yol; الثلاثة trio, üçlük; دون ان يقول ثلث الثلاثة كم heç bir söz soruşmadan

- ثلاث üç-üç; üç dəfə, üç yol

- ثلاثاء: الـ~ *yaxud* يوم الـ~ çərşənbə axşamı

- ثلاثون otuz

- ثلاثيّ 1) üçqat, üçtərəfli, üç qat artıq, üç hissədən ibarət olan; الارجل ~ üçayaq; الالوان ~ üçrəngli; الحدود ~ *riyaz.* üçhədli; الزوايا ~ üçbucaqlı, üçkünc; السطوح ~ üçüzlü; الفصوص ~ *bot.* üçləçəkli; الورقات ~ *bot.* üçyarpaqlı ~الهرم الـ *riyaz.* üçbucaqlı piramida; 2) *geol.* üçüncü; 3) *qram.* üçhərfli, üçsamitli (*fel*); 4) *qram.* üçnöqtəli (*hərf*); 5) üçlük; 6) *müs.* trio; 7) *rad.* triod

- ثلاثينات *c.* otuzuncu illər

- ثلاثينيات *c.* = ثلاثينات

- ثلاثية trilogiya

- ثلث üçgünlük; حمّى الـ~ üçgünlük titrədib-qızdırma

- ثلث[1] *c.* أثلاث üçdəbir

- ثلث[2], ثلث süls, sülüs (*ərəb yazısının bir növü*)

- ثلثي , ثلثي sülsi, sülüsi (*ərəb yazısında kalliqrafik xətt növü*)

- مثلث = ثلاث

- مثلث[1] 1) üç dəfə artırılmış, üç qat artıq; üçqat, üç misli; علم أذربيجان الـ~ الالوان Azərbaycanın üçrəngli bayrağı; 2) *qram.* üçnöqtəli (*hərf*)

- مثلث[2] *c.* ـات – *riyaz.* üçbucaq; قائم الزاوية ~ düzbucaqlı üçbucaq; الـ~ الحادّ itibucaqlı (*sivribucaqlı*) üçbucaq; متساوى الساقين ~ bərabəryanlı üçbucaq; مختلف الاضلاع ~ müxtəliftərəfli üçbucaq; المثلثات المتشابهة oxşar üçbucaqlar; المثلثات *yaxud* حساب المثلثات *yaxud* علم المثلثات triqonometriya; المثلثات الكروية sferik triqonometriya; المثلثات المستوية düzxətli triqonometriya; الحضارة القديمة ~ *tar.* qədim sivilizasiya üçbucağı (*Yəmən və Həzrəmövt – zirvə; Nil vadisi və Mesopotamiya tərəflər*)

- مثلّث *c.* مثالث üçdən ibarət, üçqat, üçhissəli

- مثلثيّ triqonometrik; النسبة الـ~ـة triqonometrik funksiya

- مثلوث üçqat; üç dəfə artırılmış; ~ حبل üçqat hörülmüş ip

I (ثلج) ثلج[1] (u) ثلج yağmaq (*qar*); تثلج السماء qar yağır; ثلج[2] (u) ثلوج ürəyi buz kimi olmaq, arxayın, rahat, əmin olmaq (*nədən* الى , بـ);

ثلج (ə) ثلج 1) sərinlənmək, havasını dəyişdirmək, təmizləmək; 2) sevinmək; الصدور (القلوب) ~ـت qəlblər sevindi; II ثلج dondurmaq; buza qoymaq; soyutmaq; IV أثلج 1) yağmaq (*qar*); تثلج السماء qar yağır; 2) soyutmaq; 3) sevindirmək; القلوب (الصدور) ~ qəlbləri sevindirmək

- تثليج dondurma, buza qoyma; bərk soyutma

- ثلاج buzsatan

- ثلاجة *c.* ـات – 1) buzxana; soyuducu; كهربائية ~ refrijerator; elektrik soyuducusu; 2) buzlaq, aysberq, buzdağı

- ثلج buz kimi soyuq

– ثلْج c. ثُلوج qar, buz; ابرد من الـــ~ a) o, buzdan da soyuqdur; b) onunla adamın ürəyi sıxılır; ندفة الـــ~ qar dənəciyi; زهرة الثلوج *bot.* xəccəgülü, novruzgülü, qargülü; سيّدة الثلوج qar qız

– ثلْجيّ qar -i/-ı, qarlı; buzlu; buzlaq -i/-ı; soyuq; buz kimi soyuq, bumbuz; عاصفة ~ـــة boran, çovğun; العصر الـــ~ buzlaq dövrü

– ثلِيج donmuş, dondurulmuş, don vurmuş; 2) buz kimi soyuq, bumbuz

– مثلّج ، مثلوج 1) donmuş, dondurulmuş; لحوم ~ـــة dondurulmuş ət; ~ دجاج dondurulmuş toyuq; 2) soyudulmuş, soyuq, buz kimi soyuq, bumbuz

– مُثلّجات c. sərinləşdirici içkilər

– مثلَجة c. مثالِج buzxana; soyuducu

– مثلوج dondurulmuş; ~ حليب dondurma

I ثلم (i) ثلْم dəlik, deşik, yarıq açmaq;

ثُمَام *topl. bot.* Panicum satigerum; هذا على رأس البنان وطرف الـــ~ *zərbi-məsəl.* bu, hamıya yaxşı məlumdur; bunu uşaq da bilir, böyük də

– ثُمامَة çox zərif və artmayan bitki (ثُمام-nin təki, kiçik, cüzi bir şeyi göstərmək üçün işlədilir); الغريق يتشبّث بـــ~ *At.sözü:* suda batan saman çöpündən yapışar

ثمود ، ثَمُود səmud (*Quran. asilik etdiklərinə görə Allahın həlak etdiyi qövmlərdən birinin adı*)

I ثَمَرَ (u) ثُمور səmərə vermək; bar, meyvə, bəhər vermək; II ثمّر 1) səmərə verdirmək; 2) istifadə etmək; 3) qoymaq (*pul*); kapital qoymaq, maya qoymaq, investisiya qoymaq, sərmayə yatırmaq (*nəyə* في); IV أثمر səmərə vermək, bəhər vermək;



– مُثمِر 1) meyvə verən, bar verən; اشجار ~ة bar verən ağaclar; 2) münbit, məhsuldar, bərəkətli; 3) səmərəli; 4) mənfəətli, qazanclı, gəlirli

I ثمِل (ə) ثمَل ، ثُمول keflənmək, sərxoş olmaq, məst olmaq; IV أثمل kefləndirmək, sərxoş etmək, məst etmək

– ثُمالَة c. ثمَال 1) çöküntü, xılt, tör-töküntü, pozğun ünsürlər; köpük

– ثمَل keflilik, sərxoşluq, məstlik

– ثمِل 1) keflənmiş; kefli, sərxoş, məst; 2) aludə olmuş, cəlb edilmiş (*nəyə* الى)

I (ثمن) ثَمَنَ (u) ثمْن səkkizdə birini almaq (*məs., məhsulun*); ثمِن (ə) ثمْن səkkizinci olmaq; ثمُن (u) ثَمَانَة qiymətli olmaq; II ثمّن 1) qiymətləndirmək, qiymət qoymaq, qiymətini müəyyən etmək; لا يثمن *məch.* a) qiymətsizdir, qiyməti yoxdur; b) dəyərsizdir,

– ثُمُنَة sumunə (*1/8* قدح *yaxud 0,26 litrə bərabər tutum ölçüsü*)

– ثمين qiymətli

– مثمَن səkkiz-səkkiz

– مُثمَّن 1) qiymətləndirilən; qiymətli; 2) səkkiz dəfə artırılmış, səkkizdən ibarət; الزوايا ~ a) səkkizbucaqlı; b) səkkizüzlü; السطوح ~ səkkizüzlü, oktaedr

– مُثمِّن 1) qiymətləndirən; 2) nırx qoyan, məzənnə qoyan, qiymət qoyan; qiymət təyin edən; الجمرك ~ gömrük qiymətləndiricisi

ثُنَّة c. ثُنَن dırnaqüstü qıl (*atın*)

ثَنْدُوَة c. ثنَاد döş (*kişinin*)

I ثنَى (i) ثَنْي 1) əymək; döndərmək; bükmək, ikiyə qatlamaq; 2) ikiqat artırmaq; 3) saxlamaq, çəkindirmək, daşındırmaq (*nədən* عن); 4) üz döndərmək, dö

اهتماما عالميًا ~ beynəlxalq maraq doğurmaq; 2) qaldırmaq, təşviqat aparmaq, təşviq etmək; 3) qiyam etmək, qalxmaq

- إِثَارَة 1) oyandırma, oyatma, doğurma, qaldırma, irəli sürmə; 2) təhrik etmə, təşviq etmə

- ثَائِر *c.* ثُوَّار 1. 1) qalxmış, qiyam etmiş, üsyan etmiş, əleyhinə çıxmış; 2) qəzəbli, hirsli, hiddətli, acıqlı; 3) coşqun, gurultulu, həyəcanlı, şiddətli; 2. üsyançı, qiyamçı ~ بركان püskürən vulkan; ~ه ثار *bax:* ثَارَ; واذا بالعاصفة قد ثار ~ها birdən tufan qopdu

- ثَائِرَة 1) oyanma, həyəcanlanma; 2) hiddət, qeyz, şiddətli əsəb, hirs

- ثَوَّار 1) naxırçı; 2) toreador

- ثَوْر *c.* ثِيرَان , ثِيَرَة öküz; فحل ~ cins buğa; مخصي ~ öküz; ~الـ برج *astr.* Buğa bürcü; كالشعرة البيضاء في الـ~ الاسود *macaz.* dənizdə bir damcı (*hərf. qara öküzün bədənində ağ tük kimi*)

- ثَوَرَان 1) çaxnaşma, vəlvələ, həyəcan; 2) püskürmə (*vulkanın*); 3) başlanma (*müharibənin*)

- ثَوْرَجِيّ *c.* ثَوْرَجِيَّة 1) inqilabçı; 2) qiyamçı, üsyançı

- ثَوْرَة[1] *c.* ات - inqilab; ثقافية ~ mədəni inqilab; مجلس الثورة İnqilabi Şura; ثورة معاكسة əksinqilab; 2) üsyan, qiyam; 3) püskürmə (*vulkanın*); 4) partlayış, coşma, hiddətlənmə, acıqlanma, qızışma

- ثَوْرَة[2] *c.* ات - inək

- ثَوْرِيّ = ثَوْرَوِيّ

- ثَوْرِيّ 1. inqilabi; ~الـ النضال inqilabi mübarizə; 2. inqilabçı

- ثَوْرِيَّة inqilabilik

- مَثَار 1) bir şeyin başlanğıcı, doğduğu yer; 2) səbəb, bəhanə olan şey; səbəb, bəhanə; مثار لكثير من الصعوبات bir çox çətinliklərin səbəbi; الجدال ~ mübahisənin səbəbi; النزاع ~ münaqişənin səbəbi; الهموم ~ qayğı obyekti

- مُثِير 1. 1) həyəcanlandıran, narahat edən; səbəb olan, bais olan, doğuran; خبر ~ sensasiya; للاشمئزاز ~ nifrət doğuran; الشفقة ~ şəfqət doğuran; 2) qıcıqlandıran; للاعصاب ~ əsəblərə toxunan; 2. qızışdıran, təhrikçi

ثُورِيُوم *kim.* torium

(ثول) V تَثَوَّلَ 1) beçələmək (*arılar*), toplaşmaq, qaynaşmaq; 2) yığışmaq, toplaşmaq; VII اِنْثَالَ 1) axışıb gəlmək; töküşmək, yığışıb gəlmək (*hara* على); 2) sel kimi axıb gəlmək, basmaq (*kimi* على - *hiss, həyəcan*), xəyalında canlanmaq (*kimin* على - *xatirələr*); 3) yığılmaq, toplanmaq

- ثَوْل *c.* أَثْوَال arı beçəsi, dəstə, yığın

ثُوم *topl.* sarımsaq

- ثُومَة bir baş sarımsaq

I ثَوَى (i) ثَوَاء , ثُوِيّ 1) bir yerdə olmaq, qalmaq, yaşamaq; 2) rahat yatmaq, uyumaq (*ölü haqqında*); 3) *məch.* basdırılmaq, dəfn edilmək; IV أَثْوَى bir yerdə olmaq, qalmaq, yaşamaq; 2) qalmaq üçün yer vermək, sığındırmaq

- ثُوَّة *c.* ثُوًى yolqırağı dirək, yolqırağı daş

- مَثْوًى *c.* مَثَاوٍ qalma yeri; mənzil; الكمال ~ utopiya; اكرم الله مثواه! Allah yatdığı yeri rahat eləsin!

ثَيِّب *c.* ات - ərdə olmuş qadın; dul qadın; boşanmış qadın

ثَيْتَل *c.* ثَيَاتِل dağkeçisi, təkə

ثَيْل *topl. bot.* ayrıq

ثَيِّن mirvari ovçusu



# ج

ج[1] (جيم) cīm (*ərəb əlifbasının beşinci hərfi; rəqəm mənası 3*)

ج[2] 1) جواب - *dan qısald.* cavab; 2) جمع- *dən qısald. qram.* cəm; 3) جمادى الاخرة-*dən qısald.* qəməri təqvimin 6-cı ayı; 4) جلد - *dən qısald.* cild; 5) جنيه مصري -*dən qısald.* Misir funtu; 6) الجمهورية العربية المتحدة - *dən qısald.* ج.ع.م BƏR; 7) جمهورية مصر العربية -*dən qısald.* ج.م.ع. MƏR

- جا جمادى الاولى -*dən qısald.*, qəməri təqvimin 5-ci ayı

جَاتُوه pirojna

جَاثَلِيق *c.* جَثَالِقَة katolikos

جاراج *bax:* جرج

جَارَاج = جَارَاش

جَارُور *bax:* جر

جَاز[1] *c.* ات – 1) qaz; 2) ağ neft

جَاز[2] qaz (*parça*)

جَازْبَنْد caz, caz-bənd

جَاكَتَة *c.* ات – jaket; pencək

شاكوش = جاكوش

جَاكِيَة *c.* ات – qadın jaketi

جَالُوت *Bibl.* Calut (*Qoliaf*)

جَالُوت *tar.* yəhudilərin sürgün həyatı, caliyə, diaspora

جَالُوص *c.* جَوَالِيص bir topa zığ, palçıq

جَالُون güləbətin, bafta

جَالُون *c.* ات – qallon

جَام *q. c.* ات – cam, badə; صب ~ غضبه ونقمته (حقده وكرهه) على... *macaz.* bütün hirsini (*qəzəbini, nifrətini*) … üstünə tökmək

جَامَا qamma (*yunan əlifbasının 3-cü hərfi*); ~ أشعة *fiz.* qamma şüalar

جَامَكِيَّة *c.* ات – maaş, əmək haqqı

جَامُوس *c.* جَوَامِيس kəl; البحر ~ hippopotam, kərgədan

جَامُوسَة *c.* ات ~ camış

جَانْدَرْمَة jandarma

جَاه cah-cəlal, yüksək məqam, rütbə; 2) ləyaqət, qədr-qiymət; 3) nüfuz, güc; عريض الـ~ geniş nüfuzlu

جَوْدَار = جَاوْدَار , جَاوَدَار

جَاوَرْس moqar, macar darısı

جَاوِي = جَاوِيّ 1. Yava -i/-ı; 2. 1) yavalı; 2) benzoy qatranı; şehli buxur

جَاوِيش *c.* جَاوِيشِيَّة 1) çavuş; باش~ baş çavuş (*polisdə*); 2) yeməyin axırında süfrəyə gətirilən düyü xörəyi

(جاجا) تَجَاجَأَ özünü saxlamaq, çəkinmək

- جُؤْجُؤ *c.* جَآجِئ 1) köks (*quşun*); 2) burun (*gəminin*)

I جَأَرَ (ə) جَأْر , جُؤَار böyürmək, movuldamaq

- جُؤَار böyürmə, movuldama

I جَأَشَ (ə) جَأْش təşvişə düşmək, narahat olmaq, təlaş keçirmək, həyəcanlanmaq

- جَأْش 1) həyəcan, təşviş, narahatlıq; اسكن ~ه kimisə sakitləşdirmək; 2) ürək; 3) nəfəs, təmkin, özünü saxlama, özünü itirmə; استرد ~ه özünü ələ almaq, sakitləşmək; رابط (ساكن) الـ~ soyuqqanlı, sakit, özünü saxlaya bilən; رباطة ~ soyuqqanlılıq, sakitlik, səbirlilik

I جَبَّ (ə/u) جَبّ 1) kəsmək, kəsib atmaq; خصيته ~ axtalamaq; 2) üstün olmaq, üstün gəlmək

- جُبّ *c.* أَجْبَاب , جِبَاب 1) çala, çuxur; 2) quyu

- جُبَّة *c.* جِبَاب , جُبَب cübbə (*geniş qolları olan üst paltarı*)

- مَجْبُوب xədim, hərəmağası

جَبْخ *c.* جِبَاخ , أَجْبُخ arı pətəyi, arı təknəsi

I جَبَى (i) جِبَايَةٌ toplamaq, yığmaq, tutmaq (*vergi*); II جَبَّى 1) üzüqoylu düşmək, diz çökmək (*məs., namaz vaxtı*); 2) hədiyyə etmək; bağışlamaq; VII اِجْتَبَى seçmək

– تَجْبِيَةٌ diz üstə durma (*məs., namaz vaxtı*)

– جَابٍ *q.* جَابِيَةٌ *c.* جُبَاةٌ vergiyığan; جابى التذاكر biletəbaxan, biletyoxlayan

– جَابِيَةٌ *c.* جَوَابٍ hovuz, nohur

– جَبَا *xalq dil.* hədiyyə, bəxşiş, sovqat; عاش ~ وصاحبه! hədiyyə də, hədiyyə verən də sağ olsun!

– جِبَايَةٌ toplama, yığma (*vergi*)

جَبْتٌ 1) qabıq (*meyvənin*); 2) karotin

I جَثَّ (ə/u) جَثٌّ 1) kökündən qoparıb atmaq; 2) kökünü kəsmək; VIII اِجْتَثَّ = I

– جُثَّةٌ *c.* جُثَثٌ cüssə, meyit; cəmdək (*heyvanın*); هامدة ~ nəfəsi kəsilmiş, ölü, cansız bədən

جَثْلٌ qalın (*saç*)

جَثْلِيقٌ *c.* جَثَالِقَةٌ katolikos

I جَثَمَ (u, i) جُثُومٌ 1) çömbəlmək, sallağı oturmaq; əyilmək; yerə sıxılmaq, qısılmaq; 2) tərpənmədən uzanmaq; 3) gizlənmək, özünü göstərməmək, xəlvətə çəkilmək; 4) oturmaq (*it haqqında*); 5) daş kimi düşmək (*quş haqqında*); 6) üstünə düşmək, üstünə yıxılmaq, üstünə cummaq (*kimin-nəyin* على); 7) sıxmaq, təzyiq göstərmək, zülm etmək, əsarət altına almaq (*kimi* على); 8) enmək, düşmək (*məs., gecə*)

– جُثَّامٌ , جَاثُومٌ vahimə, dəhşət

– جُثْمَانٌ bədən; الميت ~ meyitin, ölünün bədəni

– جُثْمَانِيٌّ bədən -i/-ı; cismi, cismani, fiziki

– مَجْثَمٌ *c.* مَجَاثِمُ quşların yatdığı yer; tar (*hində*); ağac çubuq (*hində*)

I جَثَا (جثو) (u) جُثُوٌّ diz çökmək; على ركبتيه ~ dizləri üstə düşmək

– جَاثٍ *q.* جَاثِيَةٌ *c.* جُثِيٌّ diz çökən, diz çökmüş, səcdə edən; الجاثي *astr.* Herkules

– جُثُوٌّ dizçökmə, səcdə

– جُثْوَةٌ *c.* جُثًى qəbir, qəbir üzərindəki torpaq təpə

– مَجْثًى *c.* مَجَاثٍ döşəkçə (*namaz vaxtı dizlərin altına atmaq üçün*)

جُحٌّ qarpız (*Nəcddə*)

جُحَا , جُحَى Cuha (*Qoha*) (*ərəb folkloru qəhrəmanının adı*)

I جَحَدَ (ə) جَحْدٌ , جُحُودٌ 1) danmaq; 2) dönmək, üz döndərmək, inkar etmək, imtina etmək; 3) inanmamaq; 4) nankor olmaq, nankorluq etmək

– جَاحِدٌ 1) danan; 2) inanmayan, iman gətirməyən; 3) nankor; المعروف ~ *yaxud* الجميل ~ yaxşılığı danan, nankor

I جَحَرَ (ə) جَحْرٌ yuvada gizlənmək; VII اِنْجَحَرَ = I

– جُحْرٌ *c.* جُحُورٌ , أَجْحَارٌ yuva

جَحْشٌ *c.* جِحَاشٌ eşşək balası, xotuq, qoduq; خشب ~ eşşək (*inşaat işlərində işlədilən hündür skamya*); dayaq, altlıq

– جَحْشَةٌ *c.* ات – dişi eşşək balası

I جَحَظَ (ə) جُحُوظٌ gözləri bərəlmək, gözü kəlləsinə çıxmaq; dombalangöz olmaq; VI تَجَاحَظَ Cahizi təqlid etmək, Cahiz kimi yazmağa səy göstərmək (*bax:* الجاحظ)

– جَاحِظٌ *c.* جُحَّظٌ (*həmç.* العينين ~) dombalangöz; عيناه ~تان من الفرح sevincdən gözləri bərəlmək; الجاحظ Cahiz (*IX əsrin məşhur yazıçısının ləqəbi*); هو ~ البيان bəlağətdə ona çatan olmaz (*bəlağətdə Cahizdir*)



– جُحُوظٌ dombalangözlük; الدرقي ~الـ *tibb.* Bazedov xəstəliyi

I جَحَفَ (ə) جَحْفٌ 1) dağıtmaq, yuyub aparmaq; 2) meyil etmək (*kimə tərəfsə* مع); IV أَجْحَفَ 1) ziyan vurmaq, zərər yetirmək; 2) ədalətsizlik etmək (*kiməsə münasibətdə* بـ); VI تَجَاحَفَ oynamaq (*nə* بـ); بالكرة ~ at üstündə top oyunu oynamaq

– إِجْحَافٌ 1) zərər, ziyan; 2) zülm, ədalətsizlik

– جَحَّافٌ məhvedici, zərərli

– جَحْفَةٌ hokkey

جَحْفَلٌ *c.* جَحَافِلُ böyük ordu, çoxsaylı qoşun; رجل ~ böyük, hörmətli adam

I جَحَمَ (ə) جَحْمٌ 1) yandırmaq (*od*), alışdırmaq, alovlandırmaq, odlamaq; 2) «cəhənnəm ol!», «lənətə gələsən!» deməklə rədd etmək; II جَحَّمَ diqqətlə baxmaq; gözünü dikmək; IV أَجْحَمَ çəkinmək, imtina etmək (*nədən* عن)

– جَاحِمٌ alovlu; yandırıcı; qızmış, közərmiş

– جَحِيمٌ *q.* cəhənnəm odu, cəhənnəm; اصبحت الحياة ~الـ في نظري həyat nəzərimdə cəhənnəmə dönüb

– جَحِيمِيٌّ cəhənnəm -i/-ı

I جَخَّ (ə/i) جَخٌّ lovğalanmaq, iddialanmaq, öyünmək, özünü öymək

– جَخَّاخٌ 1. lovğa; 2. öyünən, özünü öyən

– جَخَّةٌ gop hekayət

جَخِفَ (i, u) جَخْفٌ , جَخِيفٌ həddən artıq lovğalanmaq, öyünmək

– جُخَافٌ böyüklük iddiası

– جَخَّافٌ çox lovğa adam, özünü çox öyən adam

I (جد) جَدَّ[1] (ə/i) جَدٌّ 1) böyük olmaq; 2) mühüm, əhəmiyyətli olmaq; جَدَّ[2] (ə/i) جِدٌّ 1) ciddi görkəm almaq, ciddiləşmək; cidd-cəhd göstərmək (*nədə* في); zəhmət çəkmək; جد وكد tər töküb işləmək; 2) ciddi olmaq, ciddiyyətlə işə girişmək; جَدَّ[3] (i/i) جِدَّةٌ yeni olmaq هل جد للامر جديد təzə nə var? جَدَّ[4] (i/ə) جَدٌّ *yaxud* جُدَّ *məch.* xoşbəxt olmaq; II جَدَّدَ 1) yeniləşdirmək; yenidən başlamaq, təzələmək; bərpa etmək; الخدمة في الجيش ~ müddətindən artıq hərbi qulluqda qalmaq; yenidən hərbi xidmətə başlamaq; الشباب ~ cavanlaşdırmaq; 2) yenilik gətirmək, yenilik tətbiq etmək; 3) yenidən başlamaq, təkrar etmək; IV أَجَدَّ cidd-cəhd göstərmək, ciddiyyətlə çalışmaq (*nədə* في); 2) yeniləşdirmək, təzələmək, yenidən etmək; V تَجَدَّدَ 1) yeniləşmək, təzələnmək; yenidən başlanmaq; bərpa olunmaq; 2) ilk dəfə görünmək, yenicə meydana çıxmaq; X اِسْتَجَدَّ 1) yeniləşmək, təzələnmək, yenidən başlanmaq, yenidən əmələ gəlmək; 2) yenidən bərpa etmək; 3) nəyisə ilk dəfə etmək; təzə (*şagird, işçi*) olmaq; 4) yenisini axtarmaq

– تَجَدُّدٌ yeniləşmə; الخلوي ~الـ *biol.* anabolizm

– تَجْدِيدٌ 1) yeniləşdirmə; bərpa etmə, əvvəlki şəklinə salma; الشباب ~ cavanlaşdırma; 2) yenilik tətbiq etmə

– تَجْدِيدِيٌّ yeniləşdirici; yenilik tətbiq edən, yenilikçi

– جَادٌّ 1) mühüm, ciddi, ağır, təmkinli, vüqarlı; 2) çalışqan, səyli, qeyrətli

– جَادَّةٌ *c.* جَادَّاتٌ , جَوَادُّ geniş yol, prospekt; الحق ~ haqqın yolu; الرشاد ~ doğru yol; عاد الى الصواب ~ doğru yola qayıtmaq, doğru yola düşmək; النهر ~ farvater

– جَدٌّ[1] *c.* جُدُودٌ 1) böyüklük; 2) xoşbəxtlik, uğur; عاثر الجد a) xoşbəxt olmayan; b) uğursuz;

– جَدَلِيَّةٌ *fəls*. dialektika
– جَدِيلٌ *c.* جُدُلٌ hörülmüş ip, burma ip
– جَدِيلَةٌ *c.* جَدَائِلُ saç, tel, zülf; hörük
– مُجَادَلَةٌ mübahisə; müzakirə
– مِجْدَالٌ [1] 1. mübahisə etməyi xoşlayan; 2. mübahisəçi
– مِجْدَالٌ [2] *c.* مَجَادِيلُ yol kənarında dirəkcik; iri daş
– مِجْدَلٌ *c.* مَجَادِلُ 1) qəsr; 2) mübahisəçi
– مَجْدُولٌ 1) burulmuş; bərk hörülmüş; eşilmiş; dolaşıq salınmış, ilişik düşmüş; 2) güclü və yaraşıqlı; الرقبة ~ möhkəm boyunlu

I (جدو) جَدَا (u) جَدْوٌ bağışlamaq, vermək (*kimə* على); IV أَجْدَى gətirmək, vermək (*fayda*); fəxr etmək; هذا لا يجديك نفعا bunun sənə faydası olmayacaq; أجدى عليه خيرا kiməsə fayda, xeyir gətirmək; هذا لم يجد فتيلا bunun heç bir xeyri olmadı; VIII إِجْتَدَى istəmək, diləmək; X إِسْتَجْدَى istəmək, yalvarıb almaq, diləmək; dilənmək; sədəqə istəmək
– أَجْدَى daha xeyirli, daha faydalı
– جَدَاءٌ fayda, xeyir
– جُدَاءٌ *riyaz*. vurma hasili
– جَدْوَى 1) pay, hədiyyə; 2) fayda, xeyir; üstünlük; ~ على غير *yaxud* ~ دون xeyirsiz, faydasız; nəticəsiz; ~ بلا *yaxud* ~الـ عديم *yaxud* منه ~ لا faydasız, xeyirsiz; ~ عدم fayda-

جَدْوَلَ xətləmək, xətt çəkmək; cızmaq, cızıqlamaq, cızıq çəkmək (*kağıza*); تَجَدْوَلَ xətlənmək, cızıqlanmaq
– جَدْوَلٌ *c.* جَدَاوِلُ 1) axın; sel, kiçik çay; kanal; 2) cədvəl, siyahı; qrafik, diaqramma; الاعمال ~ iş cədvəli, gündəlik; الخطأ ~ والصواب səhvlərin siyahısı; جدول الدروس dərs cədvəli; الضرب ~ vurma cədvəli; القضايا ~ məhkəmə işlərinin siyahısı; مندليف ~ *yaxud* نظام العناصر الدوريّ ~ Mendeleyev cədvəli, elementlərin dövri sistemi cədvəli; جداول انتخابية seçki siyahıları
– جَدْوَلَةٌ xətləmə, cızıqlama
– جَدْوَلِيٌّ cədvəl -i/-ı; ~الـ رقم العنصر elementin cədvəldəki rəqəmi

جَدُونٌ sükan (*velosipedin*)

I جَذَّ (ə/u) جَذٌّ kəsmək; vurmaq, çapmaq; VII إِنْجَذَّ kəsilmək, çapılmaq
– جُذَاذَةٌ *c.* ـات – 1) kart, vəsiqə; 2) fiş, oyun daşı
– جُذَاذَاتٌ *c.* qırıntılar, parçalar; talaşa, yonqar

I جَذَبَ (i) جَذْبٌ 1) dartmaq, çəkmək; 2) cəzb etmək, cəlb etmək; heyran etmək; 3) uzatmaq, çəkmək; III جَاذَبَ 1) dartışmaq; hərə bir tərəfə dartmaq; 2) rəqabət aparmaq, mübarizə aparmaq (*kiminlə*); mübahisə etmək; iddiasında olmaq (*nəyin*); حبل المكاتبة



çıxarılmaq; 2) *fiz*. cəlb olunmaq, cəzb olunmaq; 3) vəcdə gəlmək, haldan çıxmaq, huşunu itirmək; 4) ağlını itirmək, dəli olmaq, havalanmaq; VIII إِجْتَذَبَ cəzb etmək, cəlb etmək; الانظار ~ diqqəti cəlb etmək (*nəyə* الى)
– إِجْتِذَابٌ 1) meyil etmə, özünə çəkmə; 2) cazibədarlıq; 3) *fiz*. cazibə
– إِنْجِذَابٌ 1) vəcd halı, haldan çıxma; heyranlıq; 2) hüsn-rəğbət, meyil, arzusunda olma
– تَجَاذُبٌ 1) bir-birinə meyil etmə; qarşılıqlı cəlbetmə; dostluq; 2) *fiz*. bəndlənmə, bağlanma; ilişmə, qarşılıqlı cazibə; المغنطيسيّ ~الـ maqnit cazibəsi; 3) birləşmə; كيماويّ ~ kimyəvi birləşmə
– جَاذِبٌ 1) cəzbedici; cəlbedici; القوة المركزية ~ـة الـ *fiz*. mərkəzəqaçan qüvvə; 2) cazibədar, məftunedici, valehedici
– جَاذِبَةٌ *c.* جَوَاذِبُ 1. جَاذِبٌ – in *q*.; 2. cəzbedici keyfiyyət, cəlbedici xüsusiyyət; cazibə, gözəllik
– جَاذِبِيَّةٌ 1) vəcd, həvəs, cəlbetmə, meyil; 2) *fiz*. cazibə, الالتصاق ~ bəndlənmə; ~الـ الارضية yer cazibəsi; الثقل ~ ağırlıq qüvvəsi; المغنطيسية ~الـ maqnetizm; ~الـ (قانون) ناموس cazibə qanunu; 3) cazibədarlıq, cəlbedicilik; 4) maraqlılıq (*məs., nağılın*)
– جَذَّابٌ cazibədar, cazibəli, cəlbedici
– جَذْبٌ 1) meyil, həvəs, rəğbət; 2) cəzbet-

– مَجْذُوبٌ *c.* مَجَاذِيبُ 1. 1) vəcd halında olan, vəcdə gəlmiş; 2) özündə olmayan, özündən çıxmış, ağlını itirmiş; مستشفى المجاذيب dəlilər üçün müalicəxana; 3) dəli, divanə, cinli; 2. məczub (*sufilikdə vəcddən nurlanmış halda olan; kiminsə rəhbərliyi olmadan vəcd halına düşən*)
– مُنْجَذِبٌ 1) heyran olmuş, valeh olmuş; 2) vəcdə gəlmiş; 3) ağlını itirmiş; 4) divanə, dəli, cinli

I جَذَرَ (u) جَذْرٌ 1) kökündən qoparmaq; 2) kökünü kəsmək; II جَذَّرَ 1) kökündən çəkib çıxartmaq; 2) kök buraxmaq; 3) *riyaz*. kök almaq
– تَجْذِيرٌ 1) kökündən qoparma; 2) kökünü kəsmə; 3) *riyaz*. kök alma
– جِذْرٌ *c.* جُذُورٌ *müxt. mənalarda*. kök; الملك ~ *bot*. mələkotu; تربيعيّ ~ *yaxud* مربّع ~ *riyaz*. kvadrat kök; ~الـ استخراج *riyaz*. kök alma; ~الـ علامة *riyaz*. kök işarəsi; الجذر الثنائي *qram*. ikisamitli kök; 2) əsas, təməl
– جِذْرِيٌّ 1) köklü, radikal; ~ـة تبدّلات köklu dəyişikliklər; 2) kök -i/-ı

جَذَعٌ *c.* جُذْعَانٌ 1) cavan oğlan, igid, qoçaq, dəliqanlı; 2) təzə (*işçi, şagird*)
– جَذَعًا *yaxud* جَذَعَةً yenidən, təzədən, bir daha
– جِذْعٌ *c.* جُذُوعٌ 1) kötük; gövdə; saplaq; tir;

– جَذَل sevinc, şadlıq, fərəh
– جَذِل c. جُذْلَان şad, şən; xoşbəxt
– جِذْل c. أَجْذَال , جُذُول kötük; gövdə
– جَذْلَان şad, şən
– جُذَيْل c. ات – dirək (dəvələrin sürtünməsi üçün)
I جَذَمَ (i) جَذْم 1) kəsmək, kəsib gödəltmək; budamaq; 2) məch. cüzama tutulmaq; IV أَجْذَمَ cüzama tutulmaq
– أَجْذَم q. جَذْمَاء c. جُذْم 1) cüzamlı, cüzama tutulmuş; 2) barmaqları əzilmiş, yaxud əli əzilmiş
– جُذَام tibb. cüzam
– جُذَامَة kövşənlik; kövşən
– جِذْم c. جُذُوم 1) kök; 2) gövdə
– مَجْذَم cüzamlılar üçün xəstəxana
– مَجْذُوم cüzamlı, cüzama tutulmuş
جُذْمُور c. جَذَامِير kötük
جُذْوَة , جِذْوَة c. جُذًى yanar kömür; köz; kösöv
I جَذَى (i) جَذْي mane olmaq, əngəl törətmək (nə isə etməyə عن)
I جَرَّ (ə/u) جَرّ 1) daşımaq, çəkmək, dartmaq, sürümək; ardınca çəkib aparmaq; جَرَّ المركب gəmini yedəyə almaq, yedəyə alıb aparmaq, yedəkləmək; جَرَّ المياه الى... harasa su çəkmək; جَرَّ الهواء الى جوفه canına hava çəkmək; جَرَّ قدميه ayaqlarını sürümək; جَرَّ نفسه الى zorla yerimək, sürünə-sürünə, ayaqlarını çəkə-çəkə getmək (harasa); كل يجرّ النار الى قرصه *At. sözü.* hər kəs öz keçəlini qaşıyar (*hərf. hər kəs odu öz kökəsinə tərəf çəkər*); 2) daşımaq, daşıyıb aparmaq; 3) çəkmək; sövq etmək, cəlb etmək (*nəyə* الى); جرّ الى الحرب kimisə müharibəyə sürükləmək; 4) çıxartmaq (*nədən* من); 5) *qram.* sözü yiyəlik halına salmaq; جرّ شكلا ...مع qovğa salmaq (*kiminləsə*); جرّ جريرة cinayət işlətmək (*kimə qarşı* على); II جَرَّرَ zorla dartıb aparmaq, sürükləmək; IV أَجَرَّ 1) yenidən çeynəmək (*saqqızı*); 2) təxirə salmaq (*ödənişi*); VII إِنْجَرَّ 1) zorla dartılıb aparılmaq, sürüklənmək, yedəyə alınmaq; مع التيار ~ axınla aparılmaq, axına düşüb getmək; 2) cəlb edilmək, sövq edilmək (*nəyə* الى); وراء عجلة... ~ hamıdan geridə qalmaq, arxada qalıb sürünə-sürünə getmək; الى الوراء ~ geriyə çəkilmək, kənarlaşmaq; انجرّ قدّامي! qabağımca sürün! انجرّ من هنا! çəkil buradan!; sürüş buradan!; VIII إِجْتَرَّ yenidən çeynəmək (*saqqızı*); X إِسْتَجَرَّ 1) yavaş-yavaş dartıb aparmaq, sürükləmək; 2) kreditə almaq
– إِجْتِرَار yenidən çeynəmə (*saqqızı*)
– إِنْجِرَار cəlb olunma, sövq edilmə
– إِنْجِرَارِيَّة 1) yedəyə alma; 2) yedəyə alma haqqı
– جَارّ 1) dartıb aparan, sürükləyən; 2) *qram.* yiyəlik halına salan
– جَارُور c. جَوَارِير siyirtmə
– جَرّ 1) sürümə, sürüyüb çəkmə; yedəkləmə; جرّ الاثقال mexanika (*ağırlıqların qaldırılması və daşınması üzrə*); *qram.* sözün yiyəlik hala salınması; حرف الجرّ *qram.* ön qoşması; هَلُمَّ جرًّا *bax:* هَلُمَّ
– جَرَّاء: من جرّاء ذلك bunun nəticəsində; bu səbəbdən
– جَرَّار 1. çoxsaylı (*ordu haqqında*); 2. 1) dulusçu; 2) qoşma platforma, üstüaçıq qoşma vaqon; و الحبل على الـ~ və ilaxır
– جَرَّارَة c. ات – 1) traktor; (ذات) جنازير ~ *yaxud* (ذات) حصيرة ~ *yaxud* بحصيرة ~ tırtıllı traktor; كهربائية ~ elektrik traktoru; 2) yan qayışı (*qoşquda*); 3) sarı əqrəb



– جَرَّة[1] c. ات – təkan; sərt hərəkət; من القلم بـ~ bir qələmə, irəlisini-gerisini düşünmədən, bir anda
– جَرَّة[2] c. جَرَّات , جِرَار küvec, bardaq, küpə; بينه وبينها كسر الـ~ *məcaz.* araları dəyib; ما كل مرّة تسلم الـ~ *At. sözü.* su çanağı suda sınar
– جُرَّة c. جُرَر iz; təkər izi; cığır, yol
– جِرَّة c. أَجِرَّة saqqız
– جَرِير c. أَجِرَّة noxta, ovsar
– جَرِيرَة c. جَرَائِر günah, pis iş, cinayət; و ذلك ... بـ~ bunun nəticəsidir; من ~ه onun ucbatından
– مُجْتَرّ gövşəyən; الحيوانات الـ~ة gövşəyən heyvanlar; الـ~ات c. gövşəyənlər
– مَجَرّ c. ات – nov
– مِجَرّ ötürücü qayış
– مَجَرَّة: الـ~ *yaxud* نهر الـ~ Ağ Yol, Süd Yolu, Kəhkəşan
– مَجَرِّيّ Süd Yoluna aid; العالم الـ~ Kəhkəşan
– مَجْرُور[1] 1) çəkilən, sürüdülən, aparılan; yedəyə alınmış; 2) *qram.* yiyəlik halına salınmış, yiyəlik halına düşmüş; الجارّ والـ~ ön qoşması və onun təsiri altında yiyəlik halına düşmüş söz
– مَجْرُور[2] c. مَجَارِير (*həmç.* المنزل ~) navalça; مدخل ~ qanov; مجارير kanalizasiya; شبكة المجارير kanalizasiya şəbəkəsi
جَرَاج *bax:* جرج
جِرَام c. ات – qram
جِرَامُوفُون c. ات – qramofon
جِرَانِيت qranit
– جِرَانِيتِيّ qranit (*sif.*)
I جَرُؤَ (u) جُرْأَة , جَرَاءَة 1) cürətli, qorxmaz, cəsarətli olmaq; 2) cürət etmək (*nəyə* على); II جَرَّأَ cürətləndirmək, ruhlandırmaq, ürəkləndirmək (*nəyə və ya kimə qarşı* على); V تَجَرَّأَ cürətlənmək, cəsarətlənmək (*nəyə* على); VIII إِجْتَرَأَ = V
– جَرَاءَة cürətlilik, cəsarətlilik, qorxmazlıq, igidlik
– جُرْأَة cürət; cəsarət; بـ~ cürətlə, cəsarətlə
– جَرِيء c. أَجْرِيَاء cürətli, cəsarətli, qorxmaz
I جَرِبَ (ə) جَرَب 1) yara-xura salmaq; qotur tutmaq; 2) tükləmək, tük tökmək, solmaq; II جَرَّبَ 1) təcrübədən keçirmək, yoxlamaq; təcrübə aparmaq; نفسه ~ özünü yoxlamaq (*nədə* في); 2) sınamaq, imtahan etmək; yoldan çıxarmaq, tovlamaq; V تَجَرَّبَ yoxlanmaq, imtahana məruz qalmaq; təcrübədən, sınaqdan keçirilmək
– أَجْرَب q. جَرْبَاء c. جُرْب 1) qoturluq -i/-ı; keçəlliyə, qoturluğa tutulmuş; yara-xura basmış; 2) tükü tökülmüş (*məs., quyruq*)
– تَجْرِبَة c. تَجَارِب 1) təcrübə, sınaq, yoxlama, eksperiment; التجارب النووية nüvə sınaqları; اجرى التجارب sınaq keçirmək; عرفه بالـ~ təcrübədən bilmək; الطبع ~ mətbəə korrekturası; راجع الـ~ korrekturanı oxumaq (*tashih etmək*) مدة الـ~ yoxlama müddəti; 2) təcrübə, vərdiş; 3) tovlama; 4) məşq; الغنائية الـ~ xorun məşqi; المسرحية الـ~ pyesin məşqi
– تَجْرِيب eksperiment aparma, təcrübə etmə, təcrübə qoyma; yoxlama
– تَجْرِيبِيّ eksperimental, təcrübi
– جِرَاب c. أَجْرِبَة 1) kisə; torba, çuval; çanta; çiyin çantası; 2) qın; (المسدس) الفرد ~ qobur, tapancaqabı; 3) *anat.* xayalıq, xaya torbası
– جُرَاب c. جوارب , جُرَابات corab
– جَرَب 1) qaşınma, gicişmə; qotur, yara-xura, keçəllik; الحلاقين ~ *tibb.* parazitar sikoz; 2) qasnaq, köz, qartmaq (*yarada*)

- جَرِبٌ c. جِرَابٌ qotur; keçəl
- جَرْبَانُ c. جَرْبَى 1) bax: جَرِبٌ; 2) tükü tökülmüş, solmuş
- جَرِيبٌ c. أَجْرِبَة cərib (*100 قصبة مربّعة - ya və ya 1260-1592 m²-ə bərabər sahə ölçüsü*)
- جُرَيْبٌ *anat.* follikul vəzi, qovuqcuq
- مُجَرِّبٌ 1. sınaqdan keçirən, yoxlayan, təcrübə aparan; 2. 1) sınaqçı; 2) tovlayan, aldadan
- مُجَرَّبٌ yoxlanılan, sınaqdan çıxarılan; təcrübi
- جَرَبَنْدِيَّة c. اتٌ – ovçu çantası, ovçu heybəsi
- جَرْبُوعٌ c. جَرَابِيعُ 1) cərbu (*ərəbdovşanı*); 2) avara

تَجَرْثَمَ bakteriyalarla yoluxdurmaq; جَرْثَمَ rüşeym halında olmaq, yaradılmaq, törədilmək

- جَرْثَمَة bakteriyalarla yoluxdurma
- جُرْثُومَة c. جَرَاثِيمُ 1) kök, əsas; 2) rüşeym, nüvə; toxum; جراثيم منويّة *yaxud* جراثيم الذكر *biol.* kişi tənasül hüceyrəsi, məni; 3) mikrob, bakteriya; حرب الجراثيم bakterioloji müharibə; علم الجراثيم bakteriologiya
- جُرْثُومِيٌّ bakterioloji; الحرب الـ~ـة bakterioloji müharibə
- مُجَرْثَمٌ bakteriyalarla yoluxmuş

(جرج) II جَرَّجَ qaraja qoymaq (*maşını*)

- جَرَاجٌ c. اتٌ – qaraj

جَرْجَاوِيٌّ 1. Cərco əyalətindən olan; 2. cərcolu, Cərco sakini

جَرْجَرَ 1) guruldamaq; gumbuldamaq; gurultu qoparmaq, səs salmaq, uğuldamaq; الماء في حلقه ~ boğazını yaxalamaq, boğazını qarqara etmək; 2) çəkmək, sürütmək; نفسه من شدة العناء ~ *yaxud* قدميه (رجليه) من شدة العناء yorğunluqdan ayaqlarını güclə çəkmək, sürünə-sürünə gəzmək; وراءه ~ dalınca çəkib aparmaq; sürümək, çəkə-çəkə aparmaq

- جِرْجَارٌ *bot.* circar (*salat*), vəzəri; الماء ~ su vəzərisi; بَرِّيّ ~ yabanı vəzəri
- جِرْجِرٌ *topl.* paxla; مصريّ ~ acıpaxla
- جَرْجَرَة gurultu; səs-küy; 2) sürükləmə, darta-darta aparma
- جِرْجَارٌ = جِرْجِيرٌ

I جَرَحَ (ə) جَرْحٌ 1) yaralamaq; 2) incitmək, təhqir etmək; pisləmək; الشهادة ~ şahidin ifadələrini rədd etmək; اسمه ~ kimisə ləkələmək, bədnam etmək; II جَرَّحَ 1) çox yara vurmaq, bərk yaralamaq; 2) bir şeyin həqiqiliyini şübhə altına almaq; inanmamaq; rədd etmək (*şahidin ifadəsini*); etiraz etmək (*şahidin şahidliyinə*); V تَجَرَّحَ bərk yaralanmaq; VII اِنْجَرَحَ yaralanmaq; VIII اِجْتَرَحَ etmək, törətmək, işlətmək; السيّئات ~ pis işlər görmək; العجائب ~ möcüzələr yaratmaq

- تَجْرِيحٌ 1) yaralama; 2) incitmə, təhqir etmə; 3) rədd etmə (*şahidin ifadəsini*); etiraz etmə (*şahidin şahidliyinə*)
- جَارِحٌ 1) yaralayan, yaralayıcı; 2) təhqiredici, incidici; 3) aşındırıcı, yandırıcı, kəskin, acı; 4) yırtıcı (*heyvan, quş*)
- جَارِحَة c. جَوَارِحُ 1) orqan, əza, üzv (*bədənin*); بكلّ جوارحه bütün varlığı ilə; 2) yırtıcı quş
- جَرَّاحٌ, جَرَّائحِيٌّ cərrah
- جِرَاحَة[1] c. جِرَاحٌ, جِرَاحَاتٌ yara
- جِرَاحَة[2] cərrahlıq, cərrahiyyə; التجميل ~ plastik cərrahiyyə; غرفة الـ~ cərrahiyyə otağı; مائدة الـ~ cərrahiyyə masası
- جِرَاحِيٌّ 1. cərrahiyyə -i/-ı; عمليّة ~ـة cərrahiyyə əməliyyatı; 2. cərrah
- جُرْحٌ c. جُرُوحٌ, جِرَاحٌ yara; çapıq, kəsik
- جَرِيحٌ c. جَرْحَى yaralı



- مَجْرُوحٌ c. مَجَارِيحُ yaralı

I (جرد) جَرَدَ (u) جَرْدٌ 1) soyundurmaq, çılpaq etmək; 2) qabığını soymaq, təmizləmək; 2) məhrum etmək (*nədən* من); 4) siyahıya almaq; siyahı tutmaq, uçot aparmaq; inventarizasiya etmək; جَرِدَ (ə) جَرَدٌ 1) çılpaq olmaq, bitkisiz olmaq; 2) tükünü tökmək; solmaq; II جَرَّدَ 1) açmaq; soyundurmaq; çılpaq etmək, lüt etmək; السيف ~ qılıncı sıyırmaq; 2) qabığını, dərisini soymaq; 3) məhrum etmək (*nədən* من); من الجنسية ـه~ kimisə vətəndaşlıqdan məhrum etmək; من الحقوق ـه~ kimisə hüquqlarından məhrum etmək; من الرتبة ـه~ kiminsə rütbəsini alçaltmaq; من السلاح ـه~ kimisə tərk-silah etmək; من الملك ~ mülkiyyət haqqından məhrum etmək; من المعدّات ~ sökmək (*qurğunu, cihazı*); نفسه من ~ özünü təcrid etmək (*nədənsə*); boyun qaçırmaq (*nədənsə*); 4) ekspedisiya göndərmək, təchiz etmək; yürüşə hazırlamaq (*nə üçün* لـ *yaxud kimə qarşı* على); 5) mücərrədləşdirmək; V تَجَرَّدَ 1) açılmaq, soyulmaq, çılpaqlaşdırılmaq, sıyrılmaq, ifşa edilmək, aşkara çıxarılmaq; 2) təcrid olunmaq (*nədən* عن); məhrum olmaq (*nədən* عن); 3) özünü büsbütün həsr etmək (*nəyə* لـ); VII اِنْجَرَدَ 1) çılpaq, lüt olmaq; bitkidən məhrum olmaq; tükünü tökmək (*heyvanlar haqqında*)

- أَجْرَدُ q. جَرْدَاءُ c. جُرْدٌ 1) çılpaq, lüt; 2) bitkidən məhrum; الجرداء barsız torpaq; 3) tüksüz, keçəl
- أَجْرُودٌ *xalq dil.* tüksüz (*üz*)
- تَجَرُّدٌ qərəzsizlik, üzgörməzlik; marağı olmama
- تَجْرِيدٌ 1) açma, çılpaqlaşdırma, ifşa etmə; 2) qabığını soyma; 3) məhrum etmə (*nədən* من); من السلاح ~ tərk-silah etmə; demilitarizə etmə; 4) ekspedisiya yola salma, təchiz etmə; yürüşə təchiz etmə; 5) mücərrədləşdirmə; təcrid etmə; abstraksiya; مذهب الـ~ abstraksionizm; 6) sökmə (*qurğunu, cihazı*); 7) qərəzsizlik, mənfəətdar olmama, marağı olmama, üzgörməzlik
- تَجْرِيدَة c. اتٌ – hərbi dəstə
- تَجْرِيدِيٌّ mücərrəd, abstrakt, təcridi; الرسم الـ~ abstrakt rəsm; الفنّ الـ~ abstrakt sənət; لوحة ~ـة abstrakt lövhə
- تَجْرِيدِيَّة abstarksionizm
- جَرَادٌ *topl.* çəyirtkə; نطّاط ~ omar, dəniz xərçəngi
- جَرَادَة c. اتٌ – çəyirtkə
- جَرْدٌ[1] 1) uçot; yoxlama; السنويّ الـ~ illik uçot (*malların*); قائمة الـ~ inventar siyahısı; 2) siyahı, reyestr
- جَرْدٌ[2] c. جُرُودٌ köhnə yun şal
- جَرَدٌ c. أَجْرَادٌ yalın, çılpaq, bitkisiz torpaq
- جَرِدٌ 1) çılpaq; 2) bitkisiz
- جَرِيدٌ *topl.* çılpaq xurma budaqları
- جَرِيدَة[1] c. اتٌ - çılpaq xurma budağı
- جَرِيدَة[2] c. جَرَائِدُ 1) qəzet; الرسمية الـ~ ofisioz, rəsmi qəzet; الشبيهة بالرسمية الـ~ yarımofisioz, yarımrəsmi qəzet; اليومية الـ~ gündəlik qəzet; 2) siyahı
- مِجْرَدٌ c. مَجَارِدُ fırça; الاسنان ~ diş fırçası
- مُجَرَّدٌ 1) çılpaq, lüt; ~ (ملك) شاه *şahm.* tənha şah; 2) sadə, adi; بعين ~ة adi gözlə; التشابه ~ sadəcə oxşarlıq; 3) məhrum edilmiş (*nədən* من); منطقة ~ة من السلاح tərk-silah (*demilitarizə*) edilmiş bölgə; 4) mücərrəd, abstrakt; بصورة ~ة mücərrəd, abstrakt tərzdə; 5) *qram.* ilk, ibtidai; فعل ~ I bab feli; ~ بـ~ a) ancaq… görə; təkcə… görə; b) …-dən

– تَجَاسُرٌ qorxmazlıq, igidlik

– جَسَارَةٌ cəsarət, cəsurluq, qoçaqlıq, qorxmazlıq

– جَسَارِيَّةٌ c. اتٌ – ponton (*körpü üçün*), üzən körpü

– جِسْرٌ c. جُسُورٌ 1) qum təpəsi; bənd; dəhnə; 2) körpü (*həmç. stomatologiyada*); şax döşənək, çırpı döşənək; سكّة الحديد ~ dəmir yolu körpüsü; عائم ~ ponton körpüsü, üzən körpü; متحرّك ~ mütəhərrik körpü; açılan körpü; معلّق ~ asılı körpü; 3) tir, çatı; جسور حديديّة dəmir çatılar; جسور خشبيّة ağac tirlər

– جَسُورٌ c. جُسُرٌ cəsur, çox cəsarətli, qoçaq; dəliqanlı

– مُتَجَاسِرٌ qoçaq, igid, cəsur

تَجَسْطَنَ yayılıb uzanmaq (*harada* في)

I جَسُمَ (u) جَسَامَةٌ böyük, iri, cüssəli, görkəmli olmaq; II جَسَّمَ 1) təcəssüm etdirmək; ـه بالجصّ~ kiminsə obrazını gipsdə təcəs-

– جُسْمَانٌ bədən, cüssə; kütlə

– جُسْمَانِيٌّ 1) cismani; 2) fiziki; العمل الـ~ fiziki əmək; ~ـا او معنويّا fiziki və ya mənəvi olaraq; 3) maddi

– جِسْمِيٌّ 1) cismani; 2) fiziki; 3) maddi

– جَسِيمٌ c. جِسَامٌ 1) böyük, iri, cüssəli; 2) canlı, dolğun, boylu-buxunlu; 3) mühüm

– جُسَيْمٌ c. اتٌ - cisimcik; zərrəcik

– جُسَيْمَةٌ c. اتٌ - cisimcik; *fiz.* ən kiçik hissəciklər (*maddənin*); الجسيمات الشمسيّة günəş korpuskulları; الجسيمات المضادّة للمرض *tibb.* anticisimciklər

– مُجَسَّمٌ 1. 1) böyük, iri, cüssəli, gövdəli; 2) şişirdilmiş; 3) qabarıq, qabardılmış; relyef -i/-ı; الخريطة الـ~ـة relyef xəritəsi; القطع ~ الزائد 2. *riyaz.* üçölçülü həndəsi cisim; hiperboloid

I جَسَا (جسو) (u) جُسُوٌّ möhkəm, bərk, kobud, cod olmaq



– أَجْشَرُ q. جَشْرَاءُ c. جُشْرٌ xırıltılı, batıq

جَشَعٌ tamahkarlıq, acgözlük

– جَشِعٌ tamahkar, acgöz

I جَشِمَ (ə) جَشْمٌ 1) özünə zəhmət vermək, özünü əziyyətə salmaq, üzərinə yük götürmək; 2) dözmək, tab gətirmək; المشقّة ~ məşəqqətə, çətinliyə dözmək; II جَشَّمَ yükləmək (*kimə*), zəhmətə salmaq (*kimi*); V تَجَشَّمَ 1) boynuna yük götürmək; 2) məruz qalmaq (*təhlükəyə*); 3) itki, tələfat vermək

(جشى) V تَجَشَّى = V تَجَشَّأَ *bax:* جشأ

(جصّ) II جَصَّصَ gips çəkmək; malalamaq

– جِصٌّ *min.* gips

– جَصَّاصَةٌ c. اتٌ – gipsi bişirmək üçün soba

تَجَسْطَنَ = تَجَصْطَنَ

جَعَانٌ *bax:* جوع

(جعب) II جَعَّبَ 1) çevirmək, döndərmək, tərs üzünə çevirmək; 2) yerə atmaq

– جَعْبَةٌ c. جِعَابٌ oxqabı, oxluq; çanta; patron-

I جَعُدَ (u) جُعُودَةٌ , جَعَادَةٌ 1) qıvrım, buruq-buruq olmaq (*saç*); 2) qırışıq, qırış-qırış olmaq (*dəri*); II جَعَّدَ 1) burmaq, qıvrıltmaq; 2) qırışıq əmələ gətirmək; V تَجَعَّدَ 1) burulmaq, buruq-buruq düzümlənmək, qıvrılmaq (*saç*); 2) qırışmaq

– أَجْعَدُ q. جَعْدَاءُ c. جُعْدٌ qıvrım, buruq; qıvrımsaç, buruqsaç

– تَجَعُّدَاتٌ c. qırışıqlar, büküklər, qatlar

– تَجْعِيدٌ c. تَجَاعِيدُ qırışıq, bükük, qat

– جَاعِدٌ döşənək, döşənəcək

– جَعْدٌ [1] c. جِعَادٌ qıvrım, buruq; qıvrımsaç, buruqsaç

– جَعْدٌ [2] c. جِعَادٌ (*həmç.* اليدين ~ *yaxud* اليد ~) simic

– جَعْدَةٌ c. اتٌ - 1) zülf, tel; burum, qıvrım; 2) qat, qırış

– جَعْدِيٌّ burulan, qıvrılan, qıvrım, buruq-buruq

[redacted]

- مُجَلِّد cildçi
- مُجَلِّداتِيّ c. مُجَلِّداتِيَّة = مُجَلِّد
- مِجْلَدَة c. مَجَالِد şallaq, qırmanc, qamçı

I جَلَزَ (i) جَلْز 1) bürmələmək, bükmək, yığmaq; bağlamaq; 2) şallaqlamaq, qamçılamaq, qırmanclamaq
- جِلَاز , جِلَازَة qayış (*şallağın, qırmancın, qamçının*)
- جَلَسَ (i) جُلُوس oturmaq; əyləşmək; II جَلَّس

[redacted]

تامّة *yaxud* ~عامّة بكامل الاعضاء plenar iclas; ~ المستعجلة الـ~ təcili, fövqəladə iclas; مقفلة ~ *yaxud* مغلقة~ *yaxud* سريّة~ bağlı, gizli iclas; فتح الـ~ iclası açmaq; 2) oturum, seans; قرأت الكتاب ~ين kitabı iki oturuma oxuyub qurtardım
- جِلْسَة götürüm, atil, tənbəl
- جِلْسَة minik, minmə; oturuş جلس جلسة التأمّر والتنفخ amiranə və lovğa oturuşla oturmaq
- جُلُوس 1) oturma; 2) taxta çıxma; عيد الـ~ taxta çıxma bayramı
- جَلِيس c. جُلَسَاء , جُلَّاس 1) qonşu (*parta, masa qonşusu*); 2) yoldaş, oturub-duran, tay-tuş; həmsöhbət
- مَجْلِس c. مَجَالِس 1) məclis; iclas yeri; اتّخذ ~ـه المألوف o, adətən oturduğu yerdə oturdu; اخذ ~ـه حيالهم o onlara müqabil

tərəfdə öz yerini tutdu; 2) iclas, toplantı; 3) cəmiyyət; birlik; 4) şura, idarə, palata; الأمّة ~ milli məclis; النيابي ~الـ parlament; التشريعي ~الـ qanunvericilik məclisi; الشورى ~الـ məşvərət şurası; şura; الشيوخ ~ şeyxlər palatası, senat; النوّاب ~ vəkillər palatası, nümayəndələr palatası; اللوردات ~ lordlar palatası; الدفاع ~ Müdafiə Şurası; الجامعة ~ universitetin şurası; الرقابة ~ nəza-

[redacted]

I جَلَطَ (i) جَلْط 1) qırxmaq (*başı*); 2) sürtmək; sıyırmaq; soymaq (*dərini*); V تَجَلَّطَ laxtalanmaq (*qan*)
- تَجَلُّط koaqulyasiya, pıxtalaşdırılma, laxtalanma (*qanda*)
- جَلْط sürtmə, sıyırma, soyma (*dərini*)
- جُلْطَة qan laxtası, pıxtı, tromb; الدموية ~الـ *yaxud* الدم ~ *tibb.* emboliya, damarların tutulması, tıxanması

I جَلِعَ (ə) جَلَع pis tərbiyə olunmaq; ədəbsiz olmaq; IV أَجْلَعَ = I

I جَلِفَ (ə) جَلَافَة kobud, yontalanmamış, mədəniyyətsiz olmaq
- جِلْف c. أَجْلَاف 1. kobud, yontalanmamış, ədəbsiz, tərbiyəsiz; 2. qaba, nəzakətsiz adam

جَلْفَطَ qatranlamaq, qatran çəkmək, kəpitkələmək (*gəmini*)
- جَلْفَطَة qatranlama, kəpitkələmə



جَلْفَنَ qalvanizasiya etmək
جَلْفَنَة qalvanizasiya etmə

I جَلَمَ (i) جَلْم kəsmək, qırxmaq (*yun*); VIII إِجْتَلَمَ = I
- جَلَّام qırxıcı, qoyunqırxan
- جُلَامَة , جَلَامَة qırxılmış yun
- جَلَم *yaxud təsn:* جَلَمَان yunqırxan qayçı

جَلْمَد c. جَلَامِد 1) qaya; 2) qaya parçası; buzlaq daşı

[redacted]

mək, köçüb getmək, təxliyə edilmək (*haradan* من, عن); 3) təmizləmək, pardaxlamaq, parıldatmaq, cilalamaq; 4) kənar etmək, qovmaq (*haradan* عن) لصدأ ~ pasını qaşıyıb tökmək (*nədən* عن); 5) aşkar etmək, göstərmək; II جَلَّى aydınlaşdırmaq, açıb göstərmək; III جَالَى məlumat vermək (*nə barədə*), diqqətinə çatdırmaq (*təsirlik halda və ya* بـ); هذا الكتاب على الناس ~ o bu kitabı nəşr etdi; IV أَجْلَى çıxıb getmək, kənar olmaq, uzaqlaşmaq (*haradan* من); 2) uzaqlaşdırmaq, kənar etmək; təxliyə etmək, köçürmək; V تَجَلَّى 1) aydın olmaq, aydınlaşmaq; aşkar olmaq, açılmaq; 2) bütün aydınlığı ilə görünmək (*kimin qarşısında* على); VII إِنْجَلَى 1) aydın, aşkar olmaq; açıqlanmaq; aşkar görünmək; 2) çıxıb getmək, kənarlaşmaq, yan keçmək, təxliyə edilmək

(*haradan* عن); 3) pardaqlanmaq, cilalanmaq, parıltılı olmaq; 4) başa çatmaq, qurtarmaq (*nə ilə* عن); nəticədə alınmaq (*nəyin nəticəsində* عن); VIII إِجْتَلَى 1) aydınlaşdırmaq, açmaq, aşkar etmək, faş etmək; 2) görmək, sezmək, müşahidə etmək; X إِسْتَجْلَى aydınlıq, aşkarlıq istəmək; görməyə, bilməyə çalışmaq; aydınlaşdırmaq, aşkar etmək

[redacted]

bəsirət, qabaqcadan görmə; بـ~ و وضوح açıq-aydın, açıq-aşkar; gözgörəsi; 2) çıxıb getmə, köçmə, köçürülmə, təxliyə
- جِلَاء məlumatlandırma, diqqətə çatdırma
- جَلْو pardaxlama, parıldatma, cilalama
- جَلْوَة 1) parıltı, cilvə; 2) örtüyün (*ər evində gəlinin örtüyünün*) götürülməsi
- جَلِيّ aydın, aşkar, şübhəsiz; ا~ açıqcasına, açıq-aydın; من الـ~ ان... tamamilə aydındır ki...; كالشمس ~ gün kimi aydın
- جَلِيَّة c. جَلَايَا 1) aydın, aşkar şey; الامر ~ işin mahiyyəti; 2) düz xəbər
- مُتَجَلٍّ q. مُتَجَلِّيَة aydın, aşkar, gözgörəsi
- مَجْلًى c. مَجَالٍ təzahür; أُستقبل بمجالى التكريم o, böyük ehtiramla qarşılandı

جِلْوَاز c. جَلَاوِزَة polis

جَلْوَز topl. cəviz, qoz; خازن الـ~ sitta

– جَلْوَزَةٌ c. ات – bir dənə ceviz, bir dənə qoz
جَلُوكُوز qlükoza
– جَلُّونٌ c. ات – qallon
جِلِّين = جَلُّون
– جِلِّقَةٌ = جَلُّونَةٌ
جَلْوَيْن südotu (Sonchus oleraceus)
I جَلَى (i) جَلْيٌ pardaxlamaq, cilalamaq; II جَلَّى cıdırda hamını ötmək (at)
– جَلْيٌ pardaxlama, cilalama
– جَلِيزٌ 1) lük, qapaq, ağız; 2) dam pəncərəsi
– مُجَلٍّ cıdırda hamını ötmüş at
– جَلِّيَاتٌ = جَالُوتٌ
جَلَّطَ yağlamaq, piy çəkmək
– جَلْيَطَةٌ yağlama, piyləmə
I جَمَّ (ə/i) جَمٌّ 1) dolu olmaq, bol olmaq; çox olmaq; 2) doldurmaq; II جَمَّمَ 1) ağzınacan doldurmaq; 2) sıx bitmək (ot); IV أَجَمَّ istirahət vermək, dincəltmək; V تَجَمَّمَ 1) sıx bitmək (ot); 2) toplaşmaq, doluşmaq, yığışmaq; X اِسْتَجَمَّ 1) dincəlmək, istirahət etmək; gücünü toplamaq; 2) bol olmaq; otla örtülmək
– أَجَمُّ q. جَمَّاءُ c. buynuzsuz, qapaq
– اِسْتِجْمَامٌ dincəlmə, istirahət; دار الـ~ istirahət evi
– جَمٌّ 1. 1) bol, çoxlu; أحبّ حبًّا جمًّا çox sevmək; 2) dolu; جمّ النشاط enerji ilə dolu; 2. bolluq, çoxluq; جمّ وفير yaxud جمّ غفير a) böyük say; b) böyük kütlə
– جَمَامٌ tam dinclik, istirahət
– جُمَّةٌ c. جُمَمٌ darama; الشعر ~ saç düzümü
– مَجَمٌّ c. مَجَامٌّ sinə, yaxa
جَمْبَرِيٌّ topl. dəniz xərçəngi
– جَمْبَرِيَّةٌ c. ات – dəniz xərçəngi
جُمْبَاز (müq. et: جُنْبَاز) gimnastika; الـ~ الفنّي bədii gimnastika; القوي ~ atletik gimnastika
جُمْبَازِيٌّ 1. gimnastika -i/-ı; 2. gimnast

جُمْبَاز = جُمْبَازِيَّة –
جُمْبُوزِيَا: سمك ~ qambuziya (xırda balıq)
جَمْجَمَ mırtıldamaq, öz-özünə danışmaq, burnunun altında danışmaq; جَمْجَمَ = تَجَمْجَمَ
– جَمْجَمَةٌ qeyri-aydın nitq, mırtıldama, burnunun altında danışma
– جُمْجُمَةٌ c. جَمَاجِمُ kəllə, qafa tası; علم الـ~ kraniologiya
– جُمْجُمِيٌّ kəllə -i/-ı
I جَمَحَ (ə) جُمُوحٌ , جِمَاحٌ 1) baş aparmaq, hürkmək (at); من الحرب ~ məcaz. döyüş meydanından qaçmaq; 2) qızmaq, harınlamaq (at); 3) öz kefində olmaq; 4) dikbaşlıq etmək, ərini atmaq
– جَامِحٌ c. جُمَّحٌ 1) tərs, harın, kəhgir (at); 2) ipə-sapa yatmayan, azğın; رغبة ~ـة qarşısıalınmaz istək
– جِمَاحٌ 1) kəhgirlik, harınlıq (atda); 2) şıltaqlıq, tərslik; كبح ~ـه cilovlamaq, saxlamaq, çəkindirmək
– جُمَّاحٌ bot. erkəkcik
– جُمُوحٌ = جَامِحٌ
– جِمْخَانَةٌ cimxana (at və dəvə üstündə idman yarışı)
I جَمَدَ (u) جُمُودٌ , جَمْدٌ 1) donmaq; bərkimək; qurumaq; qatılaşmaq; qəlizləşmək; laxtalanmaq (qan); çürümək (süd); 2) donub qalmaq, yerində quruyub qalmaq (qorxudan, təəccübdən); في مكانه من الخوف ~ qorxudan yerində quruyub qalmaq, matı-mutu kəsilmək; (كفّه) ~ت يده o, simicdir; ~ فهمه لهذا الكتاب o bu kitabı anlaya bilmədi; ~ت نفسه على... biganə qalmaq (nəyəsə); II جَمَّدَ 1) bərkitmək; dondurmaq; 2) iqt. dondurmaq; الاموال ~ kapitalı dondurmaq; 3) laxtalandırmaq (qanı); çürütmək (südü); V تَجَمَّدَ



1) donmaq, buzla örtülmək, buz basmaq; bərkimək, quruyub qalmaq; 2) qatılaşmaq; laxtalanmaq (qan); çürümək (süd); 3) iqt. dondurulmaq; VII اِنْجَمَدَ 1) buz bağlamaq, donmaq
– تَجْمِيدٌ dondurma, bərk soyutma, dondurulma; الاموال ~ iqt. kapitalın dondurulması
– جَامِدٌ c. جَوَامِدُ 1) quru; 2) donmuş; bərk; soyumuş, donub qalmış; 3) möhkəm, güclü; ضربة ~ة güclü zərbə; 4) hərəkətsiz, tərpənməyən; 5) cansız, ölgün; kim. qeyri-üzvi; جَوَامِد minerallar; 6) qram. dəyişməz; فعل ~ felin dəyişməz, təsrif edilməz forması (məs. بِئْسَ , عَسَى , نِعْمَ); اليد (الكفّ) ~ simic
– جَمَادٌ c. ات – mineral, qeyri-üzvi maddə; عالم الجمادات cansız təbiət
– جَمَادِيٌّ mineral -i/-ı; qeyri-üzvi
– جُمَادَى الاولى ~ cümadəl-əvvəl (hicri-qəməri təqviminin 5-ci ayı – 30 gündür); الآخرة ~ cümadəl-axirə (hicri-qəməri təqviminin 6-cı ayı – 29 gündür)
– جَمْدٌ donma; bərkimə; donub qalma, soyuma; درجة الـ~ donma dərəcəsi
– جَمَدٌ c. أَجْمَادٌ buz; buz parçası
– جُمُودٌ 1) hərəkətsizlik; donuqluq; durğunluq; 2) cansızlıq; 3) bərklik, möhkəmlik
– مُتَجَمِّدٌ donmuş, buz bağlamış; bərkimiş; quruyub qalmış; المنطقة الـ~ة الشمالية Arktika; المنطقة الـ~ة الجنوبية Antarktika
– مُجَمَّدٌ donmuş; buzlu; لحم ~ buzlu, dondurulmuş ət; اموال ~ة iqt. dondurulmuş kapital
– مَجْمَدَةٌ c. مَجَامِدُ buzlaq (dağlarda)
I جَمَرَ (i) جَمْرٌ birləşmək, toplaşmaq, cəmləşmək; II جَمَّرَ 1) közərmiş kömürlə bişirmək; 2) toplamaq, birləşdirmək; V تَجَمَّرَ birləşmək; cəmləşmək; VIII اِجْتَمَرَ yellətmək (buxurdanı بالمجمرة)
– جُمَّارٌ topl. 1) özək (bitkilərdə); 2) xurma ağaclarının başları, çətirləri
– جُمَّارَةٌ c. ات – xurma ağacının başı, çətiri
جَمْرٌ topl. yanar köz; məcaz. bərk qəzəb; هرق على ~ك ماء sakit ol! (hərf. yanar közünün üstünə su səp); هو على مثل الـ~ من القلق o elə təşviş keçirirdi ki, sanki yanar köz üstündədir; على احرّ من الـ~ bax: احرّ
– جِمَارٌ = جَمْرٌ
– جَمْرَةٌ c. جَمَرَاتٌ 1) yanar köz; kösöv; لا يميّز بين التمرة والـ~ masal: o, xurmanı közdən ayıra bilmir; لو قلت تمرة لقال ~ masal: mən nə hayda, o nə hayda (hərf. mən xurma barəsində danışıram, o isə köz); 2) xırda daş; 3) tibb. çiban; خبيثة ~ a) irin, irinli yara; çiban; b) Sibir xorası
– مِجْمَرَةٌ c. مَجَامِرُ 1) kürə, manqal; 2) buxurdan
جُمْرُكٌ c. جَمَارِكُ gömrük; رسم الـ~ gömrük rüsumu
– جُمْرُكْجِيٌّ c. جُمْرُكْجِيَّةٌ gömrükçü
– جُمْرُكِيٌّ gömrük -i/-ı; التعرفة الـ~ة gömrük tarifi; الاجراءات الـ~ة gömrük rəsmiyyəti
جُمَّيْز topl. fironənciri; əncir
– جُمَّيْزَةٌ c. ات – firon ənciri, əncir (ağac və meyvə)
جَامُوسٌ topl. c. جَوَامِيسُ camış; البحر (النهر) ~ hippopotam, kərgədan; ~ لبو vağ (tünd-sarı)
– جَامُوسَةٌ c. ات – kəl, camış
جَمَّاسٌ çodar
جَمَشْت min. ametist
I جَمَشَ (u) جَمْشٌ tükləri təmizləmək; qırxmaq; II جَمَّشَ qıdıqlamaq; nazlamaq, oxşamaq
– جَمُوشٌ depilyator (tükləri təmizləmək üçün krem)

- جَمُوش = جَمِيش -

I جَمَعَ (ə) جَمْع 1) toplamaq; 2) yığmaq (*məhsulu*); 3) əhatə etmək, cəm etmək; شملهم ~ bir yerə yığmaq, birləşdirmək; 4) *riyaz*. toplamaq, cəmləmək, üs-üstə gəlmək; 5) الحروف ~ *poliq*. yığmaq; 6) qoşmaq (*nəyə* الى); 7) eyni zamanda bir neçə iş görmək (*hansı işi hansı ilə* بـ); birləşdirmək (*nəyi nə ilə* بين); 8) *qram*. cəmləmək (*müəyyən model üzrə* - على); عدته ~ kimə qarşı isə silah toplamaq; II جَمَّعَ 1) çoxlu miqdarda toplamaq, çox yığmaq, 2) cəmləşdirmək; 3) kollektivləşdirmək; 4) kolleksiya yığmaq; III جَامَعَ 1) kiminləsə birləşmək; 2) cinsi əlaqəyə girmək; IV أَجْمَعَ qərara gəlmək; razılaşmaq (*nə ilə*), həmfikir, həmrəy olmaq (*nədə* على); أَجْمَعُوا على أمرهم onların sözü düz gəldi; أجمعوا على القول... onlar bir səslə qərara gəldilər; V تَجَمَّعَ 1) toplaşmaq, yığılmaq; 2) bir qrupda birləşmək; 3) toplamaq, üs-üstə gəlmək, cəmləmək (*rəqəmləri*); 4) cəmləşdirilmək; VIII إِجْتَمَعَ 1) toplanmaq; 2) birləşmək; 3) görüşmək (*kiminlə* بـ); X إِسْتَجْمَعَ 1) toplamaq; hazırlaşmaq; قواه ~ var gücünü toplamaq

- إِجْتِمَاع c. ات - 1) iclas; yığıncaq; mitinq; جَمَاهِيرِيّ ~ mitinq; انتخابي ~ seçkiqabağı iclas;

ictimai işlər naziri; 2. sosioloq إِجْتِمَاعِيَّات c. sosial məsələlər; ictimai həyat hadisələri

- إِجْتِمَاعِيَّة ictimaiyyət

- إِجْمَاع yekdil qərar; yekdillik; ~الـ *fiqh*. fəqihlərin şəriət məsələlərində rəy yekdilliyi; بالـ~ yekdilliklə

- إِجْمَاعِيّ 1) kollektiv, ümumi; السلامة الـ~ـة kollektiv təhlükəsizlik; 2) yekdil; موافقة ~ـة yekdil razılıq

أَجْمَع q. جَمْعَاء c. أَجْمَعُون bütün; العالم ~ *yaxud* العالم باجمعه bütün aləm; المدينة جمعاء bütün şəhər; بـ~هم hamı bir yerdə

- تَجْمِيع 1) toplama, birləşdirmə; 2) yığma, montaj etmə

- تَجْمِيعِيّ yığma (*sif*.); montaj -i/-ı; الاعمال الـ~ـة montaj işləri

- جَامِع[1] 1. 1) toplayan; 2) tam, əhatəli; məzmunlu (*nitq*); 3) birləşdirici, toplayıcı; لا يجمعهم ايّ جامع بـ... onları birləşdirən heç bir şey yoxdur; 4) came (*məscid*); 2. 1) yığıcı, montajçı; 2) *həmç*. الحروف ~ mürəttib; 3) tərtibatçı, düzücü; kompilyator

- جَامِع[2] c. جَوَامِع məscid; الازهر ~ *yaxud* الـ~ الازهر əl-Əzhər məscidi (Qahirədə) الـ~ الاموي Əməvilər məscidi (Dəməşqdə)

- جَامِعَة c. ات - 1) ümumilik, birlik; الـ~ الاسلاميّة panislamizm; الـ~ الطورانيّة pantürkizm; الـ~ العربية panərəbizm; المصلحة ~ mənafe ümumiliyi; 2) birlik, ...



جِمَاع 1) birləşmə; cəm, yekun, məcmu; القول ~ و ان... sözün qısası...; 2) yığılma, dilbir olma, cinsi əlaqə; 3) yetərlilik

- جَمَّاع toplayan, yığan, toplayıcı, kollek-sioner; كهربائيّة ~ـة *el*. akkumlyator

- جَمَاعَة c. ات - 1) birlik, korporasiya; 2) cəmiyyət; icma; 3) qrup; camaat; 4) *hərb*. bölmə; 5) dəstə, guruh; الرَّجُل ~ a) ailə; b) arvad

- جَمَاعِيّ kütləvi, kollektiv; تدابير ~ـة kollektiv tədbirlər; المزرعة الـ~ـة kollektiv təsərrüfat; قتل ~ kütləvi qətl

- جَمَاعِيَّة kollektivlik; القيادة ~ kollegiallıq, kollektiv rəhbərlik

- جَمْع c. جُمُوع 1) toplama, birləşdirmə; كلمتهم ~ *yaxud* شملهم ~ dilbirlik, sözbirlik; birlik; 2) toplantı; 3) *riyaz*. toplama, cəmləmə; 4) iclas; 5) yığnaq, kütlə; 6) *qram*. cəm; الكثرة ~ say çoxluğu bildirən cəm; القلّة ~ say azlığı bildirən cəm; الـ~ ~ cəmin cəmi; اليد ~ yumruq

- جُمَع c. أَجْمَاع cəm, yekun, məcmu; bütövlük, tamlıq; قرأ الكتاب بـ~ o, kitabı büsbütün oxudu; (الكف) اليد ~ yumruq

- جُمْعَة c. جُمَع 1) həftə; الآلام ~ *din*. həzinlik həftəsi (*Pasxa ərəfəsindəki sonuncu həftə*); 2) يوم الـ~ cümə günü; يوم الـ~ الحزينة *dini*. həzinlik cüməsi

Assambleyası; الامم ~ *tar*. Millətlər birliyi; 4) çoxluq

جَمِيع 1. cəm, yekun, məcmu; بـ~ bütövlükdə, məcmu halında; 2. bütün, hamı; الناس ~ bütün insanlar; هم ~ onlar hamısı

- مُجَامَعَة birləşmə, cinsi əlaqə

- مُجْتَمَع c. ات - 1) toplantı, yığışma, görüş yeri; 2) iclas; 3) cəmiyyət; kollektiv; (البشريّ) الانسانيّ الـ~ insan cəmiyyəti

- مُجْتَمِع toplantı iştirakçısı

- مَجْمَع c. مَجَامِع 1) toplantı yeri; 2) iclas, qurultay, toplantı; العلميّ الـ~ elmlər akademiyası; اللغة العربيّة ~ Ərəb dili akademiyası; 3) kompleks; 4) blok; اخذ بمجامع القلوب ürəklərə yol tapmaq

- مُجَمِّع toplayan, toplayıcı; الكهرباء ~ *el*. akkumlyator

- مَجْمَعِيّ 1. akademik (*sif*.); akademiyaya aid; 2. akademik; akademiyanın əməkdaşı

- مَجْمُوع 1. toplanmış, yığılmış, bir yerdə götürülmüş; اومفروقا بـ~ bir yerdə və ya ayrıca; الحروف الـ~ـة *poliq*. yığım; 2. c. مَجَامِيع 1) cəm, məcmu; ümumi məbləğ; yekun; *riyaz*. cəm; c. مصانع التعدين ~ metallurgiya kombinatı; 2) kollektiv

- مَجْمُوعَة c. ات - məcmuə, toplu; kompleks; النظام الشمسيّ ~ *yaxud* الشمسيّة الـ~ günəş sistemi planetləri; 2) kolleksiya;

...bizə yaraşarmı; جَمَلَ (u) جَمْل toplamaq; birləşdirmək; cəmləmək; II جَمَّلَ bəzəmək, yır-yığış etmək, gözəlləşdirmək; zinət vermək (*nə ilə* بـ); III جَامَلَ 1) xoş, yaxşı, nəzakətlə rəftar etmək (*kiminləsə*); IV أَجْمَلَ 1) birləşdirmək, toplamaq, cəmləmək; 2) qısa ifadə etmək; 3) bir işi yaxşı görmək; V تَجَمَّلَ 1) bəzənmək; özünü yaraşığa salmaq; 2) ədəb-ərkanı, nəzakət qaydalarını gözləmək; في الكلام ~ şirin, nəzakətlə, xoş danışmaq; 3) dözmək; təmkin göstərmək; VI تَجَامَلَ bir-birilə xoş rəftar etmək; bir-birinə xoş sözlər demək; X إِسْتَجْمَلَ gözəl saymaq, gözəl hesab etmək

- إِجْمَالٌ 1) birləşdirmə, toplama, cəmləmə; 2) icmal, xülasə; qısa ifadə; بالـ~ qısaca, yığcam şəkildə; على بوجه الـ~ *yaxud* وجه الـ~ ümumiyyətlə

- إِجْمَالِيٌّ 1) ümumi, yekun, ümumiləşdirici; الضربات الـ~ـة *hərb.* bir nöqtəyə yönəldilmiş zərbələr; 2) icmal -i/-ı

- تَجَمُّلٌ 1) (*zahiri*) nəzakət; 2) dözüm

- تَجْمِيلٌ bəzəmə; جراحة الـ~ *bax:* جراحة; مستحضرات الـ~ kosmetik vasitələr

- تَجْمِيلِيٌّ bəzək -i/-ı; الجراحة الـ~ـة bərpaedici (*plastik*) cərrahiyyə

- جَمَالٌ gözəllik, qəşənglik, qanışirinlik, gözəşirinlik; cazibadarlıq; صاحبة ~ gözəl, məlahətli (*qadın*); ربّة (إلاهة) الـ~ gözəllik ilahəsi, Venera, علم الـ~ estetika

- جَمَّالٌ c. جَمَّالَةٌ çarvadar, çodar

- جَمَّالُونَ c. ات – *bax:* جَمَلُون

- جَمَالِيٌّ estetik; المتعة الـ~ـة estetik həzz; الذوق الـ~ estetik zövq; القيم الـ~ـة mənəvi dəyərlər

- جَمَالِيَّةٌ estetiklik, estetika

- جَمَلٌ c. جِمَال dəvə; بسنام ~ birhörgüclü dəvə; بسنامين ~ *yaxud* ذوسنامين ~ ikihörgüclü dəvə; اليهود ~ *zool.* buqələmun; الماء ~ qutan; ليس لهم في الامر ~ ولا ناقة onların işə heç bir aidiyyəti yoxdur

- جُمَّلٌ حساب الـ~ hərf hesabı (*əlifbanın rəqəm mənası daşıyan hərfləri üzrə; bax:* ابجد)

- جُمْلَةٌ c. جُمَل 1) cəm, məcmu; yekun; müəyyən say; sıra, bir neçə; من النصائح ~ اعطاهم o onlara bir neçə məsləhət verdi; و~ القول bir sözlə; بالـ~ a) bir sözlə; b) topdan, hamı bir yerdə; c) kütləvi miqyasda; اعتقالات بالـ~ kütləvi həbslər; بالـ~ والمفرّق *yaxud* بالـ~ والقطّاعي topdan və pərakəndə; تجّار الـ~ topdansatış alverçiləri; جملةً bütövlükdə; məcmu halında; جملةً وتفصيلا *yaxud* في ~ـه وتفصيله bütövlükdə və təfsilatı ilə; ümumiyyətlə və xüsusilə; من ~هم o cümlədən; ... في ~ ماحدّث وحدّثنا ان o sözarası (*o cümlədən*) bizə danışdı ki...; 2) خبريّة ~ *qram.* xəbər cümləsi; اسميّة ~ ismi cümlə; فعليّة ~ feli cümlə; [illegible]

- جَمَلُونَ c. ات – binanın qübbə şəklində olan yuxarı hissəsi; taxtapuş; çatı; qübbə; qoşaçatılı dam; سطح الـ~ damda at başı şəklində olan bəzək

- جَمَلُونِيٌّ tağlı; qübbəşəkilli

- جَمِيلٌ 1. gözəl, qəşəng; xoşagəlimli; məlahətli; 2. yaxşılıq; yaxşı iş; lütf, iltifat; معرفة الـ~ *yaxud* عرفان الـ~ *yaxud* اعتراف بالـ~ minnətdarlıq; yaxşılıq bilmə, təşəkkür; نكران الـ~ naşükürlük; جميلا çox gözəl;

- مُجَامَلَةٌ xoşrəftarlıq, xoşxasiyyətlik, iltifat; nəzakət; على سبيل الـ~ nəzakət xatirinə; مجاملة له kiməsə xoş getmək üçün



- مُجْمَلٌ 1. 1) cəmi; 2) qısa; 2. icmal; oçerk; sxem; qısa kurs (*məs., tarix kursu*); ... يظهر من ~ حاله ان hər şeydən görünür ki...; في ~ـه (بـ ~ـه) وتفصيله bütövlükdə və təfsilatı ilə

- مُجَمِّلٌ gözəlləşdirən, bəzədən, bəzəkçi

- مُجَمَّلَاتٌ c. bəzək əşyaları (*gümüşdən, qiymətli daşlardan*)

جُمَّانٌ *topl.* mirvari, inci

- جُمَانَةٌ c. ات – mirvari dənəsi, inci dənəsi

جَمْهَرَ toplamaq, yığmaq; تَجَمْهَرَ toplaşmaq, yığışmaq, axışıb gəlmək

- تَجَمْهُرٌ toplaşma, yığışma; yığın

- جَمَاهِيرِيٌّ kütləvi

- جَمَاهِيرِيَّةٌ kütləvilik, kütləvi xarakter, cəmahiriyyə

- جَمْهَرَةٌ toplantı, yığıncaq; yığnaq, toplu

- جُمْهُورٌ c. جَمَاهِير kütlə; dəstə; izdiham; guruh; xalq; الجماهير الغفيرة geniş kütlələr

- جُمْهُورِيٌّ 1) ümumi, xalq -i/-ı; respublika -i/-ı; 2) respublikaçı

- جُمْهُورِيَّةٌ c. ات – respublika; آذربيجان ~ Azərbaycan Respsbulikası

- مُجَمْهَرٌ 1. toplanmış; 2. c. ات – məcmuə, toplu; مجمهرات العرب *yaxud* المجمهرات Mücəmhərat – islamaqədərki yeddi qəsidə toplusu (*ərəb poeziyasında əhəmiyyətinə görə Müəlləqələrdən sonra ikinci yerdə duran*)

I جَنَّ (ə/u) جَنٌّ 1) gizlətmək, örtmək; جنّ الليل gecə düşdü; 2) *mach.* ağlını itirmək, dəli olmaq; II جَنَّنَ 1) dəli etmək, ağlını başından almaq; 2) cinləndirmək; hirsləndirmək, qəzəbləndirmək; IV أَجَنَّ ağlını başından almaq, dəli etmək; 2) gizlətmək, örtbasdır etmək; V تَجَنَّنَ dəli olmaq; ağlını itirmək; VI تَجَانَّ özünü dəliliyə vurmaq; X إِسْتَجَنَّ pərdələnmək (*nə ilə* بـ); 2) gizlənmək; 3) dəli hesab etmə

- جَانٌّ cinlər

- جَنَّانِيٌّ c. جَنَّانِيَّةٌ = جَنَّانٌ

- جَنَانٌ c. أَجْنَانٌ can; qəlb; ruh; ثابت الـ~ ruhən möhkəm, qorxmaz

- جُنَّانٌ , جُنَّانَةٌ sipər

- جِنَانٌ dəlilik

- جَنَّانٌ bağban

- جِنٌّ *hamç.* جِنَّةٌ *topl.* cinlər, ruhlar; عالم الـ~ cinlər aləmi

- جِنِّيٌّ cin

- جِنِّيَّةٌ c. ات – cin (*qadın şəklində*); pəri; البحر ~ su pərisi

- جَنَّةٌ c. جَنَّاتٌ , جِنَانٌ bağ; الـ~ cənnət; اهل الـ~ cənnət əhli, əməlisalehlər; أسكنه الله فسيح جنّاته Allah onun yerini cənnət eləsin!; ساكن الجنان cənnətlik; عصفور الـ~ qaranquş

- جُنَّةٌ c. جُنَنٌ 1) daldalanacaq (*nədənsə qorunmaq üçün*); 2) sipər

- جُنَانٌ = جُنَّةٌ

- جُنُونٌ 1) ağılsızlıq, dəlilik; ... من الـ~ ان ağılsızlıq olar ki...; جُنَّ جُنُونُهُ cin vurdu başına; cinləndi; dəli oldu; فنون الـ~ *məsəl.* hərə bir cür başını itirib (*hərf.* dəliliyin fənləri var); 2) qəzəb, hirs; 3) maniya, mübtəlalıq, düşkünlük, iddia; التعاظم ~ əzəmətlilik iddiası; الحريق ~ piromaniya (*odlamağa meyllilik*); السرقة ~ kleptomaniya (*oğurluğa meyllilik*)

- جُنُونِيٌّ şiddətli, dəhşətli, məkrli, iblisanə

- جَنِينٌ c. أَجِنَّةٌ rüşeym, embrion; علم الاجنة embriologiya

- جُنَيْنَةٌ c. جُنَيْنَاتٌ , جَنَائِنُ bağ, bağça

- جُنَيْنَاتِيٌّ c. جُنَيْنَاتِيَّةٌ bağban

- جَنِينِيٌّ rüşeym -i/-ı; embrional

– مِجَنّ , مِجَنَّة c. مَجَانّ sipər; قلب ظهر الـ~ silahı (kimə qarşısa) çevirmək; xəyanət etmək

– مَجْنُون c. مَجَانِين məcnun, dəli, ağılsız, quduz

I جَنَبَ (u) جَنْب 1) kənara qoymaq; 2) ...-dən kənarda saxlamaq; kənarlaşdırmaq; II جَنَّبَ = I; III جَانَبَ 1) yaxın olmaq; 2) qaçınmaq, kənar gəzmək; هذا الرأي لا يجانب الصواب bu nöqteyi-nəzər həqiqətə yaxındır; من قواعد النحو والصرف ~ qrammatika qaydalarını gözləməmək; V تَجَنَّبَ qaçınmaq, kənar gəzmək, yayınmaq, özünü kənara çəkmək; VI تَجَانَبَ 1) qaçınmaq, kənar gəzmək, yayınmaq, özünü kənara çəkmək; 2) qonşu, həmmərz olmaq; bir-birinə yaxın olmaq; VIII إِجْتَنَبَ = V; مُجْتَنَب qaçınılası şey

– إِجْتِنَاب yayınma, çəkinmə

– أَجْنَبِيّ c. أَجَانِب 1. 1) yad, kənar; 2) xarici; اللغات الـ~ـة xarici dillər; 2. yadelli, əcnəbi, xarici

– تَجَنُّب yayınma

– جَانِب c. جَوَانِب 1) yan, böyür, tərəf; cinah; المركب الايسر ~ gəminin sol cinahı; الـ~ الفرنسيّ Fransa tərəfi (*danışıqlarda*); اتّفق الـ~ان على ان... tərəflər razılıq əldə etdilər ki...; متعدّد الجوانب a) çoxtərəfli; çoxkünclü; b) çoxkünc; وحيد الـ~ birtərəfli; ~ـا kənara; kənarda; تركه ~ـا bir kənara qoymaq; كان بـ~ـه kiminsə tərəfində olmaq; وقف بـ~ـه kiminsə tərəfində durmaq; الى ~ هذا bununla yanaşı; من ~... bir tərəfdən..., [redacted]

məhəl qoymurlar; لا يؤمن ~ـه onun tərəfindən arxayınlıq yoxdur; ona etibar yoxdur; خاف ~ـه kimdənsə qorxmaq; اعطى صوته في ~... o, kiminsə lehinə səs verdi; فكانت النتيجة ٦١ الى ~ المشروع لصوت واحد ضدة nəticədə layihənin lehinə 61 səs, əleyhinə 1 səs verildi; علينا ان نناضل في ~ قوّات السلام والحريّة biz sülh və azadlıq qüvvələri ilə bir sırada mübarizə aparmalıyıq; 2) hissə, pay; عظيم ~ (*nəyinsə*) böyük bir hissəsi; هذا الخبر على ~ كبير (عظيم) من الاهميّة (الخطورة) bu xəbərin əhəmiyyəti çox böyükdür; ليّن الـ~ xoşrəftar; üzüyola; سهل الـ~ yumşaqxasiyyət; مرهوب الـ~ qorxunc

– جَانِبِيّ 1) yan, yandan, köndələn; صورة ~ـة *yaxud* منظر ~ profil; 2) əlavə, kənar, ikinci dərəcəli; ~ ناتج əlavə məhsul; 3) *fon.* lateral

– جَانِبِيَّة profil

– جَنَاب 1) tərəf, yan, böyür; 2) cənab (*əsasən əcnəbi – rəsmi şəxslərə müraciət*); العلم انكلترا قنصل ~ cənab İngiltərənin baş konsulu; كم ~ cənabınız

– جُنَاب plevrit (*ağ ciyər pərdəsinin iltihabı*)

– جَنَابَة 1) palçıq; 2) *dini.* murdarlama, təhqir etmə

– جَنَابِيَّة c. ـات – 1) dəmir yolu boyunca uzanan xəndək; 2) qum təpəsi; qalaq

– جَنْب c. جُنُوب , أَجْنَاب yan, böyür; tərəf; bort; *hərb.* cinah; ~ـا الى ~ (ـا) yan-yana; بـ~ـه onun yanında; على ~ tərəfinə; جنبه onun yanında; قعد جنب التليفون telefonun yanında oturmaq; ذات الـ~ plevrit; بين ~يه [redacted]



– جَنِيبَة c. ـات – 1) yan xurcun (*atın belinə çatılmış xurcunlardan biri*); 2) yan, tərəf, böyür; بجنباته *yaxud* في جنباته nəyinsə daxilində; بجنبات الحجرة otağın içində; بين جنبات المسجد məscidin divarları arasında; 3) kol

– جَنْبِيّ yan, köndələn

– جَنُوب 1) cənub; ~ـا cənuba tərəf, cənubda; 2) cənub küləyi; ~ شرقيّ cənub-şərqi; ~ غربيّ cənub-qərbi

– جَنُوبِيّ cənubi; القطب الـ~ Cənub qütbü

– جَنِيب 1. (*yandan*) aparılan; 2. dinc, itaətkar

– مُجَنَّبَة c. ـات – fligel, əsas binanın yanında tikilmiş əlavə bina

جَنَابِزَة c. gimnastlar; akrobatlar

– جِنْبَاز c. جَنَابِزَة gimnast; akrobat

– جُنْبَاز gimnastika (*müq. et:* جُمْبَاز)

– جُنْبَازِيّ *gimnastika söz. sif.*

– جُنْبَازِيَّة = جُنْبَاز

جُلْجُل = جُنْجُل

I جَنَحَ (a) جُنُوح , جَنْح 1) qanadından, əlindən yaralamaq; 2) düşmək (*gecə düşdü*); 3) saya oturmaq (*gəmi saya oturdu*); 4) səy etmək, çalışmaq (*nəyə* الى); meyil etmək (*nəyə* الى); meyil göstərmək (*nəyə* الى); getmək (*nəyə* الى); II جَنَّحَ 1) qanad qoymaq, qanadla təmin etmək; بيديه ~ əllərini yelləmək; 2) *məcaz.* qanad vermək, qanadlandırmaq; 3) kimisə taqsırlı bilmək, bir qəbahətdə günahlandırmaq; IV أَجْنَحَ 1) meyilləndirmək [redacted]

2. 1) yan, böyür,tərəf; qabırğa; 2) günahkar, taqsırlı

– جَانِحَة c. جَوَانِح *anat.* qabırğa; بين جوانحه qəlbində, ürəyində

– جَنَاح c. أَجْنِحَة , جَنَاحَات 1) qanad; 2) üzgəc; 3) fligel, korpus, pavilyon (*sərgidə*); 4) yan, tərəf, böyür; *hərb.* cinah; 5) pər (*məs., yelvuranın, havadəyişənin*) 6) himayə; هي تحت ~ـه o qadın onun himayəsindədir; 7) ətək (*paltarın*); منخفض الـ~ qolları yanına düşmüş; مقصوص الـ~ qanadı sınmış; على ~ الطائر *yaxud* على ~ السرعة quş qanadı üstündə, sürətlə; الحرب على ~ السرعة ildırımsürətli müharibə

– جُنَاح günah; təqsir, cinayət; لا جناح عليه ان... günah olmaz ki...

– جُنْح hissə (*gecənin*); تحت ~ الظلام gecənin qaranlığında

– جِنْح tərəf, qırağ, kənar; من الليل ~ gecənin bir çağı

– جُنْحَة c. جُنَح pis iş, pis əməl, günah, taqsır

– جَنُوح meyilli (*nəyə* الى)

– جُنُوح 1) meyillilik; 2) saya oturma

– جُنَيْح , جُنَيْحَة c. جُنَيْحَات qanadcıq; *av.* eleron

– جُنَيْح = جُنَيْح

– مُجَنَّح 1) qanadlı, qanadları olan; 2) qanadlanmış

(جند) II جَنَّدَ cəlb etmək (*bir təşkilata*); orduya yığmaq; hərbi xidmətə çağırmaq; səfərbər etmək; نفسه ~ özünü səfərbər etmək (*nə üçün* لـ); nə isə etməyi (لـ) boynuna götürmək, öhdəsinə götürmək, təklif [redacted]

hərbi xidmətə çağırış; səfərbərlik; الـ~ الاجباريّ icbari hərbi mükəlləfiyyət

- جُنْدٌ c. جُنُودٌ , أَجْنَادٌ ordu; hərbi hissə; جنود نظاميُّون nizami ordunun əsgərləri; جنود المظلّات paraşütçülər; الجنود المجنّدة saysız-hesabsız ordu

- جُنْدِيٌّ c. جُنُودٌ 1) əsgər, sıravi əsgər; hərbçi; ~ مستجدّ orduya yeni çağırılmış; قبر الـ~ المجهول naməlum əsgərin qəbri; 2) şahm. piyada; ~ المقثاة bostan uyuğu

- جُنْدِيَّةٌ 1) əsgərlik, hərbi xidmət; 2) hərbçilər; 3) militarizm

- مُجَنَّدٌ yeni əsgər, əsgərliyə yeni alınmış

جَنْدَارْمَة jandarma

جُنْدُبٌ c. جَنَادِبُ cırcırama

جَنْدَرَ basıb ütüləmək (*paltarı*)

- جَنْدَارَةٌ toxac (*paltarı basıb ütüləmək üçün*)

- جَنْدَرَةٌ 1) basıb ütüləmə (*paltarı*); 2) toxac (*paltarı basıb ütüləmək üçün*)

جَنْدَارْمَةٌ = جَنْدَرْمَةٌ

- جَنْدَرْمِيٌّ 1) jandarma -i/-ı; jandarma

جَنْدُفْلِي *topl.* istridyə

جَنْدَلَ yıxmaq, çevirmək, devirmək, aşırmaq

- جَنْدَلٌ c. جَنَادِلُ daş; qaya; astana, kandar (*çayda*)

- جَنْدَلَةٌ yıxma, çevirmə, devirmə, aşırma

- جُنْدُولَا , جُنْدُولَةٌ c. جُنْدُولَاتٌ qondola

(جنز) II جَنَّزَ meyiti cənazəyə qoymaq; meyit üzərində dua oxumaq; dəfn etmək

- جِنَازٌ , جُنَّازٌ c. جَنَانِيزُ dəfn mərasimi; dəfn

- جِنَازَةٌ c. جَنَائِزُ , جِنَازَاتٌ cənazə; صلاة الـ~ cənazə namazı

- جَنَائِزِيٌّ dəfn -i/-ı

جَنْزَبِيل zəncəfil (*müq. et:* زَنْجَبِيل); شراب الـ~ zəncəfil suyu; كعك الـ~ zəncəfilli kökə

جَنْزَرَ mis oksidi ilə, yaşıl boya ilə örtülmək

- جِنْزَارٌ , جِنْزَارَةٌ , جَنْزَرَةٌ mis oksidi, yaşıl boya

- جَنْزِيرٌ (*müq. et:* زَنْجِيرٌ) c. جَنَازِيرُ zəncir; طارة الـ~ zəncirin halqası; جنازير لتوصيل الحركة transmissiya; 2) tırtıl; جنازير الجرّارة traktorun tırtılları

- مُجَنْزَرٌ mis oksidi ilə örtülmüş; tırtıllı

(جنس) II جَنَّسَ 1) eynicinsli etmək; bənzətmək; 2) naturallaşdırmaq, vətəndaşlıq haqqı vermək; 3) çevirmək, döndərmək; 4) həmahəng etmək; eyni cür səsləndirmək; ~ الكسور *riyaz.* kəsirləri eyni məxrəcə gətirmək; III جَانَسَ 1) eyni, bənzər, həmcins olmaq; 3) ikimənalı ifadələr işlətmək; 4) əyləndirmək; tay-tuş olmaq, cur olmaq, yoldaşlıq etmək; V تَجَنَّسَ oxşadılmaq, bənzədilmək; *gram.* assimilyasiya olmaq; 2) naturallaşdırılmaq; ~ بالجنسيّة təbəəliyi, vətəndaşlığı qəbul etmək; VI تَجَانَسَ bənzəmək, həmcins olmaq

- تَجَانُسٌ 1) bənzərlik, oxşarlıq; həmcinslik; *miner.* izomorfizm; عدم الـ~ həmcins olmama; 2) tam uyğunluq

- تَجَنُّسٌ naturallaşma; təbəəliyi, vətəndaşlığı qəbul etmə

- تَجْنِيسٌ naturallaşdırma, vətəndaşlıq haqqı vermə

- جِنَاسٌ 1) uyğunluq; həmahənglik; 2) söz-oynatma; *üslub.* cinas, paronomaziya

- جِنْسٌ c. أَجْنَاسٌ 1) *biol.* cins; الـ~ البشريّ bəşər cinsi; 2) sort, növ; 3) qəbilə, irq, cinsiyyət, milliyyət; هو مصريّ الـ~ o, milliyyətcə misirlidir; ابناء ~ـه a) onun həmvətənləri; b) kişilər; بنات ~ـها a) onun (*qadının*) həmvətənləri; b) qadınlar; اولاد الـ~ qəbilənin, millətin və s. nümayəndələri; علم الاجناس البشريّة *yaxud* علم اصول اجناس antropologiya; نظريّة الاجناس irqi nəzəriyyə;



5) *gram.* cins; اسم الـ~ (c. اسماء الاجناس) *gram.* ümumi isim

- جِنْسِيٌّ 1) irqi; qəbilə -i/-ı; milli; 2) cinsi; اتّصال ~ cinsi əlaqə; لا ~ a) cinsiyyətsiz; qeyri-cinsi; b) apatrid, vətəndaşlığını itirmiş şəxs

- جِنْسِيَّةٌ 1) milliyyət (*millətə mənsubluq*) 2) təbəəlik; vətəndaşlıq; عديم الـ~ apatrid; اختار الـ~ vətəndaşlığı qəbul etmək اسقط (سحب , سلب) الـ~ عنه kimisə vətəndaşlıqdan məhrum etmək; اللا~ a) apatridizm; b) cinsiyyətsizlik; 3) cins

- مُتَجَانِسٌ eyni, həmcins, homogen

- مُجَانِسٌ bənzər, oxşar

- مُجَانَسَةٌ 1) bənzərlik, oxşarlıq; həmcinslik; 2) əyləndirmə

- مُجَنَّسٌ cins olmayan; qanı təmiz olmayan; 2) düdəmə, mələz

I جَنَفَ (ə) جَنَفٌ doğru yoldan çıxmaq (عن); 2) özbaşınalıq etmək; ədalətsizlik etmək (*öz vəsiyyətində*); III جَانَفَ çəkinmək, kənar gəzmək; VI تَجَانَفَ çəkinmək (*nədən* عن); boyun qaçırmaq (*nədən* عن); meyil göstərmək (*nəyə* الى , لـ)

- جَنَفٌ zülm, ədalətsizlik

جُنْفُصٌ , جُنْفَيْصَةٌ giş, qalın kətan parça, kisəlik parça

جَنْلَز *bax:* جلنز

جُنَّلَةٌ c. اتٌ – qısa tuman, yubka

I (جنى) جَنَى[1] (i) جَنْيٌ yığmaq, dərmək (*meyvə*); məhsul yığmaq; *məcaz.* bəhrəsini görmək; xeyir götürmək, faydalanmaq; جَنَى[2] (i) جِنَايَةٌ cinayət işlətmək (*kimə qarşı* على); على نفسها جنت براقش *məsəl.* insanın özü-özünə elədiyini heç kəs etməz; başına nə geilrsə, öz ucbatından gəlir; V تَجَنَّى günahlandırmaq; cinayətdə ittiham etmək; kiməsə (على) münasibətdə alçaq hərəkət etmək; kiməsə (على) böhtan atmaq; kiminsə (على) qeybətini qırmaq; ~ على الحقيقة haqqı qoyub nahaqqı tutmaq; VIII إِجْتَنَى yığmaq, dərmək (*meyvə*)

- تَجَنٍّ cinayətdə ittiham etmə (*kimi* على); kiməsə (على) münasibətdə alçaqlıq etmə; kiməsə (على) böhtan atma; qeybət etmə (*kimin barəsində* على); ...التجنّى ان ədalətsizlik olardı ki...

- جَانٍ *q.* جَانِيَةٌ c. جُنَاةٌ 1) yığan, dərən (*meyvə*); 2) cani; cinayətkar; günahkar

- جِنَائِيٌّ cinayət -i/-ı; cinayətkar

- جِنَايَةٌ c. اتٌ – cinayət

- جَنًى tər meyvələr (*üzüm, xurma və s.*)

- جَنْيٌ c. جَنَيَاتٌ yığım; məhsul yığımı

- مَجْنًى c. مَجَانٍ 1) meyvələrin yığım yeri; bağ; 2) *məcaz.* qaynaq

- مَجْنِيٌّ yığılan; yığılmış; ~ عليه a) zərərçəkən; b) cinayətin qurbanı

جُنَيْهٌ , جِنَيْهٌ c. اتٌ – cineyh; ~ انجليزيّ ingilis funtu; ~ مصريّ Misir funtu; ~ استرلينيّ funt sterlinq

جَهْبَذٌ , جِهْبِذٌ c. جَهَابِذَةٌ 1) görkəmli insan; bilici; 2) zirək, diribaş adam, bacarıqlı adam, hərif

I جَهَدَ (ə) جَهْدٌ 1) çalışmaq; səy göstərmək; cidd-cəhd etmək; mübarizə aparmaq (*çətinliklərlə*); ~ جهده الاقصى لـ... var gücü ilə səy göstərmək; 2) yormaq; əldən salmaq (*xəstəlik haqqında*); III جَاهَدَ var gücünü qoymaq; mübarizə aparmaq, vuruşmaq (*nə uğrunda* في سبيل); ~ في سبيل الدين din yolunda cihad etmək; IV أَجْهَدَ 1) zəhmətə salmaq, zəhmət vermək; gərgin qüvvə sərf etmək; ~ الذاكرة hafizəsinə, yaddaşına güc vermək;

نفسه ~ özünü yormaq (*nə ilə* بـ); 2) yormaq, əldən salmaq, üzmək; VIII اِجْتَهَدَ 1) çalışmaq, cidd-cəhdlə etmək; 2) *fiqh.* ictihad etmək – şəriət məsələləri ilə bağlı müstəqil rəy bildirmək (*bax:* اِجْتَهَادٌ)

– اِجْتِهَادٌ 1) cidd-cəhd; səy; çalışqanlıq; 2) *fiqh.* ictihad – ən yüksək bilik səviyyəsinə yetişmə və bəzi fiqh-ilahiyyat məsələlərini müstəqil həll etmək haqqı qazanma ləlrini müstəqil həll etmək haqqı qazanma lələrini müstəqil həll etmək haqqı qazanma; الـ~ في الشرع şəriət məsələlərinin mötəbər şərhi; الـ~ في المسائل القضائية fiqh məsələlərini müstəqil həll etmək haqqı; 3) müstəqil yaradıcılıq, (*qaynaqların*) müstəqil tədqiqi

– اِجْتِهَادِيٌّ ictihadi; müstəqil tədqiqata əsaslanan

– إِجْهَادٌ yorma, əldən salma, üzmə

– جِهَادٌ cidd-cəhd; cihad; mübarizə; ~ في سبيل الدين (الله) din (*Allah*) yolunda cihad, mübarizə

– جِهَادِيٌّ 1) cihada aid olan; mübariz

– جِهَادِيَّةٌ cihad xidməti

– جَهْدٌ *c.* جُهُودٌ 1) cəhd; cidd-cəhd; zəhmət; səy; بـ~ جهيد böyük zəhmətlə; بذل الـ~ الجهيد في... nə üçünsə bütün gücünü sərf etmək; 2) *el.* gərginlik; الـ~ العالى (المتوسّط ، المنخفض) yüksək, (orta, alçaq) gərginlik; أقسم جهد ايمانه ان... o, and-aman elədi ki...

– جُهْدٌ güc, qüvvə; bacarıq; gərginlik; cidd-cəhd; səy, zəhmət; الطاقة ~ gücü çatdıqca, var gücü ilə; المستطاع ~ *yaxud* الاستطاعة ~ imkana görə; ما ~ bacardığı qədər; ما يستطيع ~ bacardığı qədər

– جَهِيدٌ son dərəcə çətin, ağır

– مُجَاهِدٌ mücahid (*haqq iş uğrunda*); mübariz, döyüşçü

– مُجَاهَدَةٌ 1) mücahidə; cidd-cəhd; 2) mübarizə

– مُجْتَهِدٌ 1) çalışqan, zəhmətkeş, cidd-cəhd göstərən; 2) müctəhid, yüksək (*fiqhi-hüquqi*) bilik dərəcəsinə yetişmiş; الائمة المجتهدون müctəhid imamlar, qaynaqların sərbəst tədqiqi əsasında müstəqil rəy bildirən şəriət alimləri

– مُجْهَدٌ yorğun, əldən düşmüş, üzülmüş

– مَجْهُودٌ *c.* ات – cidd-cəhd, səy, zəhmət, enerji; بذل ~ه bütün gücünü sərf etmək; ذهبت مجهوداتهم عبثا onların zəhməti hədər getdi

I جَهَرَ (ə) جَهْرٌ (جهر) , جِهَارٌ 1) bərkdən, uca səslə danışmaq; 2) açmaq, elan etmək; etiraf etmək; bir işi hamının gözü qarşısında etmək (بـ); جَهُرَ (u) جَهَارَةٌ bərk, cingiltili olmaq (*səs*); II جَهَّرَ *fon.* cingiltili etmək; gurlaşdırmaq; III جَاهَرَ açıq, hamının yanında danışmaq, elan etmək, bəyan etmək; bildirmək, ifadə etmək; ~ها برأيه o öz fikrini ona (*o qadına*) açıq bildirdi; VI تَجَاهَرَ açıq çıxış etmək

– أَجْهَرُ *q.* جَهْرَاءُ *c.* جُهْرٌ 1) gündüz korluğundan əziyyət çəkən; 2) yaxıngörən

– جَاهِرَةٌ mikroskop

– جِهَارٌ aydınlıq, aşkarlıq; ~اً aydın, aşkar; açıq-aşkar; ~اً ونهارا günün günorta çağı

– جَهْرٌ 1. aydın, açıq, aşkar; ~اً aydın, aşkar olaraq; bərkdən, ucadan; 2. aydınlıq, aşkarlıq, açıqlıq

– جُهْرٌ (*zahiri*) görünüş, görkəm

– جَهْرَةٌ açıqlıq, aşkarlıq; جهرة açıq, aşkar, gur, bərkdən, ucadan

– جَهْرِيٌّ açıq, aydın

– جَهْوَرِيٌّ cingiltili, gur, bərk (*səs*); ~اً bərkdən, ucadan

– جَهِيرٌ bərk, uca, gur, yoğun; bas; الـ~ الاول bariton



– مِجْهَارٌ *c.* مَجَاهِيرُ 1) bərk, ucasəsli, gursəsli; reproduktor, səsucaldan

– مُجْهَرٌ bərk, gur, uca

– مُجْهَرٌ *fon.* gurlaşdırılmış, gur

– مِجْهَرٌ [1] = مِجْهَارٌ

– مِجْهَرٌ [2] *c.* مَجَاهِرُ mikroskop; الـ~ الكهربائي elektrik mikroskopu; الـ~ الالكتروني elektron mikroskop

– مِجْهَرِيٌّ 1) mikroskop -i/-ı; 2) mikroskopik

– مِجْهَرِيَّةٌ mikroskopiya

– مَجْهُورٌ *fon.* cingiltili, gur

I جَهَزَ (ə) جَهْزٌ axırına çıxmaq, nəfəsini kəsmək (*kimin* على); II جَهَّزَ 1) hazırlamaq; təchiz etmək (*nə ilə* بـ); 2) cehiz hazırlamaq (*gəlin üçün*); IV أَجْهَزَ = I; V تَجَهَّزَ hazır olmaq, təchiz edilmək; hazırlaşmaq, təchiz olunmaq

– تَجْهِيزٌ təchiz etmə; hazırlama

– تَجْهِيزَاتٌ *c.* təchizat; avadanlıq

– تَجْهِيزِيٌّ hazırlıq -i/-ı

– تَجْهِيزِيَّةٌ *c.* ات – hazırlıq sinfi

– جَاهِزٌ hazır; ملابس ~ة hazır paltarlar

– جَهَازٌ *c.* أَجْهِزَةٌ 1) bütün zəruri şeylər; təchizat; avadanlıq; 2) cehiz (*gəlinin*); 3) aparat; الدولة ~ dövlət aparatı; 4) cihaz; maşın; qurğu; الارسال (اللاسلكي) ~ radio ötürücü; الاستقبال (اللاسلكي) ~ radio qəbuledici; التليفزيون ~ televizor; الحاسب الـ~ elektron hesablayıcı maşın, EHM; الرادار ~ radar; الرحوي الـ~ siklotron; لتكييف الهواء ~ havanı dəyişdirmək üçün cihaz, kondisioner; 5) *anat.* sistem, orqan, cihaz, apparat; دموي ~ qan sistemi; عصبي ~ əsəb sistemi; هضمي ~ həzm cihazı; عضوي حي ~ canlı orqanizm

– مُجَهَّزٌ 1) təchiz edilmiş (*nə ilə* بـ); 2) hazır; ملابس ~ة hazır paltarlar

(جهش) IV أَجْهَشَ: بالبكاء ~ hönkürməyə, ağlamağa hazır olmaq

– جَهْشَةٌ *c.* ات – ağlama; hönkürtü

(جهض) IV أَجْهَضَ uşaq saldırmaq; abort əməliyyatı etmək; ~ت المرأة qadın uşaq saldı; vaxtından qabaq doğdu; مطالبه ~ kiminsə tələblərini yerinə yetirməkdən imtina etmək

– إِجْهَاضٌ uşaqsalma; abortetmə; abort

– جَهَّاضٌ cərrah-ginekoloq

– جِهَاضٌ = إِجْهَاضٌ

– جَهِيضٌ , جِهْضٌ salınmış uşaq, vaxtından qabaq düşmüş uşaq; ölü doğulmuş uşaq

– مُجْهِضٌ abortiv

I جَهِلَ (ə) جَهْلٌ , جَهَالَةٌ 1) cahil olmaq; 2) axmaq olmaq; 3) düşüncəsiz olmaq; 4) bilməmək; لا يجهل هذا احدٌ *yaxud* لا يجهل هذا انسان elə adam yoxdur ki, bunu bilməsin; bunu bilməyən yoxdur; II جَهَّلَ 1) cahillikdə ittiham etmək; 2) cahillik yaymaq, cahillikdə saxlamaq; VI تَجَاهَلَ 1) özünü bilməməzliyə vurmaq; 2) hesablaşmamaq (*nə ilə*), saya almamaq (*nəyi*); saymamaq, əhəmiyyət verməmək, məhəl qoymamaq; X اِسْتَجْهَلَ cahil hesab etmək

– أَجْهَلُ *q.* جَهْلَاءُ *c.* جُهْلٌ çox cahil

– تَجَاهُلٌ saymama, saya almama, əhəmiyyət verməmə; ~ من جهل او من cahillik ucbatından *yaxud* saymazlıqdan

– جَاهِلٌ *c.* جُهَّلٌ , جَهَلَةٌ , جُهَلَاءُ 1) cahil; 2) axmaq; nadan, savadsız, avam

– جَاهِلِيٌّ 1. cahili; islamaqədərki dövrdə yaşamış; العصر الـ~ cahiliyyə dövrü; 2. bütpərəst

– جَاهِلِيَّةٌ 1) cahillik; 2) bütpərəstlik; الـ~ *yaxud* الـ~ الجهلاء cahiliyyət, islamaqədərki dövr

- جَهَالَة 1) axmaqlıq; axmaq hərəkət; 2) cahillik, cəhalət, nadanlıq

- جَهْل 1) axmaqlıq; 2) bilməməzlik, cahillik, nadanlıq, avamlıq; من ~ nadanlıqdan, avamlıqdan; ولسنا من الـ~ بحيث نفكر في ذلك biz o qədər də axmaq deyilik ki, bu barədə fikirləşək; 3) düşüncəsizlik; 4) təcrübəsizlik

- جَهُول 1. son dərəcə cahil, nadan; 2. key, kütbeyin, avam

- مَجْهَل c. مَجَاهِل 1) tədqiq edilməmiş, öyrənilməmiş yer; مجاهل الصحراء Səhranın tədqiq edilməmiş yerləri; 2) səhra

- مَجْهُول c. مَجَاهِيل , مَجْهُولاَت 1. 1) məchul, naməlum, müəmmalı, əsrarəngiz; ~ الاصل naməlum mənşəli; 2) həmç. ~ الاسم anonim; كان ~ العين والاثر izi-sorağı olmamaq; عُدَّ في حكم الـ~ naməlum qismində sayılmaq; 2. 1) qram. məchul növ; صيغة للـ~ yaxud فعل مبنيّ للـ~ felin məchul növü; 2) riyaz. məchul; معادلة ذات عدة مجهولات bir neçə məchullu tənlik

- مَجْهُولِيَّة məchulluq, naməlumluq

I (جهم) جَهِمَ (ə) جَهْمٌ 1) qaşqabaqlı baxmaq; 2) qaşqabaqlı qəbul etmək (kimi); qaraqabaq qarşılamaq; جَهُمَ (u) جُهُومَة , جَهَامَة qaşqabaq tökmək; mısmırığını sallamaq; üz-gözünü turşutmaq; tutulmaq; V تَجَهَّمَ 1) qaşqabaq tökmək; tutulmaq, qanı qaralmaq; ~ الجوّ a) qaranlıq düşdü; b) məcaz. vəziyyət gərginləşdi; 2) qaşqabaqlı, tutqun nəzərlərlə baxmaq (kiməsə təs. halda və yaxud لـ)

- جَاهِم tutqun, qaşqabaqlı, üzügülməz

- جَهَام topl. qara, tutqun buludlar (yağışsız)

- جُهُومَة , جَهَامَة qaraqabaqlıq, qaşqabaqlılıq, tutqunluq, üzügülməzlik

- جَهْم qaşqabaqlı, qaraqabaq

- جَهْم = مُتَجَهِّم

(جهنم) جَهَنَّم q. cəhənnəm

- جَهَنَّمِيّ cəhənnəm -i/-ı; آلة ~ـة cəhənnəm maşını

جِهَة bax: وجه

(جهو) II جَهَّى açmaq, aralamaq, genişləndirmək (yaranı)

- أَجْهَى q. جَهْوَاء çılpaq, örtülməmiş; بيت ~ üstü örtülməmiş ev; رأس ~ daz baş

جِهَوِيّ bax: وجه

جَوّ c. أَجْوَاء , جِوَاء 1) hava, atmosfer; اجواء البلاد ölkənin hava məkanı; سلاح الجوّ hərbi-hava qüvvələri; جوا hava ilə, təyyarə ilə; 2) məcaz. atmosfer, şərait; في جوّ من الودّ والصداقة dostluq və mehribanlıq şəraitində; في جوّ التفاهم المتبادل qarşılıqlı anlaşma şəraitində; وجرت المناقشة في جوّ من المبدئيّة العالية müzakirələr yüksək prinsipiallıq şəraitində keçdi; 3) göy; 4) geniş vadi; 5) hava; iqlim; 6) məcaz. əlverişli zəmin; münasib şərait; 7) fiz., tex. (bir) atmosfer (təzyiqi ölçərkən); الجوّ النفسيّ hal, əhval-ruhiyyə; التحف الجوّ sığınacağı olmamaq; اخلى الجوّ sərbəst buraxmaq (kimi لـ)

- أَجْوَائِيّ meteoroloq

- جُوَّا , جَوَّا xalq dil. içəridə

- جَوَّانِيّ , جُوَّانِيّ daxili, içəri

- جَوِّيّ 1) hava -i/-ı; اسطول ~ hava donanması; بريد ~ aviapoçt; غارة ~ـة hava hücumu; 2) atmosfer -i/-ı; ظواهر ~ـة atmosfer hadisələri; الاحوال الـ~ـة hava şəraiti, hava; سوء الاحوال الـ~ـة pis hava şəraiti; علم الارصاد الـ~ـة meteorologiya; الضغط الـ~ hava təzyiqi; 3) hava -i/-ı; حجر ~ meteorit; 4) radio antenna

- جَوِّيَّات c. hava, atmosfer şəraiti

جُوَافَة bot. quvafa (meyvə və ağac)



جُوَال bax: جول

جُوَالِق c. جَوَالِق , جَوَالِيق = جُوَال

جُوَال c. ـات – tex. aralıq, ara qat

جُوَانْتِي c. جُوَانْتِيَات əlcək; əlcəklər; جلد ~ dəri əlcəklər; صوف ~ yun əlcəklər

I (جوب) جَابَ (u) جَوْب 1) səyahət etmək; dolanmaq; gəzib dolanmaq; başdan ayağa öyrənmək; 2) nüfuz etmək, içinə girmək; 3) yarıb keçmək; yarmaq; 4) kəsmək; biçmək; 5) جَاب xalq dil. gətirmək; III جَاوَبَ cavab vermək (kimə); IV أَجَابَ 1) cavab vermək; ~ـه (على) عن السؤال kiminsə sualına cavab vermək; etiraz etmək; 2) cavab vermək; müvafiq olmaq (nəyə لـ); qane etmək; 3) razılaşmaq (nəyə الى); VI تَجَاوَبَ 1) bir-birinə cavab vermək; 2) uyğun gəlmək; 3) səsləşmək; 4) əks-səda vermək; VII إِنْجَابَ keçmək; dağılmaq (əndişə, qaranlıq haqqında); VIII إِجْتَابَ tədqiq etmək, öyrənmək; ~ الارض yer üzünü gəzib dolanmaq; X [1] إِسْتَجَابَ diqqətlə dinləmək (yalvarışı); cavab vermək (səsə); eşitmək (kimisə لـ); X [2] إِسْتَجْوَبَ dindirmək; sorğu-sual etmək; 2) sorğu göndərmək (məs., parlamentdə)

- إِجَابَة c. ـات – 1) cavab; ...إجابةً على... cavab olaraq; 2) yerinə yetirmə, əməl etmə; ~ لطلبكم xahişinizi yerinə yetirərək; 3) razılıq; 4) itaət

- إِسْتِجَابَة 1) əməl etmə, yerinə yetirmə (xahişi); ... ~ لطلبكم xahişinizi yerinə yetirərək; 2) uyğunluq (nəyə لـ); 3) reaksiya, əks-səda

- إِسْتِجْوَاب c. ـات – 1) dindirmə; ~ الخصوم hüq. tərəflərin dindirilməsi; 2) sorğu; parlament sorğusu

- إِنْجِيَاب dağılma, keçib getmə (dumanın, buludun və s.)

- جَائِبَة c. جَوَائِب yenilik, xəbər

- جَوَاب c. أَجْوِبَة , جَوَابَات 1) cavab; 2) replika, atmaca; 3) xalq dil. məktub; 4) mus. oktava

- جَوَّاب 1. səyahət edən; gəzən, gəzib dolaşan; dənizdə çox üzən (gəmi); 2. səyyah; yolçu; turist

- جَوَّابَة görkəmli səyyah

- جَوَابِيّ cavab -i/-ı; رسالة ~ـة cavab məktubu

- جَوْب 1) gəzmə, dolaşma, səyahət; 2) öyrənmə; 3) nüfuz etmə

- جُوب q. yubka; قصيرة ~ qısa yubka

- جَوْبَة c. جُوَب 1) dəlik; 2) kəsik yer, açıq yer (qadın paltarında)

- مِجْوَب c. مَجَاوِب burğu

- مُجِيب cavab verən; ولكن لا من ~ ولا سميع lakin nə cavab verən var, nə eşidən

جُوت cüt

جُوتَر tibb. boğaz uru; qalxanvari vəzi

I (جوح) جَاحَ (u) جَوْح məhv etmək, həlak etmək; süpürüb atmaq; IV أَجَاحَ tələf etmək, məhv etmək; VIII إِجْتَاحَ 1) məhv etmək, tələf etmək, həlak etmək; viran etmək, xaraba qoymaq (məs., ölkəni); 2) süpürüb aparmaq; götürüb aparmaq (dalğa, sel haqqında); sürətlə, gurultu ilə keçib getmək (fırtına, dalğa, tətil və s.)

- جَائِحَة c. جَوَائِح 1) bəla, fəlakət, müsibət; 2) fırtına, tufan, boran; 3) taun

جُوخ c. أَجْوَاخ mahud; مفرش من الـ~ الاخضر yaşıl mahud süfrə; مسح ~ـه kiminsə qarşısında quyruq bulamaq, yaltaqlıq etmək, alçalmaq

I (جود) جَادَ [1] (u) جَوْدَة , جُودَة 1) üstün olmaq; 2) əla keyfiyyətli olmaq; جَادَ [2] (u) جُود səxavətli olmaq; səxavətlə pay vermək (بـ);

fəda etmək, qurban vermək (*nəyi* بـ); لا يجود به الدهر (الزمان) bu çox nadir hallarda olur; ~ت العين göz yaşını tökmək; ~ت السماء göydən yağış tökmək; ~ بنفسه özünü fəda etmək; ~ بالنفس الاخير canı çıxmaq; ölmək; II جَوَّدَ 1) keyfiyyətini yüksəltmək; yaxşılaşdırmaq; 2) təcvid etmək, avazla oxumaq (*Quranı*); IV أَجَادَ 1) bir işi yaxşı, əla görmək; ~ المضغ yaxşı-yaxşı çeynəmək; 2) yaxşı, gözəl danışmaq; ~ اللغة العربية ərəb dilini yaxşı bilmək; ərəb dilində yaxşı danışmaq; 3) yaxşılaşdırmaq; V تَجَوَّدَ yaxşısını seçmək; VI تَجَاوَدَ kimin daha yaxşı olduğunu müəyyən etmək, yarışmaq (*nədə* في); X إِسْتَجَادَ nəyisə yaxşı, əla hesab etmək

- إِجَادَة əla, yaxşı, kamil yerinə yetirmə; kamillik (*nədə* في)

- تَجْوِيد təcvid, avazla oxuma (*Quranı*)

- جَوَاد[1] *c.* جِيَاد at; cins at; çapağan at; löhrəm at

- جَوَاد[2] *c.* أَجْوَاد , أَجَاوِد səxavətli, comərd, əliaçıq adam

- جَوْد bərk yağış

- جُود səxavət; comərdlik

- جَوْدَة üstünlük; yüksək keyfiyyət, yaxşı cəhət

- جَيِّد *c.* جِيَاد 1) yaxşı, əla, gözəl, üstün; علم العلم جيّد çox yaxşı bilmək; ~ا yaxşı, əla; ~ جدا əla (*qiymət*); 2) səxavətli

- مِجْوَاد çox səxavətli

- مُجِيد mahir, bacarıqlı

جَوْدَار çovdar; خبز الـ~ çovdar çörəyi

I جَارَ (u) (جور) جَوْر 1) aralanmaq, çəkilmək; uzaqlaşmaq, sapmaq (*nədən* عن); ~ عن السبيل yoldan sapmaq; 2) cövr etmək, zülm etmək (*kimə* على); 3) sıxmaq, əzmək; zor işlətmək (*kimə qarşı* على); ~ على الارض yeri özbaşına tutmaq, torpağı zəbt etmək; II جَوَّرَ kimisə cövr etməkdə, cəfa etməkdə günahlandırmaq; III جَاوَرَ 1) qonşuluqda yaşamaq; qonşuluqda olmaq; həmhüdud, yanaşı olmaq; yapışıq olmaq; 2) mücavirlik etmək, pirə və ya məscidə xidmət etmək, məscidin yanında dinin təbliği ilə məşğul olmaq; ~ في الازهر əl-Əzhərin tələbəsi olmaq; ~ ربّه ölmək; IV أَجَارَ himayədarlıq etmək; kömək, yardım göstərmək; müdafiə etmək; VI تَجَاوَرَ qonşuluqda yaşamaq; qonşuluğunda olmaq; X إِسْتَجَارَ kömək, himayə istəmək (*kimdən* بـ , من)

- جَائِر *c.* جَوَرَة , جَارَة 1. 1) cövr edən; qəddar, zalım; 2) ədalətsiz; ~ حرب ədalətsiz müharibə; 2. müstəbid

- جَار *c.* جِيرَان , أَجْوَار qonşu; yaxın; الاجوار الغربيّون qərbli qonşular; الـ~ جار وإن جار *At. sözü. hərf.* qonşu zülm etsə də qonşuluğunda qalır

- جَارَة *c.* ات – qonşu qadın

- جَايِر ayaqqabı qəlibi

- جِوَار 1) qonşuluq; yaxınlıq; بـ~ه kiminsə qonşuluğunda; حسن الـ~ yaxşı qonşuluq; 2) himayə; انتقل الى ~ ربّه *yaxud* دعاه الله الى ~ه ölmək

- جَوْر cövr, cəfa; zülm, zorakılıq; qəddarlıq; ədalətsizlik; özbaşınalıq

- جُورَة *c.* جُورَات , جُوَر 1) çuxur (*döşəmədə*); oyuq, çala

- جُورِيّ *həmç.* ورد~ Dəməşq qızılgülü

- جِيرَة qonşuluq

- مُتَجَاوِر qonşu, həmhüdud

- مُجَاوِر 1. həmhüdud, yanaşı, qonşu, yapışıq; الزاويتان الـ~تان *riyaz.* qonşu bucaqlar; 2. mücavir, pir və ya türbə yanında xidmət edən, dini təbliğ edən şəxs; ilahiyyatçı tələbə; ~ في الازهر əl-Əzhərin tələbəsi

- مُجَاوَرَة 1) qonşuluq; حسن ~ yaxşı qonşuluq; 2) mücavirlik

- مُجِير 1. himayə göstərən; 2. himayəçi



جَوْرَب *c.* جَوَارِب corab; ~ قصير qısa corab; حمّالة الـ~ corabbağı, dizbağı

I جَازَ (u) (جوز) جَوَاز 1) keçmək; keçib getmək; 2) verə bilmək (*imtahanı*), çıxmaq (*imtahandan*); 3) caiz, icazəli olmaq; icazə verilmək; لا يجوز olmaz, caiz deyil; 4) baş tutmaq, keçmək, əmələ gəlmək; لم تجز هذه الحيلة عليها onunla bu hiylə baş tutmadı; II جَوَّزَ icazə vermək, caiz saymaq; 2) səlahiyyət vermək; 3) *xalq dil.* evləndirmək; ərə vermək (*müq. et:* زَوَّجَ); III جَاوَزَ 1) ötmək, aşmaq; هذا يجاوز طاقته buna onun gücü çatmaz; 2) həddi aşmaq; pozmaq (*məs., qanunu*); 3) keçmək (*nədən nəyə* الى , عن); ~ عن ذنبه günahından keçmək; IV أَجَازَ 1) icazə vermək, izn vermək, ixtiyar vermək; 2) vermək; 3) mükafatlandırmaq (*nə ilə* بـ), savabını vermək; 4) yerinə yetirmək; keçirmək; ~ قرارا qərarı keçirmək; 5) diplom vermək (*kimə* في , بـ); 6) keçirmək, göndərmək (*vasitəsilə* عبر); V تَجَوَّزَ 1) lazım olduğundan az etməyi özünə rəva bilmək; 2) (*nədəsə* في) yarıtmaz olduğunu göstərmək; 3) məcazi ifadə işlətmək; 4) *xalq dil.* evlənmək; ərə getmək; evli olmaq; ərli olmaq (*müq. et:* تَزَوَّجَ); VI تَجَاوَزَ 1) həddi aşmaq; kənara çıxmaq; ötmək; ~ السبعين yaşı yetmişi ötüb; 2) dolanmaq; yanından ötüb keçmək; 3) kəsmək, qabağını kəsmək, aradan qaldırmaq; ~ كل المشاكل bütün çətinlikləri aradan qaldırmaq; 4) çəkinmək; imtina etmək (*nədən* عن); VIII إِجْتَازَ 1) keçmək; aşmaq; addamaq; çevrilmək; ~ امتحانا imtahanı verə bilmək; 2) çəkmək, qatlaşmaq, dözmək; ~ ضائقة çətinliyə qatlaşmaq; 3) aradan qaldırmaq; öhdəsindən gəlmək; keçmək (*maneələri*); X إِسْتَجَازَ 1) icazə istəmək; 2) diplom verilməsi barədə xahiş etmək

- إِجَازَة *c.* ات – 1) icazə; اجازات التصدير (الاستيراد) ixrac (*idxal*) lisenziyaları; 2) şəhadətnamə; diplom (*elmi dərəcənin verilməsi barədə*); ~ القنصلية *yaxud* الـ~ القنصلية ekzekvatura; 3) məzuniyyət; ~ مدفوعة ödənişli məzuniyyət; ~ إعتيادية *yaxud* ~ سنويّة növbəti məzuniyyət; ~ مرضيّة xəstəliyə görə məzuniyyət; ~ الولادة *yaxud* ~ الوضع *yaxud* ~ الحمل hamiləlik məzuniyyəti; غائب بالـ~ məzuniyyətdə olan; حضر الى... بالـ~ məzuniyyətə harayasa gəlmək

- إِجْتِيَاز keçmə; kəsib keçmə; ~ الامتحان imtahanı vermə; ~ العقبات çətinlikləri aradan qaldırma, maneələri keçmə

- أَجْوَز daha caiz

- تَجَاوُز *c.* ات – 1) keçmə (*nəyisə*); 2) aşma; addama; ifrat, ifratçılıq; 3) qanunu pozma

- تَجَوُّز məcazi, obrazlı ifadə; من باب الـ~ (على سبيل الـ~) اسمّيه هكذا mən bunu obrazlı olaraq belə adlandırıram

- جَائِز 1) keçən; 2) caiz, icazəli; غير ~ qeyri-caiz, yolverilməz; من الـ~ ان... ola bilər ki...

- جَائِزَة *c.* جَوَائِز mükafat

- جَوَاز[1] 1) keçid; 2) yol verilmə, mümkünlük; icazəlilik, caizlik; عدم ~ qeyri-caizlik; qeyri-mümkünlük; ~ الامتحان imtahanı vermə; 4) *xalq dil.* nikah, evlənmə

- جَوَاز ² c. ـات – 1) həmç. السفر ~ pasport; مصلحة الجوازات pasport şöbəsi; 2) pasportda viza
- جَوْز ¹ xalq dil. 1) cüt; 2) ər; arvad (müq. et: زَوْج)
- جَوْز ² c. أَجْوَاز 1) məkan; أجواز الفضاء kosmik məkanda; 2) özək, məğz; başlıca hissə
- جَوْز ³ topl. qoz, qoza; البلّوط ~ palıd qozası; الطيب ~ cövüz; القزّ ~ barama; الكشيو ~ hindqozu, keşyu; المقيء ~ الـ ravənd; ~الـ الهنديّ yaxud الهند ~ hindqozu; kokos; خشب ~ qoz ağacı (material kimi)
- جَوْزَاءُ: الـ ~ بُرْج astr. Əkizlər bürcü; بيت الـ~ astr. Betelgeyz; النجاح عليه ابعد منالا من الـ~ onun uğur qazanmağına çox qalıb
- جَوْزَة ¹ c. ـات – qoz; الحلقوم ~ yaxud الرقبة ~ anat. hulqum, xirtdək
- جَوْزَة ² c. ـات – qəlyan; شرب الـ~ qəlyan çəkmək; شرب الحشيش ~ həşiş çəkmək
- جَوْزِيّ 1) qoz -i/-ı; 2) qoz rəngi, qəhvəyi
- جِيزَة xalq dil. nikah, evlənmə
- مُتَجَاوِز həddi aşan
- مُتَجَوِّز evli, ailəli
- مَجَاز keçid, dəhliz; 2) boğaz; 3) məcaz; obrazlı ifadə; metafora; ً~ yaxud في سبيل الـ~ məcazi olaraq
- مُجَاز 1) icazəsi olan; 2) lisensiat, diplomlu, şəhadətnaməsi olan; في العلوم الجغرافيّة ~الـ coğrafiya elmləri namizədi
- مَجَازِيّ məcazi, obrazlı
- مُجَاوَزَة 1) keçmə; 2) ötüb keçmə, həd-

جَوْسَق c. جَوَاسِق 1) köşk; 2) çardaq; 3) qəsr

I جَاعَ (جوع) (u) جَوْع ac olmaq, aclıq çəkmək; II جَوَّعَ ac saxlamaq; IV أَجَاعَ = II; نفسه ~ özünü ac saxlamaq; ac qalmaq; X اِسْتَجَاعَ özünü həmişə ac hiss etmək, doymaq bilməmək
- تَجْوِيع ac saxlama; yeməkdən məhrum etmə
- جَائِع c. جِيَاع ac; aclıq çəkən
- جَعَان c. جَعَانِين = جَائِع
- جُوع 1) aclıq; doyunca yeməmə; ~الـ كافر At. sözü: aclıq kafirdir; aca nə halal, nə haram; لا يسمن ولا يغني من ~ هذا bunun xeyri yoxdur
- جَوْعَان q. جوعى c. جِيَاع = جَائِع
- مَجَاعَة = جُوع

I جَافَ (ə) جَوْف boş olmaq; içiboş olmaq; II جَوَّفَ içini boşaltmaq; içiboş etmək; V تَجَوَّفَ = I
- أَجْوَف q. جَوْفَاءُ c. جُوف boş, içiboş; الخدين ~ yanaqları batmış; فعل ~ qram. boş fel; كلمات جوفاء yaxud عبارات جوفاء boş, mənasız sözlər; boşboğazlıq; الساعات الجوفاء xəlvət, durğun gecə
- تَجْوِيف c. تَجْوِيفَات , تَجَاوِيف 1) içini oyma; oyuqlama; 2) oyuq, çuxur, girinti, qazıq; boşluq; تجويفات القلب ürək boşluğu; الصدريّ ~الـ sinə boşluğu; البريتونيّ ~الـ qarın (periton) boşluğu; حُقّيّ ~ oynaq batığı; dərə, çuxur
- جُوَافَة bax: əlifba sırası ilə
- جَوْف c. أَجْوَاف 1) boşluq; iç; السفينة ~ gəminin anbarı; 2) qarın; tək; alt; الارض ~ yerin



- مُجَوَّف boş, içiboş

أَجْوَق q. جَوْقَاءُ c. جُوق əyilmiş (sifət)
- جَوْق c. أَجْوَاق 1) toplantı, qrup, dəstə; 2) truppa; 3) orkestr; 4) xor
- جَوْقَة c. ـات – qrup, dəstə; ansambl; موسيقية ~ orkestr; مدير الـ~ dirijor; الشرف ~ şərəf legionu

جُوكِيّ c. جُوكِيَّة jokey

I جَالَ (جول) (u) جَوْل , جَوَلَان 1) gəzmək; gəzib dolaşmaq; dolanmaq; 2) cövlan etmək; get-gəl etmək; hərlənmək; aylanmaq; 3) at oynatmaq; صال و~ bax: صال; في خاطره ~ nə barədəsə düşünmək; II جَوَّلَ = I; IV أَجَالَ 1) cövlan etdirmək; gəzdirmək; الكناسون مكانسهم على الارصفة ~ süpürgəçilər səkilərə yaxşı süpürgə çəkdilər; 2) dolandırmaq; dövrə vurdurmaq; hərlətmək, aylandırmaq; بصره ~ ətrafa göz gəzdirmək; فيه الفكر ~ طويلا bir şey haqqında uzun-uzadı düşünmək; الرأى في ~ müzakirə etmək; V تَجَوَّلَ 1) gəzib-dolaşmaq, dolanmaq; 2) cövlan etmək; cövlana çıxmaq; hər yanı gəzmək; get-gəl etmək
- إِجَالَة dolanma; hərlənmə; dövrə vurma; الفكر ~ fikrə dalma
- تَجْوَال 1) gəzib dolaşma; cövlan etmə; 2) dövrə vurma, hərlənmə
- تَجَوُّل gəzib dolaşma; get-gəl etmə; hərlənmə
- مُتَجَوِّل = جَائِل

جُوَال c. جُوَالَات , أَجْوِلَة kisə, xaral, çuval (müq. et: شُوَّال bax: شول)
- جَوَّال 1. 1) gəzib dolaşan; 2) səyyar; gəzər-
- جَوَلَان = جَوْل
- جَوْلَة 1) səyahət; turne; turist səfəri; 2) tur; gəzmə; reys (gəmi, təyyarə); 3) hərlənmə; hərəkət; yeriş; 4) idm. raund; الاولى ~ربح الـ birinci raundu udmaq
- مُتَجَوِّل gəzib dolaşan; səyahət edən; بيّاع ~ səyyar, gəzərgi alverçi; çərçi; ayaqçı, paylayan; وكيل ~ səyyar agent; مراسل ~ səyyar müxbir
- مَجَال c. ـات – 1) yer; ليس هنا ~ للشك burada şübhə üçün yer yoxdur; ليس هنا ~ للكلام على... bura … haqqında danışmağın yeri deyil; ليس هنا ~ لمناقشة هذه المسألة bura bu məsələni müzakirə etmək yeri deyil; 2) məkan; genişlik; واسع الـ~ geniş; الحيويّ ~الـ həyati sahə; الجويّ ~الـ hava məkanı; 3) meydan, sahə; العمل ~ fəaliyyət sahəsi; القوّة ~ fiz. qüvvət sahəsi; الكهربائيّ ~الـ elektrik sahəsi; ~الـ المغناطيسيّ fiz. maqnit sahəsi; شدة ~الـ المغناطيسيّ fiz. maqnit sahəsinin gərginliyi; 4) imkan لم يكن عنده ~ للاختيار onun seçmək imkanı yox idi; لا ~ لنكران هذه الحقيقة bu həqiqəti danmaq mümkün deyildir
- مِجْوَل c. مَجَاوِل 1) halqa; asma, asmalıq; sırğa, tana; 2) həmayil

جُولْف qolf (oyun)

جُوَالِق bax: əlifba sırası ilə

جَوْلَق c. جَوَالِق çarx topu, təkər topu; buksa; oymaq, tıxac

جَام bax: əlifba sırası ilə

جَوْن c. جُون 1. qara, zil qara (at); 2. gün

جَوْهَرٌ *c.* جَوَاهِرُ 1) cövhər, mahiyyət (*işin*); الصورة والـ~ forma və mahiyyət; 2) maddə, materiya; فرد ~ a) atom; b) *fəls.* monada; 3) qiymətli daşlar; cəvahirat

- جَوْهَرْجِيٌّ *c.* جَوْهَرْجِيَّةٌ *yaxud* جَوَاهِرْجِيٌّ *c.* جَوَاهِرْجِيَّةٌ zərgər

- جَوْهَرَةٌ *c.* ات – 1) qiymətli daş; 2) daşqaş; qızıl-gümüş; cəvahirat; qiymətli şey; *məcaz.* xəzinə

- جَوْهَرِيٌّ 1) əhəmiyyətli; mahiyyətli; 2) maddi

- جَوْهَرِيَّةٌ maddilik

- مُجَوْهَرَاتٌ *c.* qiymətli əşyalar

I جَوِيَ (ə) جَوًى 1) böyük həvəsə düşmək; ehtirasa uymaq; 2) müsibətə, dərdə düçar olmaq; VIII اِجْتَوَى nifrət bəsləmək

- جَوًى ehtiras, coşqunluq, coşqun sevgi

جَوْدَارٌ çovdar

I (جيأ) جَاءَ (i) مَجِيءٌ 1) gəlmək; gəlib çatmaq; yetişmək; الى الدنيا ~ dünyaya gəlmək; ~نا البيان الآتي... biz belə bir açıqlama almışıq; ~ من القاهرة ان... Qahirədən xəbər gəlib ki...; 2) yaxınlaşmaq; yanaşmaq (*kimə* على); 3) baş vermək, alınmaq, olmaq; ~ هذا طبق مرامه bu onun istəyinə uyğun alındı; 4) etmək; 5) gətirmək (*nə* بـ); 6) göstərilmək, xəbər verilmək; وقد ~ في الامثال ان... zərb-məsəllərdə deyilir ki...; IV أَجَاءَ gətirmək (*kimi*)

- جَاءٍ *q.* جَائِيَةٌ gələn, gəlib çatan

- جَيْئَةٌ gəliş, gəlmə; تمشى ذهابا (ذهوبا) وجيئة var-gəl etmək; o başa-bu başa getmək

- مَجِيءٌ gəliş, gəlmə

جِيبٌ *c.* ات – yubka

I (جيب) جَابَ (i) جَيْبٌ 1) kəsik açmaq (*paltarda*); 2) *xalq dil.* gətirmək

- جَيْبٌ *c.* جُيُوبٌ 1) cib; ساعة الـ~ cib saatı; سكين الـ~ cib bıçağı; مصروف الـ~ cibxərcliyi; وضع في الـ~ a) cibinə qoymaq; b) mənimsəmək; على ~ الآخر başqasının hesabına; ~ ابو مخروق *obrazl.* cibiyırtıq, bədxərc; 2) kəsik (*paltarda*); 3) *obrazl.* ürək; ناصح الـ~ təmiz ürəklə; 4) *riyaz.* sinus; ~ تمام الزاوية *riyaz.* kosinus; 5) yuva, ocaq (*müqavimət*)

- جَيْبِيٌّ cib -i/-ı

- جَيْبِيَّةٌ *c.* ات - cib dua kitabçası

جِيدٌ *c.* أَجْيَادٌ boyun

جَيْرِ bəli, əlbəttə

جِيرٌ əhəng; *kim.* kalsium; حي ~ söndürülməmiş əhəng; مطفأ ~ söndürülmüş əhəng; نترات الـ~ kalsium nitratı, əhəngli şora; كربونات الـ~ kalsium karbonatı

- جَيَّارٌ 1) söndürülməmiş əhəng; 2) əhəngsatan

- جَيَّارَةٌ *c.* ات – əhəngbişirmə sobası

- جِيرِيٌّ əhəng -i/-ı; əhəngli, təbaşirli

جِيرُوسْكُوبٌ giroskop

جِيزَاوِيٌّ cizəli; Cizə sakini

I (جيش) جَاشَ (i) جَيْشٌ 1) coşmaq, qızışmaq; qalxmaq; cuşa gəlmək; 2) qaynamaq, guruldamaq; ~ت نفسه onun ürəyi bulandı; II جَيَّشَ səfərbər etmək; ordu yığmaq; qoşun yığmaq; جَيَّشَ الجيوش *məch.* ordular toplandı (*nə üçün* لـ); X إِسْتَجَاشَ coşdurmaq (*hissləri*)

- جَائِشٌ 1) coşan, həyəcanlanan; 2) qaynayan, guruldayan; ~ النفس ürəyi bulanan

- جَيَّاشٌ qaynar

- جَيْشٌ *c.* جُيُوشٌ ordu; qoşun; الـ~ الأذربيجاني Azərbaycan ordusu; مجلس الـ~ hərbi şura; وحدات الـ~ ordu hissələri

- جَيَشَانٌ həyəcan, coşqunluq; 2) qaynama, guruldama; ~ النفس ürəyi bulanma

(جيص) II جَيَّصَ *xalq dil.* qarından yel buraxmaq



I (جيف) جَافَ (i) جَيْفٌ 1) çürümək; xarab olmaq; 2) pis qoxu, iy vermək; II جَيَّفَ = I; V تَجَيَّفَ 1) çürümək, korlanmaq, xarab olmaq; 2) ölü iyi vermək

- جِيفَةٌ *c.* جِيَفٌ , أَجْيَافٌ cəmdək, leş, ölü

- جِيفِيٌّ ölü -i/-ı; ~ زاغ *yaxud* ~ غراب qarğa

جِيلٌ *c.* أَجْيَالٌ 1) qəbilə, nəsil; ~ بعد ~ا nəsildən nəslə; ~ من ~ إلى nəsildən nəslə; 2) əsr; على مر الاجيال əsrlər boyu; اجيالا nəsilbənəsil; əsrlərlə, əsrlər boyu

جِيلَاتِيٌّ , جِيلَاتَةٌ dondurma

جِيلُوتِين gilotin

جِيلِي jele

جِيمٌ 1) cim (ج *hərfinin adı*); 2) qamma (*yunan hərfinin adı*); سين وجيم (سؤال وجواب -*dan qısald.*)

- جِيمِيٌّ – جيم hərfi ilə bağlı; الاشعة الـ~ـة qamma şüalar

جِمْخَانَةٌ = جِيمْخَانَةٌ

جِيلُوتِينٌ = جِيُوتِينٌ

جِيُوفِيزِيَا geofizika

- جِيُوفِيزِيقِيٌّ , جِيُوفِيزِيَائِيٌّ 1. geofiziki; 2. geofizik

جِيُوكِيمِيَائِيٌّ geokimyəvi

جِيُولُوجِيَا geologiya

- جِيُولُوجِيٌّ 1. geoloji; 2. geoloq

# ح

ح (حَاءٌ) hā (*ərəb əlifbasının altıncı hərfi; rəqəm mənası 8*)

حا , حَ *xalq dil.* رايح – *dən qısald.* 1) (*gələcək zamanda dərhal hərəkət bildirmək üçün işlədilən söz*): انا حاكتب indi yazacağam; حنعمل ايه nə edəcəyik?; bəs nə edək? 2) ha (*eşşəyi hərəkətə gətirmək üçün çıxarılan səs, hoş demə*)

حَاحَة *xalq dil.* çığırtı (*məs., keçi, qaz*); كانت مرتاحة جابت لها ~ *At. sözü*: hər işi qurtarmışdı, qalmışdı qaqqıltısı

حَاخَامٌ *c.* اتٌ – ravvin; باشي ~ baş ravvin; كبير حاخامات اسرائيل İsrailin baş ravvini

حَامٌ *Bibl.* Ham (*Nuhun oğlu*)

حَامُول *bax:* حمل

حَامِيٌّ 1. hami (*sif.*); اللغات الـ~ـة hami dilləri; 2. hami

حَانٌ şərab dükanı; بنت الـ~ şərab

حَانَا *xüs. ad q.* Hana; كان بين ~ ومانا *məcaz.* iki od arasında qalmaq

حَانَةٌ *c.* اتٌ – şərab dükanı; aşxana

حَانُوتٌ *c.* حَوَانِيتُ dükan; şərab dükanı; aşxana

- حَانُوتِيٌّ *c.* حَانُوتِيَّةٌ 1) dükançı; 2) tabutdüzəldən

I حَبَّ (ə/i) حُبٌّ sevmək; məftun olma;

V تَحَبَّبَ məhəbbət bəsləmək (*kimə* الى); 2) sevgisini qazanmağa çalışmaq; özünü sevdirmək; VI تَحَابَّ *yaxud* تَحَابَبَ bir-birini sevmək; dostluq münasibətində olmaq; X إِسْتَحَبَّ 1) sevmək; həzz almaq; 2) üstünlük vermək (*nəyə* على); 3) *məch.* təqdirəlayiq olmaq; 4) ümumən məqbul sayılmaq

- أَحَبُّ ən sevimli, ən xoş; ~ الى... من... ... üçün ...dan/dən daha xoşdur

- تَحَابٌّ , تَحَابُبٌ qarşılıqlı məhəbbət; sevgi; dostluq; dostluq münasibətləri

- حَبٌّ *topl. c.* حُبُوبٌ 1) toxum; dən; حبّ الهال hil dənələri; حبّ الرمّان nar dənələri; حبّ البركة *bot.* qaraçörəkotu; حبّ الرأس *bot.* vəzəri; حبّ الشوم *bot.* zoğal; حبّ العزيز *yaxud* حبّ الزلم *bot.* yerbadamı; حبّ الملوك *bot.* albalı; القى الحبّ dən atmaq (*tələ yemi kimi*); 2) giləmeyvə; 4) *c.* çörək (*taxıl şəklində*); حبّ الصبا *yaxud* حبّ الشباب sızanaq, civzə; حبّ الغمام dolu

- حُبٌّ [1] sevgi, məhəbbət; bağlılıq; meyil; حبّ الاستطلاع hər şeyi bilmək həvəsi; حبّ الذات (النفس) özünü sevmə, xudpəsəndlik; حبّ السلم pasifizm; sülhpərəstlik; حبّ الظهور şöhrətpərəstlik; حبّ الغير altruizm; حبّ الوطن vətənpərvərlik; حبًا وكرامة böyük məmnuniyyətlə; ...حبًا بـ *yaxud* ...حبًا لـ kiməsə/nəyəsə sevgisi üzündən; وقع في حبّها o qıza vurulub



السوداء ~الـ *bot.* zirə; الحلوة ~الـ *bot.* cirə, anis; 2) giləmeyvə; 3) həb; 4) sızanaq, civzə; 5) *xalq dil.* əhəmiyyətsiz, xırda şey; 6) dənə (*sayda*); 7) həbbə (1/72 فدّان *fəddana yaxud 58,345* $m^2$ *bərabər sahə ölçüsü*); الشعير ~ ($^1/_{144}$ ذراع معمارى *yaxud 0,521 sm. bərabər uzunluq ölçüsü*); العين ~ göz bəbəyi; يا ~ عينى əzizim!; القلب ~ könül; جعل كل ~ قبّة milçəkdən fil düzəltmək

- حُبِّي sevgi -i/-ı; dost; dostluq -i/-ı; ~ـا sevə-sevə, sevgi ilə

- حَبِيبٌ *c.* أَحِبَّاءُ , أَحْبَابٌ 1. sevgili, canan, məhbub; 2. 1) istəkli; الشعب ~ xalqın istəklisi; 2) dost, aşna

- حَبِيبَةٌ *c.* حَبَائِبُ sevgili (*qadın*); canan, məhbubə

- حُبَيْبَةٌ *c.* اتٌ - toxumcuq, dənəcik

- حُبَيْبِيٌّ dənəvər; ~ خشب preslənmiş taxta yonqarı (*tikinti materialı kimi*)

- مُتَحَابٌّ sevən və sevilən; dostluq münasibətində olan; الدول الـ~ـة dost ölkələr

- مُحِبٌّ 1. sevən; للسلم ~ sülhsevər; للحريّة ~ azadlıqsevər; لذاته ~ eqoist, xudpəsənd, özünüsevən; للعمل ~ əməksevər; 2. sevgili, vurğun; aşiq; pərəstişkar; محبّو الفنّ sənətsevərlər

- مُحَبَّبٌ [1] sevimli; istəkli; xoşlanılan

- مُحَبَّبٌ [2] dənəvər, xırdalanmış, dən-dən edilmiş

حَبْحَبَ axmaq, şırıltı ilə axmaq, xəfif-xəfif axmaq

- حُبَاحِبٌ *c.* حَبَاحِبُ işıldaquş

- حَبْحَبَةٌ *c.* حَبْحَبٌ qarpız (*Hicaz*)

(حبذ) II حَبَّذَ bəyənmək, tərifləmək, təqdir etmək

- تَحْبِيذٌ bəyənmə, tərifləmə, təqdiretmə

- حَبَّذَا nə yaxşı!; əladır!; الرجل ~ nə yaxşı kişidir!; المرأة ~ nə yaxşı qadındır!; لو ~ yaxşı olardı ki ...

I (حبر) حَبَرَ (u) حَبْرٌ 1) bəzəmək; 2) sevindirmək; şad etmək; حَبِرَ (ə) حُبُورٌ sevinmək, şadyanalıq etmək; II حَبَّرَ 1) bəzəmək; bəzək vurmaq; istənilən şəklə salmaq; 2) yazmaq; المسودّة ~ qaralama yazmaq; 3) mürəkkəblə xətləmək, cızmaq; qaralamaq; IV أَحْبَرَ sevindirmək; V تَحَبَّرَ qaralanmaq; mürəkkəbə bulanmaq

- حِبَارٌ *c.* حِبَارَاتٌ , حَبْرٌ iz, əsər, əlamət; الضرب ~ zərbə izləri; qançır (*bədəndə*); yara yeri, çapıq, kəsik

- حُبَارَى *c.* حُبَارَيَاتٌ dovdaq (*quş*)

- حَبْرٌ , حِبْرٌ *c.* أَحْبَارٌ , حُبُورٌ 1) əməlisaleh alim; سفر الاحبار *Bibl.* Levit; 2) din başçısı; yepiskop; Roma papası; الاعظم ~الـ a) baş kahin; b) Roma papası

- حِبْرٌ *c.* أَحْبَارٌ , حُبُورٌ mürəkkəb; rəng,

- حَبَرَةٌ c. ات - örtük, mantilya (*çiyin şalı*);
ايّام البرقع والـ~ çadra və örtük əsri
- حِبْرِيٌّ = حَبْرَوِيٌّ
- حَبْرِيٌّ , حِبْرِيٌّ 1) papa -i/-ı; 2) yepiskopal
- حَبْرِيَّةٌ c. ات - ibadət cübbəsi, xələti
- حُبُورٌ sevinc, şadyanalıq
- مَحْبَرَةٌ c. مَحَابِرُ mürəkkəbqabı
- يَحْبُورٌ şən, şad; xoşhal, razı

I حَبَسَ (i) حَبْسٌ 1) həbs etmək, həbsxanaya salmaq; 2) bağlamaq, qıfıllamaq, kilidləmək, qapamaq; 3) qorumaq; 4) saxlamaq; qoymamaq; mane olmaq; وحَبَسَني المرض المفاجئ عن ان ازوركم gözlənilməz xəstəlik məni sizi ziyarət etməyə qoymadı; ~ انفاسه bir qədər nəfəs almamaq; 5) cilovlamaq, boğmaq (*hissləri*); 6) yolu kəsmək; buraxmamaq (عن); 7) həsr etmək; vəqf kimi vəsiyyət etmək (*nəyə* على); VII إنْحَبَسَ 1) həbs olunmaq, saxlanılmaq; 2) ilişib qalmaq sıxılmaq (*nəfəs*); صرخت ولكن الصرخة ~ت في حلقي çığırdım, amma çığırtı boğazımda ilişib qaldı; VIII إحْتَبَسَ 1) həbsxanaya salınmaq; 2) bağlanmaq, qapanmaq; 3) kəsilmək, boğulmaq, sıxılmaq (*nəfəs*); ~ت انفاسه onun nəfəsi sıxılır; ~ الصوت في حلقه səs boğazında ilişib qaldı

- إحْتِبَاسٌ kəsilmə; ~ البول *tibb.* sidiyin kəsilməsi
- إنْحِبَاسٌ saxlanılma; ~ في الهواء boğanaqlıq, havada ağırlıq; (الامطار) ~ المطر yağışsızlıq, yağışların yağmaması
- إحْتِبَاسٌ həbs etmə; həbs; ~ احتياطي ibtidai (*ilkin*) həbs; ~ انفرادي ayrı, təkcə saxlanılmaqla həbs
- حَبْسٌ[2] c. حُبُوسٌ həbsxana; zindan; qazamat
- حُبْسٌ c. أحْبَاسٌ xeyriyyəçilik məqsədləri üçün vəsiyyət edilmiş mal; vəqf malı; كان ... على ~ـا özünü büsbütün (*nəyəsə*) həsr etmək
- حِبْسٌ c. أحباس 1) bənd; dəhnə; 2) döşəkağı, mələfə
- حَبْسَخَانَةٌ c. ات - həbsxana
- حَبْسَةٌ pul verib azad etmə, girovu geri alma
- حُبْسَةٌ *tibb.* afaziya, nitq pozğunluğu
- حَبِيسٌ 1. 1) məhbus; qapadılmış, bağlı; كانت ~ـة الدار ev dustağı olmaq, bütün günü evdə oturmaq (*qadın haqqında*); 2) sıxılmış (*nəfəs*); 2. c. حُبَسَاءُ 1) məhbuslar, dustaqlar; 2) zahid, tərkdünya, zaviyəyə çəkilmiş
- مَحْبِسٌ c. مَحَابِسُ 1) məhbəs; 2) saxlanma yeri, saxlanc; 3) rezervuar, çən; 4) zaviyə, hücrə (*zahidin*)
- مِحْبَسٌ bağlama kranı
- مُحْبَسٌ: ~ عليه nəfinə vəqf ayrılmış şəxs və ya müəssisə
- مُحَبِّسٌ vəqf ayıran, vəqf təsisçisi
- مَحْبِسَةٌ c. مَحَابِسُ zahidin, münzəvinin qaldığı yer
- مَحْبُوسٌ məhbus, dustaq

(حبش) II حَبَّشَ 1) doldurmaq (*məs., pambıqla*); 2) bəzəmək (*məs., xörəyin üstünü xuruşla*); xuruş, ədviyyat vurmaq
- تَحْبِيشَةٌ c. تَحَابِيشُ 1) iç, tıxma; 2) bəzək; (*cəfəri, quru nanə, soğan, kəvər və sarımsaqdan hazırlanmış*) xuruş
- حَبَشٌ : ~الـ *topl.* həbəşlər; دجاج الـ~ firəngtoyuğu
- حَبَشَةٌ: الـ~ Həbəşistan (*Efiopiya*)
- حَبَشِيٌّ c. أحْبَاشٌ , حُبْشَانٌ 1. həbəş (*sif.*); الـ~ـة həbəş dili; 2. həbəş



- حَبَشِيَّةٌ həbəşlik; həbəş mənşəyi (*məs., sözün*)
- حُبَيْشٌ *topl.* firəngtoyuğu
- حُبَيْشَةٌ c. ات - firəngtoyuğu
- مُسْتَحْبِشٌ həbəşşünas alim

I حَبِطَ (ə) حُبُوطٌ baş tutmamaq, müyəssər olmamaq, müvəffəq olmamaq, uğursuz nəticələnmək, boşa çıxmaq; IV أحْبَطَ pozmaq, batırmaq, heçə çıxarmaq, korlamaq
- حَبَطٌ göy qançır, çapıq
- حُبُوطٌ pozulma, zay olma, heçə çıxma, uğursuzluq, müvəffəqiyyətsizlik

(حبط) II حَبَّطَ zarafat etmək, məzələnmək, əylənmək; şitlik etmək

حَبَقٌ *bot.* birəgülü; ~ البقر çobanyastığı, ağkirpik, mollabaşı

I حَبَكَ (u, i) حَبْكٌ 1) sıx toxumaq, sıx hörmək; toxumaq (*corab*); hörmək (*kəndir*); qurmaq, quraşdırmaq, düzəltmək; ~ الدسائس intriqa düzəltmək; ~ المؤامرة qəsd hazırlamaq; ~ السوء pis niyyətdə olmaq (*kiməsə qarşı* ...); 2) tikmək, bənd etmək, bitişdirmək; yenidən hörmək, bir-birinə keçirmək; 3) möhkəm etmək, bərkitmək; II حَبَّكَ bitişdirmək, bərkitmək; VIII احْتَبَكَ bir-birinə keçmək, hörülmək
- حَبَّاكٌ toxucu, culfa
- حِبَاكَةٌ toxuculuq, culfalıq
- حُبْكَةٌ c. حُبَكٌ 1) toqqa, qayış, kəmər; 2) başlanğıc, giriş (*ədəbi əsərdə*)
- حَبِيكَةٌ c. حُبُكٌ hərəkət yolu, iz (*ulduzun*)
- مَحْبُوكٌ sıx, yaxşı hörülmüş, yaxşı görülmüş; əla edilmiş

I (حبل) حَبَلَ (u) حَبْلٌ 1) iplə bərkitmək; 2) torla tutmaq; kəmənd atmaq; حَبِلَ (ə) حَبَلٌ hamilə olmaq; 2) dolu olmaq (*nə ilə* من); II حَبَّلَ hamilə etmək; mayalandırmaq, döllәndirmək; IV أحْبَلَ = II; VIII احْتَبَلَ torla, kəməndlə tutmaq
- أُحْبُولَةٌ c. أحَابِيلُ , أُحْبُولاتٌ 1) ilgək, ilmə; kəmənd; 2) cələ, tələ, duzaq, tor, kəmənd
- حَابِلٌ 1) tələ quran, torçu; 2) yerlik (*parçanın*); اختلط الـ~ بالنابل qat-qarış olmaq; dolaşıq düşmək
- حَبَّالٌ c. حَبَّالَةٌ ipçi, kəndirqayıran
- حِبَالَةٌ c. حَبَائِلُ tor, cələ, tələ, kəmənd
- حَبْلٌ c. حِبَالٌ , أحْبُلٌ 1) ip, kəndir, qaytan, zivə, kanat, buraz; ~ الجرّ buraz (*yedək üçün*); ~ الغسيل zivə, paltar zivəsi; ~ غليظ kabel; ~ المرساة lövbər zənciri; ~ الله həblullah, Allahın ipi (*İslam*); اعتصم بـ~ الله Allahın ipindən bərk yapışmaq (*İslama etiqad etmək*); وضع ~ـا في عنقه boynuna kəndir salmaq, ilişdirmək; لعبة شدّ الـ~ kəndirçəkmə oyunu, kim kimi dartar oyunu; لعب على ~ين *məcaz.* ikili oyun oynamaq; 2) tel; الصوت حبل (أحبال) səs telləri; 3) damar; ~ الوريد boyun damarı; 4) şırnaq; ~ سرّيّ göbəkbağı; ~ شوكي onurğa beyni (*haram ilik*); ~ المساكين *bot.* sarmaşıq; ~ منوي *anat.* toxum borusu; ~ النط ip (*ipatdı oyunu üçün*); اضطرب ~ الامن ictimai asayiş pozuldu; ألقى الـ~ على الغارب cilovu buraxmaq; sərbəstlik vermək; *məcaz.* özünü taleyin ixtiyarına vermək; ألقى ~ الامور على غاربه heç bir tədbir görməmək, passivlik göstərmək; مد إليه ~ النجاة kiməsə kömək əli uzatmaq; طال ~ المشاجرة mübahisə uzun çəkdi; انقطع ~ المودة بينهما *məcaz.* aralarında məhəbbət telləri kəsildi, araları dəydi; قطع الـ~ بينهم مبتوت bütün münasibətləri kəsilib; ~ الصمت sükutu kəsmək

- حَبَل hamilə olma; boynuna düşmə; mayalanma; بلا دنس ~ bakirə hamiləlik, toxunmadan hamilə olma
- حُبْلاَنُ 1) dolu, boylu; 2) hamilə qadın
- حُبْلَى c. حَبَالَى boylu, hamilə qadın; الحالة الـ~ باوخم العواقب təhlükəli nəticələri ola biləcək vəziyyət

I حَبِنَ (ə) حَبَن həmç. məch. bədən boşluqlarına su yığılmasına tutulmaq
- أَحْبَن q. حَبْنَاء c. حُبْن 1) bədən boşluqlarına su yığılan xəstə; 2) ayağının altı ətli olan
- حَبَن bədən boşluqlarına su yığılması
- حَبْهَان hil toxumu

I حَبَا (u) حَبْو (حبو) 1) sürünmək; على يديه ~ و ركبتيه dizləri üstündə sürünmək; diz-diz sürünmək; 2) bağışlamaq (nə), hədiyyə etmək, vermək (nə بـ); 3) yaxınlaşmaq; yetmək; إلى العاشرة من العمر ~ o, on yaşına yetişmişdi; III حَابَى 1) yararlı olmaq; 2) qərəzkar olmaq; tərəfkeşlik etmək
- حِبَاء c. أَحْبِيَة hədiyyə, bəxşiş, töhfə, peşkeş
- حَبْو sürünmə
- حِبَاء = حُبَى , حِبَى c. حُبْوَة , حَبْوَة , حِبْوَة
- حَبَوِيَّة vergililik, istedadlılıq
- مُحَابٍ q. مُحَابِيَة yararlı, qərəzkar, tərəfkeş
- مُحَابَاة 1) yararlılıq; 2) üzgörənlik; tərəfgirlik; عدم الـ~ qərəzsizlik; بلا~ üzgörənlik etmədən; bitərəf

I حَتَّ (ə, u) حَتّ 1) pozmaq; qaşımaq; qazıyıb təmizləmək; 2) içərisindən yemək,

[redacted]

- حَتّ yarpaqların tökülməsi (xəstəlikdən)
- حَتَّة c. حُتَت 1) parça, tikə; ovuntu; az miqdar; 2) sikkə; 3) məhəllə (şəhərdə)

I حَتَدَ (ə) حَتْد 1) əsil-nəcabətli, adlı-sanlı olmaq; 2) cins olmaq
- مَحْتِد əsil; mənşə; cins; كريم الـ~ əsil-nəcabətli

حِتَار c. حُتُر qıraq, uc, ətək; haşiyə, kənar
- حُتْرَة 1) kiçicik bir parça; 2) boş, vecsiz, dəyərsiz şey

حَتْف c. حُتُوف ölüm, həlak olma, tələf olma; لقي ~ـه من الرصاصة o, güllədən öldü; قضى ~ـه ölmək; مات حتف أنفه yaxud مات حتف فيه öz əcəli ilə ölmək

I حَتَمَ (i) حَتْم 1) vacib etmək; boynuna qoymaq; tələb etmək; 2) qəti qərara gəlmək; qərara almaq (nə بـ); II حَتَّمَ öhdəsinə qoymaq (على), bir vəzifə olaraq tapşırmaq, məcbur etmək (على); V تَحَتَّمَ öhdəsinə düşmək; boynuna qoyulmaq, vacib olmaq, zəruri olmaq, labüd olmaq (kimə, kimin üçün على)
- حَاتِم xüs. ad Hatəm; من ~ أجود çox səxavətli (hərf. Hatəmdən də səxavətli)
- حَاتِمِيّ: السخاء الـ~ böyük səxavət; الضيافة الـ~ـة səxavətli qonaqlıq
- حَتَّام = حتى + ما bax: حَتَّى
- حُتَامَة qalıqlar; tikələr; qırıntılar, ovuntular
- حَتْم c. حُتُوم qəti qərar; qətnamə; ~ـا qətiyyətlə; labüd olaraq; dönmədən; qeydsiz-şərtsiz

[redacted]



حَتَّى 1. qədər, dak-dək; الصبح ~ sabahadək; يومنا هذا ~ günümüzə qədər; حَتَّام (~ + ما) nə vaxtacan? الآن ~ indiyədək, hələ; لعلك ~ لم تره bəlkə, sən onu hələ görməmisən?; 2. 1) hətta; 2) nə qədər ki; 3. ta ki; ان ~ ki; وما ~ (لم) ما elə bunu demişdim ki...; ابتسم ~ انتهيت من كلماتي sözümü qurtarmamışdım ki, o gülümsədi

حَاتٍ q. حَاتِيَة bişirən, qızardan; حَاتِي كباب kababbişirən

I حَثَّ (ə/u) حَثّ 1) vadar etmək; təhrik etmək, qızışdırmaq (على); həvəs doğurmaq; 2) qovmaq, tələsdirmək, sıxışdırmaq; حث خطاه yerişini bir qədər sürətləndirmək; VIII إِحْتَثَّ təhrik etmək, qızışdırmaq; X إِسْتَحَثَّ = I
- حَثِيث c. حِثَاث sürətli, becid, tez, yeyin; ~ـا sürətlə, yeyin; tələsik

حُثَالَة qalıq; tör-töküntü; xılt; çöküntü

I حَثَا (u) حَثْو (حثو) tökmək; çırpmaq (tozu nəyinsə üstünə على)

I حَجَّ (ə/u) حَجّ 1) həcc etmək; həccə getmək; حج البيت الحرام Beytülhəramı (Məkkədə) ziyarət etmək; 2) dəlil-sübutları ilə qalib gəlmək; sübut etmək, inandırmaq; II حَجَّجَ həccə yola salmaq; III حَاجَّ mübahisə etmək; sübut etməyə çalışmaq; IV أَحَجَّ həccə yola salmaq; həccə göndərmək; V تَحَجَّجَ özünə bəraət qazandırmaq (nə ilə بـ); dəlil-sübut gətirmək (بـ); bəhanə ilə boyun qaçırtmaq; VI تَحَاجَّ bir-birilə mübahisə etmək, höccət etmək, höcətləşmək; VIII إِحْتَجَّ 1) dəlil-sübut

[redacted]

- حَاجّ c. حُجَّاج , حَجِيج hacı, həcc ziyarətində olan, zəvvar; الـ~ احمد balqabaq (İraq)
- حَاجَّة c. ات – hacı qadın, zəvvar qadın, ziyarətdə olan qadın, hacıxanım
- حَجّ , حِجّ həcc, həcc ziyarəti; الحج الاكبر böyük həcc (zilhiccənin 9-cu günü – Ərəfat günü cümə gününə təsadüf edəndə)
- حَجَاج c. أَحِجَّة hədəqə sümüyü (gözün); العين ~ a) hədəqə (gözün); b) qaş
- حِجَاج mübahisə, höcət, münazirə
- حُجَّة c. حُجَج 1) dəlil, sübut, bəhanə; bəraət; ...بـ~ bəhanəsi ilə; 2) hüq. (nəyəsə) sahiblik haqqı barədə sənəd; ...هو ~ في o bu sahədə mötəbər nüfuz sahibidir
- حِجَّة 1) həcc, müqəddəs yerlərə ziyarət; ذو الـ~ zülhiccə (ay təqviminin 12-ci ayı); 2) il; الشمس ~ قبل günəş batmamış, günəş batmazdan qabaq
- حُجِّيَّة sübutluluq gücü
- مُحَاجَّة 1) dəliligətirmə; 2) hüq. mübahisə
- مَحَجّ c. مَحَاجّ həcc yeri, ziyarət yeri, ibadət yeri
- مِحْجَاج mübahisəçi, höcətçi, höcət adam
- مَحَجَّة c. مَحَاجّ 1) böyük yol; həcc yolu; 2) həcc, ibadət yeri; العلم ~ məcaz. cəzbedici elm mərkəzi; 3) orta; الطريق ~ yolun ortası

I حَجَبَ (u) حَجْب , حِجَاب 1) bağlamaq, örtmək, örtük çəkmək; 2) gizlətmək; 3) buraxmamaq (harasa); بيني و بينك ~ məni səndən ayırmaq; القوم عن طريق التقدم ~ xalqı tərəqqi yolun-

[redacted]

istifadə etmək (*məs., Qurandan* بالمصحف); VII إِنْحَجَبَ gizli olmaq, örtülü olmaq; VIII إِحْتَجَبَ 1) hicablı olmaq; başını çəkmək, başını örtmək; 2) tənhalığa çəkilmək; kimdənsə gizlənmək (عن); 4) *məcaz.* pərdələnmək (*nə ilə* وراء), nəyinsə arxasında gizlənmək; 5) çıxmamaq (*qəzet haqqında*); çıxış etməmək (*artist haqqında*); görünməmək (*məs., xəstələndiyi üçün*)

- حَاجِبٌ [1] *c.* حَجَبَةٌ , حُجَّابٌ hacib, xidmətçi; qapıçı; nəzarətçi; المحكمة ~ məhkəmə icraçısı; الضوء ~ işıq örtəcəyi (*fotoaparatda*)

- حَاجِبٌ [2] *c.* حَوَاجِبُ 1) qurtaracaq, uc, qıraq, kənar; 2) العين ~ qaş

- حِجَابٌ [1] *c.* حُجُبٌ 1) örtük; لم يضع هذا على عينيه ~ا دون bu ona ... görməyə mane olmadı; 2) pərdə; arakasmə; حاجز ~ a) *anat.* diafraqma, döş boşluğunu qarın boşluğundan ayıran əzələ; b) *foto.* diafraqma

- حِجَابٌ [2] *c.* أَحْجِبَةٌ nəzər duası, gözmuncuğu, həmayil, tilsim

- حِجَابَةٌ haciblik, qapıçılıq, nəzarətçilik

- مُحَجَّبٌ 1) örtüyə bürünmüş, örtüklü; 2) nəzər duası gəzdirən

- مَحْجُوبٌ 1) örtülü; عن الاستغلال ~ istifadə üçün bağlı; 2) kor

I حَجَرَ (u) حَجْرٌ 1) mane olmaq; qadağan etmək; saxlamaq, yubandırmaq; başını bağlamaq; 2) qəyyum təyin etmək; عليه ~ *məch.* kiminsə dəli olduğunu təsdiq etmək; II حَجَّرَ 1) daşlaşdırmaq; 2) daş kimi bərkitmək; 3) qadağan etmək; V تَحَجَّرَ 1) daşlaşmaq, daşa dönmək; 2) daş kimi bərk olmaq; 3) yerində donub qalmaq, yerindən dəbərməmək, irəliləməmək (*məs., danışıqlar haqqında*); X إِسْتَحْجَرَ daşlaşmaq, daşa dönmək

- تَحَجُّرٌ daşlaşma; daşa dönmə; daşlaşmış heyvan və ya bitki qalığı; ~ علم paleontologiya

- تَحْجِيرٌ 1) daşlaşdırma, daşa döndərmə; 2) qadağan etmə, qadağa qoyma

- حَاجِرٌ [1] zəvvarların yolda dincəlməsi üçün ev

- حَاجِرٌ [2]: العين ~ gözün hədəqəsi

- حَجَّارٌ daşyonan

- حَجْرٌ 1) qadağa; الـ~ الصحّيّ karantin; الـ~ الصحّيّ الوقائيّ profilaktik karantin; مدّة الـ~ الصحّيّ karantin müddəti; رفع الـ~ عن bir şeyin üzərindən qadağanı götürmək; 2) qəyyumluq, himayəçilik; أنت في ~ ه sən onun himayəsi altındasan; 3) vətəndaş haqlarından məhrum etmə

- حَجَرٌ *c.* أحجار , حجارة 1) daş; أسود ~ bazalt; الـ~ الأسود Qara daş (*Kəbənin qapıya yaxın küncündə yerləşdirilmişdir*); البلاط ~ tava daşı; جهنّم ~ lyapis, cəhənnəm daşı, gümüş nitrat; جوّيّ ~ meteorit; جيريّ ~ *yaxud* كلسيّ ~ əhəngdaşı; خفاف ~ *yaxud* الخفّان ~ pemza; süngər daşı; الحيّة ~ serpentin, ilandaşı; الدبش ~ çınqıl, qırma daş; الدم ~ dəmir filizi, gematit; الرشيد ~ ər-Rəşid daşı; الرصف ~ çay daşı; الـ~ الرمليّ qumdaşı; السكاكين ~ bıçaqitiləyən daş, bülöv, bülöv daşı; صوانيّ ~ kvars; الطاحون ~ dəyirmandaşı; طباعة الـ~ litoqrafiya; القمر ~ selenit; الكتابة ~ qrafit; الكحل ~ *kim.* sürmə; كريم ~ qiymətli daş; لامع ~ daş-qaş; mika; مشقّق ~ *yaxud* الالواح ~ şist; المغناطيس ~ təbii maqnit; النار ~ pirit; الهدم ~ çınqıl, qırma daş; لوح ~ qrifel taxtası; وضع الـ~ الأساسي özülünü qoymaq, təməl daşını qoymaq (*nəyin* لـ); 2) *şahm.* fiqur, dama; الحجران qızıl və gümüş; الحكمة ~ *yaxud* الفلاسفة ~ hikmət daşı, iksir; الزاوية (الاسس) ~ məhək daşı; عثرة ~ maneə, əngəl; لم يترك فيه ~ا على آخر *yaxud* لم يبق منه ~ا على ~ nədəsə daşı daş üstə qoymamaq

- حِجْرٌ [1] *c.* حُجُورٌ 1) qadağa qoyulmuş şey; محجور ~ qəti qadağan edilmiş şey, qəti yasaq buyurulmuş şey; الـ~ Hicr (*Kəbənin şimal-qərbində divar*); 2) diz, ağuş; 3) ətək; 4) cinsiyyət orqanı

- حِجْرٌ [2] *c.* حُجُورٌ madyan

- حَجْرَةٌ *c.* حَجْرٌ , حَجَرَاتٌ tərəf, qıraq

- حُجْرَةٌ *c.* حُجَرٌ , حُجُرَاتٌ hücrə, otaq; kamera; kayut; الزوّار ~ *yaxud* الاستقبال ~ qonaq otağı; السطح ~ mansarda; الطيار ~ təyyarəçinin kabinəsi; النوم ~ yataq otağı; الاحتراق ~ *tex.* yanacaq kamerası; لكل ~ لها أجرة *At. sözü:* hər şeyin öz qiyməti var

- حَجَرِيٌّ 1) daş, daşdan qayrılmış; 2) daşlı, daşlıq; العصر الـ~ daş dövrü; العصر الـ~ القديم paleolit; العصر الـ~ الحديث neolit

- حُجَيْرَةٌ *c.* ـات 1) kiçik otaq; kamera; 2) özək; *biol.* hüceyrə

- مُتَحَجِّرٌ daşlaşmış, daşa dönmüş; حيوان ~ (نبات) qazıntı halında tapılan heyvanlar

- مُتَحَجِّرَاتٌ *c.* 1) daşlaşmış qalıqlar; 2) qazıntı halında tapılan şeylər

- مَحْجَرٌ , مَحْجِرٌ *c.* مَحَاجِرُ daş karxanası, daş çıxarılan yer; العين ~ gözün hədəqəsi; الـ~ الصحّيّ karantin; الـ~ الصحّيّ البيطريّ heyvanlar üçün karantin

- مَحْجُورٌ 1) saxlanılmış (*karantində*); 2) himayədə olan; عليه ~ dəli sayılan



I حَجَزَ (i, u) حَجْزٌ 1) saxlamaq, çəkindirmək (*kimi nədən* عن); yubatmaq; buraxmamaq; 2) toplamaq, yığmaq (*su*); 3) qarşısını kəsmək, qabağını tutmaq; tıxamaq; ayırmaq; بينهما ~ bir-birindən ayırmaq; الطريق ~ yolu bağlamaq; النهر ~ çayın qarşısını kəsmək (*bənd tikintisində*); 4) siyahıya almaq (*malı-mülkü*); müsadirə etmək (*nəyi* على); həbsə almaq (*nəyi*); 5) qabaqcadan (*yer, bilet və s.*) ayırıb saxlamaq; IV أَحْجَزَ Hicaza yollanmaq; VII إِنْحَجَزَ 1) saxlanılmaq; 2) siyahıya alınmaq, müsadirə edilmək (*mal-mülk*); VIII إِحْتَجَزَ 1) qapanmaq, qapanıb qalmaq, adamlara qovuşmamaq, adam arasına çıxmamaq; 2) özü üçün saxlamaq (*nəyisə*); yubatmaq, saxlamaq; في نفسه ه ~ gizlətmək, gizli saxlamaq (*nəyi*)

- حَاجِزٌ [1] *c.* حَجَزَةٌ 1) ayıran; qabağını tutan; 2) həbsə alan, müsadirə edən

- حَاجِزٌ [2] *c.* حَوَاجِزُ 1) maneə; 2) sədd, çəpər, hasar, arakəsmə; bənd; *hərb.* sipər, zireh sipər; torpaq səngər; təpə; السلّم ~ sürahı, məhəccər; للامواج ~ *yaxud* الموج ~ və ya الرصيف ~ dalğaqıran, bənd; حواجز جمركيّة (كمركيّة) gömrük maneələri; دولة ~ة bufer dövlət; الصوت ~ səs maneəsi; اجتاز الحواجز maneələri keçmək (*at yarışında*)

- حِجَازٌ hündür yer, təpəlik; هذا ~ يصعب التغلّب عليه bu elə bir maneədir ki, onu keçmək çətindir

- حِجَازِيٌّ 1. hicazlı; 2. Hicaz sakini; سنا ~ *bot.* kassiya, səna

- حَجْزٌ 1) saxlama; həbs etmə; həbs; الاموال ~ əmlaka həbs qoyulması; əmlakın müsadirə edilməsi; الـ~ التحفّظيّ iddianı təmin etmək üçün əmlaka ibtidai (*ilkin*) həbs qoyulması; الـ~ التنفيذيّ əmlaka satış üçün həbs qoyulması; 2) maneə, əngəl

- حُجْزَةٌ *c.* حُجُزَاتٌ , حُجَزٌ qurşaq; bel; شديد الـ~ dözümlü; səbirli; أخذ بـ~ـه kiməsə kömək

üçün müraciət etmək; kiminsə ətəyindən yapışmaq

- مُحَاجَزَة mane olma, buraxmama, əngəl

- مَحْجُوز 1) saxlanılmış; 2) müəyyən məqsəd uçün qabaqcadan ayrılmış; təxsis edilmiş (*yer, bilet və s.*); عليه ~ a) siyahıya alınmış; b) həbs edilmiş

I حَجَل (i, u) حَجْل , حَجَلَان 1) səyirtmək, çapmaq, çaparaq getmək; atılmaq, hoppanmaq; 2) atıla-atıla getmək; 3) dik qalxmaq, şaha qalxmaq (*at haqqında*)

- تَحْجِيل atın ayağında ala halqa; فلما رأيتُ البلقة ~الـ عليَّ هان *At. sözü.* alaca atı görəndə ayaqdakı ala halqa, alındakı ala qaşqa gözümdən düşdü

- حَجْل , حِجْل *c.* حِجَال , حُجُول , أَحْجَال halqa; xalxal; (الحجول) ربّات الحجال qadınlar

- حَجَل *topl.* kəkliklər

- حَجَلَة *c.* ات - kəklik

- مُحَجَّل 1) xalxallı (*qadın haqqında*); ayaqları ala halqalı (*at haqqında*)

I حَجَم (i, u) حَجْم , حِجَامَة hecəmət qoymaq, müalicə məqsədilə küpə qoyub (*zəli salıb*) qan almaq; IV أَحْجَم 1) imtina etmək, bitərəf qalmaq (عن); 2) çıxıb getmək; geri çəkilmək

- إِحْجَام 1) çıxıb getmə; geri çəkilmə; 2) imtina etmə, bitərəf qalma (*nədən* عن)

- حَجَّام hecəmətçi, hecəmət qoyan

- حِجَامَة hecəmətçilik sənəti; *tibb.* qanalma (*zəli ilə*)

- حَجْم *c.* حُجُوم həcm; format; ~الـ كبير iri-həcmli

- مِحْجَم , مِحْجَمَة *c.* محاجم 1) zəli; 2) *tibb.* küpə, banka

I حَجَن (i) حَجْن əymək, bükmək, qatlamaq; VIII إِحْتَجَن gecikdirmək, ləngitmək (*bir şeyin haqqını*)

- أَحْجَن *q.* حَجْنَاءُ *c.* حُجْن əyri; bükük; ~ أنف qarmaqşəkilli, (qırğı) burun

- مِحْجَن *c.* مَحَاجِن 1) qırmaq; dəstəyi əyri çomaq; 2) harpun

I (حجو) حَجَا (u) حَجْو düşünmək, fikirləşmək, zənn etmək; به خيرا ~ kimdəsə xeyir görmək; III حَاجَى tapmaca demək; eyhamla danışmaq; VI تَحَاجَى bir-birinə tapmaca demək

- أَحْجَى daha ağlabatan; daha münasib, daha yaxşı; ...به ان ~ كان onun üçün daha yaxşı olardı ki...

- أُحْجِيَّة *c.* أَحَاجٍ tapmaca; bağlama

- حِجًا *c.* أَحْجَاء ağıl, dərrakə

- حِجًا = حِجَى

حَدّ *xalq dili.* bir

I (حدّ) حَدَّ [1] (ə, u) حَدّ 1) hədd qoymaq, məhdudlaşdırmaq; حدّ من حريّته kiminsə azadlığını məhdudlaşdırmaq; حدّ من سرعة الحركة sürəti azaltmaq; 2) itiləmək, yonmaq; حَدَّ[2] (ə/i) حِدَاد matəm saxlamaq; yaslı olmaq; حَدَّ[3] (ə/i) حِدَّة hiddətlənmək, hirslənmək (*kimə* على); II حَدَّد 1) məhdudlaşdırmaq; 2) müəyyən etmək, təyin etmək; 3) itiləmək, yonmaq; 4) dəmirçi olmaq, dəmirçilik etmək; III حَادّ 1) acılamaq; düşmənçilik etmək; müqavimət göstərmək; 2) ümumi hüdudlara malik olmaq; qonşu olmaq, hüdudlanmaq; IV أَحَدّ 1) matəm saxlamaq (*kimin üçün* على); 2) itiləmək, yonmaq, sivriləşdirmək; النظر ~ nəzərə çarpdırmaq; diqqətlə baxmaq (*kimə* إلى); V تَحَدَّد 1) məhdud olmaq, məhdudlaşmaq; 2) müəyyən olunmaq, təyin edilmək; müəyyənləşmək; VIII إِحْتَدّ hiddətlənmək; qızışıb özündən çıxmaq; hirslənmək (*kimə* على); 2) kəskinləşmək (*məs., hisslər*);



X إِسْتَحَدّ 1) itiləmək; yonmaq; 2) tüklərini qırxmaq (*bədəndəki*)

- تَحْدِيد 1) məhdudlaşdırma; النسل ~ nəslin məhdudlaşdırılması; 2) hədd qoyma, sərhəd çəkmə; müəyyən etmə, təyin etmə; الاراضي ~ demarkasiya; (وجه) ~الـ على *yaxud* ~بالـ aydın surətdə; dəqiq; qəti surətdə

- حَادّ 1) iti; kəskin; şiddətli; البصر ~ itigöz, itigözlü; الذهن ~ itiağıl; ~ة زاوية *riyaz.* sivri bucaq; 2) kəskin; tünd; tündməcaz, tezhirslənən, tezacıqlanan; الطباع ~ tündxasiyyət; 3) matəm saxlayan, yas saxlayan (*kimə* على)

- حَدّ *c.* حُدُود 1) hədd, hüdud, son, qıraq; الحدّ الادنى minimum; الحدّ الاقصى maksimum; الحدّ الفاصل بين ayırıcı xətt; suayrıcı; إلى حدّ كبير *yaxud* إلى حدّ بعيد xeyli, böyük miqdarda, əhəmiyyətli dərəcədə; الى حدّ ما müəyyən dərəcədə, bir qədər; الى حدّ معلوم məlum həddə qədər; الى أقصى حدّ son həddə qədər; الى غير ما حدّ intəhasız, son dərəcə uzun, axırı, sonu olmayan; على حدّ سواء eyni dərəcədə; لا حدّ له intəhasız, hüdudsuz; həddi-hüdudu olmayan; saysız-hesabsız; لحدّ الآن indiyədək; متفائل الى ابعد حدود التفاؤل son dərəcə nikbin, optimist; مولع به لحدّ الهوس kiməsə intəhasız dərəcədə vurğun olmaq; على حدّ بحدّ (في~) ذاته özü-özünə; özlüyündə; قوله onun dediyinə görə; الزمه حدوده *yaxud* وقفه عند حدّه kiməsə həddini bildirmək; kimisə həddini aşmağa qoymamaq; في حدود القانون qanun çərçivəsində; وقف عند حدّ bir həddə dayanmaq, yerində durmaq; 2) sərhəd, hüdud; تعيين الحدود demarkasiya; تخطّى حدود اللياقة ləyaqət həddini aşmaq; ثقة بغير الحدود hədsiz etibar; 3) uc; tiyə, ağız; بحدّ السيف qılıncla; سلاح ذو ~ ين ikiağızlı silah; سكّينة بحدّين fin bıçağı; 4) hədd (*şəriətə əsasən cəza hökmü, maddəsi*); 5) *riyaz.* hədd; ثانى الحدّ ikihədli, binom; *fəls., məntiq.* mühakimə

- حِدَاد matəm, yas; ~الـ ثوب matəm libası; وقف ~ ا على... kiminsə xatirəsini yad etmək üçün qalxmaq

- حَدَّاد dəmirçi

- حِدَادَة dəmirçilik, dəmirçi işi

- حَدَد qadağan edilmiş; ...ان ا ~ ya Allah, ... -dən Özün saxla

- حِدَة *bax:* وحد

- حِدَّة 1) hiddət, şiddət; hirs; ~ في *yaxud* ~بـ hirslə; 2) qısqanclıq; 3) həvəs, şövq; 4) kəskinlik, itilik; البصر ~ gözün itiliyi; iti göz; التوتّر الدوليّ ~ beynəlxəlq vəziyyətin kəskinləşməsi; 5) fərasət, bəsirət, açıqgözlülük

- حُدُودِيّ sərhədboyu, sərhəddə olan; المنطقة الـ~ـة sərhəd zonası

- حَدِيد [1] *c.* حِدَاد 1) iti, kəskin, sivri; 2) القلب ~ tezqızışan, tez özündən çıxan, tezhirslənən

- حَدِيد [2] 1) dəmir; صلب ~ polad; الصبّ ~ *yaxud* الظهر ~ çüyün; الخردة ~الـ *yaxud* قُراضة ~ dəmir qırıntıları; مشغول ~ döyülməyə qabil dəmir; على شكل زاوية ~مرقّق *yaxud* مُزَوّى ~ bucaq şəklində olan dəmir; künc dəmiri; مبروم ~ burma dəmir; مطروق ~ döymə dəmir, prokat; خام ~ *yaxud* غفل ~ dəmir filizi; ~الـ سكّة dəmir yolu; ~الـ مصنع dəmir emalı zavodu; والنار ~بالـ *məcaz.* odla-qılıncla; تضرب في ~ بارد *zərbi-məsəl.* qəlbirlə su daşıyırsan (*hərf.* dəmiri soyuq-soyuq döyürsən); 2) *idm.* ştanq

- حَدِيدَة *c.* حَدَائد 1) dəmir parçası; 2) dəmir məmulatı; صناعة الحدائد dəmir emalı səna-

yesi; المحراث ~ gavahın; اللجام ~ dəhnə, yüyən ağızlığı; ~الـ هو على onun əli aşağıdır; ~الـ اصبح على pulsuz qalmaq, bir həsir, bir Məmmədnəsir qalmaq

- [illegible] 1) dəmir (sif), dəmirdən qayrıl-

- حَدَبٌ 1) qozbel; 2) əyri, bükük, donqar; 3) qabarıq, çıxıntılı; 4) meyilli, meyil göstərən, hüsn-rəğbət bəsləyən (*kimə* على)

- حَدَبَةٌ 1) qoz, donqar; 2) güvən, hörgüc (*dayada*); 3) çıxıntı; 3) yüksəklik, hündür yer



bu, böyük dəyişikliklərə səbəb oldu (*nədə* في); 2) ilk dəfə əmələ gətirmək (*yeni cins*); təzədən, yenidən etmək; yeniləşdirmək

- إِحْدَاثِيٌّ *c.* اتٌ - *riyaz.* koordinata; أبعاد ~ـة koordinatlar; افقيّ ~ *yaxud* السّينيّ ~الـ «x»

qillik əldə etmiş; التحرّر ~ yenicə azad olmuş; ~ـا yenicə; bu günlərdə; السنّ ~ yeniyetmə, cavan, gənc; العهد ~ a) yenicə baş vermiş; b) gənc; c) yenicə tanış olmuş (*nə ilə* بـ);

2

düşmək, üzüaşağı gəlmək, yuvarlanmaq; حَدَرَ [2] (u) حُدُرٌ kök olmaq, dolu olmaq, yoğun olmaq; II حَدَّرَ 1) eniş düzəltmək; 2) endirmək; V تَحَدَّرَ 1) düşmək, enmək; diyirlənib düşmək; 2) irəli gəlmək, əmələ gəlmək, törəmək (nədən من); 3) mənşəcə, əslən (kimdən من) olmaq; VII إِنْحَدَرَ 1) enmək, düşmək; diyirlənib düşmək, yuvarlanmaq; aşağı düşmək; 2) mənşəcə, əslən (haradan من) olmaq; 3) keçmək, ötürülmək (irsən – kimə الى); 4) çatmaq (kimə-nəyə), yetişmək (kimə - nəyə الى)

- أُحْدُورٌ eniş, enişlik
- إِنْحِدَارٌ 1) eniş, meyil, enişlik, yamac; 2) düşkünlük (mənəvi)
- تَحَدُّرٌ c. ات - eniş, meyil, enişlik
- حَادِرٌ kök, dolu, yoğun, şişman
- حُدَارٌ şiş
- حُدْرَةٌ 1) kütlə, yığnaq; 2) sürü (dəvə)
- حَدُورٌ sərt eniş, dağdöşü, dağətəyi
- حُدُورٌ düşmə, enmə, eniş
- حَيْدَرٌ şir
- مُنْحَدَرٌ c. مُنْحَدَرَاتٌ = تَحَدُّرٌ

I حَدَسَ (u) حَدْسٌ düşünmək, zənn etmək; fərz etmək

- حَدْسٌ 1) fərasət, fəhm, tez başa düşmə; nüfuz etmə; 2) zənn, güman, hiss etmə, duyma; ~الـ على düşünmədən, bəxtə-bəxt, necə gəldi; ~الـ yaxud النفسي ~الـ intuisiya
- حَدْسِيٌّ intuitiv
- حَدْسِيَّةٌ: ~الـ fəls. intuitivizm

I حَدَفَ [1] (u) حَدْفٌ ayağını geriyə çəkmək (dəvə yol gedərkən); حَدَفَ [2] (i) حَدْفٌ bax: حَذَفَ

- حَدَّافَةٌ c. ات - nazim çarx

I حَدَقَ (i) حَدْقٌ 1) əhatə etmək (kimi-nəyi بـ); 2) dik-dik baxmaq; ...النظر في ~ gözlərini bərəldib baxmaq; II حَدَّقَ diqqətlə baxmaq (hara في yaxud الى); الطعام ~ xörəkdən qabaq duzlu, acı bir şey yemək; IV أَحْدَقَ əhatə etmək (kimi-nəyi بـ)

- حَادِقٌ 1) turş, şor, acı (yemək haqqında); 2) mahir, hiyləgər, fəndgir
- حَدَاقَةٌ = حَذَاقَةٌ
- حَدَقَةٌ c. حَدَقٌ , حَدَقَاتٌ , أَحْدَاقٌ hədəqə; العين ~ حفظه حفظ nəyisə göz bəbəyi kimi qorumaq
- حُدَقِيٌّ dombalangöz
- حَدِيقَةٌ c. حَدَائِقُ bağ; park; الحيوانات ~ heyvanxana, zoopark
- مُحْدِقٌ əhatə edən; خطر ~ qaçılmaz təhlükə

I (حدل) حَدَلَ [1] (i) حَدَلٌ yaxud حَدِلَ (ə) حَدَلٌ ədalətsiz rəftar etmək (kiminlə على); حَدَلَ [2] (i) حَدَالَةٌ hamarlamaq, yaymaq

- حَادِلَةٌ c. ات - buldozer
- مِحْدَلَةٌ c. مَحَادِلُ vərdənə, yayıcı dəzgah, yolbasan (maşın), paltarhamarlayan

(حدم) VIII إِحْتَدَمَ 1) yanmaq, alovlanmaq; 2) özündən çıxmaq; غيظا ~ qeyzlənmək; 3) qızışmaq, alovlanmaq (mübarizə haqqında)

- مُحْتَدِمٌ qeyzli, özündən çıxmış, cinlənmiş, hirslənmiş

حِدَةٌ bax: وحد

I (حدو) حَدَا (u) حَدْوٌ , حِدَاءٌ , حُدَاءٌ 1) dəvələri səsləyib çağırmaq; 2) təhrik etmək, həvəsləndirmək, sövq etmək (kimi بـ nəyə الى); ...رغبة في ~ məqsəd güdmək, səy etmək

- أُحْدِيَّةٌ , أُحْدُوَةٌ dəvəçi, sarban mahnısı
- حَادٍ c. حُدَاةٌ sarban, dəvəçi
- حِدَاءٌ , حُدَاءٌ 1) dəvəni qızışdırmaq üçün oxunan mahnı; 2) məcaz. təhrik, sövq; təhrikedici səbəb
- حَدَّاءٌ dəvəçi, sarban
- حَدْوَةٌ c. حِدَاوٌ , حَدَوَاتٌ nal



I حَدِيَ (ə) حَدًى qalmaq, olmaq (harada بـ); V تَحَدَّى 1) çağırmaq; meydan oxumaq; 2) ədəbsizlik, həyasızlıq etmək; 3) iddiasında olmaq (nəyin بـ); iddia etmək (nəyə بـ); rəqabət aparmaq; 4) tərəfdar olmaq; bir şeyə münasibətdə mövqe tutmaq

- تَحَدٍّ c. تَحَدِّيَاتٌ meydanoxuma; çağırış; في~ ədəbsizcəsinə
- حُدَايَّةٌ = حِدَأَةٌ

I حَذِرَ (ə) حَذَرٌ həzər etmək, çəkinmək, ehtiyatlanmaq (nədən من); II حَذَّرَ çəkindirmək, xəbərdarlıq etmək; تك النظر اليها ~ səni ona baxmaqdan çəkindirmişdim; III حَاذَرَ çəkinmək, ehtiyatlanmaq; V تَحَذَّرَ = I; VIII إِحْتَذَرَ ehtiyat tədbirləri görmək; çəkinmək

- تَحْذِيرٌ xəbərdarlıq, çəkindirmə
- حَاذِرٌ çəkinən; ehtiyatlı
- حَذَارِ: من هذا ~ bundan ehtiyatlı ol! ! ~ ehtiyatlı ol! !أن تفعل هذا ~ bax, bunu etməyəsən ha!
- حِذَارٌ həzər, ehtiyatlılıq
- حَذِرٌ , حَذُرٌ ehtiyatlı, ehtiyatkar
- حَذَرٌ , حِذْرٌ ehtiyatlılıq, ayıqlıq; كان على~ ayıq-sayıq, ehtiyatlı olmaq; ه ~ أخذ ehtiyat tədbirləri görmək
- مَحْذُورٌ c. مَحَاذِيرُ , مَحْذُورَاتٌ 1) çəkinməli şey; təhlükə; 2) xoşagəlməz şey, bəla; 3) bədbəxt hadisə

I حَذَفَ (i) حَذْفٌ 1) buraxmaq, çıxartmaq, atmaq, pozmaq; 2) tullamaq (nəyi بـ); 3) riyaz. çıxmaq; II حَذَّفَ qaydaya salmaq, gözəl görkəm vermək, yaraşıqlı etmək; VII إِنْحَذَفَ buraxılmaq, düşmək, çıxarılmaq, atılmaq, pozulmaq

- حَذْفٌ 1) buraxma, çıxartma, atma, pozma; 2) tullama
- حَذَفٌ topl. çöl ördəkləri
- حَذَفَةٌ c. ات - çöl ördəyi
- حُذْفَارٌ c. حَذَافِيرُ tərəf; أخذه بحذافيره büsbütün götürmək

I (حذق) حَذِقَ (ə) حَذَقٌ , حَذَاقَةٌ mahir olmaq (nədəsə); حَذَقَ (i) حُذُوقٌ turş, şor, acı, tünd, bərk olmaq

- حَاذِقٌ c. حُذَّاقٌ 1) mahir, zirək, çevik; bilən, yüksək ixtisaslı; عامل ~ ixtisaslı fəhlə; 2) turş, şor, acı, tünd, bərk
- حَذَاقَةٌ məharət, ustalıq; bacarıq, qabiliyyət; yüksək ixtisas; zirəklik, çeviklik
- حِذْقٌ = حَذَاقَةٌ

حَذْلَقَ 1) özünü bilici göstərmək, əlləməlik etmək; 2) pedant olmaq, xırdaçı, vasvası olmaq; تَحَذْلَقَ = حَذْلَقَ

- تَحَذْلُقٌ pedantlıq
- حِذْلَاقٌ 1. özünü bilici göstərən, əlləməlik edən; 2. pedant
- حَذْلَقَةٌ pedantlıq, ifrat dəqiqlik
- مُتَحَذْلِقٌ = حِذْلَاقٌ

حَذَامِ Həzami (iti görmə qabiliyyəti olan ərəb qadınının adı)

I (حذو) حَذَا (u) حَذْوٌ , حِذَاءٌ təqlid etmək, yamsılamaq, ardınca getmək; حذوه ~ kiminsə yerişini yerimək; III حَاذَى 1) nə iləsə üzbəüz, qarşı-qarşıya olmaq; 2) yanaşı, müvazi, paralel getmək; IV أَحْذَى bağışlamaq, hədiyyə etmək; VI تَحَاذَى 1) paralel olmaq; 2) bir-birilə üzbəüz, qarşı-qarşıya olmaq; VIII إِحْتَذَى 1) ayağına geymək; ayağa geyilmək; 2) təqlid etmək, yamsılamaq; مثاله ~ kiminsə gedişini getmək

- إِحْتِذَاءٌ təqlid, yamsılama
- تَحَاذٍ paralellik; hərb. düzlənmə; من اليمين~! sağa düzlən!

- حِذَاءٌ [1] c. أَحْذِيَة çəkmə; səndəl; ayaqqabı; أحذية بساق طويل yaxud أحذية طويلة uzunboğaz çəkmə; ~ قصير qısaboğaz çəkmə; ~ اللباد keçə çəkmə
- حِذَاءٌ [2]: حِذَاءَهُ yaxud بحذائه kiminsə, nəyinsə qarşısında, müqabilində
- حَذَّاءٌ çəkməçi
- حَذْوٌ təqlid, yamsılama; حذوه kiminsə, nəyinsə qarşısında, müqabilində
- حَذِيَّةٌ hədiyyə
- مُحَاذٍ q. مُحَاذِيَة qarşıda duran; paralel (nəyə لـ); müqabil (nəyə لـ)
- مُحَاذَاةٌ əks, müqabil tərəf; paralellik; بـ~ـه yaxud في ~ـه yaxud على ~ـه kiminsə, nəyinsə qarşısında, müqabilində; kiməsə, nəyəsə paralel

I حَرَّ (i/ə, u) حَرَارَةٌ isti, qızğın, hərarətli olmaq; II حَرَّرَ 1) azad etmək, azadlıq vermək; emansipasiya etmək; qurtarmaq (nədən من); 2) redaktə etmək; yoxlamaq; 3) yazmaq, tərtib etmək; 4) yönəltmək, istiqamətləndirmək, tuşlamaq, nişan almaq (topla, tüfənglə); 5) həsr etmək; V تَحَرَّرَ 1) azad olmaq, azadlığa çıxmaq; emansipasiya olmaq; 2) yazılmaq, tərtib edilmək; yazılmış olmaq; VIII إِحْتَرَّ qızmaq, qızışmaq (məs., mübahisə); X إِسْتَحَرَّ qızmaq, qızışmaq

- أَحَرُّ ən hərarətli; على ~ من الجمر sanki köz üstündə, böyük səbirsizliklə, əlimyandı, darda
- أَحْرَارِيٌّ əhrari, liberal
- تَحَرُّرٌ azadlıq; حركة الـ~ الوطني milli azadlıq hərəkatı
- تَحَرُّرِيٌّ azadlıq (sif.); حركة ~ـة azadlıq hərəkatı
- تَحْرِيرٌ c. تَحَارِيرُ , تَحْرِيرَاتٌ 1) azadlıq, azad etmə; 2) redaktə etmə; 3) redaksiya; ادارة الـ~ redaksiya (qəzetin, jurnalın); صاحب الـ~ redaktor; رئيس الـ~ baş redaktor; 4) yazma; tərtib etmə; 5) məktub; rəsmi sənəd; و قد يعرف الـ~ من عنوانه *At. sözü.* yazı başlığından tanınar (*yazı haqqında başlığına əsasən fikir yürüdülər*)
- تَحْرِيرِيٌّ 1) redaksiya ...; 2) yazılı; ~ـا yazılı surətdə; حركة ~ـة azadlıq hərəkatı
- حَارٌّ 1) isti, hərarətli, qızğın; 2) çalışqan; səyli; 3) tünd, acı, bərk (*yemək*)
- حَرٌّ c. حُرُورٌ isti, hərarət, dəm; الدنيا حرّ hava istidir; منطقة حرّة tropik (*isti*) qurşaq
- حُرٌّ c. أَحْرَارٌ 1. 1) azad, hürr, sərbəst; müstəqil; مدينة حرّة azad şəhər; مدرسة حرّة özəl məktəb; 2) yanında olan, nağd; المال الحرّ nağd pul; 3) azadlıqsevər; 4) nəcib, əsilzadə; 5) nəcib, saf, qatışığı olmayan (*metal*); ذهب حرّ saf, xalis qızıl; 2. 1) azad insan; 2) nəcib, əsilzadə insan; 3) liberal; حرّ الوجه yanaq
- حَرَّارٌ = حَرَائِرِيٌّ
- حَرَّارٌ ipək toxucusu
- حَرَارَةٌ 1) isti, istilik; 2) hərarət, qızdırma; مسجّل الـ~ termoqraf; ميزان الـ~ termometr; كانت الـ~ ٤٣ درجة في الظل havanın hərarəti kölgədə 43 dərəcə idi; 3) qızğınlıq, həvəs, coşqunluq, ehtiras; حيّاه بـ~ kimisə hərarətlə salamlamaq; أيّده بـ~ kimisə hərarətlə dəstəkləmək; 4) səpmə, səpgi, xırda sızanaq; 5) yandırma (*dərini*); 6) tündlük, acılıq, bərklik (*yeməyin*)
- حَرَارِيٌّ istilik -i/-ı; termik; محطّة الكهرباء الـ~ـة istilik elektrik stansiyası; نوويّ ~ istilik-nüvə -i/-ı; وحدة ~ـة kalori
- حَرَّانُ q. حَرَّى c. حَرَارَى 1) hiddətlənmiş, hirslənmiş; 2) isti; hərarətli; 3) yanğısı olan; ehtirasla arzu edən



- حَرَّةٌ c. حِرَارٌ , حَرَّاتٌ vulkanik mənşəli daşlı torpaq
- حُرَّةٌ c. حَرَائِرُ *tar.* azad qadın (*kəniz olmayan*) qadın
- حَرُورٌ isti külək
- حَرِيرٌ c. حَرَائِرُ 1) ipək; مشاقة ~ xamna; 2) ipək parça; اصطناعيّ (صناعيّ) ~ süni ipək; ~ طبيعيّ təbii ipək; 3) ipək məmulatı; ~ صخريّ asbest
- حُرَيْرَةٌ c. ـات - *fiz.* kalori
- حَرِيرِيٌّ 1. ipək -i/-ı; ipək kimi; 2. ipək taciri; ipəksatan
- حُرِّيَّةٌ azadlıq; ~ الاجتماع toplantı azadlığı; ~ الاختيار seçki azadlığı; ~ الاديان *yaxud* ~ العبادة etiqad azadlığı, vicdan azadlığı; ~ التجارة ticarət azadlığı; ~ التعليم təhsil azadlığı; ~ تنظيم الاضراب tətil keçirmək azadlığı; ~ الشخصية şəxsiyyət azadlığı; ~ الكتابة *yaxud* ~ النشر *yaxud* ~ الصحافة mətbuat azadlığı; ~ العمل hərəkət azadlığı; ~ الفكر fikir azadlığı; ~ الكلام *yaxud* ~ القول *yaxud* ~ ابداء الرأي söz azadlığı; ~ النقد tənqid azadlığı
- مِحْرَارٌ termometr, istiliksölçən
- مُحَرِّرٌ 1. azad edən; 2. 1) xilaskar; 2) yazıçı, yazar; jurnalist; müxbir; ~ سياسيّ siyasi icmalçı; 3) redaktor, mühərrir
- مُحَرَّرَاتٌ c. korrespondensiya; yazışmalar; kağızlar; kağız sənədlər
- مَحْرُورٌ 1) hirslənmiş, hiddətlənmiş; 2) hərarətli, qızdırmalı

I حَرِبَ (حرب) (ə) حَرَبٌ acıqlanmaq; qəzəblənmək; حَرَبَ (u) حَرْبٌ , حَرَبٌ 1) qarət etmək, əlindən almaq; III حَارَبَ döyüşmək, müharibə etmək, dava etmək, vuruşmaq; VI تَحَارَبَ bir-birilə vuruşmaq; 2) birgə müharibə aparmaq; VIII إِحْتَرَبَ = VI

- حَرْبٌ q. c. حُرُوبٌ müharibə; kampaniya; döyüş, vuruş; الـ~ الاهلية vətəndaş müharibəsi; الـ~ الكبرى الاولى birinci dünya müharibəsi; الـ~ العالمية الثانية ikinci dünya müharibəsi; ~ عادلة ədalətli müharibə; ~ جائرة ədalətsiz müharibə; ~ قذرة çirkin müharibə; ~ باردة soyuq müharibə; ~ حامية müharibə; ~ نوويّة حراريّة istilik-nüvə müharibəsi; ~ عدوانية təcavüzkar müharibə; ~ كليّة total müharibə; ~ الابادة qırıcı müharibə; حروب الاغتصاب işğalçılıq müharibələri; ~ غير معلنة elan olunmamış müharibə; مشعلو نيران الـ~ müharibə qızışdırıcıları; ما بعد الـ~ müharibədən sonrakı; اركان الـ~ baş qərargah; في حالة الـ~ müharibə vəziyyətində; اشهر الـ~ *yaxud* اعلن الـ~ müharibə elan etmək; دار الحرب *bax*: دار
- حَرَبٌ dərd, bəla; وَا حَرَبَاهُ! bu nə müsibətdir!
- حِرْبَاءٌ c. حَرَابِيُّ , حِرْبَاوَاتٌ *zool.* buqələmun
- حَرْبَجِيٌّ c. حَرْبَجِيَّةٌ militarist, hərbçi
- حَرْبَةٌ c. حِرَابٌ nizə, mizraq, cida; süngü; harpun
- حَرْبِيٌّ 1) hərbi; مجلس ~ hərbi şura; مدرسة ~ـة hərbi məktəb; وزارة ~ـة hərbi nazirlik; 2) hərbsevər, davakar; 3) *fiqh.* hərbi (*hərb dünyasının təbəəsi və ya sakini*)
- حَرِيبٌ qarət edilmiş
- مُتَحَارِبٌ başqaları ilə birgə müharibə edən; müharibədə iştirak edən
- مُحَارِبٌ 1. döyüşən, müharibə edən; 2. 1) döyüşən tərəf; حقوق الـ~ döyüşən tərəfin haqları; 2) döyüşçü; قديم ~ müharibə veteranı
- مُحَارَبَةٌ müharibə; vuruş, döyüş

- مِحْرَابٌ *c.* مَحَارِيبُ mehrab, səcdəgah; الكنيسة ~ kilsə mehrabı; المسجد ~ məscidin mehrabı (*qiblənin səmtini bildirir*)

حَرْتَقَ cingildəmək, danqıldamaq, taqqıldamaq

- حَرْتَقَةٌ *c.* ـات - cingilti, taqqıltı; القيود ~ qandalların cingiltisi; 2) *məcaz.* boşboğazlıq, gəvəzəlik, laf

I حَرَثَ (u) حَرْثٌ şumlamaq, sürmək (*yeri*), becərmək (*torpağı*); VII إِنْحَرَثَ şumlanmaq, sürülmək

- حَارِثٌ *c.* حُرَّاثٌ cütçü, əkinçi; ~ابو الـ şir

- حَرَّاثٌ 1. şumlayan; 2. cütçü, əkinçi

- حَرَّاثَةٌ *zool.* danadişi

- حِرَاثَةٌ 1) şumlama, sürmə; 2) cütçülük, əkinçilik

- حَرْثٌ 1) şumlama; ~آلة الـ kotan, cüt; 2) becərilmiş torpaq; əkin yeri, sürülmüş yer; 3) əkinçilik məhsulları

*yət*); 3) səhvdən, xətadan, günahdan çəkinmək

- أَحْرَجُ ən ağır, ən böhranlı, ən kritik

- تَحَرُّجٌ 1) sıxıntı, sıxılma, utanma; 2) ciddi çətinlik, ciddi ağırlaşma (*vəziyyətdə*)

- تَحْرِيجٌ 1) sıxışdırma, ağırlaşdırma; 2) çətin vəziyyət, ağır vəziyyət; 3) meşəsalma; الارض ~ ağacəkmə

- حَرَّاجٌ hərrac

- حَرَاجَةٌ çətinlik, ağırlıq, böhranlı vəziyyət

- حَرَاجِيٌّ meşə -i/-ı; ثروة ~ـة meşə sərvəti

- حَرَجٌ [1] 1) sıxıntı, çətinlik; böhranlı durum; ~ اوقعه في kimisə çətin vəziyyətə salmaq; 2) qadağa; 3) pis iş, pis əməl; günah; ~ فهل من ... علينا ...bizim üçün çətindirmi; ولم نجد ~ـا في ان... biz elə bir çətinlik görmürük ki...; لا ~ عليك! sənə elə bir çətinliyi olmaz! فحدث عنه ولا ~ onun barəsində nə desən, inanacağam (*tam etibar bildirmək üçün*)



حِرْخٌ *c.* أَحْرَاخٌ *anat.* uşaqlıq yolu, balalıq yolu

I (حرد) حَرَدَ (u) حُرُودٌ sapmaq, kənara çıxmaq, uzaqlaşmaq; حَرِدَ (ə) حَرَدٌ hirslənmək (*kimə* على); II حَرَّدَ qübbə hörmək; qübbəli etmək (*tikintini*)

- حَرِدٌ , حَارِدٌ hirsli, qəzəbli

- حَرْدَانٌ = حَارِدٌ

حِرْذَوْنٌ *c.* حَرَاذِينُ kərtənkələ

I (حرز) حَرَزَ (u) حَرْزٌ qorumaq, saxlamaq, mühafizə etmək; حَرُزَ (u) حَرَازَةٌ möhkəmləndirilmək, istehkam şəklinə salınmaq, əlçatmaz olmaq; IV أَحْرَزَ ələ keçirmək, ələ almaq; yiyələnmək; nail olmaq; qazanmaq; الاولويّة في... ~ *idm.* nədəsə birincilik qazanmaq; الهدف ~ qol vurmaq; فوزا ~ qələbə qazanmaq; نجاحا ~ uğur qazanmaq; قصب ~ السبق yarış çələngini qazanmaq; V تَحَرَّزَ çəkinmək, özünü qorumaq, özünü gözləmək (*nədən* من); VIII اِحْتَرَزَ = V

- إِحْتِرَاسٌ ehtiyat, ehtiyat tədbiri; ~بـ ehtiyatla

- حَارِسٌ 1. 1) qoruyucu, gözətçi; ~الملك الـ qoruyucu mələk; 2) ayıq-sayıq; 2. *c.* حُرَّاسٌ, حَرَسَةٌ 1) qoruyucu; hami; gözətçi; mühafizəçi; qarovul; الحدود ~ sərhədçi; 2) *həmç.* المرمى ~ *idm.* qapıçı

- حَرَّاسٌ qoruyucu, mühafizəçi; gözətçi

- حِرَاسَةٌ mühafizə; qoruma; nəzarət, himayə; qarovul xidməti; الحدود ~ sərhəd mühafizəsi; قضائيّة ~ sekvestr; ~وضع تحت الـ a) himayə təyin etmək; b) sekvestr qoymaq

- حَرَسٌ mühafizə dəstəsi, keşikçi dəstəsi, qarovul; növbətçi; qvardiya; الشرف ~ şərəf qarovulu; الوطنيّ ~الـ milli qvardiya

- مُحْتَرِسٌ ehtiyatlı; ayıq-sayıq

- مَحْرُوسٌ 1. hifz olunan, qorunan; nicat tapan; ~ـة الـ əl-Məhrusə (*Qorunan*) Qahirənin epitetlərindən biri; 2. oğul; övlad;

- خَبِير c. خُبَرَاء 1) məlumatlı, bilikli, işbilən, işdən başı çıxan; 2) yaxşı bilən, bilici; ekspert, mütəxəssis (hansı iş üzrə في)
- مُخَابَرَة c. ـات – 1) yazışma, yazılı əlaqə; 2) danışıqlar; تلفونية ~ telefon danışıqları; المخابرات kəşfiyyat; قلم المخابرات məlumat bürosu; kəşfiyyat bürosu; 3) yardarlıq
- مُخْبَر [1] c. مَخَابِر laboratoriya
- مَخْبَر [2] təcrübə və ya informasiya əsasında (kimisə/nəyisə) bilmə
- مُخْبِر 1) xəbərverən, məlumatverən; 2) müxbir; 3) xəfiyyə
- مَخْبَرِيّ laboratoriya -i/-ı
- مُخْتَبِر 1) təcrübə aparan; 2) təcrübədən keçirən; sınaqçı
- مُخْتَبَر c. ـات – laboratoriya (təcrübə, sınaq laboratoriyası); للفيزياء النووية ~ nüvə fizikası laboratoriyası
- مُخْتَبَرِيّ laboratoriya -i/-ı

I خَبَزَ (i) خَبْز çörək bişirmək; VII إنْخَبَزَ bişirilmək; VIII إخْتَبَزَ = I
- خَبَّاز çörəkçi, çörəkbişirən
- خِبَازَة çörəkbişirmə, çörəkçilik
- خُبْز çörək; الاسمر ~ الـ qara çörək; التنور ~ təndir çörəyi; من الذرة ~ الـ qarğıdalı unundan çörək; من القمح ~ الـ buğda unundan çörək; الغراب ~ göbələk (zəhərli); اليومي ~ الـ gündəlik ruzi; dolanacaq; ليس بالـ~ وحده يحيا الانسان insanı yaşadan təkcə çörək deyil
- خَبْزَة çörək bişirimi, bir dəfəyə bişirilən çörəklərin sayı
- خُبْزَة c. ـات – kömbə
- خَبِيز 1. bişirilmiş; 2. bişirim
- خُبَّيْز، خُبَّيْزَة bot. əməkömənci (balbay)
- مَخْبَز، مَخْبَزَة c. مَخَابِز çörəkxana

I خَبَصَ (i) خَبْص 1) qatmaq, qarışdırmaq
çilik etmək, söz gəzdirmək (kim barəsində على); qedi-qodu ilə məşğul olmaq, qeybət etmək (kim barəsində على); 3) aralarını vurmaq, dalaşdırmaq (kiminlə kimin بين وبين); II خَبَّصَ qarışdırmaq; dolaşdırmaq; VII إنْخَبَصَ qatışdırılmaq, dolaşdırılmaq; dolaşıq salınmaq
- خَبَّاص 1. hər şeyi qatıb-qatışdıran; 2. 1) dediqoduçu, sözgəzdirən, aravuran
- خَبْص qatıb-qarışdırma; qarışıq; الادبي ~ الـ qatma-qarış ədəbi əsər; بلاش خبص bəsdir, özündən qondardın!; bəsdir, uydurdun!
- خَبِيص c. أخْبِصَة xabis (xurma, qaymaq və kraxmaldan hazırlanan şirin sıyıq); marmelad
- خَبِيصَة bir pay xabis (خبيص)
- مَخْبُوص 1. 1) qatma-qarış; qatılıb-qarışdırılmış; 2) dolaşıq; 2. qarışıq

I خَبَطَ (i) خَبْط 1) vurmaq, döyəcləmək; tapdalamaq (ayaqla); الباب ~ qapını döymək; رأسه في الحائط ~ ...على nəyə görəsə başını divara vurmaq; 2) çırpmaq (xalça); خبط ~ العشواء yaxud على العمي ~ fikirləşmədən iş görmək; kor-koranə hərəkət etmək; في الظلام ~ في امر معالجة... bir işin həlli yolunu tapmaqda çətinlik çəkmək; II خَبَّطَ çox vurmaq, bərk döyəcləmək, var gücü ilə çırpmaq; V تَخَبَّطَ 1) əl ilə yoxlaya-yoxlaya getmək, kor kimi getmək; في قوله ~ məcaz. hətərən-pətərən danışmaq, nə dediyini bilməmək; 2) çapalamaq, çırpınmaq, əlləşmək (nə içində في); في البؤس والحرمان ~ yoxsulluq və məhrumiyyət içində yaşamaq; في دوامة ~ الحيرة والقلق heyrət və təşviş içərisində olmaq; VIII إخْتَبَطَ = V
- خَبْط vurma, döymə, zərbə endirmə; خبط عشواء düşünmədən, bəxtə-bəxt, necə gəldi,



- خَبْطَة c. خَبَطَات zərbə; taqqıltı; بـ~ ~ məsəl. gözə göz, dişə diş
- مِخْبَاط c. مَخَابِيط oxlov (yuyarkən paltarı çırpmaq üçün)
- مِخْبَط c. مَخَابِط = مِخْبَاط

I خَبَلَ (i) خَبْل (خبل) 1) pərt etmək, utandırmaq; 2) çətin vəziyyətə salmaq; mane olmaq (hərəkətə); 3) ağlını başından almaq, dəli-divanə etmək; خبل (ə) خبل ağlı başından çıxmaq, dəli-divanə olmaq; II خَبَّلَ 1) pərt etmək; çətin vəziyyətə salmaq; 2) ağlını başından almaq; V تَخَبَّلَ ovqatı təlx olmaq, qanı qaralmaq, kefi pozulmaq; VIII إخْتَبَلَ çaşmaq (ağıl)
- أخْبَل q. خَبْلَاء c. خُبْل ağlını itirmiş, ağlı başından çıxmış, dəli
- إخْتِبَال ağlını itirmə, ağlı başından çıxma, dəlilik
- خَبَل 1) çaşqınlıq; nizamsızlıq; 2) ağlını itirmə, dəlilik
- خَبْل pozulma, pozğunluq; çaşqınlıq
- خَبْل 1) pozulma, pozğunluq; çaşqınlıq; 2) dəlilik; 3) ağılsızlıq
- خَبِل ağlını itirmiş, dəli
- خَبْلَة = خَبَل
- مُخَبَّل 1) çaşıb qalmış; ovqatı pozulmuş; pərt olmuş; 2) ağlını itirmiş
- مَخْبُول ağlını itirmiş, ağlı başından çıxmış, dəli
- مُخْتَبَل ağlını itirmiş; العقل ~ ağlı başında olmayan

I خَبَا (u) خَبْو (خبو) sönmək, keçmək; اوار ~ الحرب müharibə qurtardı
- خَابٍ q. خَابِيَة sönük, ölgün; نظرة خابية sönük baxış
- خَبَارِي kürü (balığın); ... ~ qırmızı kürü;

I خَتَرَ (i) خَتْر vəfasız çıxmaq, etibarsız çıxmaq (kiməsə); aldatmaq (kimisə); xəyanət etmək
- خَاتِر vəfasız, etibarsız, namərd
- خَتَّار satqın, xain
- خَتْر satqınlıq, xəyanət, aldatma
- خَتِيعَة c. خَتَائِع oymaq

I خَتَلَ (i, u) خَتْل aldatmaq, biclik etmək, kələk gəlmək; III خَاتَلَ aldatmaq; VIII إخْتَتَلَ aldatmaq; سرا ~ sirri öyrənməyə çalışmaq
- خَاتِل adamaldadan, yalançı
- مُخَاتِل 1) aldadan; 2) aldadıcı
- مُخَاتَلَة aldatma, yalan, kələk

I خَتَمَ (i) خَتْم، خِتَام 1) möhür vurmaq (nəyə على); möhürləmək (nə ilə بـ); بختمه ~ öz möhürü ilə möhürləmək; 2) bağlamaq (nəyi على yaxud təs. hal nə ilə بـ); على الخطاب ~ yaxud الخطاب ~ məktubu möhürləmək; 3) qurtarmaq, bitirmək, xətm etmək; القرآن ~ Quranı xətm etmək; 4) sağalmaq, bitişmək (yara haqqında); V تَخَتَّمَ üzük taxmaq; VII إنْخَتَمَ möhürlənmək; VIII إخْتَتَمَ 1) bağlamaq, qurtarmaq, tamamlamaq, bitirmək; 2) xitam verilmək
- إخْتِتَام nəticə, son, xitam
- خَاتَام c. خَوَاتِيم 1) üzük (qaşlı); möhürlü üzük; 2) nəticə, son
- خَاتَم، خَاتِم c. خَوَاتِم 1) möhür; möhürlü üzük; 2) üzük; الزواج ~ nişan üzüyü; الملك سليمان ~ folk. Şah Süleymanın üzüyü; 3) anat. göbək; النبيين (الانبياء) ~ Peyğəmbərlərin möhürü, Məhəmməd peyğəmbər; العذرة ~ bakirəlik pərdəsi
- خَاتِمَة c. خَوَاتِم yekun, son, epiloq; nitqin sonu; المطاف ~ son nəticə; الامور بخواتمها məsəl. cücəni payızda sayarlar (hərf. işlər son nəticələri

- خَتَّامٌ möhürdüzəldən
- خِتَامٌ 1) son, xitam, yekun, nəticə; sonda; 2) *mus*. final
- خَتَّامَةٌ möhür üçün rəngli yastıqça
- خِتَامِيٌّ son, axır; ~ حساب illik hesabat; ــة ~ جلسة yekun iclası
- خَتْمٌ 1) möhürləmə; بالرصاص ~ plombla möhürləmə, plomblama; ~الـ شمع surğuc; 2) *c*. أَخْتَامٌ ştamp; möhür; damğa; iz, nəqşə;

خُثٌّ torf
- مَخَثَّةٌ *c*. مَخَاثُّ torfluq, torf batlağı

I خَثَرَ (ə) خَثْرٌ qatılaşmaq; qəlizləşmək; laxtalanmaq; qıcqırmaq, turşumaq; II خَثَّرَ qatılaşdırmaq; qəlizləşdirmək; çürütmək; mayalamaq; IV أَخْثَرَ = II; V تَخَثَّرَ qatılaşmaq, laxtalanmaq, qıcqırmaq; çürümək
- تَخَثُّرٌ qatılaşma; qıcqırma, çürümə; الدم ~ في وعاء دموي *tibb*. tromboz



- مَخْجُولٌ utandırılmış, rüsvay edilmiş, pərt edilmiş

I خَدَّ (ə/u) خَدٌّ 1) şırım açmaq; 2) şumlamaq; II خَدَّدَ 1) zol-zol etmək, şırımlamaq; 2) qırış-qırış etmək; V تَخَدَّدَ 1) şırımlanmaq; 2) qırışmaq, qırış-qırış olmaq, qırışlarla örtülmək
- أُخْدُودٌ *c*. أَخَادِيدُ 1) qanov, xəndək; çuxur, çala, oyuq; 2) şırım

- خِدْرٌ *c*. خُدُورٌ , أَخْدَارٌ 1) pərdə, portyer; 2) qadınlar üçün otaq
- خَدَرٌ 1) keyimə, keyləşmə, qeyri-həssaslıq; vicvicə, ürpəriş; الرجل ~ ayağın keyiməsi; 2) anesteziya
- خَدِرٌ keyimiş, keyləşmiş, şişmiş (*göz*); yatmış (*ayaq*); həssaslığını itirmiş (*bədən üzvü*)
- خُدْرَةٌ keyimə, keyləşmə, qeyri-həssas

– خَدَّاعٌ 1. 1) aldadan, yalanla dolu; 2) aldadıcı; 2. yalançı, hoqqabaz, hiyləgər, bic, cüvəllağı

– خِدَاعٌ yalan, hiylə, kələk; البصر ~ göz aldanması; الحواس ~ hisslərin aldanması, illüziya

– خِدَاعِيٌّ aldadıcı, yalançı, xəyali, illüzor

– خَدْعَةٌ c. خَدَعٌ , خَدَعَاتٌ aldatma; aldanma; yalan, kələk, biclik; بصريّة ~ göz aldanması

– خُدَعَةٌ böyük adamaldadan

– خَدِيعَةٌ c. خَدَائِعُ aldatma, biclik, hiyləgərlik

– خَيْدَعٌ aldadıcı, ilğım, xəyal

– مُخَادِعٌ adamaldadan, yalançı

– مَخْدَعٌ , مُخْدَعٌ c. مَخَادِعُ evin içində ev

– مَخْدُوعٌ aldadılmış

I خَدِلَ (ə) خَدَلٌ 1) keyləşmiş, keyimiş, qeyri-həssas olmaq; 2) yorğun olmaq

– خَدْلَانُ 1) hissiyyatsız; 2) yorğun

I خَدَمَ (i) خِدْمَةٌ 1) xidmət etmək, işləmək, xidmətdə olmaq; 2) xidmət göstərmək; الارض ~ torpağı (*əkinə*) hazırlamaq, bellə-mək (*səpin üçün*); II خَدَّمَ iş vermək; xidmətə qəbul etmək; X إِسْتَخْدَمَ 1) işə qəbul etmək, xidmətə götürmək; 2) istifadə etmək, işlətmək, tətbiq etmək

– إِسْتِخْدَامٌ 1) işə götürmə, xidmətə qəbul etmə; ~ طلب الـ işə, xidmətə qəbul edilmək barədə ərizə; 2) istifadə etmə, işlətmə, tətbiq etmə; 3) iş, xidmət

– تَخْدِيمٌ iş vermə, xidmətə götürmə; مكاتب الـ~ muzdla işə qəbul üzrə vasitəçilik büroları

– خَادِمٌ c. خَدَمٌ , خُدَّامٌ 1. xidmətçi, qulluqçu; 2. xadim, xidmətçi, nökər; خدم المنازل ev qulluqçuları; ~كم المطيع həqir bəndəniz (*məktublarda*)

– خَادِمَةٌ c. اتٌ – xadimə, xidmətçi qadın

– خَادِمِيَّةٌ xidmətdə olma, xidmətçilik, qulluqçuluq

– خَدَّامٌ xadim, qulluqçu, nökər; qulluq-göstərən

– خَدَّامَةٌ c. اتٌ – xidmətçi qadın

– خَدَمَةٌ *topl.* xidmətçilər, qulluqçular, nökərlər

– خِدْمَةٌ c. خِدَمٌ , خِدْمَاتٌ 1) xidmət; الحكومة ~ dövlət xidməti; الاجباريّة ~الـ hərbi mükəlləfiyyət; العسكريّة ~الـ hərbi xidmət; ~الـ أدى العسكريّة hərbi xidməti yerinə yetirmək; ~الـ العاملة (العسكريّة) həqiqi (*hərbi*) xidmət; وضعه في ~ـه xidmətinə vermək; وضع مصنعا موضع ~الـ zavodu işə salmaq; 2) xidmət göstərmə; 3) iş; vəzifə; 4) qulluq; في ~كم! buyurun!; qulluğunuzda hazıram!; هو في ~ـك! o sənin qulluğunda hazırdır!; أدى خدمة xidmət göstərmək (*kimə* لـ); الارض ~ torpağı (*əkinə*) hazırlama, belləmə

– مُخَدِّمٌ işverən, işəgötürən; muzdla işə qəbul üzrə vasitəçi

– مَخْدُومٌ ağa, sahib; işverən, işəgötürən

– مَخْدُومَةٌ xanım, sahibə

– مَخْدُومِيَّةٌ sahib məqamı

– مُسْتَخْدَمٌ 1. 1) istifadə olunmuş; 2) xidmətə götürülmüş; 2. xidmətçi, qulluqçu

(خدن) III خَادَنَ dostluq etmək (*kiminləsə*)

– خِدْنٌ c. أَخْدَانٌ dost, tanış

– خِدِينٌ = خِدْنٌ

– خِدِيوٌ *tar.* xədiv (*Osmanlı imperiyası dövründə Misir hökmdarı*)

– خِدِيويٌّ c. خِدِيوِيُّونَ = خِدِيوٌ , خِدَاوِيٌ

– خِدِيوِيٌّ xədiv -i/-ı

– خِدِيوِيَّةٌ *tar.* xədivlik

I خَذَأَ (ə) خَذْأً tabe olmaq (*kimə* لـ); X إِسْتَخْذَأَ = I

– خُذْرُوفٌ c. خَذَارِيفُ fırfıra, fırlanğıc

– خُذْرُوفِيٌّ fırfıravari, kürəvi, yumru



I خَذَفَ (ə) خَذْفٌ atmaq, tullamaq (*nəyi* بـ)

– مِخْذَفَةٌ c. مَخَاذِفُ sapand

I خَذَلَ (u) خَذْلٌ , خِذْلَانٌ 1) köməksiz, dəstəksiz qoymaq; başlı-başına buraxmaq; 2) işləməmək (*bədən üzvləri haqqında*); ~ـته قواه qüvvəsi tükənmişdir; 3) *məch.* məğlubiyyətə uğramaq; uğursuzluğa düçar olmaq; dəstək almamaq (*məs., hökumət haqqında*); II خَذَّلَ 1) çaşdırmaq; 2) həvəsdən salmaq (*nəyisə etməyə*); 3) dəstəkdən məhrum etmək (*məs., hökuməti*); 4) canını üzmək, əldən salmaq; III خَاذَلَ köməksiz qoymaq; başlı-başına qoymaq; VI تَخَاذَلَ 1) atmaq, buraxmaq (*nəyi* عن); 2) tərk etmək (*qüvvə haqqında*); işləməmək (*bədən üzvləri haqqında*); 3) zəifləmək, gücünü itirmək; 4) cəsarətsizlik göstərmək; acizliyini boynuna almaq, çəkilmək; VII إِنْخَذَلَ uğursuzluğa düçar olmaq, məğlub olmaq; dəstək almamaq (*məs., hökumət haqqında*); 2) özünü zəif, köməksiz hiss etmək; acizliyini boynuna almaq; çəkilmək

– إِنْخِذَالٌ uğursuzluq, məğlubiyyət

– تَخَاذُلٌ 1) zəiflik, gücsüzlük, köməksizlik; gücdən düşmə; cəsarətsizlik, ürəksizlik

– خِذْلَانٌ 1) köməksiz, dəstəksiz qoyma; 2) uğursuzluq, məğlubiyyət; أصيب بـ~ məğlub olmaq, uğursuzluğa düçar olmaq (*nədə* في)

– مُتَخَاذِلٌ güсdən düşmüş, zəifləmiş; 2) cəsarətsiz, ürəksiz, təslimçi

– مَخْذُولٌ köməksiz, dəstəksiz qalmış

(خذى) X إِسْتَخْذَى alçalmaq; boyun əymək, itaət göstərmək; təslim olmaq, tabe olmaq (*kimə* لـ)

– إِسْتِخْذَاءٌ özünü alçaltma, boyun əymə, tabe olma, itaət göstərmə

– مُسْتَخْذٍ *q.* مُسْتَخْذِيَةٌ alçaldıcı; ~يا itaətkarcasına; acizanə

I (خرّ) خَرَّ [1] (ə/i) خَرِيرٌ 1) quruldamaq, qur-qur etmək; 2) xoruldamaq; خَرَّ [2] (ə/u) خَرٌّ , خُرُورٌ 1) üzüqoylu düşmək, diz çökmək; خرّ صريعا həlak olmaq; خرّوا صرعى في الجهاد onlar döyüşdə həlak oldular; خرّ بين قدميه kiminsə ayaqlarına düşmək; 2) dammaq; axıtmaq

– خَرَّارَةٌ c. اتٌ – 1) drenaj borusu; 2) zibil quyusu; 3) fırfıra

– خَرِيرٌ 1) quruldama, qur-qur etmə; 2) xorultu

I خَرِئَ (ə) خَرْءٌ , خُرُوءٌ qarnını boşaltmaq, nəcis ifraz etmək

– خُرْءٌ , خَرَاءٌ ifrazat, nəcis

– مَخْرَأَةٌ , مَخْرَأٌ c. مَخَارِئُ ayaqyolu

I (خرب) خَرِبَ (i) خَرْبٌ xarab etmək, xaraba qoymaq, sökmək, korlamaq, yıxmaq, dağıtmaq; خَرِبَ (ə) خَرَابٌ xarab olmaq, xarabalığa çevrilmək, sökülmək, dağılmaq, korlanmaq; بيتي ~! evim yıxıldı!; II خَرَّبَ 1) xaraba qoymaq, dağıtmaq, viran qoymaq; 2) təxribatçılıq etmək, ziyan vurmaq; IV أَخْرَبَ xaraba qoymaq, viran qoymaq, xarabaya çevirmək; V تَخَرَّبَ dağılmaq, xarabalığa çevrilmək, viran qoyulmaq

– تَخْرُوبٌ c. تَخَارِيبُ çuxur, çala, oyuq; özək

– تَخْرِيبٌ 1) xaraba qoyma, dağıtma, viran etmə; الآثار القديمة ~ vandalizm, vəhşilik, barbarlıq; 2) korlama, ziyançılıq, təxribatçılıq

– تَخْرِيبِيٌّ təxribatçılıq -i/-ı; الحركات الـ~ـية təxribatçılıq fəaliyyəti

– خَارِبٌ xaraba qoyan, dağıdan; dağıdıcı, pozucu

– خَرَابٌ c. أَخْرِبَةٌ 1) xaraba qoyma, viran etmə; 2) ölüm; 3) xarabalıqlar

- خَرَابَة c. ات - xarabalıqlar, xarabazarlıq, viranəlik
- خَرْبٌ xaraba qoyma, viran qoyma, dağıtma
- خَرِبٌ 1) dağıdılmış, xaraba qoyulmuş, viran qoyulmuş; 2) xarab olmuş, sıradan çıxmış, korlanmış; الذمّة ~ vicdansız
- خُرْبٌ c. خُرُوبٌ 1) göz, deşik (*iynədə*); 2) diz qapağı
- خَرْبَانٌ 1) xaraba qoyulmuş, viran qoyulmuş, dağıdılmış; 2) xarab olmuş, korlanmış, sıradan çıxmış
- خَرِبَةٌ c. خَرَائِبُ = خَرَابَةٌ
- خَرِبَةٌ c. خِرَبٌ = خَرِبٌ
- خَرْبَةٌ c. خَرَبٌ = خَرَابَةٌ
- خَرُّوبٌ xərrub (*qınlı bitkilər fəsiləsindən olan ağac və onun meyvəsi*)
- خَرُّوبَةٌ c. ات - 1) xərrub; 2) xərrubə (*1/16 qədəhə - قدح və ya 0,129 l. bərabər tutum ölçüsü*)
- مُخَرِّبٌ 1) xarabaqoyucu, dağıdıcı; 2) xaraba qoyan, viran edən
- مُخَرِّبٌ dağıdan, dağıdıcı, viranedici; təxribatçı

خَرْبَشَ korlamaq; eybəcərləşdirmək, tanınmaz hala salmaq; 2) cırmaqlamaq, cızmaq; cızma-qara, səliqəsiz yazmaq
- خَرَابِيشُ c. 1) cırmaqlar, cırmaq yerləri, sıy-

[redacted]

- خَرْبَطَةٌ korlanma, xarab olma; nasazlıq, xarablıq, pozuqluq

خَرْبَقَ korlamaq, xarab etmək; 2) deşmək, dəlmək
- خَرْبَقٌ *bot.* asırqal, çöpləmə
- خَرْبَقَةٌ 1) korlama; 2) deşmə, dəlmə

I خَرَتَ (u) خَرْتٌ deşmək, dəlmək, deşik açmaq
- خَرْتٌ c. خُرُوتٌ , أَخْرَاتٌ deşik, dəlik; أضيق من ~ الابرة iynə gözündən də dar
- خِرِّيتٌ c. خَرَارِيتُ bacarıqlı, cəld; təcrübəli; ~ دليل təcrübəli bələdçi

خَرْتِيتٌ kərgədən

I خَرَجَ (u) خُرُوجٌ 1) çıxmaq (*haradan* من); الى الوجود ~ meydana çıxmaq, işıq üzü görmək; 2) aralanmaq, uzaqlaşmaq, kənara çıxmaq (*nədən* عن); عن الخط ~ xətdən çıxmaq (*qatar haqqında*); عن صمته ~ susmağı pozmaq; عن عادته ~ yadırğamaq; عن الموضوع ~ mövzudan kənar çıxmaq; ما ~ عن... ...kənara çıxmamaq, məhdudlaşmaq (*nə iləsə*); 3) nəticədə çıxmaq, alınmaq; 4) xaric olmaq; 5) çıxarmaq (*kimi* بـ); 6) imtina etmək, üz döndərmək (*nədən* عن); 7) qalxmaq, getmək (*kiməsə/nəyəsə qarşı* على); 8) pozmaq; على القواعد ~ qaydaları pozmaq; 9) əlindən gəlmək; يخرج من يده عمل الحلق üz qırxmaq

[redacted]



etmək; الصوت ~ səs çıxartmaq; الحروف من مخارجها ~ səsləri düzgün tələffüz etmək; الصور ~ *foto* aydınlaşdırmaq; 5) kənarlaşdırmaq; qovmaq; من الخدمة ~ işdən çıxartmaq; من جدول الاعمال ~ gündəlikdən çıxartmaq; V تَخَرَّجَ 1) bitirmək, qurtarmaq (*kursu, məktəbi* من , في); 2) kursu bitirməklə dərəcə, ixtisas almaq; VI تَخَارَجَ öz aralarında bölüşdürmək (*malı, ümumi xərcləri*); ayrılmaq (*şəriklər haqqında*); X إِسْتَخْرَجَ almaq, çıxarmaq, hasil etmək; parçalar çıxarmaq (*yazıdan*), çıxarışlar etmək (*haradan* من); الجذور ~ *riyaz.* kök almaq; المسألة ~ məsələ həll etmək; 2) distillə etmək
- إِخْرَاجٌ 1) çıxartma; alma; 2) xaric, kənar etmə; 3) istisna etmə; işdən çıxartma; 4) rejissorluq, tamaşaya qoyuluş (*pyesin, filmin*); 5) yaratma, təşkil etmə
- إِسْتِخْرَاجٌ 1) çıxartma, alma; الجذر ~ *riyaz.* kök alma; 2) hasil etmə; 3) çıxarış, yazıdan bir parça; 4) distillə
- إِسْتِخْرَاجِيٌّ hasiletmə -i/-ı; çıxarma -i/-ı; الصناعة الـ~ـة hasiletmə, çıxarma sənayesi
- تَخَرُّجٌ qurtarma, bitirmə (*kursu*)
- تَخْرِيجٌ 1) kənar etmə, çıxarma; 2) hazırlama, təlim keçmə; tərbiyə etmə; 3) bura-

[redacted]

b) bayıra; هرع الى الـ~ bayıra, çölə qaçmaq; 2) *həmç.* القسمة ~ *riyaz.* qismət
- خَارِجِيٌّ[1] 1) zahiri, bayır; 2) kənar; 3) xarici; وزارة الـ~ـة *yaxud* الـ~ـة xarici işlər nazirliyi; وزير الشؤون الـ~ـة *yaxud* الـ~ـة xarici işlər naziri; السلك الـ~ diplomatik xidmət; ~ تلميذ dərslərə müvəqqəti gələn şagird; ~ ممرّضة gəlib-gedən şəfqət bacısı (*xəstəxanada*)
- خَارِجِيٌّ[2] c. خَوَارِجُ bidətçi, təfriqəçi; الخوارج *tar.* xaricilər
- خَرَاجٌ 1) xərac, torpaq vergisi; رأسي ~ adambaşına yığılan vergi, can vergisi; 2) malikanə (*kəndlər, mülklər və s.*)
- خُرَاجٌ c. أَخْرِجَةٌ *yaxud* خُرَّاجٌ c. خَرَارِيجُ irin, yara, çiban; şiş
- خَرَّاجٌ : ولاّج ~ sudan quru çıxan; diribaş
- خَرَاجِيٌّ torpaq vergisi qoyulmuş, xərac təyin edilmiş
- خَرْجٌ c. أَخْرَاجٌ 1) xərc, məsarif; 2) xərclik; 3) rasion, pay; düşəcək, çatacaq; qazanılmış; 4) bac, xərac, vergi; 5) işləmə, bəzək vurma (*paltara*)
- خُرْجٌ c. أَخْرَاجٌ xurcun; aşırma heybə; حطّ (وضع) الامر الى الـ~ işi ləngitmək, süründürməyə salmaq
- خَرْجَةٌ c. خَرَجَاتٌ 1) çıxış; 2) cənazənin

[redacted]

- خِرِّيج kursu bitirmiş; məzun; yetişdirmə; kursu bitirməklə dərəcə, rütbə almış
- مُتَخَرِّج məzun; yetişdirmə
- مَخْرَج c. مَخَارِج 1) çıxış yeri, çıxış; وجد ~ من ازمة böhrandan çıxış yolu tapmaq; 2) *anat.* gödən; 3) *linq.* məxrəc, artikulyasiya yeri; 4) *riyaz.* məxrəc
- مُخْرِج quruluşçu; rejissor; سينمائي ~ kino-rejissor
- مُسْتَخْرَج 1. çıxarılan, hasil edilən; 2. *c.* ات - çıxarış (*sənəddən* من); sənədin üzü; رسمي ~ من شهادة الميلاد doğum haqqında şəhadətnamənin təsdiqlənmiş üzü
- مُسْتَخْرَجَات *c.* 1) ekstraktlar; 2) istehsalatın əlavə məhsulları (*məs., neftin*); معدنيّة ~ yer altından çıxarılan minerallar; mineral qazıntıları

خَرْخَرَ xoruldamaq; xırıldamaq; 2) şırıldamaq (*su haqqında*)
- خَرْخَرَة 1) xoruldama, xorultu; xırıltı, xışıltı (*məs., sinədə*); 2) şırıltı

خَرْخَشَ xırıldamaq (*xəstə haqqında*)
- خَرْخَشَة xırıldama, xırıltı

I خَرِدَ (ə) خَرَدٌ bakirə olmaq; təvazökar, başıaşağı olmaq
- خُرْدَجِيّ *c.* خُرْدَجِيَّة xırda alverçi; xırdavatçı, xırdavat satan
- خُرْدَة *c.* خُرْدَوَات 1) xırda, xırda şey, xırda-xuruş; 2) xırda mallar; *c.* xırdavat; خردوات من القطن pambıq parçadan xırdavat; دكان الخردوات xırdavat dükanı; 3) istifadə müddəti çıxmış şeylər (*müəssisələr, xəstəxanalar tərəfindən satılan mallar*); ~ بيعت الباخرة لأنها gəmi istifadə müddəti çıxmış bir şey kimi satıldı; الحديد ~ dəmir qırıntısı
- خَرُود 1. təvazökar (*qadın, qız*); 2. bakirə qız
- خَرِيد qız, bakirə qız
- خَرِيدَة *c.* خَرَائِد 1) bakirə qız; 2) deşilməmiş mirvari

خَرْدَق *topl.* qırma, seçmə
- خَرْدَقَة *c.* ات - qırma dənəsi, seçmə dənəsi

خَرْدَل 1) *bot.* xardal; 2) xardal toxumu; حبّة الـ~ xardal dəni (*toxumu*); غاز الـ~ xardal qazı, iprit; لزقة الـ~ xardal yaxması; لا يعدل هذا الامر حبّة الـ~ bu iş bir qəpiyə dəyməz, bu işin zərrə qədər əhəmiyyəti yoxdur
- خَرْدَلَة *c.* ات - xardal dəni (*toxumu*); لا تسقط من يده ~ o çox simicdir, əli bərkdir
- خَرْدَلِيَّة *c.* ات - xardal qabı

I خَرَزَ (i, u) خَرْز deşmək, dəlmək (*burğu ilə*)
- خَرَز *topl.* muncuq; dənələr (*təsbehin*); daşlar (*boyunbağının*); زجاج ~ şüşə muncuq
- خَرَزَة *c.* ات - muncuq dənəsi; dənə (*təsbehin*); daş (*boyunbağının*); البئر ~ quyu çatısı; الرقبة ~ xirtdək, hülqum; الظهر ~ fəqərə
- مِخْرَز *c.* مَخَارِز biz; deşikaçan (*alət*)
- مِخْرَاز *c.* مَخَارِز = مِخْرَز

I خَرِسَ (ə) خَرَس 1) lal olmaq; dili tutulmaq; عن ايضاح المسألة ~ məsələnin üstündən sükutla keçmək; 2) susmaq, səsini kəsmək, sakit olmaq; !إخرس sus!; IV أَخْرَسَ 1) lal etmək; səsini almaq; 2) susdurmaq, səsini kəsmək; ماذا ~ك؟ niyə susdun?; لسانه ~ kimisə susdurmaq, susmağa məcbur etmək; ـه ~ بهذا الجواب cavabı ilə kimisə susdurmaq; VI تَخَارَسَ özünü lal, dili-ağzı olmayan göstərmək
- أَخْرَس *q.* خَرْسَاء *c.* خُرْس , خُرْسَان lal, dinməz, danışmaz, dilsiz-ağızsız
- خَرَس 1) lallıq; 2) susma; *tibb.* afaziya, danışma qabiliyyətini itirmə
- خِرْس əkib-becərmək üçün yararsız torpaq



- خَرْسَان *q.* خَرْسَى = أَخْرَس
- خَرَسَان beton
- خَرَسَانَة 1) beton; المسلّحة الـ~ dəmir-beton, armaturla möhkəmləndirilmiş beton; 2) kirəmit
- خَرَسَانِيّ beton (*sif.*); اعمدة ~ة beton dayaqlar

I خَرَشَ (i) خَرْش cırmaqlamaq; cızmaq, sıyırmaq

خَرْشَنَة su qaranquşu

خَرْشُوف *topl. bot.* ənginar
- خَرْشُوفَة *c.* ات - ənginar

خُرْشُوم *c.* خَرَاشِيم 1) zirvə; hündür dağ; 2) burun

I خَرَصَ (u, i) خَرْص 1) fal açmaq, fala baxmaq; ehtimal etmək, güman etmək; 2) yalan demək, yalan danışmaq; V تَخَرَّصَ özündən uydurmaq, qondarmaq; fərz, ehtimal etmək; 2) böhtan, şər atmaq, iftira etmək (*kimə* على); yalan demək; VIII إِخْتَرَصَ böhtan, şər atmaq, iftira etmək (*kimə* على)
- تَخَرُّص *c.* ات - 1) uydurma, qondarma; 2) böhtan, şər, iftira
- خَرَّاص yalançı; iftiraçı, böhtançı
- خُرْص *c.* خِرْصَان sırğa; üzük

خَارْصِين = خَرْصِين

I خَرَطَ (u) خَرْط 1) yonmaq (*xarrat haqqında*); 2) doğramaq, kəsmək; 3) yalan demək, yalan danışmaq; basıb-kəsmək; lovğalanmaq, öyünmək; 4) dəmləmək (*çay*); 5) yarpaqları sıyırıb qoparmaq (*ağacdan*); الشجرة ~ ağacdan yarpaq dərmək; II خَرَّطَ 1) kəsib doğramaq, xırda-xırda doğramaq, ovub tökmək; 2) təmizləmək (*mədəni dərmanla*); V تَخَرَّطَ təmizlənmək (*mədə haqqında*); VII إِنْخَرَطَ 1) yonulmaq; 2) xırda-xırda doğranılmaq; 3) daxil olmaq, girmək (*hara* في); qarışmaq, başını soxmaq (*nəyə* في); في سلك ~ ...-da/-də xidmətə girmək; في سلك ~ الوزارة nazirlikdə xidmətə girmək; في سلك ~ القضاء məhkəmə sistemində işə düzəlmək; في سلكهم ~ o onların birliyinə daxil oldu; VIII إِخْتَرَطَ qından çıxarmaq (*qılıncı*); X إِسْتَخْرَطَ: في البكاء ~ hönkürməyə başlamaq
- خَارِطَة *c.* خَوَارِط , خَارِطَات xəritə (*coğrafi*)
- خَرَّاط 1) xarrat; 2) lovğa, gopçu, özünü öyən
- خَرَّاطَة *c.* ات - bıçaq (*ufalamaq, ovub tökmək üçün*)
- خُرَاطَة yonqar, sıvantağzı, taxta kəpəyi
- خِرَاطَة xarratlıq
- خَرْط 1) yonma; xarrat işi; 2) yarpaqları dərmə, üzmə; الشجرة ~ ağacdan yarpaqları qopartma; 3) yalan, gop; دون ذلك القتاد ~ bu çox çətin işdir
- خُرْطَة *c.* خُرَط tikə, parça, dilim, fal
- خَرِيطَة *c.* خَرَائِط 1) xəritə (*coğrafi*); الارصاد ~ الجوّيّة meteoroloji xəritə; علم رسم الخرائط kartoqrafiya, xəritəçəkmə elmi; 2) dəri kisə, torba; çiyin çantası
- مَخْرَط *c.* مَخَارِط xarrat emalatxanası
- مِخْرَطَة *c.* مَخَارِط xarrat dəzgahı
- مَخْرُوط *c.* مَخَارِيط konus; قطع مخروط *riyaz.* konus kəsiyi; الفخار ~ـة konusşəkilli gil qab
- مَخْرُوطَة məxrutə (*xörək adı*)
- مَخْرُوطِيّ konus (*sif.*), konusşəkilli; ~ قطع *riyaz.* konusşəkilli kəsik

خَرْطَال *bot.* vələmir, yulaf

خَرْطُوش *topl. c.* خَرَاطِيش patron, güllə; بيت الـ~ patronqabı; patrontaş; الصيد ~ ov patronları; تجاري ~ ticarət dəftəri
- خَرْطُوشَة *c.* ات - patron, güllə; حيّة ~ döyüş patronu, dolu güllə; خرساء ~ boş patron, güllə; 2) kartuş (*üzərində yazı, emblem, gerb və s. şəkli olan qalxanvari yonma və ya qrafik bəzək*), çərçivə

خَرْتِيت = خَرْطِيط

خَرْطَمَانِيّ iri xortumlu; yekəburun

- خُرْطُوم *c.* خَرَاطِيم 1) xortum; donuzun burnu; yekə burun; 2) *həmç.* الماء ~ su xortumu, su vermək üçün rezin boru, su şlanqı

خَرْطُون *c.* خَرَاطِين torpaq qurdu, soxulcan

I خَرَعَ (u) خُرُوع *yaxud* خَرِعَ (ə) خَرَع , خَرَاعَة 1) zəif olmaq, zəifləmək; 2) kəmağıl olmaq; VII اِنْخَرَعَ üzgün, zəif olmaq, zəifləmək; VIII اِخْتَرَعَ ixtira etmək, düşünüb tapmaq, kəşf etmək

- اِخْتِرَاع *c.* ات - 1) ixtiraçılıq; 2) ixtira, kəşf

- خَرَاعَة uyuq

- خَرِع zəif, üzgün, taqətdən düşmüş; zəifləmiş

- خَرِع = خَرِيع

- مُخْتَرَع 1. uydurulmuş, uydurma; ixtira edilmiş, kəşf edilmiş; 2. *c.* ات - ixtira

- مُخْتَرِع ixtiraçı

- خَرْعُوبَة *c.* خَرَاعِيب gənc qız

I خَرِفَ (ə) خَرَف 1) xəriflәmək, ağlını itirmək, uşaqlıq etmək; 2) boş-boş danışmaq; sayıqlamaq (*xəstə haqqında*); II خَرَّفَ = I

- تَخْرِيف *c.* ات - boşboğazlıq, boş danışıq, cəfəngiyat; كله ~ في ~ bütün bunlar boş söhbətdir

- خُرَافَة *c.* ات - 1) xürafat, mövhumat; 2) nağıl, əfsanə; boş söhbət; cəfəngiyat; əsassız ehtimal, güman; uydurma

- خُرَافِيّ mövhumi, xürafi, əfsanəvi, nağılvari

- خَرَف 1) kəmağıllıq; ağlını tədricən itirmə (*qocalıqdan*); 2) xürafat

- خَرِف , خَرْفَان kəmağıl, ağlını itirmiş, xərifləmiş

- خَرُوف *c.* خِرْفَان , خِرَاف quzu, qoyun; الــ ~ المحشي içi doldurulmuş qoyun, qoyun ləvəngisi (*yemək*); البحر ~ *zool.* lamantin (*dənizinəyi*)

- خَرِيف payız

- خَرِيفِيّ payız -i/-ı

- مُخَرِّف 1. xərifləmiş; 2. boşboğaz, çoxdanışan, çərənçi

خَرْفَشَ 1) qarışdırmaq, qatıb qarışdırmaq, dolaşdırmaq; 2) dolaşıq danışmaq; oxunmaz bir surətdə yazmaq, cızma-qara yazmaq; 3) kələ-kötür, nahamar olmaq

- خَرَافِيش *c.* dialekt ifadələri, dialektizmlər

- خَرْفَشَة 1) qatıb qarışdırma, dolaşdırma; 2) dolaşıq nitq; 3) *radio* əngəl, maneə, ilişik, səs-küy

خَرْقُوش *topl. kart.* xırda kartlar

- خَرْقُوشَة *c.* ات - *kart.* xırda kart, atılmalı kart

I خَرَقَ (i, u) خَرْق [1] 1) deşik, dəlik açmaq; deşmək, dəlmək; içindən yemək; açmaq; yarmaq; جبهة العدو ~ düşmən cəbhəsini yarmaq; البنت ~ qızın üzünü açmaq; العين ~ gözünü deşmək, açıq-aşkar görünmək; 2) keçmək, nüfuz etmək; 3) pozmaq, tapdalamaq, aşmaq; أدبا ~ ədəb qaydalarını pozmaq; الأمن العام ~ ictimai təhlükəsizliyi pozmaq; حدود الدولة ~ dövlət sərhədlərini pozmaq; حرمة المعهد ~ *hüq.* institutun toxunulmazlığını pozmaq; المدى الجوي ~ hava sərhəddini pozmaq; خَرِقَ [2] (u) خُرُوق evdə oturmaq, evdən çıxmamaq; خَرُقَ (u) خَرَاقَة axmaq olmaq; II خَرَّقَ parça-parça etmək; deşik-deşik etmək; V تَخَرَّقَ deşilmək, yırtılmaq, dağılmaq, yarılmaq; VII اِنْخَرَقَ deşilmək, deşik-deşik olmaq; VIII اِخْتَرَقَ 1) açmaq, oymaq; nüfuz etmək; yarmaq (*cəbhəni*); kəsib keçmək; yarıb keçmək, dəlib keçmək (*məs., güllə*)

- اِخْتِرَاق 1) nüfuz etmə qabiliyyəti, keçicilik; 2) nüfuz etmə; yarıb keçmə (*cəbhəni*); dəlib keçmə (*məs., güllə*)



- أَخْرَق *q.* خَرْقَاء *c.* خُرْق 1) axmaq, sarsaq, qanmaz, küt; 2) yöndəmsiz, biçimsiz, ağır tərpənən

- خَارِق 1. 1) yarıb keçən; dəlib keçən; 2) fərqlənən, qeyri-adi, fövqəladə olan; العادة ~ qeyri-adi, xariqüladə, fövqəladə; نجاح ~ qeyri-adi uğur; الطبيعة ~ fövqəltəbii; 2. *c.* خَوَارِق xariqələr; möcüzələr; qeyri-adi, fövqəltəbii hadisələr

- خَرْق 1) yarma, yarıb keçmə; 2) pozma; 3) *c.* خُرُوق dəlik, deşik, yarıq, ara; çatdaq, çat; الــ ~ اكبر من ابرة الراتق واطول من خيطه *məcaz.* bu, düzələn iş deyil (*hərf. deşik yamaqçının iynəsindən böyük, sapından uzundur*); ومنع الــ ~ 1) dəliyi genişləndirmək; b) işi mürəkkəbləşdirmək; قام بــ ~ اذنيه qulağını deşmək (*sırqa salmaq üçün*)

- خُرْق 1) axmaqlıq, sarsaqlıq; 2) kütlük, yöndəmsizlik, biçimsizlik, ağır tərpənmə

- خَرِق *c.* أَخْرَاق 1) nəcib, alicənab; 2) səxavətli, comərd

- خِرْقَة [1] *c.* خِرَق 1) cındır, əski, quraq, parça, tikə; *c.* cır-cındır; əski-üskü; خرق بالية köhnə-kültə, köhnə-kürüş; جامع الخرق cındıryığan, köhnə-kürüşyığan; 2) *tar.* xirqə (*dərviş paltarı, sufi geyimi, sufinin təriqətin tələblərinə əməl edəcəyini vəd edərkən geydiyi paltar*); اصحاب الــ ~ sufilər

- خِرْقَة [2] parça, qumaş; من الكتان ~ kətan parça

- مُخْتَرَق *c.* ات - keçid

- مُخَرَّق dəlik-deşik olmuş

- مَخْرَقَة oyunbazlıq, hoqqabazlıq

I خَرَمَ (i) خَرْم dəlmək, deşmək, dəlik açmaq, deşik açmaq; قواعد النطق ~ nitq qaydalarını pozmaq; II خَرَّمَ 1) çoxlu deşik açmaq, deşik-deşik etmək; 2) naxış tikmək; çəki çəkmək; 3) qısa yolla getmək (*hara* على); sındırmaq, bölmək; VII اِنْخَرَمَ 1) deşilmək, dəlinmək; 2) pozulmaq, xarab edilmək; VIII اِخْتَرَمَ 1) oğurlamaq; 2) yonmaq; oymaq, içindən yemək; korlamaq, dağıtmaq; məhv etmək; ~ـته المنية o öldü

- أَخْرَم *q.* خَرْمَاء *c.* خُرْم deşikburun, burnunda sırqa taxmaq üçün deşik olan

- اِنْخِرَام deşilmə, xarab olma, korlanma, pozulma

- تَخْرِيم 1) deşik-deşik etmə; deşikaçma; عدة الــ ~ *yaxud* آلة الــ ~ perforator, deşikaçan, dəlici alət; naxışsalma, naxıştikmə; 3) *c.* تَخَارِيم çəki, naxış; تخاريم الشرفة eyvanın şəbəkələri

- تَخْرِيمَة ən qısa yol

- خُرَّام , خُرَّامَة *c.* ات - burğu; matqab

- خَرْم *c.* خُرُوم 1) zirvə, dağın şiş təpəsi; 2) nöqsan, qüsur, çatışmazlıq

- خُرْم *c.* خُرُوم dəlik, deşik; الابرة ~ iynənin gözü, deşiyi

- خَرْمَان tütün mütəxəssisi

- خَرْمَنْجِيّ *c.* خَرْمَنْجِيَّة = خَرْمَان

- مُخَرَّم 1) deşilmiş, dəlinmiş; deşik, yırtıq; 2) toxunmuş, çəki ilə çəkilmiş

- مُخَرَّمَات *c.* çəki, naxışlı toxuma

- مَخْرُوم deşilmiş, deşiyi olan, deşik; كانت اذنه ~ـة qulağı deşilmiş idi (*sırqa taxmaq üçün*)

خَرْمَشَ 1) cırmaqlamaq (*dırnaqla*), cızmaq; 2) korlamaq, xarab etmək

- خَرْمَشَة 1) cırmaqlama, cızma; 2) korlama, xarab etmə

خِرْنِق *c.* خَرَانِق dovşan balası

خَرْنُوب = خَرُّوب *bax:* خرب

خِرْوَع *bot.* gənəgərçək kolu; زيت الــ ~ gənəgərçək yağı

I خَزَّ (ə/u) خَزّ yarmaq; sancmaq (*nə ilə* بـ), batırmaq (*nə* بـ); VIII اِخْتَزَّ = I

- خَزّ c. خُزُوز ipək parça, ipək
- خُزَز c. خِزَّان , خِزَّان dovşan

I خَزَرَ (u) خَزْر çəp-çəp, qaşqabaqlı baxmaq; gözlərini qıyaraq baxmaq

I خَزَعَ (ə) خَزْع kəsmək, ayırmaq

خَزَعْبَل topl. uydurma, yalan-palan, nağıl, cəfəngiyat, olmazın şeylər
- خُزَعْبِلَة c. ـات - uydurma, nağıl, əfsanə
- خُزَعْبِلِيّ uydurulmuş, uydurma, qondarma, inanılmaz

خَزَّاف 1) dulusçu; 2) saxsı qab satan
- خِزَافَة dulusçuluq
- خَزَف saxsı qab; saxsı, fayans; صيني ~ farfor, çini; keramika, saxsı istehsalı
- خَزَفِيّ saxsı; fayans

I خَزَقَ (i) خَزْق 1) dəlmək, deşmək, sancmaq, dəlib keçmək; 2) cırmaq, yırtmaq, qopartmaq; II خَزَّقَ parça-parça etmək, cırıq-cırıq etmək; V تَخَزَّقَ 1) deşilmək; 2) cırılmaq, parça-parça edilmək; VII اِنْخَزَقَ = V
- خَازِق nizənin ucu
- خَازُوق c. خَوَازِيق paya
- خَزْق c. خُزُوق deşik, dəlik; nöqsan, qüsur

I خَزَلَ (i) خَزْل kəsmək; ayırmaq; qısaltmaq, azaltmaq, əksiltmək; VIII اِخْتَزَلَ azaltmaq, əksiltmək, ixtisara salmaq; الكسور ~ riyaz. kəsrləri ixtisar etmək; برأيه ~ öz fikrində qalmaq
- اِخْتِزَال azaltma, əksltmə, ixtisara salma; كتابة الـ~ stenoqrafiya; كتب بالـ~ stenoqrafiya üsulu ilə yazmaq; كاتب الـ~ stenoqrafist; الكسور ~ riyaz. kəsrləri ixtisara salma
- اِخْتِزَالِيّ stenoqrafiya -i/-ı
- مُخْتَزَل c. ـات stenoqram
- مُخْتَزِل stenoqorafist

I خَزَمَ (i) خَزْم keçirmək, düzmək (məs., sapa); الانف ~ burnuna halqa keçirmək; انفه ~ kimisə alçaltmaq, təhqir etmək, burnunu ovmaq
- خُزَام 1) sünbülçiçəyi; 2) əsperək, quzuotu
- خُزَامِ əsperək, quzuotu (Suriya)
- خُزَامَى topl. 1) lavanda; 2) əsperək, quzuotu; 3) lalə, qızıl zanbaq
- خُزَامَاة lavanda, əsperək, quzuotu çiçəyi; lalə, qızıl zanbaq
- خِزَامَة , خِزَام c. خَزَائِم halqa (dəvənin burnuna keçirilən); 2) üzük (qadınların burunlarına taxdıqları)

I خَزَنَ (u) خَزْن 1) yığmaq, ehtiyat saxlamaq; toplamaq; 2) qoruyub saxlamaq; السر ~ sirr saxlamaq; الطريق ~ ən qısa yolla getmək; II خَزَّنَ 1) ehtiyat saxlamaq; ehtiyat düzəltmək, tədarük görmək; yığmaq; toplamaq; 2) hifz etmək, qorumaq; anbarda yerləşdirmək, anbarda saxlamaq; القطار ~ qatarı ehtiyat yolda saxlamaq; VIII اِخْتَزَنَ 1) yığmaq (özü üçün); ehtiyat görmək; ehtiyat saxlamaq; 2) qorumaq, saxlamaq; الطريق ~ ən qısa yolla getmək
- تَخْزِين 1) ehtiyat görmə, tədarük görmə; العلف ~ silos tədarükü; 2) saxlama, qoruma; اجرة الـ~ saxlama haqqı; سلك الـ~ ehtiyat yolan
- خَازِن c. خَزَنَة , خُزَّان 1) mühafizəçi; anbarçı, anbardar; 2) xəzinədar; 3) göy ağacdələn, sitta
- خَزَّان c. خَزَّانَات , خَزَازِين 1) saxlanc; anbar; 2) su anbarı; hövzə, bak, çən, sistern; الوقود ~ yanacaq bakı; bənd
- خِزَانَة c. خَزَائِن balaca otaq, hücrə (kəndli evində)
- خِزَانَة c. خَزَائِن , خِزَانَات 1) xəzinə; الحكومية الـ~ yaxud العامة الـ~ dövlət xəzinəsi; 2) şkaf; الملابس ~ yaxud الثياب ~ paltar şkafı; الكتب ~



a) kitab şkafı; b) kitab saxlanılan yer; kitabxana; السفرة ~ bufet; الحديدية الـ~ dəmir şkaf, odadavamlı şkaf, seyf; 3) kamera; الاحتراق ~ tex. yanma kamerası
- خَزْن saxlama, mühafizə etmə; اجرة الـ~ saxlama haqqı
- خَزْنَدَار c. خَزْنَدَارِيَّة xəzinədar
- خَزْنَة c. خَزَن 1) xəzinə (mədəni və mənəvi sərvətlər toplusu); xəzinə (patron qutusu); 2) şkaf; 3) saxlanc; 4) şahm. rokirovka (top ilə şahın yerini dəyişmə); صغيرة ~ qısa rokirovka; طويلة ~ uzun rokirovka
- خَزِين 1. qorunan, mühafizə edilən; 2. ehtiyat; حجرة الـ~ anbar
- خَزِينَة c. خَزَائِن , خَزِينَات 1) xəzinə (daş-qaş, cavahirat); dəfinə; 2) xəzinə (pul saxlanılan yer); الدولة ~ dövlət xəzinəsi; 3) kassa
- مَخْزَن c. مَخَازِن 1) saxlanc, anbar; 2) park (tramvay, avtobus və s. saxlanılan yer); 3) universal maqazin; 4) hərb. patron darağı; 5): الـ~ məxzən (Mərakeşdə hökumət); مخازن الطريق ən qısa yol
- مَخْزَنْجِيّ c. مَخْزَنْجِيَّة anbara baxan, anbardar
- مَخْزَنْجِيَّة anbarda mal saxlama haqqı
- مَخْزُون 1. anbarda saxlanılan; 2. 1) ehtiyat; النفط في بطون الارض ~ yeraltı neft ehtiyatı; 2) anbar, saxlanc
- مَخْزُونَات c. anbarda saxlanılan mal ehtiyatı

I خَزِيَ (خزى) (i) خِزْي utandırmaq, xəcalət vermək; (ə) خَزِيَ , خِزْي , خَزًى biabır olmaq, rüsvay olmaq, xəcalət çəkmək; IV أَخْزَى biabır etmək, rüsvay etmək; utandırmaq; X اِسْتَخْزَى xəcalət çəkmək
- خِزْي biabırçılıq, rüsvayçılıq; bədnamlıq, ayıb
- خَزْيَان q. خَزْيَا c. خَزَايَا utandırılmış, biabır edilmiş, rüsvay edilmiş
- خَزْيَة , خِزْيَة c. خَزْيَات rüsvayçılıq, biabırçılıq, ayıb
- مُخْزٍ q. مُخْزِيَة 1. 1) rüsvayedici, bədnamedici; 2) biabırçı, rüsvayçı; 2. c. مُخْزِيَات rüsvayçılıq gətirən hərəkətlər
- مَخْزَاة c. مَخَازٍ biabırçılıq
- مَخْزِيّ 1. utandırılmış, biabır edilmiş, rüsvay edilmiş; 2.: الـ~ iblis, şeytan

I خَسَّ (خس) [1] (i/ə) خِسَّة , خَسَاسَة 1) alçaq, rəzil olmaq; 2) az olmaq, azalmaq; خَسَّ [2] (ə/u) خَسّ azaltmaq, aşağı salmaq, əksiltmək; II خَسَّسَ = خَسَّ [2]
- خَسّ kahı
- خَسَاسَة 1) alçaltma; 2) alçaqlıq, rəzillik; 3) simiclik
- خِسَّة rəzillik, alçaqlıq; النفس ~ nəfsin rəzilliyi
- خَسِيس c. أَخِسَّاء alçaq, rəzil; əclaf
- خَسِيسَة 1) azaltma, əksiltmə; 2) alçaqlıq, rəzillik

I خَسَأَ (خسأ) [1] (ə) خَسْء qovmaq (məs., iti); اِخْسَأْ! rədd ol!; اِخْسَأْ عني! itil başımdan!; خَسِئَ (ə) خَسْأ qovulmaq, uzaqlaşdırılmaq; خسئت يا رجل! ay kişi, kənar ol!; خسئت يا مرأة! ay arvad, kənar ol!; فَلْيَخْسَأْ فلان و لْيَحْيَ فلان! rədd olsun filankəs, yaşasın filankəs!; خَسَأَ [2] (ə) خُسُوء zəifləmək (göz haqqında)
- خَاسِئ 1) qovulan; yaxına buraxılmayan; 2) zəifləmiş (göz haqqında); فارتد بصره الـ~ gözləməkdən yorulmaq, gözü kütləşmək, zəifləmək

خَسْتَخَانَة c. ـات - xəstəxana
- خَسْتَك xəstələnmək; nasaz olmaq
- خَسْتَكَة xəstəlik; nasazlıq
- مُخَسْتَك xəstə, nasaz

I خَسِرَ (ə) خَسْر , خُسْر 1) itirmək; məhrum olmaq; ziyana düşmək; zərər çəkmək; 2) uduzmaq (müharibəni, oyunu, pullarını); 3) yolu

itirmək, azmaq; 4) tələf olmaq; II خَسَّرَ 1) zərərə salmaq, itkiyə salmaq; ziyan yetirmək; 2) korlamaq, xarab etmək; məhv etmək; IV أَخْسَرَ = II; X إِسْتَخْسَرَ 1) qibtə etmək, həsəd aparmaq (nəyə في , على); itki, ziyan hesab etmək; heyfi gəlmək, əsirgəmək; عليه الرصاصة ~ *məcaz*. o, bir gülləni də ona artıq gördü

- خَاسِرٌ 1) itirən, uduzan; 2) zərərgətirən, zərərli, ziyanlı; 3) ümidsiz, itmiş, batmış, heç bir şeyə yaramayan; ~ ة دافع عن قضيّة ümid yeri olmayan bir işi müdafiə etmək

- خَسَارٌ itki, zərər, ziyan

- خَسَارَةٌ *c.* خَسَائِرُ 1) itki, xəsarət, tələfat; لا ~ تُعَوَّضُ əvəzedilməz itki; məhv olma, tələf olma; 3) uduzma, baxtalama; ziyan, zərər; خسائر و ارباح zərərlər və gəlirlər; خسائر الارواح والاموال insan və mal itkiləri; ~ يا heyf!

- خُسْرَانٌ 1) itirən, zərərçəkən; 2) korlanmış; xarab olmuş

- خُسْرَانٌ itki, ziyan, zərər; ~ وقع في الــ zərərə düşmək, ziyan çəkmək

- مُخَسِّرٌ zərərəsalan, zərərgətirən, ziyanvuran

I خَسَفَ (i) خُسُوفٌ 1) enmək, düşmək, yoxa çıxmaq; 2) tutulmaq (*ay haqqında*); 3) endirmək; düşürtmək; yoxa çıxarmaq (*nəyi* بـ); VII إِنْخَسَفَ 1) tutulmaq (*ay haqqında*); 2) yox olmaq, yoxa çıxmaq; إِنْخَسِفْ! yox ol!

[redacted]

I خَشَّ (ə/u) خَشٌّ 1) daxil olmaq, girmək; 2) dəvənin burnuna ağac parçası keçirmək; II خَشَّشَ 1) salmaq, daxil etmək (*kimisə*); 2) bəzəmək (*güllərlə*)

- خَشَاشٌ , خِشَاشٌ *c.* أَخِشَّةٌ sürünənlər; həşərat

- خِشَاشَةٌ *c.* خَشَاشٌ xişaşə, dəvənin burnuna keçirilən ağac parçası

- خَشِيشٌ [1] bəzək gülləri

- خَشِيشٌ [2] xışıltı (*yarpaqların*)

- مَخْشُوشٌ burnuna ağac parçası keçirilmiş (*dəvə*); ~ يهيج كالجمل الــ *məsəl*. o, burnuna ağac parçası keçirilən dəvə kimi özündən çıxıb

(خشب) II خَشَّبَ 1) taxta ilə örtmək, üz çəkmək; fanerləmək; 2) ağac kimi bərk olmaq; V تَخَشَّبَ taxta ilə örtülmək, üzünə taxta çəkilmək; fanerlənmək; 2) ağaca dönmək; ağac kimi möhkəm olmaq; donuxmaq; quruyub qalmaq; 3) keyimək, qurumaq, bərkimək

- تَخَشُّبٌ ağaca dönmə, quruma; *tibb*. katalepsiya; tetanus

- تَخْشِيبٌ taxta üz çəkmə, taxta ilə örtmə, fanerləmə

- تَخْشِيبَةٌ *c.* ـات - taxtadan tikilmiş bina; barak

- خَشَّابٌ *c.* خَشَّابَةٌ odunçu; odunsatan

- خَشَبٌ *topl. c.* أَخْشَابٌ taxta, taxta-şalban, ağac (*material kimi*); لخشب البناء *yaxud* لخشب العمارة tikintiyəyarar ağac; لخشب الحريق odun; الورد ~ qızılgül ağacı; بغدادي ~ *yaxud* سويد ~ çiləkən;

[redacted]



- خَشَبِيَّةٌ *c.* ـات - *mus*. ksilofon

- خَشِيبٌ kobud, kələ-kötür, nahamar

- مُتَخَشِّبٌ ağaca dönmüş, qurumuş, bərkimiş; keyimiş

خَشْتٌ *c.* خُشُوتٌ nizə, mızraq, cida

خَشْتَنَاشَةٌ *c.* ـات - kamerist qadın

خَشَقَ dəlmək, deşmək, sancmaq

خَشْخَشَ cingildəmək; səs salmaq; 2) xışıldamaq (*məs., paltar*)

- خَشْخَاشٌ *topl. bot*. xaşxaş

- خَشْخَاشَةٌ [1] *c.* ـات - bir xaşxaş bitkisi

- خَشْخَاشَةٌ [2] *c.* ـات - sərdaba

- خَشْخَشَةٌ cingilti, səs; xışıltı, xırıltı

- خَشْخِيشَةٌ *c.* ـات - şax-şax, çax-çax

خَشْخَنَ pardaxlamaq, cilalamaq, taraş etmək; yonmaq; yiv açmaq (*tüfəngin lüləsində*)

- خَشْخَانٌ 1) üz, tərəf; faset (*taraş edilmiş daşın, mərmərin üzü*), tiyənin ağzı; 2) qırış, kiçik şırım

- خَشْخَنَةٌ 1) pardaxlama, cilalama, taraş etmə; 2) yiv açma (*lülədə*)

خُشَارٌ *yaxud* خُشَارَةٌ tullantı, süfrədən qalan tör-töküntü, zibil

خَشْرَمٌ *c.* خَشَارِمُ arı beçəsi; arı pətəyi, arı təknəsi

I خَشَعَ (ə) خُشُوعٌ 1) arxayın halda boyun əymək, hörmətlə itaət etmək; 2) baş əymək, pərəstiş etmək; ~ ببصره gözünü yerə dikmək,

[redacted]

getmək II خَشَّفَ yol göstərmək, bələdçilik etmək

- خُشَافٌ şərbət; xoşab, kompot; بلح ~ xurma kompotu; تين ~ əncir kompotu; رمّان ~ nar kompotu

- خُشَّافٌ *c.* خَشَاشِيفُ *zool*. uzunqanad; الليل ~ yarasa, şəbpərə, gecəquşu

- خَشِفٌ sulu qar; dən-dən qar

- خِشْفٌ , خُشْفٌ *c.* خِشَفَةٌ , خُشُوفٌ ceyran balası

- خُشُوفٌ *c.* خُشَّفٌ başını hər yerə soxan, zəhlətökən, qarayaxa

- خَشِيفٌ *c.* خُشُفٌ = خَشَفٌ

خُشْكَارٌ ələnməmiş, xəlbirdən keçirilməmiş un

خَشْكَرِيشَةٌ qasnaq, köz, qartmaq, qabıq

(خشم) II خَشَّمَ məst etmək, uydurmaq, başını gicəllətmək, bihuş etmək, başına vurmaq

- خَشْمٌ *c.* خُشُومٌ 1) burun; 2) *coğr*. burun

- خُشَامٌ *tibb*. anosmiya, iybilmə qabiliyyətinin itirilməsi

- خَيْشُومٌ *c.* خَيَاشِيمُ burun; burun deşiyi; خياشيم السمك balığın qəlsəmələri

I خَشُنَ (u) خُشُونَةٌ kobud, sərt olmaq; qabalaşmaq, codlaşmaq, sərtləşmək; II خَشَّنَ kobudlaşdırmaq, sərtləşdirmək, qabalaşdırmaq; III خَاشَنَ kobud, sərt rəftar etmək; V تَخَشَّنَ 1) kobud, sərt olmaq, qabalaşmaq; 2) sərt həyat tərzi keçirmək; XII إِخْشَوْشَنَ çox sərt,

[redacted]

- خشونة sərtlik, kobudluq, qabalıq

I خشي (ə) خشية qorxmaq, ehtiyat etmək (*kimin üçün* على); II خشّى qorxutmaq, canına qorxu salmaq; V تخشّى = I; VIII إختشى utanmaq, xəcalət çəkmək

- خاشٍ *q.* خاشية qorxan; qorxacaq, cəsarətsiz
- خشو utancaqlıq, qorxaqlıq, cəsarətsizlik
- خشيّ utanan, çəkinən, qorxan; cəsarətsiz
- خشيان *q.* خشيا *c.* خشايا = خاش
- خشية qorxu; çəkinmə, ehtiyatlanma; ...خشية من ...dan/dən qorxaraq, ehtiyatlanaraq; ...خشية ان qorxaraq ki...

I خصّ (ə/u) خصّ , خصوص 1) xüsusi olaraq ayırıb vermək (*nə* بـ); خصّه بالذكر xüsusi olaraq yada salmaq, qeyd etmək; خصّها بعنايته o ona xüsusi hörmət, qayğı göstərdi; خصّه لنفسه xüsusi olaraq özü üçün ayırmaq; nəyisə mənimsəmək; 2) payına düşmək; 3) xüsusilə bağlı olmaq (*nə ilə*), xüsusilə aid olmaq (*nəyə* بـ); لا يخصّك هذا bu sənə aid deyildir; II خصّص xüsusi olaraq təyin etmək, ayırmaq; pul ayırmaq, pül təxsis etmək (*nə üçün* لـ); V تخصّص ixtisaslaşmaq; mütəxəssis olmaq (*nədə* بـ , في); VIII إختصّ 1) fərqlənmək, səciyyələnmək (*nə ilə* بـ); 2) əlaqəli, bağlı olmaq (*nə ilə* بـ); aid olmaq (*nəyə* بـ); 3) məxsus olmaq (*nəyə* بـ); ixtiyar, sərəncam dairəsinə daxil olmaq (*kimin* بـ); 4) özünə ixtisas seçmək (*nəyi* بـ); xüsusi olaraq məşğul olmaq (*nə ilə* بـ); ixtisaslaşmaq (*nədə* بـ)

- إختصاص *c.* ات - 1) bilik, vəzifə, səlahiyyət sahəsi; səlahiyyət, səriştə, təcrübə, məlumatlılıq, kompetensiya; tabelik; عدم الـ~ səlahiyyətsizlik, səriştəsizlik; ذو ~ səlahiyyətli, səriştəli, məlumatlı; 2) xüsusiyyət; 3) vəzifə, borc; 4) ixtisaslaşma; ixtisas
- إختصاصيّ mütəxəssis
- أخصّ xüsusi; على الـ~ *yaxud* بالـ~ *yaxud* على وجه~ xüsusilə, xüsusi olaraq
- تخصّص ixtisas qazanma, ixtisaslaşma
- تخصيص *c.* ات - 1) təyin etmə, ayırma; علامة الـ~ dırnaq işarəsi; 2) pul ayırma, pul təxsis etmə; 3) xüsusi təyinatlı fond; 4) ixtisaslaşdırma; بالـ~ xüsusi olaraq; على الـ~ ... والتعميم xüsusilə... və ümumiyyətlə...
- خاصّ 1) xüsusi; 2) şəxsi; الحياة الـ~ـة şəxsi həyat; السكرتير الـ~ şəxsi katib; الملكية الـ~ـة xüsusi mülkiyyət; 3) aid olan, xas olan (*nəyə* بـ); عرف هذا الـ~ والعامّ bunu hamı bildi; عيش ~ ağ çörək
- خاصّة *c.* خواصّ 1) xüsusiyyət, səciyyəvi cəhət; sifət; ...عامّة ...وخاصّة ümumiyyətlə ... və xüsusilə...; خاصّة *yaxud* بـ~ xüsusilə; في ~ نفسه qəlbində, ürəyində, xəyalən, fikrən; 2) müalicə təsiri, şəfavermə qabiliyyəti (*məs., dərmanın*); 3) şəxsi mülkiyyət; 4) aristokratiya, əyan, kübarlar; seçilmişlər; məiyyət, kiminsə ətrafında dolananlar
- خاصّيّة *c.* خاصّيّات , خصائص xasiyyət, xüsusiyyət, səciyyəvi cəhət
- خصّ kahı
- خصّ *c.* أخصاص , خصاص koma, daxma, dəyə
- خصاصة [1] *c.* خصاص yarğan, çat, yarıq
- خصاصة [2] ehtiyac, yoxsulluq
- خصاصة *c.* خصاص az miqdar
- خصوص 1) xüsus, xas olma, məxsus olma, məxsusluq; بـ~ *yaxud* على الـ~ *yaxud* على وجه الـ~ xüsusən, ələlxüsus, xüsusilə; 2) münasibət, əlaqə; في ~ـه *yaxud* بـ~ـه *yaxud* من~ kimin/nəyin barəsində; من هذا الـ~ bu cəhətdən
- خصوصيّ 1) xüsusi; 2) şəxsi



- خصوصيّات *c.* 1) xüsusiyyətlər; علم ~ الشعوب etnoqrafiya; 2) təfərrüat, təfsilat
- خصيص [1] xas (*nəyə* بـ); بـ~ qəsdən, xüsusi olaraq
- خصيص [2] *c.* أخصّائيّ mütəxəssis (*nədə* في); 2) yaxınlaşdırılmış,yaxın, yaxın dost
- خصيصة *c.* خصائص xüsusiyyət, keyfiyyət, səciyyəvi cəhət
- متخصّص ixtisaslı, mütəxəssis (*nədə* في)
- مختصّ münasib, müvafiq, uyğun; الهيئات الـ~ـة müvafiq orqanlar
- مخصّصات *c.* təxsis edilmiş məbləğ, təxsisat; الملك ~ kralın mülki təxsisat siyahısı
- مخصوص xüsusi; məxsus; قطار ~ xüsusi qatar

I خصب (ə) خصب münbit, məhsuldar olmaq; II خصّب 1) məhsuldarlığı, münbitliyi artırmaq; gübrələmək, gübrə vermək; IV أخصب 1) münbit, məhsuldar olmaq; məhsulu bol olmaq; gübrələmək; münbitləşdirmək

- إخصاب 1) münbitlik, məhsuldarlıq; 2) münbitləşdirmə; məhsuldar etmə
- خصب münbit, məhsuldar
- خصب münbitlik; məhsuldarlıq; məhsul bolluğu; قرن الـ~ bolluq buynuzu; الهة الـ~ münbitlik ilahəsi
- خصوبة münbitlik, məhsuldarlıq
- خصيب = خصب; الهلال الـ~ *tar.* Münbit hilal (*İraq, Suriya, Livan*)
- مخصاب münbit
- مخصّب 1. 1) münbit; məhsuldar; 2) münbitliyi, məhsuldarlığı artıran; 2. *c.* ات - gübrə; مخصبات كمياوية kimyəvi gübrələr

I خصر (ə) خصر bərk üşümək, donmaq; II خصّر bədənə sıx, yaxşı oturmaq (*paltar haqqında*); III خاصر belindən tutmaq, yapışmaq (*məs., rəqs vaxtı*); VI تخاصر bir-birinin belindən yapışmaq; bir-birini qucaqlamaq; VIII إختصر 1) ixtisar etmək, ixtisara salmaq; qısaltmaq; azaltmaq; konspektini tutmaq

- إختصار 1) ixtisar; 2) müxtəsərlik; بالـ~ *yaxud* بـ~ a) müxtəsər, qısaca; b) müxtəsəri, sözün qısası, xülasə
- خاصرة *c.* خواصر bel; böyür
- خصر *c.* خصور = خاصرة; دقيق الـ~ incəbel; العقد ~ *memar.* pilyastr
- مختصر 1. 1) ixtisar edilmiş, ixtisara salınmış; müxtəsər; qısa; 2) konspekt xarakterli, yığcam; 2. *c.* ات – konspekt
- مخصرة *c.* مخاصر dirijor çubuğu; əsa; şah əsası; مخاصر الطريق ən qısa yol

I خصف (i) خصف təmir etmək, yamamaq (*ayaqqabını*)

- خصفة *c.* خصف , خصاف xurma lifindən hörülmüş zənbil
- مخصف *c.* مخاصف biz

خصلة *c.* خصال 1) keyfiyyət, xüsusiyyət, səciyyəvi cəhət, cizgi; 2) müdrik qayda

- خصلة *c.* خصل , خصلات 1) bir çəngə saç, saç tutamı; tel, zülf; 2) salxım (*üzümün*)

I خصم (i) خصم 1) qalib gəlmək, üstələmək (*mübahisədə və s.*); 2) çıxmaq (*bir ədədi o birindən*), tutmaq (*nədən* من); qiyməti aşağı salmaq, endirmək (*nədə* على); 3) hesaba almaq (*veksellərı*); III خاصم mübahisə aparmaq; sözləşmək, çəkişmək, deyişmək; höcətləşmək; 2) düşmənçilik etmək, ədavət saxlamaq; məhkəmə iddiası qaldırmaq, məhkəmədə çəkişmək (*kiminlə* مع); VII إنخصم çıxılmaq (*ədəd ədəddən*), tutulmaq (*məbləğ*); VIII إختصم 1) mübahisəyə, sözləşməyə, çəkişməyə başlamaq; 2) sözləşmək, çəkişmək,

deyişmək, düşmənçilik etmək, ədavət saxlamaq

- خِصَامٌ 1) mübahisə, sözləşmə, çəkişmə; 2) ədavət, düşmənçilik

- خَصْمٌ [1] 1) çıxma, tutma; endirim; 2) *mal.* uçot (*veksellərin*); ~ بنك الـ uçot bankı; ~ سعر الـ uçot faizi; اصول وخصوم aktiv və passiv

- خَصْمٌ [2] *c.* خُصُومٌ , أَخْصَامٌ düşmən, rəqib; düşmən tərəf; ثالث ~ *hüquq.* üçüncü şəxs

- خُصُومَةٌ 1) mübahisə; çəkişmə; 2) düşmənçilik, ədavət

- خَصِيمٌ *c.* خُصَمَاءُ , خُصْمَانٌ düşmən, əleyhdar; rəqib

- مُخَاصِمٌ 1. çəkişən; 2. müqabil tərəf (*məhkəmədə*); düşmən

- مُخَاصَمَةٌ mübahisə; çəkişmə; məhkəmə prosesi

I خَصَى (i) خِصَاءٌ , خَصْيٌ axtalamaq, burmaq, dölsüzləşdirmək; sterilləşdirmək; IV أَخْصَى xüsusi olaraq öyrənmək (*elmin hansısa sahəsini*); ixtisaslaşmaq (*nədə* في); VII إِنْخَصَى axtalanmaq, burulmaq, dölsüzləşdirilmək

- إِخْصَائِيٌّ mütəxəssis, ixtisas sahibi, işi yaxşı bilən; في امراض العين ~ göz xəstəlikləri üzrə mütəxəssis

- إِخْصَائِيَّةٌ ixtisas, ixtisaslaşma

- خِصَاءٌ axtalama, burma, dölsüzləşdirmə (*heyvanları*)

- خَصِيٌّ *c.* خِصْيَانٌ 1. axtalanmış; 2. axta adam, xədim

- خُصْيَةٌ *təsn.* خُصْيَتَانِ *c.* خُصًى *anat.* xaya;

maq, yağ çalmaq; خضَّ الزجاجة şüşədəki suyu çalxalamaq; 2) qulaqburması vermək; qorxutmaq, təşvişə salmaq; II خَضْخَضَ parıldayan şeylərlə bəzəmək; bər-bəzək vermək, güləbətinlə işləmək; VII إِنْخَضَّ çırpılmaq, silkələndirilmək; 2) qorxudulmaq, təşvişə salınmaq

- خَضٌّ çırpma, silkələmə; لبن الخضّ yağ çalma

- خَضَّةٌ *c.* ـات - 1) silkələmə, sarsıtma; 2) sarsıntı; qorxu

- خَضِيضٌ üzsüz süd (*İraq*)

I (خضب) خَضَبَ (i) خَضْبٌ boyamaq, rəngləmək; خَضِبَ (ə) خُضُوبٌ yaşıl rəng almaq, yaşıl olmaq; II خَضَّبَ = I; VIII إِخْتَضَبَ boyanmaq, rənglənmək; XII إِخْضَوْضَبَ yaşıllaşmaq

- خِضَابٌ boya, rəng; boyaq, boyaq maddəsi

- خَضْبٌ 1) boyama; 2) piqment

- خَضِيبٌ boyanmış, rənglənmiş

خَضْخَضَ 1) silkələmək, çırpmaq; atıb-tutmaq; 2) şırıldamaq, quruldamaq; 3) yaxalamaq

- خَضْخَضَةٌ 1) silkələmə, çırpma; atıb-tutma; 2) şırıldama, quruldama; 3) yaxalama

I خَضَدَ (i) خَضْدٌ sındırmaq, qopartmaq; شوكته ~ kiminsə əzəmətini qırmaq

I خَضِرَ (ə) خَضَرٌ yaşıl, yaşıllaşan olmaq; II خَضَّرَ yaşıl etmək; الارض ~ torpağı əkmək; IX إِخْضَرَّ 1) yaşıllanmaq, yaşıllaşmaq; 2) yaşıllaşmaq, yam-yaşıl olmaq; XII إِخْضَوْضَرَ yaşıl olmaq, yaşıllanmaq

- أَخْضَرُ *q.* خَضْرَاءُ *c.* خُضْرٌ 1) yaşıl; 2) kal, dəyməmiş; 3) şəffaf, təzə, tər, sərin; الماء



- إِخْضِرَارٌ yaşıllanma, yaşıllaşma; yaşıllıq, göyərti

- خَضَارٌ 1) yaşıl rəng, yaşıllıq; göyərti; 2) tərəvəz

- خُضَارٌ *c.* ـات - göyərti, tərəvəz

- خَضَّارٌ göyərtisatan; səbzəvatçı; tərəvəzçi

- خُضَارِيٌّ *c.* خَضَارِيُّ vəhşi ördək

- خَضَرٌ yaşıl rəng; göyərti

- خَضِرٌ yaşıllanan; yaşıl

- خُضَرٌ , خُضْرٌ göyərti, tərəvəz

- خِضْرٌ: ~ الـ Xızır (*peyğəmbər*)

- خُضْرَةٌ 1) yaşıl rəng; 2) göyərti, bitki, yaşıllıq, göylük, otluq

- خُضْرَوَاتٌ , خَضْرَوَاتٌ *c.* göyərti, tərəvəz

- خُضَرِيٌّ *c.* خُضَرِيَّةٌ = خَضَّارٌ

- خَضِيرٌ = خَضِرٌ

- خُضَيْرِيٌّ *zool.* yaşılca (*quş*); ~ بطّ yaşılbaş ördək

- مَخْضَرَةٌ 1) göyərti, yaşıllıq; çim; 2) çəmən

- مُخْضَوْضَرٌ yaşıl; ~ الـ ة الاودية yaşıl vadilər

- يَخْضُورٌ xlorofil

- يَخْضُورِيٌّ: ~ لا xlorofilsiz; النباتات اللا ~ـة etiolirləşdirilmiş (*xlorofilsiz becərilmiş*) bitkilər

(خضرم) تَخَضْرَمَ iki dövrün qovşağında yaşamaq; *folk.* bir çox dövrlərdə yaşamaq

- خِضْرِمٌ *c.* خَضَارِمُ bol, çox, dolu, zəngin

- مُخَضْرَمٌ 1) cahiliyyət dövrünün axırları və islam dövrünün əvvəllərində yaşamış şair

I خَضَعَ (ə) خُضُوعٌ 1) boyun əymək, tabe olmaq, itaət etmək (*kimə* لـ); 2) asılı olmaq; II خَضَّعَ boyun əydirmək, tabe etdirmək;

tabeliyində olan (*kimin/nəyin* لـ); 3) asılı; الاقطار الـ~ـة asılı ölkələr

- خَضُوعٌ *c.* خُضُعٌ müti, itaətkar, sözəbaxan, başıaşağı

- خُضُوعٌ 1) boyun əymə, itaət, itaətkarlıq; tabelik; 2) asılılıq

(خضل) II خَضَّلَ islatmaq, suya qoymaq; IV أَخْضَلَ = II

- خَضِلٌ 1) nəm; yaş; 2) təzə, tər

I خَضَمَ (i) خَضْمٌ iştahla yemək

- خِضَمٌّ okean; dəniz; الحياة ~ *məcaz.* həyatın burulğanı; الكفاح ~ *məcaz.* mübarizə burulğanı; غرق في ~ من التفاؤل *məcaz.* həddən artıq nikbin əhval-ruhiyyədə olmaq

I خَطَّ (ə/u) خَطٌّ 1) xətt, cızıq çəkmək; cızmaq, çəkmək (*nə üzərində* على); خطّ تحتَ العبارة (السطر) خطًا ifadənin (*sətrin*) altından xətt çəkmək; 2) yazmaq, göstərmək, təsvir etmək; qurmaq, cızmaq (*plan*); 3) bığ yeri tərləmək; خطّه الشيبُ onun saç-saqqalı ağarıb; II خَطَّطَ 1) xətt, cızıq çəkmək; 2) mərz çəkmək, mərzlə ayırmaq; işarələrlə, əlamətlərlə qeyd etmək; 3) planlaşdırmaq, layihələşdirmək; 4) şırım açmaq; 5) zolaq-zolaq etmək, miləmil etmək (*parçanı*); 6) azca boyamaq; الحواجب ~ qaşları boyamaq; الوجه ~ üzü, yanağı boyamaq; V تَخَطَّطَ qaşını, üzünü boyamaq; VII إِنْخَطَّ çəkilmiş, cızılmış, yazılmış olmaq; VIII إِخْتَطَّ 1) özü üçün çəkmək, cızmaq; mərzləmək, ayırmaq; 3) plan qurmaq, hərəkət tərzi müəyyən etmək; لنفسه قاعدة... ~

kasiya; nişanlarla ayırma; 2) planlaşdırma, layihələşdirmə; الاقتصاد ~ الـ~ الاقتصاديّ yaxud təsərrüfatın planlaşdırılması; المدن ~ şəhər-lərin planlaşdırılması; 3) şırımlama, şırım açma; 4) c. ات - plan; layihə; cizgi, çertyoj; الحواجب ~ qaşların boyanması

- تَخْطِيطِيٌّ plan -i/-ı; layihə -i/-ı

- خَطٌّ c. خُطُوطٌ 1) xətt; الـ~ العامّ ümumi xətt; الخطّ المتقطّع الخطّ المنقّط kəsik-kəsik xətt; خطّ الحدود sərhəd xətti; خطّ qırıq-qırıq xətt; الخطّ الكهربائيّ لنقل وتوزيع تلغرافيّ teleqraf xətti; خطوط الكهرباء elektrik qüvvəsinin nəqli xətti; الكهرباء ذات الجهد العالي yüksəkgərginlikli cərə-yanın nəqli xətti; خطوط القوى qüvvə xətləri (*maqnit sahəsinin*); خطّ التجميع yığma xətti (*konveyeri*); الخطّ الجوّيّ (الهوائيّ) الخارج bayır antenası; الخطّ الارضيّ torpaqla birləşdirmə; الى ... الخطّ الجوّيّ (المباشر) ...a (*birbaşa*) hava xətti; خطّ السير yaxud خطّ السفر marşrut; خطّ سكّة الحديد dəmir yolu xətti; خطّ رئيسي magistral; خطّ انابيب النفط neft boru kəməri; خطّ الاستواء ekvator; خطّ الاعتدال bərabərlik xətti; خطّ نصف النهار yaxud خطّ الزوال yaxud (الطول)

[redacted]

علم الخطّ kalliqrafiya, xəttatlıq; خطّ دقيق xırda xətt; الخطّ الكوفيّ kufi xətti; الخطّ المسماريّ yaxud الخطّ الاسفينيّ mixi xətt, mixi yazı; خطّ المؤلّف avtoqraf; زاد على هذا المكتوب بخطّ يده ما يأتي... o bu məktuba öz əli ilə aşağıdakıları əlavə etdi…; 5) cizgi, cızıq; بخطوط قصيرة qısa şəkildə

- خُطَّةٌ c. أَخْطَاطٌ məhəllə; rayon, şəhərin bir hissəsi

- خَطَّاطٌ 1) kalliqraf, xəttat; 2) kalliqrafiya, xəttatlıq müəllimi

- خُطَّةٌ c. خُطَطٌ 1) hərəkət xətti, davranış tərzi, taktika; الخطط الحربيّة *hərb.* taktika; 2) plan; العمل ~ iş planı (*məs.,* *komissiyanın*); الخماسيّة (الخمسيّة) الـ~ beşillik plan; خطط الدراسة yaxud خطط التعليم tədris planları; 3) istiqamət, kurs; 4) üsul

- خِطَّةٌ c. خِطَطٌ yer; ərazi sahəsi, torpaqlar

- خَطَّةٌ c. ات - cizgi, cızıq

- خَطِّيٌّ 1) xətt -i/-ı; 2) yazılı; əlyazması -ı/-ı; بيان ~ yazılı bəyanat; ـا ~ yazılı surətdə

- مِخَطٌّ c. مَخَاطٌّ ~ مخطاط

- مِخْطَاطٌ c. مَخَاطِيطُ xətkeş

[redacted]



maq; səhv etmək; xətaya yol vermək, düz etməmək; الاستعمال ~ düz işlətməmək (*sözü və s.*); الغرض ~ hədəfə dəyməmək; hədəfdən yayınmaq; الفهم ~ yanlış başa düşmək, səhv anlamaq; بين الشيئين ~ səhv salmaq; في ~ الاستنتاج səhv nəticə çıxarmaq; في الترجمة ~ (في النقل) yanlış tərcümə etmək; في الحساب ~ səhv hesablamaq, hesabda səhv etmək

- خَاطِئٌ 1. 1) səhv edən, yanılan, xətaya yol verən; 2) səhv, yanlış, xəta; هذا ~ من الاساس bu, kökündən səhvdir; 2. c. خُطَاةٌ 1) müqəssir, günahkar, təqsirkar; 2) pozan

- خَاطِئَةٌ c. خَوَاطِئُ günahkar, taqsırkar, səhvə yol verən qadın

- خَطَاءٌ c. أَخْطِئَةٌ yaxud خَطَأٌ c. أَخْطَاءٌ xəta, səhv, taqsır; تافه ~ boş, kiçik səhv; جسيم ~ kobud, böyük səhv; يسير ~ xırda səhv; غير مقصود ~ qəsdsiz, qərəzsiz səhv, istəmədən yol veril-miş səhv; لفظيّ ~ tələffüzdə səhv; وصواب ~ mətbəə xətalarının siyahısı; الطبع ~ mətbəə xətası; في الحساب ~ hesabda səhv; خطأً yaxud بالـ~ səhvən; ... ان ~ من الـ səhv olar ki...

- خَطِيئَةٌ, خَطِيَّةٌ c. خَطَايَا 1) günah, taqsır; مميتة ~ çox ağır günah; 2) xəta, qəbahət, yaramaz

[redacted]

etmək; danışıq aparmaq; 2) bir-birilə yazış-maq; VII إِنْخَطَبَ nişanlanmaq, adaxlanmaq (*qız haqqında*)

- تَخَاطُبٌ söhbət, danışıq; لغة الـ~ danışıq dili

- خَاطِبٌ c. خُطَّابٌ 1. 1) danışan, xitab edən, çıxış edən; 2) qız istəyən; 2. 1) natiq; 2) adaxlı, nişanlı; 3) elçi

- خَاطِبَةٌ c. ات - 1) nişanlı qız; 2) elçi qadın

- خِطَابٌ c. ات - 1) nitq, çıxış; العرش ~ təntə-nəli mərasimlərdə taxt-tac sahibinin nitqi; 2) məktub; yazılı məlumat; اعتماد ~ akkre-ditiv; تجاريّ ~ kommersiya məktubu; توصية ~ zəmanət məktubu; دوريّ ~ sirkulyar, sərən-cam, əmr; الضمان ~ zəmanət məktubu; مفتوح ~ açıq məktub; موصىً عليه ~ sifarişli məktub; فصل الـ~ qəti qərar

- خَطَابَةٌ 1) nitq ilə çıxış; 2) xütbə oxuma

- خَطَابَةٌ 1) xətiblik; 2) *hamç.*; فن الـ~ natiq-lik sənəti, nitq; علمية ~ mühazirə; دينيّة ~ xütbə

- خَطَابِيٌّ natiqlik -i/-ı; ritorik; عبارات ~ـة ritorik ifadələr; حفلة ~ـة mitinq

- خَطْبٌ c. خُطُوبٌ bəla, fəlakət; ما ~ـك؟ sənə nə olub, nə baş verib?; sən nə istəyirsən?;

[redacted]

- مُخَاطَبَة c. ات - danışıq; söhbət; بالكاف ~ kiməsə «sən» deyə müraciət edilməsi
- مَخْطُوب 1. nişanlanmış (*oğlan*), adaxlanmış (*oğlan*); 2. nişanlı (*oğlan*), adaxlı (*oğlan*)
- مَخْطُوبَة 1. nişanlanmış (*qız*), adaxlanmış (*qız*); 2. nişanlı (*qız*); adaxlı (*qız*)

I (خطر) خَطَرَ¹ (u, i) خَطَرَان 1) oynatmaq, tərpətmək, yelləmək (*nəyi* بـ); 2) yellənmək, yırğalanmaq; yan basa-basa yerimək, yırğalana-yırğalana yerimək; gəzinmək; في الغرفة ~ otaqda gəzinmək, var-gəl etmək; 3) təşəxxüs satmaq, özünü çəkmək; خَطَرَ² (u) خُطُور başına düşmək, ağlına gəlmək (*kimin* لـ); في باله ~ *yaxud* بباله ~ yadına düşmək, xatırlamaq; ~ت له *yaxud* ~ت على ذهنه هذه الخاطرة başına bu fikir düşdü; لم يخطر ببال هذه الفكرة ... لم يخطر بالبال ağıla gəlməyən, gözlənilməz; خَطُرَ (u) خَطَارَة , خُطُورَة 1) ciddi, mühüm, əhəmiyyətli olmaq; 2) təhlükəli olmaq; III خَاطَرَ 1) mərc qoşmaq, bəhsləşmək, çəkişmək; 2) risk etmək; təhlükəyə məruz qoymaq, təhlükə altına qoymaq (*nəyi* بـ); IV أَخْطَرَ xəbər vermək, məlumat vermək, bildirmək; xəbərdarlıq etmək; V تَخَطَّرَ 1) təşəxxüslə gəzmək; 2) lovğalanmaq, öyünmək, təkəbbürlənmək; 3) at oynatmaq; 4) yırğalanmaq, yellənmək; tərəddüd etmək, əsmək, titrəmək; VI تَخَاطَرَ bir-birilə mərcləşmək,

lıq; سريع الـ~ fərasətli, tez başa düşən, fəhmli, hazırcavab; خطر له الـ~ onun başına fikir düşdü; 2) ağıl, fərasət; لم يدر بـ~ي heç ağlıma da gəlməди; 3) könül, xatir; ürək; اخذ بـ~ه kiməsə təsəlli, təskinlik vermək; könlünü almaq; اخذ على ~ه incimək, ürəyinə salmaq; كدّر ~ه kiminsə qanını qaraltmaq, xatirinə toxunmaq; كسر ~ه kiminsə ürəyini sındırmaq; ~ عن طيب *bax*: طيب ; 4) xahiş, istək; على ~ك sənin xahişinlə, necə istəyirsən; على غير ~ könülsüz; لاجل ~ي mənim xatirimə; ارضاءً لـ~ك اكراما لـ~ك *yaxud* sənin xatirinə, sənə hörmət naminə; 5) *xalq dil.* qonaq; !~ك görüşənədək!
- خَاطِرَة c. خَوَاطِر fikir, xatirə
- خَطَّارَة c. ات - 1) sapand; mancanaq; katapulta; 2) kəfkir, rəqqas
- خَطَر c. أَخْطَار 1) təhlükə, xata, risq; həyəcan; الحرب ~ müharibə təhlükəsi; الذرّي الـ~ atom təhlükəsi; مُحْدِق ~ təhdidedici təhlükə; اشارة الـ~ təhlükə işarəsi, həyəcan siqnalı; جرس الـ~ haray; اوقعه في ~ kimisə təhlükəyə salmaq; عرّضه للـ~ kimisə təhlükəyə məruz qoymaq; شكّل اكبر الـ~ على... ...üçün böyük təhlükə təşkil etmək; 2) ortaya qoyulan pul (*oyunda*); 3) əhəmiyyət, çəki, dəyər; ذو ~ mühüm, əhəmiyyətli
- خَطِر təhlükəli, zərərli, xətərli; صناعة ~ة



- خَطَرِيّ c. خَطَرِيَّة 1. nəyisə etməyi (*görməyi*) boynuna götürən; 2. könüllü
- خُطُورَة 1) əhəmiyyət, ciddilik, mühümlük; 2) təhlükəlilik
- خَطِير 1) ciddi, mühüm, təhlükəli, əhəmiyyətli; الشأن ~ şəni uca; 2) hörmətli, adlı-sanlı
- مَخَاطِر c. təhlükələr
- مُخَاطِر 1) risq edən, özünü təhlükəyə atan; 2) təhlükəli
- مُخَاطَرَة c. ات - risq, təhlükəli iş; مخاطرات في الصيد ovda təhlükəli qəziyyələr
- مُخْطِر = خَطِر
- خَطْرَف sayıqlamaq
- خَطْرَفَة sayıqlama

I خطف (ə) خَطَفَ 1) tutmaq, yapışmaq; 2) qapmaq, qarmalamaq, qapışdırmaq; 3) götürüb aparmaq; oğurlamaq; zorla aparmaq; ولدا ~ uşaq oğurlamaq; 4) bir işi cəld görmək; البصر ~ gözü kor etmək, kütləşdirmək, qamaşdırmaq (*güclü işıqla, parıltı ilə*); V تَخَطَّفَ 1) qamarlamaq; qapışdırmaq, əlüstü götürmək (*məs., satılan qəzetləri*); 2) bir-birinin əlindən qapmaq; VII إِنْخَطَفَ 1) tutulmaq; 2) oğurlanmaq; 3) heyran olmaq; huşunu itirmək, özündən getmək, vəcd halında olmaq (*sufilər haqqında*); VIII إِخْتَطَفَ 1) qapmaq, qapışdırmaq (*nədən* من); 2) əlindən almaq; oğurlamaq; götürüb aparmaq; يختطف هذا المرض

4) qısa, ani, iti, sürətli; الحرب الـ~ة ildırım sürətli müharibə; زيارة ~ة qısa görüş (*ziyarət*); صورة ~ة dərhal çəkilib verilən şəkil (*foto*); نظرة ~ة ani baxış; 2. oğru
- خَطَّاف oğru; soyğunçu
- خُطَّاف c. خَطَاطِيف 1) qarmaq, çəngəl, qənarə; السمك ~ dəstəli qarmaq (*balığı tutub çəkmək üçün*); 2) lövbər cəngi; lövbər; كانت السفينة على الـ~ gəmi lövbər salmışdı; 3) dırnaq, caynaq, cəng, pəncə; 4) qaranquş; البحر ~ dəniz qaranquşu; جبليّ ~ uzunqanad
- خَطْف 1) oğurlama, zorla qaçırtma; 2) altdan tutma, yapışma; رفع بيديه ~ا ٩٠ كيلوغراما *idm.* o, təkanla 90 kq. ağırlıq qaldırdı; ~ا ani olaraq
- خَطْفَة c. خَطَفَات 1) tutma, qopartma; 2) ani şiddət, ani hərəkət; في ~ البرق ildırım sürəti ilə
- خَطِيفَة c. خَطَائِف 1) qopardılmış şey; 2) oğurlanmış, qaçırdılmış şey; أخذ الفتاة خطيفة qız qaçırtmaq
- مِخْطَاف c. مَخَاطِيف lövbər
- مَخْطُوف 1) qopardılmış, qapılmış, zorla alınmış; oğurlanmış; 2) iti, ani

I خطل (ə) خَطَلَ 1) boş-boş, mənasız danışmaq; öyünmək, özünü tərifləmək; özünü çəkmək; IV أَخْطَلَ boş-boş, mənasız danışmaq; V تَخَطَّلَ özünü çəkmək, lovğalanmaq,

- خَطْمٌ c. خُطُومٌ ، أَخْطَامٌ üz, sifət, burun (*heyvanlarda*)
- خَطْمِيٌّ ، خِطْمِيَّةٌ *bot.* gülxətmi, xətmi
- مَخْطَمٌ c. مَخَاطِمُ = خَطْمٌ

I (خطو) خَطَا (u) خَطْوٌ addımlamaq, ayaq qoymaq, irəli getmək; ...في خطوات واسعة ~ ...-da/də iri addımlarla addımlamaq; ...-da/də böyük uğurlar əldə etmək; V تَخَطَّى 1) keçmək, aşmaq, addamaq, addayıb keçmək; عتبة ~ الدار evin kandarını addamaq; في الغرفة ~ otaqda var-gəl etmək; 2) pozmaq (*qanunu*); 3) ötmək, keçmək, arxada qoymaq, qabaqlamaq, ötüb keçmək (*kimisə xidmətdə yüksəlişdə*); VIII إِخْتَطَى addımlamaq, qabağa getmək

- خَطْوَةٌ c. خَطَوَاتٌ 1) addım; addımın uzunluğu; (امام) الى الامام ~ bir addım irəli; الى ~ (وراء) الوراء bir addım geri; قام بـ~ حاسمة في... ...-da/də qəti addım atmaq; 2) *şahm.* gediş
- خُطْوَةٌ c. خُطًى ، خُطُوَاتٌ = خَطْوَةٌ; اتخذ الخطوات الاولى في... ...-da/də ilk addımları atmağa başlamaq; سار بخطى واسعة (واثقة ، ثابتة) لان (لاجل)... ...-a/ə doğru iri (*inamlı, sabit*) addımlarla getmək; سار بخطى وئيدة الى... ...-a/ə doğru yavaş-yavaş getmək

خَطِيئَةٌ = خَطِيَّةٌ *bax*: خطأ

- خَفَّ (ə/i) خِفَّةٌ ، خَفٌّ 1) yüngül olmaq, vəzndə yüngül olmaq; اشترى ما خف حمله وغلا ثمنه *məsəl.* vəzndə yüngül, qiymətdə ağır nə vardısa aldı; 2) azalmaq; zəifləmək (*məs., yoluxucu xəstəlik*); seyrəlmək (*kütlə*); 3) yeyin, cəld, çevik, diribaş olmaq; tələsmək (*haraya* الى); II خَفَّفَ 1) yüngülləşdirmək, yükünü azaltmaq (*kimin* عن); هذا عنا بلوانا ~ bu bizim dərdimizi yüngülləşdirdi; 2) kömək etmək, sakitləşdirmək (*dərman haqqında*); عن ~ اعصابه əsəblərini sakitləşdirmək; 3) yumşaltmaq; من صرامته ~ sərtliyini yumşaltmaq; 4) aşağı salmaq, azaltmaq (*nəyi təs. halda və ya* من); 5) əvəz etmək (*kiminsə cəzasını* عن); 6) sıyıqlaşdırmaq, qatmaq; الحليب بالماء ~ südə su qatmaq; 7) *k.-t.* seyrəkləşdirmək; alaq vurmaq; 8) *aram*, samit səsi təşdidsiz tələffüz etmək; عنه ~ kiməsə təskinlik vermək; V تَخَفَّفَ 1) ayaqqabı geymək; 2) yüngülləşmək (*yükünün bir hissəsini başqalarına verməklə, yaxud xəstəliyin şiddəti azalmaqla*); kəsifliyi azalmaq; من ثوبه ~ yaxasını yüngülcə açmaq (*məs., istidən*); X إِسْتَخَفَّ 1) yüngül, əhəmiyyətsiz, dəyərsiz hesab etmək; 2) yüngül, laqeyd, etinasız yanaşmaq; yüngül baxmaq (*nəyə* بـ); 3) həyəcanlandırmaq, coşdurmaq; الطرب ~ـه musiqi onu həyəcanlandırdı

- أَخَفُّ [1] daha yüngül, daha kiçik, az; الضررين ~ iki zərərdən daha yüngülü
- أَخَفُّ [2] q. خَفَّاءُ c. خُفٌّ yüngül, yüngülxasiyyət, yelbeyin
- إِسْتِخْفَافٌ 1) yüngül münasibət; 2) etinasızlıq, dəmdəməkilik; hörmətsizlik; بـ ~ etinasızlıqla
- تَخْفِيفٌ 1) yüngülləşdirmə; 2) yumşaltma; من حدة التوتر بين... وبين... ~ ...arasında gərginliyin zəiflədilməsi; التَّوَتُّرِ الدُّوَلِيِّ ~ beynəlxalq gərginliyin zəiflədilməsi; 3) azaltma, aşağı salma; 4) əvəz etmə (*cəzanı*); 5) qatma, qarışdırma
- تَخْفِيفَةٌ c. ـات - yüngül ev paltarı
- خُفٌّ c. أَخْفَافٌ ، خِفَافٌ 1) pəncə, ayaq; 2) ayaqqabı; رجع (عاد) بخفي حنين *bax*: حُنَيْنٌ
- خِفَافٌ ، خَفَّانٌ süngər daşı



- خِفَّةٌ 1) yüngüllük; 2) العقل ~ yelbeyinlik, dəmdəməkilik; 3) cəldlik, zirəklik, diribaşlıq; اليد ~ əldənitilik; اليد ~ العاب oyunbazlıq, jonqlyorluq; الدم ~ gülərüzlülük, qanışirinlik; الحركة ~ mütəhərriklik; الروح ~ həyatsevərlik, şənxasiyyətlilik
- خُفُوفٌ 1) tezlik, yeyinlik; tələsiklik; 2) tələsik çıxıb getmə, tələsik yola düşmə; bir işi ayaqüstü etmə
- خَفِيفٌ c. خِفَافٌ ، أَخِفَّاءُ 1) yüngül, yüngülcəkili; ~ ورق papiros kağızı; 2) seyrək; الشعر ~ seyrəksaç; لحية ~ـة seyrək saqqal; 3) zəif, yumşaq (*məs., tütün*); 4) xəfif (*məs., yel, meh*); 5) zərif, incə (*məs., qızartı*); 6) açıq (*məs., çayın rəngi*); 7) əhəmiyyətsiz; العقل ~ yelbeyin; 8) cəld, diribaş, zirək; şənxasiyyət; الحركة ~ mütəhərrik, çox hərəkət edən; الرِّجْلِ ~ ayaqdan zirək, itiayaq; الظل و الروح ~ şən, həyatsevər; mülayim, xoşsifət; 9) xəfif (*şeirdə vəzn*); يده ~ـة o, əldən itidir; ذات ~ اليد yoxsul, kasıb
- خَفِيفَةٌ c. خَفَائِفُ qızıl yarpaqlı yüngül bəzək əşyaları
- مُخَفَّفٌ yüngülləşdirilmiş; azaldılmış; qatılmış, qatışdırılmış
- مُخَفِّفٌ 1. 1) yüngülləşdirici; للجريمة ~ ظرف təqsiri yüngülləşdirən səbəb; 2) azaldıcı; 2. c. ـات – amortizator
- مُسْتَخَفٌّ 1) xor, etinasız; 2) yelbeyin, dəmdəməki

I (خفت) خَفَتَ [1] (u) خُفُوتٌ sakit, səssiz olmaq, susmaq; خَفَتَ [2] (u) خَفْتٌ sakit, astadan danışmaq; III خَافَتَ azaltmaq, boğmaq (*səsi* بـ); IV أَخْفَتَ susdurmaq, susmağa məcbur etmək; VI تَخَافَتَ tədricən səsini kəsmək, sakit olmaq; səsi azaldılmaq; VII إِنْخَفَتَ sakit, səssiz olmaq, səsi boğulmaq; VIII إِخْتَفَتَ susmaq, sakit olmaq, səsi kəsilmək

- خَافِتٌ 1) sakit, boğuq (*səs*); الصوت ~ sakit səslə; 2) yumşaq, sakit, zəif, tutqun (*işıq*)
- خُفُوتٌ *radio* fedinq

I (خفر) خَفَرَ (i) خَفْرٌ 1) qorumaq, gözətləmək, keşiyini çəkmək, mühafizə etmək; 2) mühafizə üçün müşayiət etmək; خَفِرَ (ə) خَفَرٌ utancaq, həyalı, abırlı olmaq; II خَفَّرَ mühafizə etmək, keşiyini çəkmək; V تَخَفَّرَ utancaqlıq, həyalılıq göstərmək

- خَافِرَةٌ c. خَوَافِرُ gözətçi gəmisi
- خَفَارَةٌ gözətçilik, keşikçilik haqqı
- خِفَارَةٌ 1) keşik, mühafizə, qarovul; 2) gözətçilik, keşikçilik, qarovulçuluq
- خَفَرٌ [1] utancaqlıq, həyalılıq
- خَفَرٌ [2] mühafizə dəstəsi, keşikçi dəstəsi; qarovul, keşikçi
- خَفِرٌ utancaq, həyalı, abırlı
- خَفِيرٌ c. خُفَرَاءُ qarovulçu, keşikçi, gözətçi
- مَخْفَرٌ c. مَخَافِرُ 1) gözətçi dəstəsi, qarovul; 2) qarovul köşkü

I خفس (i) خَفْسٌ 1) ələ salmaq, məsxərəyə qoymaq; 2) dağıtmaq, uçurtmaq, yıxmaq, sökmək (*məs., tikilini*); VII إِنْخَفَسَ uçurdulmaq, sökdürülmək, dağıdılmaq; !إِنْخَفِسْ itil gözümdən!

أَخْفَشُ q. خَفْشَاءُ c. خُفْشٌ gözləri zəif olan, gündüzlər görməyən
- خُفَّاشٌ c. خَفَافِيشُ yarasa
- خَفَشٌ gündüzlər görməmə; gündüz korluğu (*xəstəlik*)

I (خفض) خَفَضَ (i) خَفْضٌ 1) aşağı salmaq, endirmək; الاثمان ~ qiymətləri aşağı salmaq; 2) alçaltmaq; 3) aşağı salmaq, aşağı dikmək; البصر ~ gözlərini aşağı salmaq; عينيه ~ gözlə-

ومناقشات görüşdə söhbət əsnasında arada mübahisə də olurdu; 4) arada olmaq, arada qalmaq; VIII إختلّ 1) pozulmaq, pozulmuş olmaq; 2) xarab, nasaz olmaq; nizamsız hala düşmək; عقله ~ ağlı xarab olmaq, ağlı çaşmaq

- إختلال 1) nasazlıq; 2) pozğunluq, xarablıq, qeyri-normallıq, qaydada olmama; العقل ~ yaxud العقليّ الـ~ əqli pozğunluq
- إخلال 1) pozma; əməl etməmə; بالآداب ~ ədəb-ərkanı pozma; 2) korlama, xarab etmə
- خلّ sirkə
- خِلّ , خُلّ k., q. c. أخلال dost, tanış; rəfiqə; الكتاب هو الخلّ الوفيّ kitab vəfalı dostdur
- خلال [1] dostluq
- خلال [2] c. أخلّة 1) diştəmizləyən; 2) sancaq; 3) mil; 4) ara, fasilə; 5) orta; في خلاله yaxud خلاله ərzində; من ~ ـه ...-dan-dən; ortasından, içərisindən, arasından; من ~ الزجاج şüşənin içindən; خلال الكتب kitabların arasında; في ~ ذلك bu arada; في ~ اليوم gün ərzində; في ~ الزيارة ziyarət, səfər zamanı
- خلالة c. أخلّة diştəmizləyən
- خُلالة dişlərin arasında qalmış yemək qırıntısı
- خلل c. خلال 1) xələl, korlanma, zədələmə; nasazlıq; 2) pozulma (*məs., əsəb sisteminin*); normal olmama, qeyri-normallıq; في ~ العقل ağlın başdan çıxması; 3) qüsur, nöqsan; 4) səhv, qələt, yanlışlıq; 5) ara, fasilə; çat, çatlaq, yarıq; 6) nizamsızlıq, pozuqluq; من ~ ـه nəyinsə arasından, içərisindən; كرّر من ~ الدموع göz yaşları arasından (*ağlaya-ağlaya*) təkrar etmək
- خلّة [1] c. خلال , خلّات xasiyyət, xüsusiyyət; anadangəlmə keyfiyyət
- خلّة [2] ehtiyac, çatışmazlıq, qüsur; ~ سدّ çatmayan yerləri doldurmaq
- خُلّة dostluq; yaxınlıq; aşnalıq; sevgi
- خُلّة , خلّة c. خُلَل , خلل *bot.* 1) *həmç.* شيطانيّة ~ ammi majus (*dəvələrin xoşladıqları bitki*); 2) ammi visnaga (*diştəmizləyən düzəltmək üçün istifadə olunan bitki*)
- خلّول: ~ الـ لم *zool.* yeməli balıqqulağı, midi
- خليل c. أخلّاء 1) sevgili; 2) dost, tanış; الله ~ Xəlilullah (*İbrahim peyğəmbər*)
- خليلة c. خليلات , خلائل sevgili (*qadın*); məşuqə
- مُخالّة dostluq
- مُختلّ 1) korlanmış, xarab olmuş; 2) qeyri-normal; العقل ~ *yaxud* الشعور ~ ağlı başdan çıxmış, ağlını itirmiş
- مُخلّ pozan; بالامن العامّ ~ ictimai təhlükəsizliyi pozan
- مُخلّل sirkəyə qoyulmuş, duza qoyulmuş, turşuya qoyulmuş
- مُخلّلات c. şoraba
- مُخلّلاتي c. مُخلّلاتيّة şorabasatan
- مَخلول c. مَخاليل 1) zədələnmiş, korlanmış; 2) qeyri-normal, ağlı başında olmayan

I خلب (u, i) خلب 1) pəncəsinə salmaq, çənginə keçirmək; 2) heyran, məftun etmək (*nə ilə* بـ); عقله ~ *yaxud* لبّه ~ ağlını başından çıxarmaq, məftun etmək; 3) azdırmaq, yoldan çıxarmaq, başdan çıxarmaq; aldatmaq; III خالب aldatmaq; VIII إختلب 1) aldanmaq, azdırılmaq, başdan çıxarılmaq; aldadılmaq; 2) məftun etmək, heyran etmək

- خالب heyranedici, məftunedici; azdırıcı, başdan çıxarıcı
- خلّاب 1) aldadıcı; 2) məftunedici, valehedici
- خلابة gözəllik, cazibədarlıq, məftunedicilik



- خِلب c. أخلاب 1) caynaq; 2) üzüm yarpağı; 3) *anat.* qaraciyərin seroz qişası, periton (*qarın boşluğu divarlarını və üzvlərini örtən seroz qişa*); ~ الـ مرض *tibb.* peritonit; النساء ~ qadınları özünə məftun edən kişi
- خُلّب aldadıcı, xəyali; ~ برق yağışsız şimşək (*vəd edən, amma vədinə əməl etməyən adam haqqında deyilir*)
- خُلّبيّ yalan, yalançı; ~ ـة طلقة boş (*güllə-siz*) patron
- مخلب c. مَخالب , مَخاليب pəncə (*caynaqlı*); caynaq; çəng; في مخالب الموت ölümün çəngində

خلبص 1) qaçmaq; 2) nadinclik etmək, dəcəllik etmək; 3) yalan danışmaq

- خلبوص c. خلابيص nadinc, dəcəl

I خلج (i) خلج (خلج) 1) məşğul etmək, həyəcanlandırmaq, qayğılandırmaq; narahat etmək; 2) tərpətmək, titrətmək, əsdirmək; خلج (ə) خلج yorğunluq hiss etmək; III خالج 1) narahat etmək, qayğılandırmaq, əndişəyə salmaq; diqqətini büsbütün cəlb etmək; 2) bürümək (*şübhə haqqında*); لا يخالجه اي شك بان... o heç şübhə etmir ki...; يخالجه الضحك onu gülmək tutur; 3) xas, məxsus olmaq; V تخلّج əsmək, titrəmək; sarsılmaq; VIII إختلج qıc olmaq; qeyri-iradi dartılmaq; əsmək; yığılmaq (*göz bəbəyi haqqında*); الامر في صدره ~ narahat etmək; təşvişə salmaq

- إختلاج əsmə, qıc olma; *tibb.* ataksiya
- إختلاجة konvulsiv hərəkət, qıc olma, qeyri-iradi dartınma
- خالجة c. خوالج həyəcan, narahatlıq hissi; səksəkə, qorxu; iztirab; خوالج نفسه qəlbində keçirdiyi hisslər, yaşantılar
- خلجة c. خلجات titrəmə, əsmə, həyəcan; خلجات نفسه qəlbindəki həyəcan
- خليج c. خُلجان , خُلُج körfəz; kanal

خلخل 1) yelləmək, tərpətmək, əsdirmək, titrətmək; ثقة الجمهور ~ kütlənin etibarını sarsıtmaq; 2) seyrəltmək, kəsifliyini azaltmaq (*qazın*); تخلخل 1) yellənmək, tərpənmək, əsmək, titrəmək; haldan düşmək, yorulmaq; 2) seyrəldilmək; kəsifliyi azalmaq (*qaz haqqında*)

- تخلخل seyrəklik, kəsifliyin azalması
- خلخال c. خلاخيل 1) xalxal (*qadınların yaraşıq üçün topuqlarına taxdıqları qızıl, gümüş və s.-dən düzəldilmiş zınqrovlu halqa*); 2) topuq
- خلخل c. خلاخل = خلخال
- خلخلة 1) yelləmə, əsdirmə; tərpətmə; 2) seyrəkləşdirmə (*qazın*)
- مُتخلخل seyrəkləşdirilmiş, kəsifliyi azaldılmış; ~ غاز seyrəkləşdirilmiş qaz
- مُخلخل 1) seyrəkləşdirilmiş (*qaz haqqında*); 2) sarsımış; laxladılmış; ~ ـة مشية yırğalana-yırğalana yerimə

I خلد (u) خلود 1) əbədi olmaq, əbədi davam etmək; 2) olmaq (*harada* بـ); للنوم ~ yatmağa uzanmaq; II خلّد 1) əbədi etmək, əbədiləşdirmək; ذكراه ~ kiminsə xatirəsini əbədiləşdirmək; 2) olmaq (*harada* بـ); 3) çox qocalmaq, pirani qoca olmaq; IV أخلد 1) qalmaq, olmaq (*harada* إلى); 2) meyil etmək, əl atmaq (nəyə), qapılmaq, uymaq, dalmaq (*nəyə* إلى); البطالة ~ bikarçılıq, avaralıq etmək; إلى السكون ~ sakitləşmək; إلى الصمت ~ süküta dalmaq; اليه بثقته ~ kiməsə tam etibar etmək; 3) əbədiləşdirmək; V تخلّد əbədiləşmək; əbədi davam etmək

- تخليد əbədiləşdirmə; ... لـ ~ ... anma üçün; لذكراه ~ xatirəsini yad edərək

- خَالِدٌ əbədi, ölməz
- خَلَدٌ c. أَخْلَادٌ qəlb; ağıl; لا يدور في ~ احد ان... heç kəsin ağlına gəlmir ki...
- خُلْدٌ [1] əbədilik, ölməzlik; جنّة الـــ~ yaxud دار الـــ~ cənnət
- خُلْدٌ [2] c. مَنَاجِذُ (həmç. اوربّيّ ~) zool. kor siçan; köstəbək; zool. ördəkburun
- خُلُودٌ sonsuzluq, əbədilik, ölməzlik; دار الـــ~ cənnət
- خَوَالِدُ c. əbədi olanlar; الـــ~ dağlar

I خَلَسَ (i) خَلْسٌ oğurlamaq, gizlicə götürmək; III خَالَسَ oğrun-oğrün, gizlin, xəlvəti etmək; نظرات ~ـــها o ona oğrun-oğrun baxırdı; VIII إِخْتَلَسَ oğurlamaq; aldadıb ələ keçirmək; sui-istifadə etmək (vəzifədən); israfa yol vermək; النظر إلي... ~ oğrun-oğrun baxmaq
- إِخْتِلَاسٌ c. اتٌ - oğurlama; mənimsəmə; oğurluq; sui-istifadə (vəzifədən); israf, dövlət malını oğurlama
- خِلَاسِيٌّ mulat
- خُلْسَةٌ c. خُلَسٌ fürsət; münasib vaxt; əlverişli an; خلسةً gizlicə; oğrun-oğrun
- مُخْتَلِسٌ dövlətin malını mənimsəyən, israf edən

I (خلص) (خلص) خَلَصَ [1] (u) خُلُوصٌ 1) təmiz, ixlaskar, saf olmaq; 2) sırf, xalis bir şeylə bağlı olmaq; 3) aşkar olmaq; 4) nəticədə alınmaq; 5) birinə çatmaq (kimə لـــ); büsbütün məxsus olmaq (kimə لـــ); 6) yetişmək, çatmaq (nəyə), gəlmək (nəyə الى); الى حكم آخر ~ başqa qərara gəlmək; خَلَصَ [2] (u) خَلَاصٌ 1) qurtarmaq, əldən çıxmaq (pul haqqında); 2) xilas olmaq, qurtarmaq, canını qurtarmaq (nədən من); II خَلَّصَ 1) xilas etmək, qurtarmaq, canını qurtarmaq, azad etmək; حقّه بيده ~ haqqına öz gücü ilə nail olmaq; 2) təmizləmək, arıtmaq (nədən من); saflaşdırmaq; 3) qurtarmaq; 4) almaq (rüsumu ödədikdən sonra malı gömrükdən); pulunu verib almaq (malın على); 5) ödəmək (nəyi على nə ilə بـــ); له ~ əvəzini çıxmaq, qisas almaq; III خَالَصَ 1) səmimi, sədaqətlə, ixlasla hərəkət etmək (kiməsə münasibətdə); 2) haqq-hesab çəkmək, hesablaşmaq, qisas almaq (kimdən); IV أَخْلَصَ səmimilik, ixlaskarlıq göstərmək (kimə لـــ nədə في); sədaqətli, ixlaskar olmaq (kimə لـــ); haqqına, vicdanla rəftar etmək (kimə münasibətdə لـــ); الحبّ (له) ~ـــه kimisə səmimi-qəlbdən sevmək; V تَخَلَّصَ çəkinmək (kimdən-nədən من); canını qurtarmaq, yaxasını qurtarmaq (nədən من); VI تَخَالَصَ bir-birilə haqq-hesab çəkmək, haqq-hesabı çürütmək, əvəz-əvəz olmaq; X إِسْتَخْلَصَ 1) canını, yaxasını qurtarmağa çalışmaq; xilas etmək; 2) çıxartmaq; almaq; çəkmək; hasil etmək; الماء ~ العذب من مياه البحر dəniz suyunu duzdan təmizləmək; فائدة من ~ nədənsə fayda götürmək; 3) çıxartmaq (nəticə); 4) öyrənmək, öyrənib bilmək; 5) malı (gömrükdən) çıxartmaq üçün icazə almağa çalışmaq; 6) səmimi, ixlaskar hesab etmək
- إِخْلَاصٌ ixlas, səmimiyyət, ürəyiaçıqlıq, sadiqlik; بـــ~ ixlasla, səmimi-qəlbdən
- إِسْتِخْلَاصٌ 1) xilas etmə, nicat vermə, qurtarma; 2) çıxartma, çəkmə, alma; الطاقة ~ الذرّيّة atom enerjisi alma
- تَخَلُّصٌ canını qurtarma, özünü xilas etmə; من العقاب ~ cəzadan yaxa qurtarma
- تَخْلِيصٌ azad etmə; xilas etmə, qurtarma; 2) təmizləmə, saflaşdırma; 3) pulunu verib alma; على البضائع ~ rüsumu ödəyib malı (gömrükdən) alma; يوم الـــ~ malı (gömrükdən) alma günü; 4) ödəmə; الرسوم ~ rüsumun ödənilməsi; على الخطاب (الجواب) ~ məktubun ödənilməsi (marka ilə)
- خَالِصٌ c. خُلَّصٌ 1) xalis, təmiz, saf, səmimi; حلية ~ـــة saf (saxta olmayan) qiymətli əşya; 2) azad (nədən من); الاجرة ~ ödənişdən azad; ödənilmiş; الضريبة ~ vergidən azad; المصارف ~ a) pulsuz; b) xərcləri ödəmədən; 3) qurtarmış
- خَالِص xalq dil. tamam, çox
- خَلَاصٌ 1) azad etmə, xilas etmə, qurtarma (nədən من); الجنين ~ anat. cift, son; 2) ödəniş, ödəmə
- خَلَاص xalq dil. bəsdir!; qurtardı!; yetər! و ~! iş bitdi!
- خُلَاصَةٌ c. اتٌ - 1) seçmə, seçilmiş, ən yaxşı şeylər; ekstrakt; 2) nəticə; 3) mahiyyət; kvintessensiya; cövhər; xülasə, qısa məzmun; و الـــ~... bir sözlə...; 4) qəbz
- خِلْصٌ c. خُلَصَاءُ səmimi, sadiq dost
- خُلُوصٌ 1) saflıq, təmizlik; 2) səmimilik, sadiqlik
- مُخَالَصَةٌ c. اتٌ - 1) qarşılıqlı hesablaşma; haqq-hesabın qaydaya salınması; 2) qəbz
- مَخْلَصٌ 1) xilas etmə, canını qurtarma; 2) xilas yeri, sığınacaq
- مُخْلِصٌ müxlis, ixlaskar, səmimi, sadiq, vəfalı
- مُخْلَصٌ 1. 1) xilas olmuş, qurtulmuş, canını qurtarmış; 2) saflaşdırılmış; 3) عليه ~ haqqı ödənilmiş; 2. c. اتٌ - çıxarış, iqtibas
- مُخَلِّصٌ xilaskar, qurtuluş gətirən; البضائع ~ haqqını ödəyərək malları (gömrükdən) alan
- مُسْتَخْلِصٌ 1) xilas etmək istəyən, azad etmək istəyən; 2) çıxaran, alan; البضائع ~ = مخلص البضائع bax: مُخَلِّصٌ
- مُسْتَخْلَصٌ 1. çıxarılmış, alınmış; 2. 1) xülasə, ekstrakt; 2) c. اتٌ - çıxarış, iqtibas



I خَلَطَ (i) خَلْطٌ 1) qatmaq; qarışdırmaq; المعادن ~ metalları əridib bitişdirmək; 2) qarışıq salmaq, qatıb qarışdırmaq; dolaşıq salmaq; لا يخلط بينهما o bunları qarışıq salmır; في الكلام ~ sözlərini qatıb qarışdırmaq, rabitəsiz danışmaq; 3) qarışdırmaq (kartları); II خَلَّطَ 1) qatmaq, qarışdırmaq; dolaşdırmaq, qatıb qarışdırmaq; 3) sayıqlamaq (xəstə haqqında); III خَالَطَ 1) qatılmaq, qatışdırılmaq; خولط في عقله məch. ağlı çaşıb; 2) üz vermək; başına gəlmək; الداء ~ـــه ona xəstəlik üz verib, o xəstələnib; 3) oturub-durmaq; dostluq etmək; görüşmək; المرأة ~ qadınla əlaqədə olmaq; VI تَخَالَطَ bir-birilə əlaqə saxlamaq; oturub-durmaq; qaynayıb-qarışmaq; VIII إِخْتَلَطَ 1) qaynayıb-qarışmaq; dolaşıq düşmək, qatışmaq; يختلط عندهم احداهما بالآخر onlar bunlardan birini digəri ilə qarışdırırlar; عقله ~ onun ağlı çaşıb; النابل بالحابل ~ hər şey qatılıb-qarışdırılıb
- إِخْتِلَاطٌ 1) ixtilat; qaynayıb-qarışma; 2) qarışıqlıq, dolaşıqlıq; 3) yaxın əlaqə, ünsiyyətdə olma, münasibət yaratma; العقل ~ ağlın çaşması
- تَخْلِيطٌ 1) qatma, qarışdırma; 2) sayıqlama, sərsəmləmə; الحمّى ~ titrədib-qızdırma sayıqlaması
- خَلَّاطَةٌ c. اتٌ - qarışdırıcı cihaz, mikser; خرسانيّة ~ betonqarışdıran
- خَلْطٌ qatma, qarışdırma; birləşdirmə; خَلْط بَلْط xalq dil. qarma-qarışıq, bir-birinə qarışmış halda, necə gəldi
- خِلْطٌ[1] qatma, qarışdırma; qarışıq, qatışıq, tərkib
- خِلْطٌ[2] hər yerə soxulan, hər yerə baş soxan, sırtıq, yaltaq

- خلط *c.* أخلاط 1) dolaşıqlıq, qarışıqlıq; 2) qarışıq, qatışıq; 3) tərkib hissəsi; ملط ~ necə gəldi bir-birinə qarışmış halda, qalaq-qalaq; اخلاط الانسان (الصفراء والبلغم والدم والسوداء) insanın temperamentləri, məcazları (öd – tündməcaz, bəlğəm – soyuqqanlı, qan –istiqanlı, qara sevda – malxulyalı, qara sevdalı); اخلاط الناس *yaxud* اخلاط من الناس a) qara camaat, avam xalq; b) tör-töküntü adamlar

- خَلْطَة 1) qarışıq, qatışıq; 2) qarışıqlıq, qarmaqarışıqlıq, dolaşıqlıq; بَلْطة ~ qarma-qarış, nizamsız, tökülüb-töküşdürülmüş halda

- خُلْطَة , خِلْطَة ünsiyyət, əlaqə; dostluq, aşnalıq, yoldaşlıq

- خَلِيط[1] 1. qatışdırılmış, qarışdırılmış; 2. qatışıq, qarışıq; معدنيّ ~ ərinti, xəlitə

- خَلِيط[2] *c.* خُلَطاء dost, tay-tuş, yoldaş

- خَلِيطَة *c.* خَلائِط xəlitə, ərinti

- مُخَالَطَة 1) ünsiyyət, əlaqə, münasibət; 2) oturub-durma, qaynayıb-qarışma

- مُخْتَلِط qarışıq; المحكمة الـ~ـة qarışıq məhkəmə

- مُخَلَّط 1) qat-qarış, qatılıb-qarışdırılmış; 2) nizamsız

- مَخْلُوط 1. qarışıq; 2. *c.* مَخَالِيط 1) qarışıq, qatışıq, tərkib; 2) xəlitə, ərinti; حديديّ ~ dəmir ərintisi

I خَلَعَ (ə) خلع (خلع) 1) çıxarmaq (*paltarı, ayaqqabını və s.*); ملابسه ~ soyunmaq; حذاءه ~ ayaqqabısını çıxarmaq; الحداد ~ matəm libasını çıxarmaq; 2) bağışlamaq, ənam vermək, hədiyyə vermək; mükafatlandırmaq (*kimi* على); 3) yıxmaq, salmaq, endirmək; عن ~ العرش taxtdan salmaq; 4) çıxartmaq (*dişini*); 5) burxutmaq (*qolunu*); العذار ~ özünü saxlaya bilməmək; ـه ابوه ~ atası ondan imtina edib; امرأته ~ arvadına xəli (*pul müqabilində*) talaq vermək; قلبه ~ kiminsə ürəyini qopartmaq; يده من طاعته ~ kiməsə itaət etməyi kəsmək; خَلُعَ (u) خَلاعَة 1) pozğun, əxlaqsız olmaq; 2) laxladılmaq, pozulmuş olmaq; II خَلَّعَ 1) burxutmaq; 2) laxlatmaq, boşaltmaq; 3) salmaq, yıxmaq, uzaqlaşdırmaq; III خَالَعَ: امرأته ~ = خلع امرأته *bax*: خلع; V تَخَلَّعَ 1) burxudulmaq; 2) laxladılmaq, boşaldılmaq; laxlamaq; في المشي ~ yırğalana-yırğalana getmək; 3) aludə olmaq (*nəyə* في); في ~ الشراب içkiyə aludə olmaq, sərxoşluq etmək; VII إِنْخَلَعَ 1) burxudulmaq; 2) salınmaq (*taxtdan*), çıxarılmaq (*vəzifədən*); devrilmək; 3) qopmaq, ayrılmaq, uzaqlaşmaq (*kimdən* عن); əlaqəsini kəsmək; عن هذا الجماعة ~ o bu qruplaşmadan ayrıldı; قلبه من الهول ~ qorxudan ürəyi qopdu; VIII إِخْتَلَعَ çıxarmaq (*paltarını, ayaqqabısını*); ملابسه ~ soyunmaq

- خَلاعَة pozğunluq, əxlaqsızlıq

- خَلْع 1) çıxarma, salma, devirmə; 2) burxulma; 3) qopartma, çıxartma (*dişi*)

- خِلْعَة *c.* خِلَع xələt, bəxşiş, hədiyyə, xələtbarat, bəxşeyiş; ~ خلع عليه xələtini çıxarıb kiməsə hədiyyə etmək

- خَلِيع 1. 1) taxtdan salınmış, hakimiyyətdən uzaqlaşdırılmış, devrilmiş; 2) rədd edilmiş; 3) köhnəlmiş (*paltar*); 4) pozğun, əxlaqsız; العذار ~ yolsuz; صور ~ـة pornoqrafik şəkillər; 2. *c.* خُلَعاء pozğun; veyil

- مُخَلَّع 1) burxulmuş; 2) iflic olmuş

- مَخْلُوع 1) burxulmuş; 2) çıxarılmış; taxtdan salınmış, devrilmiş; الخاطر ~ əhvalı pozulmuş, qanı qaralmış; الفؤاد ~ ürəyi qopmuş, qorxaq



I خَلَفَ (u) خِلافَة 1) ardınca gəlmək; 2) kiminsə xələfi, varisi olmaq; kimisə əvəz etmək; 3) kimdənsə çox yaşamaq; kimdənsə sonra qalmaq; 4) kimdənsə geridə qalmaq, dala qalmaq; arxasında qalmaq (*kimin* عن); II خَلَّفَ 1) özünə varis təyin etmək; 2) özündən sonra qoyub getmək; أثرا جميلا ~ yaxşı təsir qoymaq; 3) irs qoyub getmək; özünə varis etmək; ـها على داره ~ o həmin qızı evinə varis qoyub gedib; 4) qoyub getmək, özü ilə aparmamaq; 5) doğub törətmək; III خَالَفَ 1) əksinə hərəkət etmək; müxalif olmaq; əksinə, ziddinə getmək; qarşı çıxmaq; خَالِفْ تُعْرَفْ *məsəl.* müxalif ol, tanınarsan!; 2) fərqlənmək, müxtəlif olmaq, uyğun gəlməmək; 3) pozmaq, əməl etməmək; وعده ~ vədinə xilaf çıxmaq, əməl etməmək; IV أَخْلَفَ 1) pozmaq, əməl etməmək, xilaf çıxmaq; doğrultmamaq (*ümidləri*); وعده ~ vədinə xilaf çıxmaq; المطر ~ yağış ümidləri doğrultmadı, yağmadı; 2) əvəzində vermək, əvəzini vermək (*nəyin kimə* على); V تَخَلَّفَ 1) olmamaq, gəlməmək (*harayasa*); buraxmaq (*mühazirəni* عن); عن العودة ~ qayıtmamaq (*bazaya-təyyarə haqqında*); عن مواعيد ~ العمل işə gecikmək, işə vaxtında gəlməmək; 2) qalmaq (*kimdən sonra* عن , من); 3) geridə qalmış olmaq, geridə qalmaq (*nədə* في); VI تَخَالَفَ 1) razılaşmamaq; başqa cür baxmaq; 2) uyğun gəlməmək (*nə ilə*); müvafiq olmamaq (*nəyə* و); VIII إِخْتَلَفَ 1) müxtəlif olmaq, fərqlənmək; 2) müxalif olmaq (*nəyə*), başqa fikirdə olmaq (*nədə* على); ixtilafda olmaq; şərik olmamaq, razılaşmamaq, ayrılmaq (*fikircə*); معهم ~ *yaxud* و اياهم ~ o onlarla razılaşmadı, ixtilaf etdi; لا يختلف في هذا اثنان burada başqa fikir ola bilməz; 3) enib-qalxmaq (*qiymətlər haqqında*); 4) fərqlənmək, seçilmək (*nədən* عن); 5) tez-tez baş çəkmək, tez-tez getmək (*hara* الى); X إِسْتَخْلَفَ özündən sonra qoyub getmək; özünə əvəz, varis qoyub getmək

- إِخْتِلاف *c.* ات - 1) müxtəliflik; على ~ انواعهم növlərinin müxtəlifliyinə baxmayaraq; 2) fərq; ayrılıq; الآراء ~ fikir ayrılığı; المنظر ~ parallaks; 3) enib-qalxma, dəyişkənlik; 4) bir-birinin dalınca gəlmə; 5) ziddiyyət, uymazlıq, mübahisə, ixtilaf; اختلافات داخلية daxili ziddiyyətlər, ixtilaflar

- تَخَلُّف 1) geri qalma, gerilik; الـ~ الاجتماعيّ sosial gerilik; الـ~ العقليّ əqli gerilik; 2) olmama, gəlməmə

- خَالِف 1) geridə qalan; 2) ardınca gələn (*kiminsə-nəyinsə*); 3) əvəz edən

- خَالِفَة *c.* خَوالِف çadırın arxa payası

- خِلاف[1] *c.* ات - ziddiyyət, ixtilaf, fikir ayrılığı, mübahisə, münaqişə; فيه ~ لا mübahisəsiz, mübahisə doğurmayan; على ~ ما... *yaxud* ~ـا لما... əksinə olaraq; ~ـا لـ... ...-dan/-dən fərqli olaraq; بـ~ ذلك bundan əlavə, bunu saymasaq; و ~ـهما və bunların ikisindən savayı başqaları; و ~ـه və ilaxır, və sairə

- خِلاف[2] *bot. topl.* söyüd

- خِلافَة 1) əvəz etmə; 2) xilafət; 3) xəlifəlik; 4) xəlifənin hakimiyyət dövrü

- خِلافِيّ mübahisəli

- خَلْف *c.* خُلُوف , أَخْلاف 1) bel; 2) arxa, arxa hissə; نظرت ~ـي mən arxaya baxdım; خلفه arxasında, dalında; الى الخلف arxaya; في الـ~ arxada; من الـ~ arxadan; ضربه من الـ~ kiməsə arxadan zərbə vurmaq; أرسل خلفه arxasınca göndərmək

- خَلَف c. أخْلاَف 1) xələf, varis; 2) övlad, sonrakı nəsil; 3) əvəz (*itmiş şeyə görə*)
- خُلْف [1] 1) razılaşmama; ixtilaf, uyğunsuzluq; 2) fərq, müxtəliflik
- خُلْف [2] c. أخْلاَف 1) boş ümid; 2) yalan vəd; vədə xilaf çıxma; 3) absurd
- خِلْف 1. müxtəlif, fərqli, zidd, əks; 2. c. أخْلاَف məmə, əmcək; ودرّت عليه اخلاف النعم *məcaz. bax:* دَرَّ
- خَلْفانِيّ arxa (*sif.*), dal (*sif.*)
- خِلْفة [1], خُلْفة 1) fərq, müxtəliflik; 2) bir-birinin ardınca gəlmə
- خِلْفة [2] cavan budaq, zoğ; 2) qalıq; 3) yamaq, pinə
- خَلْفِيّ arxa (*sif.*), dal (*sif.*); ~ مصباح (نور) arxa fənər (*işıq*)
- خَلْفِيَّة c. ات - 1) evin dalındakı bağça; 2) arxa plan, fon; 3) nəyinsə gizli, xəlvəti tərəfi
- خَلِيفة c. خُلَفاء 1) canişin; xəlifə; 2) varis; انتخب فلانا خليفةً له kimisə öz varisi seçmək
- خَوالِف c. doğuşarxası ağrılar
- مُتَخَلِّف geridə qalmış; البلاد (البلدان) الـ~ـة sənaye cəhətdən geridə qalmış ölkələr صناعيًا
- مُتَخَلَّفات c. 1) tullantılar, qalıqlar; ~ الماضي keçmişin qalıqları; 2) *hərb.* düşmənin atıb getdiyi sursat
- مُخالِف 1. 1) müxalif, zidd, əks (*nəyə* لـ); uyğun gəlməyən (*nəyə* لـ); qanunu pozan, qeyri-qanuni; ~ صيد brakonyerlik, icazəsiz ov; ~ للوقائع (للحقيقة) gerçəkliyə (*həqiqətə*) uyğun gəlməyən; 2) tərs, sözə baxmayan, ipə-sapa yatmayan; 2. qarşı tərəf
- مُخالَفة c. ات - 1) ziddiyyət; 2) pozma (*qanunu*); qanuna zidd hərəkət; taqsır, günah; 3) sözə baxmama, tərslik
- مُخْتَلَف: ~ عليه mübahisəli
- مُخْتَلِف müxtəlif, fərqli (*nədən* عن)
- مِخْلاف c. مَخالِيف *tar.* mixlaf, vilayət (*Yəməndə*)
- مُخَلَّفات c. irs, miras; kimdənsə-nədənsə qalan şeylər
- مَخْلُوفة c. ات - yəhər (*dəvənin*)

I (خلق) خَلَقَ (u) خَلْق 1) xəlq etmək, yaratmaq; 2) özündən uydurmaq; خَلِقَ (ə) خَلَق *yaxud* خَلُقَ (u) خُلُوق 1) köhnəlmək, dağılmaq, yırtılmaq; خَلُقَ (u) خَلاقة yararlı olmaq (*nəyə* لـ); 2) xas olmaq (*nəyə* بـ); 3) lazım olmaq, gərək olmaq (*kimə* بـ); 4) layiq olmaq (*kimə* بـ); II خَلَّقَ 1) ətirləmək, ətir vurmaq; تـ~ـت المرأة بالخلوق qadın özünə ətir vurdu; 2) ətir çəkmək; 3) birləşdirərək almaq (*məs., dərman preparatlarını*); IV أخْلَقَ geyib köhnəltmək (*paltarı*); ~ جديده təzəsini geyib köhnəltmək, yırtmaq; V تَخَلَّقَ 1) mənəvi keyfiyyətləri mənimsəmək, əxlaq normaları əsasında yetişmək; xasiyyətini dəyişdirmək (*nəyəsə müvafiq olaraq* بـ); ~ باخلاق الاطفال özünü uşaq kimi aparmaq; ~ باخلاق اهل البلد yerli əhalinin əxlaq və rəftarını mənimsəmək; 2) ətirlənmək; ~ بالخلوق ətir vurmaq; 3) acığı tutmaq (*kimə* على); VIII إخْتَلَقَ 1) saxtalaşdırmaq, saxtasını düzəltmək; 2) özündən uydurmaq; böhtan, iftira atmaq (*kimə* على); XII إخْلَوْلَقَ 1) geyilib köhnəlmək, yırtılmaq; 2) *məcaz.* çeynənmiş, bayağı olmaq; 3) ərəfəsində olmaq (*nəyinsə*)
- إخْتِلاق 1) saxtalaşdırma, qurma, düzəltmə; 2) uydurma, yalan, böhtan
- أخْلاقِيّ əxlaqi, mənəvi; الفلسفة الـ~ـة etika; الجرائم الـ~ـة mənəviyyata qarşı cinayətlər; ~ لا əxlaqsız, qeyri-əxlaqi
- أخْلاقِيَّة 1) əxlaqilik, ~ لا əxlaqsızlıq; 2) deontologiya



- أخْلاقِيّات c. əxlaq; mənəviyyat, etika məsələləri
- تَخْلِيق 1) ətirləmə, ətir vurma; 2) ətir çəkmə; ~ جهاز الـ ətirburaxma orqanları (*bitkilərdə*); 3) yaratma, sintezləşdirmə; ~ الـ الضوئي fotosintez
- تَخْلِيقِيّ ətriyyat -i/-ı; صناعة ~ـة ətriyyat sənayesi
- خالِق, خَلاّق : ~ الـ Xaliq, Yaradan
- خَلاق pay, hissə
- خَلاّق yaradıcı, qurucu
- خَلْق 1) xəlqetmə, yaratma; 2) insanlar, xalq; 3) məxluq, yaradılmış; 4) bədən quruluşu, qəddi-qamət
- خَلَق 1. köhnəlmiş; 2. c. أخْلاق, خُلْقان köhnə paltar, köhnə-kürüş, cır-cındır, əski-üskü
- خُلُق, خُلْق c. أخْلاق 1) xasiyyət, rəftar, iradə; ~ الـ قوّة iradə gücü; ~ الـ سوء pis xasiyyət; ~ الـ سيّئ bədxasiyyət; ~ الـ سهل xoşrəftar, mülayim; علم الاخلاق etika; 2) əhval-ruhiyyə; əhval-ruhiyyəni müəyyən edən etik normalar; 3) hirs; ~ـه طلع hirslənmək, acığı tutmaq, özündən çıxmaq; ~ـه طلّع (اخلاقه) hirsini tökmək (*kimin üstünə* في); 4) c. mənəvi keyfiyyətlər; əxlaq; الاخلاق الطيّبة gözəl əxlaq, gözəl əxlaqi sifətlər
- خُلْقانِيّ c. خُلْقانيّة köhnə şeylər alverçisi, köhnə-kürüşçü
- خَلَقة c. خُلْق, خُلْقان köhnə-kürüş, cır-cındır
- خِلْقة c. خِلَق 1) xilqət, təbiət; 2) xarici görkəm, qədd-qamət
- خُلُقِيّ əxlaqi; رجل ذو الصفات الـ~ العالية yüksək əxlaqi keyfiyyətləri olan insan
- خُلُقِيّ hirsli, tündməcaz, tündxasiyyət
- خِلْقِيّ təbii, xilqətlə bağlı, anadangəlmə; ~ عيب anadangəlmə eyib, nöqsan, qüsur
- خُلُقِيَّة əxlaqilik, mənəviyyat
- خَلُوق [1] əxlaqlı, ədəbli, tərbiyəli
- خَلُوق [2] ətirli maddələr, ətir
- خَلِيق c. خُلَقاء yararlı, gərəkli (*nəyə* بـ); layiq (*nəyə* بـ); ... ~ به أن ona gərəkdir ki...; ona yaraşar ki...
- خَلِيقة c. خَلائق 1) məxluq, yaranmış; yaradılış; 2) c. təbiət
- مُخْتَلِق uydurmaçı, qondarmaçı, böhtançı, yalançı
- مُخْتَلَق uydurma, qondarma
- مُخْتَلَقات c. uydurmalar, qondarmalar, iftiralar, böhtanlar
- مَخْلُوق c. مَخْلُوقات, مَخالِيق məxluq, xəlq edilmiş, yaradılmış

خَلْقين c. خَلاقِين mis qazan

خِلّ c. أخْلاّ dost

خَلَنْج 1) süpürgə kolu; 2) xələnc (*oduncağından taxta qablar düzəldilən ağac*); *xalq dil.* təzə şey, işlədilməmiş şey (*Suriya*)
- خَلَنْجان, خُلَنْجان *bot.* xələncan

I (خلو) خَلا [1] (u) خُلُوّ 1) boş olmaq, içində heç bir şeyi olmamaq; 2) tutulmamış olmaq, boşalmaq; 3) nəyisə (من) olmamaq, nədənsə (من) naqis, məhrum olmaq; ~ جيبه من الدرهم والدانق cibində bir qəpiyi olmamaq; هذا لا يخلو من الصحة bu, doğruluqdan məhrum deyildir; 4) keçmək, ötmək, ötüb keçmək (*vaxt haqqında*); خَلا [2] خَلْوة 1) tək, tənha olmaq; 2) təklikdə qalmaq, xəlvətə çəkilmək; ~ بنفسه özü ilə təklikdə qalmaq; məşvərət otağına çəkilmək (*məhkəmə*); 4) özbaşına, köməksiz buraxmaq (*kimi* بـ); II خَلَّى 1) boşaltmaq; 2) buraxmaq; ~ سبيله kimisə azad etmək, buraxmaq; خَلِّ عنك! burax getsin!; خلّيك تخاف! *xalq dil.* burax qorxmağı!; 3) tək buraxmaq;

بينه و بين... ~ kimisə öz bildiyi kimi hərəkət etməyə buraxmaq; 4) təxliyə, evakuasiya etmək; IV أخلى 1) boşaltmaq; 2) azad etmək; سبيله ~ kimisə azad etmək, buraxmaq; طرفه ~ *bax*: طَرَف; مكانا ~ yer boşaltmaq, yer vermək (*kiməsə* لـ); 3) tərk etmək, əl çəkmək; 4) təxliyə, evakuasiya etmək; *hüq*. köçürtmək; V تَخلّى 1) boşalmaq; 2) atmaq, tərk etmək, tək buraxmaq (*kimi-nəyi* عن); 3) olmamaq, mövcud olmamaq (*harada* عن); 4) imtina etmək, geri çəkilmək; dönmək (*nədən* عن); əl çəkmək (*nədən* عن); لم يتخل عن فكرة دخول الجامعة o, universitetə daxil olmaq fikrindən əl çəkmədi; VIII إختلى 1) xəlvətə çəkilmək; təklikdə görüşü olmaq (*kiminlə* بـ); 2) məşvərət otağına çəkilmək (*məhkəmədə*)

- إختلاء təklik, tənhalıq; təklikdə olma, xəlvətə çəkilmə
- إخلاء boşaltma; evakuasiya; *hüq*. köçürtmə
- تَخلّ imtina etmə, dönmə (*nədən* عن)
- تَخلية təxliyə, evakuasiya
- خالٍ *q*. خالية *c*. خُلوّ 1) boş; من الضرر ~ الـ zərərsiz; من الغرض ~ marağı olmayan; qərəzsiz; من البال ~ qayğısız, dərdsiz, fikirsiz; 2) tutulmamış, vakant; من العمل ~ işsiz; 3) *c*. خوالٍ keçmiş, ötən; عصور (قرون) خالية keçmiş dövrlərdə; خوالي الذكريات keçmişlə bağlı xatirələr; في الايّام الخوالي keçmiş vaxtlarda; الوفاض ~ـي qəpiksiz, boş ciblə
- خَلا (*təsir. halda*) istisna olmaqla, başqa; ما ~ istisna olmaqla
- خَلاء 1) boşluq; 2) boş yer; açıq məkan; 3) təklik, tənhalıq, xəlvət; 4) kənd; bağ; كان خلاء من... nəyisə olmamaq, nədənsə naqis olmaq; هو ~ من تلك المعارف onda bu biliklər yoxdur; هو على الـ~ o, acdır, qarnı boşdur; في الـ~ *yaxud* تحت الـ~ açıq havada; بيت الـ~ ayaqyolu
- خُلوّ 1) boşluq; البال ~ qayğısızlıq, dərdsizlik, fikirsizlik; 2) boş yer (*vəzifə*)
- خلو nədənsə boş, azad, nədənsə məhrum (من); هي (هو، هم) ~ من... o qızın (onun, onların) ... yoxdur
- خَلوة *c*. خَلَوات 1) təklik; xəlvət; yeni evlənənlərin xəlvətə çəkilməsi; غرامية ~ görüş; على ~ təklikdə, xəlvətdə; 2) xəlvət, gizli yer; sığınacaq; المتعبّد ~ zahid hücrəsi; 3) soyunmaq otağı (*hamamda*); kabina (*çimənlər üçün*); 4) loja (*teatrda*)
- خَلَويّ kənd -i/-ı; ~ بيت kənd, bag evi; ~ منظر kənd mənzərəsi
- خُلْويّ içiboş (*məs*., *kərpic*)
- خليّ 1) boş, azad; 2) tutulmamış; ... من ~ nədənsə boş, nədənsə naqis, nədənsə məhrum; من الثقافة ~ mədəniyyətsiz; القلب ~ *yaxud* البال ~ qayğısız
- خليّة *c*. خلايا 1) arı təknəsi, arı pətəyi; 2) özək (*təşkilatda*); 3) *biol*. hüceyrə; حيّة ~ canlı hüceyrə; معقّدة ~ mürəkkəb hüceyrə; وحيد الـ~ birhüceyrəli

مخلاة *c*. مَخالٍ torba, kisə

I (خمّ) خَمّ[1] (ə/u) خَمّ süpürmək, süpürüb atmaq, süpürüb təmizləmək; خَمّ[2] (i/u) خُموم iy vermək, iylənmək; kif iyi vermək, pis qoxusu olmaq
- خامّ pis qoxulu, iyli; iylənmiş, kiflənmiş, kif atmış
- خُمّ *c*. أخمام səbət; خم الدجاج toyuqlar üçün səbət; toyuq hini
- خَمّة pis qoxu, pis iy, üfunət, kif iyi
- خامّ = مُخمّ
- مِخَمّة *c*. مَخامّ süpürgə



خمج (ə) خَمَج korlanmaq, iylənmək, kif atmaq

I خَمَد (u) خُمود 1) sakitləşmək, zəifləmək, yavaşımaq; 2) sönmək, keçmək; 3) ümidi kəsilmək, məyus olmaq; II خمّد boğmaq, qabağını almaq, təsirini zəiflətmək (*zərbənin*); IV أخمد 1) sakitləşdirmək; 2) söndürmək (*alovu, susuzluğu*), keçirtmək (*işığı*); 3) boğmaq, əzmək, kəsmək; الهمّة ~ çaşdırmaq, karıxdırmaq; 4) ümidini kəsmək, məyus etmək; VI تخامد tədricən sönmək
- إخماد 1) sakitləşdirmə; 2) söndürmə; 3) boğma, əzmə
- خامد 1) sakit; dinc, hərəkətsiz; 2) sönmüş (*vulkan haqqında*)
- خُمود 1) sönmə; 2) sakitlik, dinclik, hərəkətsizlik
- مُخمِّد *c*. ات - söndürücü, boğucu, zəiflədici

I خَمَر (u) خَمْر 1) örtmək, gizlətmək; 2) qıcqırtmaq; turşutmaq; maya vurmaq (*xəmirə*), acıtmaq; *kim*. qıcqırtmaq, fermentləşdirmək; II خمّر = I; III خامر 1) xəlvətcə girmək, dammaq (*ürəyə şübhə*); bürümək, tutmaq (*gicliyi*); 2) tərk etməmək, düşüb qalmaq (*harada*); البيت ~ evdən bayıra çıxmamaq; IV أخمر ürəyində kin bəsləmək (*kimə* لـ, على); V تخمّر 1) qıcqırmaq (*çaxır*); qalxmaq, turşumaq, acımaq (*xəmir*); 2) başına örtü örtmək, duvaq salmaq; VI تخامر birgə gizli plan qurmaq; bir şeyin qəsdində olmaq; VIII إختمر qıcqırmaq (*çaxır*); qalxmaq, acımaq (*xəmir*); 2) başına örtü örtmək, duvaq salmaq; ت بخمارها ~ o öz baş örtüsünü örtdü; ت الفكرة ~ fikir yarandı
- إختمار qıcqırma, acıma (*xəmirin, çaxırın*)
- تخمّر qıcqırma, acıma (*xəmirin, çaxırın*)
- تخمير maya vurma (*xəmirə*); *kim*. fermentasiya
- تخميريّ qıcqırdıcı, ferment -i/-ı; الصناعة الـ~ـة ferment istehsalı sənayesi
- خمّار şərabsatan, şərabçı
- خُمار xumarlıq, dəmlik
- خِمار *c*. خُمُر, خمارات, أخمرة örtü (*qadınlar üçün*); duvaq
- خَمّارة *c*. ات - şərab dükanı
- خَمْر *q*. bəzən *k*. *c*. خُمور şərab, çaxır; عنبري ~ ənbəri çaxır, liker; الاسلام ~ *məcaz*. (*islam şərabı*) kofe
- خمرجيّ *c*. خمرجيّة şərabsatan, şərab dükanının sahibi
- خَمْرة spirtli içki; şərab
- خِمْرة baş örtüsünü örtmək tərzi
- خَمْريّ 1) şərab -i/-ı; 2) şərab rəngində
- خَمْريّة *c*. ات - xəmriyyə, şərabın vəsfinə həsr olunmuş şer
- خمرجيّ = خمورجيّ *c*. خمورجيّة
- خِمّير 1. şərabxor; çoxiçən; 2. içki düşkünü, əyyaş
- خَمير mayalı çörək
- خَميرة *c*. ات - 1) maya, acıtma; ferment; البيرا ~ *yaxud* الجعة ~ pivə mayası; اللبن ~ a) süd mayası; b) *bot*. qladiolus, qarğasoğanı مرض الـ~ sürmə, pas (*bitkilərdə xəstəlik*); 2) *məcaz*. əsas kapital, pul fondu; 3) nüvə, özək (*nəyinsə*)
- خُمَيْرة *c*. ات - ferment
- مُختمر qalxmış, gəlmiş (*xəmir*)
- مُخَمِّر *c*. ات - ferment
- مَخْمور xumarlanmış, dəmlənmiş; sərxoş, kefli, məst

I خَمَس (u) خَمْس xüms (*beşdə bir miqdarda ayrılan pay*) almaq; II خمّس beş hissəyə bölmək; beşqat, beşkünc etmək; beşə vurmaq (*rəqəmi*)
- خامس beşinci; عشر ~ الـ on beşinci

- خُمَاسَ beş-beş
- خُمَّاس c. خَمَّاسَة məhsulun beşdə birinə işləyən əkinçi
- خُمَاسِيّ 1. beşdən (*beş hissədən*) ibarət olan, beş qat; *qram.* beş samitdən ibarət olan, beş-köklü; المنهج (البرنامج) الـ~ الاول birinci beşillik plan, birinci beşillik; الاصابع ~ beşbarmaq; الزوايا ~ beşbucaqlı; السطوح ~ beşüzlü; 2. 1) *mus.* kvintent; 2) *radio.* pentod; 3) beş, beş ədəd, beş nəfər; beşlik
- خُمَاسِيَّة c. *mus.* kvintalar
- خَمْسَ , خَمْسَة beş; خمس عشرة yaxud خمسة عشر on beş; الـ~ beş vaxt namaz
- خُمْس c. أَخْمَاس beşdə bir hissə (*nəyinsə*); ضرب اخماسا لاسداس a) gümanlar, fərziyyələr qurmaq; b) biclik gəlmək, biclik işlətmək; راجع اخماسه واسداسه öz gümanlarını, fərziyyələrini yoxlamaq
- خِمْس 1) beşgünlük müddət; حمّى الـ~ beş gün ərzində növbələnən titrədib-qızdırma; 2) dəvənin susuz qala bildiyi müddət
- خَمْسُون əlli; احد الخمسين yaxud عيد الخمسين *din.* əllinci gün bayramı
- خَمْسِيّ beşqat, beş dəfə artıq; beş hissədən ibarət; الخطة الـ~ة beşillik plan, beşillik
- خَمْسِين xəmsin (*külək*); أيّام الـ~ xəmsin küləyinin əsdiyi günlər
- خَمْسِينِيّ əlliyə aid olan; əllidən ibarət olan; əlliillik; العيد الـ~ əlliillik yubiley
- خَمِيس *həmç.* يوم الـ~ cümə axşamı; العهد ~ yaxud الفصح ~ *din.* xəmisüləhd, böyük cümə axşamı; الجسد ~ *din.* xəmisülcəsəd, İsanın cəsədi bayramı (*xrist.*); الصعود ~ *din.* göyə çəkilmə bayramı (*xrist.*)
- خَمِيسِيَّة c. ات - həftəlik (*cümə axşamıları verilən həftləik maaş*)
- خَمْسِينَات əllinci illər
- مُخَمَّس beş-beş; جاؤوا ~ onlar beş-beş gəldilər
- مُخَمَّس 1. beşüzlü; 2. 1) *həmç.* الزوايا ~ beşbucaqlı, pentaqram; النجمة الـ~ة beşguşəli ulduz; 2) *ədəb.* pentametr

I خَمَشَ (i) خَمْش qaşımaq, qazımaq, sıyırmaq; cırmaqlamaq
- خُمَاشَة c. ات - cırmaq yeri, cırmaq, sıyrıntı; yüngül yara
- خَمْش c. خُمُوش cırmaq yeri, sıyrıntı

I خَمَصَ (u) خَمْص yaxud خَمَص (ə) خَمْص boş olmaq (*mədə, qarın*)
- أَخْمَص c. أَخَامِص 1) ayağın yerə dəyməyən altı; 2) qundaq; نظر من قمّة رأسه الى ~ قدميه kimisə başdan ayağa qədər, təpədən dırnağa qədər süzmək; هبط قلبه الى اخمصين ürəyi düşdü, bərk qorxdu
- خَمْصَان c. خِمَاص boş; البطن ~ qarnıboş, ac
- خَمِيص: الحشي ~ yaxud البطن ~ ac
- مَخْمَصَة c. مَخَامِص qarnıboşluq; aclıq

I خَمَعَ (ə) خُمُوع azca axsamaq

I خَمَلَ (u) خُمُول adsız-sansız, şöhrətsiz, naməlum olmaq, heç bir şeylə seçilməmək; نكره ~ unudulmaq
- خَامِل c. خَمَلَة 1) süst, cansız, ölüvay, ləng, ətalətli; غاز ~ təsirsiz qaz; 2) əlindən iş gəlməyən, işə can yandırmayan, tənbəl, fəaliyyətsiz, yaratmaz; 3) *həmç.* الذكر ~ adsız-sansız, naməlum, şöhrətsiz, tanınmaz
- خَمْل , خَمْلَة xov; zərif, narın tük; بساط ذو الـ~ xovlu xalça
- خَمَل parazitlər, bit-birə (*toyuqlarda*)
- خَمِل tənbəl, bir işə yaramayan, əlindən iş gəlməyən
- خُمُول 1) süstlük; zəiflik, taqətsizlik; laqeydlik, ölgünlük, maraq göstərməmə (*nəyəsə*); ətalətlilik; 2) fəaliyyətsizlik, yaratmazlıq, tənbəllik, sürünmə; 3) kütlük; depressiya, durğunluq; 4) *həmç.* الذكر ~ naməlumluq
- خَمِيلَة c. خَمَائِل pöhrəlik, kolluq, cəngəllik; sıx meşəlik
- مُخْمَل məxmər
- مُخْمَلِيّ məxmər (*sif.*)

(خمن) II خَمَّنَ 1) təxmin etmək, güman etmək; 2) qiymət qoymaq, qiymətləndirmək
- تَخْمِين 1) təxmin, güman, fərziyyə; على الـ~ təxminən; 2) qiymətqoyma, qiymətləndirmə
- مُخَمِّن kalkulyator; nırxqoyan, məzənnəqoyan, qiymətqoyan

I خَنَّ (ə/i) خَنِين burnunda danışmaq, tın-tın danışmaq
- أَخَنّ q. خَنَّاء c. خُنّ burnunda danışan, tın-tın danışan
- خُنّ c. أَخْنَان səbət; خن الدجاج toyuq səbəti; toyuq hini, toyuq damı; خن الورق qasıq
- خُنَّة , خَنِين burnunda danışma; tın-tın danışma

I خَنُثَ (ə) خَنَث , خُنُوثَة 1) qadın kimi incə, zərif, nərmə-nazik olmaq; 2) özünü qadın kimi aparmaq; II خَنَّثَ qadın kimi nərmə-nazik, zərif etmək; V تَخَنَّثَ qadın kimi incə, zərif, nərmə-nazik olmaq; özünü qadın kimi aparmaq
- خَنِث qadın kimi incə, zərif, nərmə-nazik
- خُنْثَى c. خِنَاث , خَنَاثَى hermafrodit, xonsa
- خُنْثَوِيَّة hermafroditlik, xonsalıq
- خَنْجَر c. خَنَاجِر xəncər; ضربة في الظهر ~ kürəyə vurulan xəncər zərbəsi; ابو ~ *bot.* a) erikgülü, nəstərən çiçəyi; b) güllü vəzəri
- خَنْجَن = خَنّ
- خَنْجَنَة = خُنَّة
- خَنْدَقَ xəndək, səngər qazmaq; تَخَنْدَقَ səngərlənmək, xəndək qazıb daldalanmaq



- خَنْدَق c. خَنَادِق xəndək, səngər
- خَنْدَقَة qazıma
- مُخَنْدَق xəndəyə girmiş, xəndəkdə basdırılmış

خِنْذِيذ c. خَنَاذِيذ gözəl natiq

خَنْزَاب c. خَنَازِيب yaxud خِنْزَب c. خَنَازِب iblis, şeytan

خَنْزَوَانَة , خُنْزُوَان iftixar, vüqar, məğrurluq

خِنْزِير c. خَنَازِير donuz; الارض ~ qarışqayeyən; البحر ~ dəniz donuzu; delfin; برّي ~ qaban, çöldonuzu; الهند ~ hind donuzu; لحم الـ~ donuz əti; المقدد الـ~ bekon; فخذ الـ~ المملح hisə verilmiş donuz budu; داء الخنازير *tibb.* xənazir, sıraca xəstəliyi
- خِنْزِيرَة c. ات - donuz (*dişi*)
- خَنَازِيرِيّ *tibb.* xənazir, sıraca xəstəliyi
- خَنْزَرَة c. ات - daşsındıran, daşqıran çəkic

I خَنَسَ (i) خُنُوس geri çəkilmək, uzaqlaşmaq, gizlənmək
- أَخْنَس q. خَنْسَاء c. خُنْس fındıqburun
- خَنَّاس geri çəkilən (*Allahın adını çəkəndə*); الـ~ şeytan
- خُنَّس planetlər

خَنْشَار *bot.* ayıdöşəyi, qıjı

خِنْصَر , خُنْصُر c. خَنَاصِر çeçələ barmaq; العروس ~ *bot.* çölnoxudu ... عقد الخناصر على ...üçün qüvvələrin birləşdirilməsi; عقد ~ ه بـ ~ ه kiminləsə birləşmək

I خَنَعَ (ə) خُنُوع tabe olmaq, itaət etmək, boyun əymək (*kimə* لـ); alçalmaq (*kiminsə qarşısında* لـ)
- خَانِع tabe olan; itaətkar; həqir, zəlil; موجات ~ة ağır dalğalar
- خُنُوع tabe olma, itaətkarlıq; həqirlik, zəlillik

I خَنَفَ (u) خَنْف = خَنّ
- أَخْنَف q. خَنْفَاء c. خُنْف = أَخَنّ bax: خنّ

- خَنِيف c. خُنُف giş, qalın kətan

خَنْفَرَ fısıldamaq

- خَنْفَرَة fısıldama

خُنْفُس , خُنْفَسَاء topl. peyinqurdu

- خُنْفُسَة c. خَنَافِس peyinqurdu

I خَنَقَ (u) خَنْق boğmaq, əzmək, basmaq; خنقتها العبرات göz yaşları onu boğurdu; ~ الراية bayrağı aşağı salmaq; II خَنَّقَ bir-bir boğmaq; tüstüyə vermək (*məs., ipəkqurd-larını baramada*); III خَانَقَ dalaşmaq, savaşmaq; məzəmmət etmək; VI تَخَانَقَ bir-birilə dalaşmaq, savaşmaq, söyüşmək; VII إِنْخَنَقَ boğulmaq, təngnəfəs olmaq; VIII إِخْتَنَقَ 1) boğulmaq (*tüstüdən*), boğulmuş olmaq; özünü boğmaq; ~ مبتلعا لقمة boğazında tikə qalmaq; ~ ـت الكلمات في حلقه sözlər boğazında ilişib qaldı; 2) boğaza qədər doldurulmaq, tıxanmaq (*nə ilə* بـ)

- إِخْتِنَاق 1) boğulma; 2) asfiksiya, təngnəfəslik, nəfəs tutulması, təngişmə

- خَانِق I. 1) boğucu; ~ الـ الغاز boğucu qaz; 2) bürkülü, boğanaq; ~ هواء boğanaq hava; 2. c. خوانق 1) dərə, 2) *el.* drossel; ~ الذئب *bot.* qurd kökü, akonit; ~ الكلب *bot.* novruzgülü, dazı; ~ النمر *bot.* dağ öküzgözüsü

- خَانُوق difteriya

- خُنَاق 1) difteriya; ~ الـ العشاقي angina, boğaz gəlməsi; 2) qançürüklüyü; ~ الخيل saqqo (*cavan atlarda olan yoluxucu xəstəlik*); ~ الطيور dilçək xəstəliyi

- خَنَّاق boğucu; boğan; ~ الغازات الـ boğucu qazlar

- خُنَاقَة c. ـات - dava-dalaş, söyüşmə

- خَنْق boğma, boğulma; ~ الانوار işıqları keçirmə

- خُنُقَة c. خُنَق: ~ اليد bilək

- خَنِيق boğulmuş

- مَخْنَق c. مَخَانِق 1) tüstüxana (*ipəkqurdu baramaları üçün*); 2) boğaz

- مِخْنَقَة c. ـات - boyunbağı, həmayil

- مَخْنُوق 1) boğulmuş; 2) boğuq; ~ صوت خافت sakit, boğuq səslə

I (خنو) خنا (u) خَنْو , خَنَا = خني

خِنَّوْص c. خَنَانِيص donuz balası, donuz potası, çoşqa

I خني (ə) خَنًى ədəbsiz danışmaq; IV أَخْنَى 1) ədəbsiz danışmaq; ədəbsizlik etmək, 2) məhv etmək, öldürmək (*kimi* على); amansız rəftar etmək, amansız olmaq (*kimə* على); ~ عليه الدهر yaxud اخنت عليه السنون zaman onu qocaltdı; ~ عليه الدهر بكلكله tale ona amansız oldu

- خَنًا 1) ədəbsizlik; 2) pozğunluq, fahişəlik, ~ دار الـ fahişəxana

- خَنَى = خنا

- خَوَاجَة c. ـات , خواجا - ağa, cənab (*avropalılara müraciət edərkən*)

- خُوجَة c. ـات - müəllim, xoca

(خوج) II خَوَّجَ çürümək, xarab olmaq

- خَوْخ *topl.* şaftalı, hulu (*Misir*); gavalı (*Suriya*)

- خَوْخَة c. ـات - 1) şaftalı; gavalı; 2) dəlik;



I (خور) خَارَ [1] (u) خُوَار böyürmək, movuldamaq; خَارَ [2] (u) خُؤُور yaxud خَوِرَ (ə) خَوَر zəifləmək; haldan düşmək, yorulmaq; ~ ـت عزيمته o, ruhdan düşdü; ~ ـت قواه o, gücdən düşdü

- خَائِر zəif, gücsüz; ~ القوى taqətdən düşmüş

- خُوَار böyürmə, movuldama

- خَوَّار 1) zəif, gücsüz; 2) zəif iradəli

- خَوْر c. أَخْوَار 1) çayın qurumuş yatağı; vadi; 2) körfəz; çay ağzı, mənsəb

- خَوَر 1) üzgünlük, yorğunluq, zəiflik; 2) qeyri-sabitlik (*əxlaqi*); ruh düşkünlüyü

خُورَس xor

خُورِي c. خَوَارِنَة keşiş

خَوْزَقَ payaya keçirtmək

- خَوْزَقَة payaya keçirtmə

- مُخَوْزَق payaya keçirilmiş; ~ الـ يشتم السلطان *məsəl.* islanmışın yağışdan nə ar! (*hərf.* payaya keçirilmiş adam sultanı söyər)

خَوْشَق sarğı kağızı

I خوص (ə) خَوَص çuxura düşmüş gözləri olmaq; II خَوَّصَ metalla örtmək; III خَاوَصَ gözlərini qıyaraq baxmaq

- أَخْوَص q. خَوْصَاء c. خُوص qıyıqgöz, çuxurgöz

- خَوَّاص 1) xurma yarpağı satan, 2) hörücü, toxuyucu (*xurma yarpaqlarından həsir, səbət və s.*)

- خُوص *topl.* xurma yarpağı; ~ بردي *bot.* papirus; ~ برنيطة həsir şlyapa

- خُوصَة c. ـات - 1) xurma yarpağı, 2) *memar.* təpəcik, kəmərcik

qızğın yerinə baş vurmaq; ~ غمار السياسة siyasət burulğanına baş vurmaq; II خَوَّضَ dayaz yerdən keçmək

- خَوْض 1) keçmə, dayaz yerdən keçid; 2) girişmə, baş vurma (*nəyə* في); aparma (*məs., söhbət, döyüş və s.*)

- مَخَاضَة c. مَخَاضَات , مَخَاوِض çay keçidi, dayaz yer, bərə

- مِخْوَض yumurta və s. çalmaq üçün ucu yaylı alət

I (خوف) خَافَ (ə) خَوْف qorxmaq (*nədən-kimdən* من); ürkmək, qorxaqlıq göstərmək, xoflanmaq; ehtiyat etmək (*nədən-kimdən* على); يخاف الله Allahdan qorxan, ürəyində Allah qorxusu olan, II خَوَّفَ qorxutmaq; IV أَخَافَ qorxutmaq, qorxu gəlmək; V تَخَوَّفَ qorxmaq, ehtiyat etmək

- إِخَافَة qorxutma, qorxu gəlmə, ürkütmə

- تَخْوِيف qorxutma, qorxu gəlmə

- خَائِف qorxan, ehtiyat edən (*kimin üçün, nə üçün* على); qorxaq, qorxacaq, xoflu

- خَوَّاف qorxaq, qorxacaq, xoflu

- خَوْف qorxu; ehtiyatlanma; ~ مع الحرج والـ əsə-əsə, qorxa-qorxa; ~ من ـــ ...dan-dən qorxaraq, qorxudan

- خَوِيف qorxaq, qorxacaq

- خِيفَة qorxu, xof; خيفة qorxaraq, ehtiyat edərək

- مَخَافَة c. مخاوف qorxu, ürkü, xof, ehtiyat; لطير مخافة ان... ehtiyat edərək ki...; ...من nə barədəsə qorxusunu ifadə etmək

- مُخَوِّف qorxulu, qorxunc; təhlükəli (*yol*)

- مُخِيف ürəyə qorxu salan, qorxunc, dəhşətli

(خول) II خَوَّلَ haqq vermək; icazə vermək

- خَال c. أَخْوَال , خُؤُول , خُؤُولَة dayı

- خَالَة c. خَالَات xala

1) savaşma, dalaşma; 2) ip, ilgək; 3) in. ilgək ... a (*boyuna keçirmək üçün*); ~ اخذ بالـ boğmaq; boğazından yapışmaq; ... axa; ~ ضيق الـ boğulan, təngnəfəs; ضيق ... ~ عليه *məcaz.* a) yaxasından yapışmaq, ...şdırmaq, qısnamaq; b) basmaq, əzmək, ...vıq göstərmək; 4) xalta, boyunluq

keçid; pəncərə; qapıcıq (*böyük qapıda*); ~ السقف tavanda dəlik; dam pəncərəsi, baca; ~ القنطرة şlüz

خُوذَ c. خُوَذ , خُوذَات gənc qız

خُوذَة c. خُوَذ , خُوذَات tasgülah, dəbilqə, dəmir papaq

I (خوض) خَاضَ (u) خَوْض , خِيَاض 1) keçmək, çayı dayaz yerdən keçmək; 2) girmək, girişmək (*nəyə tas. hal və ya* في); ~ في البحث mühakimə yürütməyə başlamaq; ~ كفاحا (نضالا) şiddətli mübarizəyə girişmək; ~ المعركة بائسا (غمار الحرب) döyüşə girişmək; döyüşün ən

- خُؤُولَةٌ qohumluq (*dayı və xala tərəfdən*)
- خَوَلٌ [1] 1) qullar; 2) mal-qara
- خَوَلٌ [2] *c.* خَوَلاتٌ rəqqas (*qadın paltarında*)
- خَوَلِيٌّ *c.* خَوَلٌ 1) tarla gözətçisi; bağban; 2) ustabaşı; onbaşı

I (خون) خَانَ (u) خِيَانَةٌ , خَوْنٌ 1) xain olmaq; xəyanət etmək (*kimsə*); vəfasızlıq etmək; خانته الذاكرة yaddaşı onu aldatdı; خانته رجلاه ayaqları vəfasızlıq etdi; 2) aldatmaq; 3) vəfa etməmək, yerinə yetirməmək; لا يخون عهدا o, əhdə vəfasızlıq etməz; II خَوَّنَ 1) vəfasızlıqda, xəyanətdə, satqınlıqda günahlandırmaq; 2) etibar etmək, şübhələnmək; V تَخَوَّنَ 1) satqınlıq etmək, xainlik etmək; 2) zəiflətmək; zərər yetirmək, ziyan vurmaq (*səhhətinə*); لا تتخونه علة o xəstələnmir; VIII إِخْتَانَ aldatmaq, vəfasızlıq etmək; X إِسْتَخْوَنَ etibar etməmək (*kimsə*), şübhə etmək (*kiminsə vəfalılığına*)

- خَائِنٌ *c.* خَوَنَةٌ xain, satqın; *məsəl.* الـ~ خائف xain adam xoflu olar
- خَوَّانٌ , خَؤُونٌ xain, xəyanətkar, satqın
- خِوَانٌ ، خُوَانٌ *c.* أَخْوِنَةٌ masa; yemək masası
- خَوْنٌ xainlik, vəfasızlıq, satqınlıq
- خِيَانَةٌ xəyanət, satqınlıq, vəfasızlıq; الـ~ العظمى *yaxud* الـ~ الدولة *yaxud* ~ الوطنيّة vətənə xəyanət; ~ الامانة əmanətə xəyanət
- خِيَلِيٌّ xain, xəyanətkar, vəfasız, əhdi pozan

خُوَّةٌ *bax:* اخو

I خَوِيَ (i) خَوَاءٌ *yaxud* خَوِيَ (ə) خَوًى 1) boş, çılpaq olmaq; 2) ac olmaq

- تَخْوِيَةٌ *geol.* deflyasiya (*süxurların aşınması*)
- خَاوٍ *q.* خَاوِيَةٌ 1) boş, çılpaq; 2) ac; خاوي الحيلة bir köməyi olmayan, çarəsiz, çıxış yolu tapa bilməyən; خاوي الوفاض cibində bir qəpiyi olmayan, cibiboş
- خَوَاءٌ , خَوًى , خُوِيٌّ 1) boşluq; 2) aclıq

خَيَّةٌ *bax: əlifba sırası ilə*

I (خيب) خَابَ (i) خَيْبَةٌ doğrulmamaq (*ümid*), yerinə yetməmək, puça çıxmaq; uğursuzluğa düçar olmaq (*nədə* في); yanılmaq, səhv etmək (*nədə* في); II خَيَّبَ 1) məyus etmək, puça çıxartmaq (*ümidləri*); 2) rədd etmək (*xahişi*)

- خَائِبٌ uğursuz, puç, məyusluq gətirən
- خَيْبَةٌ 1) ümidsizlik; *həmç.* ~ الامل ümidin puça çıxması; أثار ~ أمله kimisə məyus etmək; kiminsə ümidini puça çıxartmaq; اصيب بـ~ الامل ümidsizliyə qapılmaq, ümidini itirmək (*nədə* في); 2) səhv, yanlışlıq, uğursuzluq; باء بـ~ uğursuzluğa məruz qalmaq

I (خير) خَارَ (i) خَيْرٌ seçmək; üstünlük vermək; II خَيَّرَ 1) seçim imkanı vermək, seçdirmək; 2) üstünlük vermək, seçmək (*nəyi* على); III خَايَرَ seçkisinə buraxmaq, seçməyə imkan vermək; V تَخَيَّرَ seçmək, üstünlük vermək (*nəyə nə ilə müqayisədə* على); üstün tutmaq (*nəyi nədən* على); VIII إِخْتَارَ = V; ~ه الله جواره (لجواره) o öldü; X إِسْتَخَارَ istixarə etmək, Allahdan xeyir-bərəkət diləmək; ~ بالمصحف Quranla istixarə etmək; ~ بالسُّبحة təsbehlə istixarə etmək

- إِخْتِيَارٌ 1) seçim, seçki; *fəls.* iradə azadlığı; حرّية الـ~ seçim azadlığı; حق الـ~ optasiya, başqa dövlətin vətəndaşlığına keçmək hüququ; وضعه في موضع الـ~ بين... و بين... kimisə nə ilə nə arasındasa seçim qarşısında qoymaq; ~ طبيعي *biol.* təbii seçim; 2) xoş məram; könüllülük; ا~ könüllü olaraq, öz könlü, ixtiyarı ilə; رجل ~ ixtiyar qoca
- إِخْتِيَارِيٌّ 1) ixtiyari, könüllü, qeyri-məcburi; ا~ ixtiyari olaraq; 2) fakültativ



- إِسْتِخَارَةٌ istixarə (*Quranla, təsbehlə*)
- تَخَيُّرٌ 1) seçmə, seçmə qabiliyyəti; دقيق الـ~ *rad.* dəqiq seçmə, tutma qabiliyyəti; دقّة الـ~ *rad.* seçmə, tutma qabiliyyəti; 2) seleksiya
- خِيَارٌ [1] 1) seçmə; seçki, seçim; ليس لدينا مجال للـ~ bizim seçimimiz yoxdur; لم يكن امامنا ~ seçimimiz yox idi; انه امام خيارين لا ثالث لهما: اما ان... و اما ان... o, ikisindən birini seçməlidir: ya..., ya da...; seçmə, ən yaxşı
- خِيَارٌ [2] *topl.* xiyar; ~ قثّة tutulmuş tər xiyar; ~ شنبر *bot.* a) Çin darçını, kassiya, sənə; b) qınlı kassiya
- خِيَارَةٌ *c.* ات - xiyar
- خَيْرٌ *c.* أَخْيَارٌ , خِيَارٌ 1. 1) yaxşı, gözəl, üstün; كان بـ~ yaxşı olmaq; انتهى على ~ yaxşı qurtarmaq; 2) daha yaxşı; ən yaxşı; هو ~ منها o ondan yaxşıdır; على ~ وجه ən gözəl tərzdə; و من الـ~ ان... daha yaxşı olar ki...; خير لنا الآ ان... bizim üçün daha yaxşı olar ki, ... olmasın; ~ الناس انفعهم للناس insanların ən yaxşısı insanlara daha faydalı olanıdır; والـ~ كل الـ~ في ان... ən yaxşısı odur ki...; رحّب بهم ~ ترحيب o onları olduqca xoş salamladı; 2. xeyir, yaxşılıq, fayda; الـ~ العامّ ümumi rifah; اهل الـ~ yaxşı insanlar; صباح الـ~ sabahın xeyir!; كثّر الله ~ك çox sağ ol! (*yaxşılıq müqabilində təşəkkür*: Allah yaxşı işlərini daha artıq eləsin!; *xalq dil.* كتّر خيرك)
- خَيِّرٌ xeyir, yaxşı, xeyirxah
- خَيْرَةٌ yaxşılıq, xeyirxahlıq
- خَيْرَاتٌ *c.* 1) yaxşılıq, sərvət; təbii sərvətlər; ~ البلاد الطبيعية ölkənin təbii sərvətləri; 2) əmlak; 3) xeyrat
- خِيرَةٌ , خِيَرَةٌ 1) seçim, seçki; 2) seçmə, ən yaxşı
- خَيْرُونَ *c.* yaxşı insanlar, yaxşılıq edənlər, xeyriyyəçilər
- خِيرِيٌّ *bot.* şəbbü (*çiçəyi*); ~ أصفر şəbbü (*gülü*)
- خَيْرِيٌّ xeyriyyə -i/-ı; جمعية ~ـة xeyriyyə cəmiyyəti
- خَيْرِيَّةٌ xeyriyyəçilik
- مُتَخَيَّرٌ seçmə, ən zərif, nəfis
- مُخْتَارٌ [1] 1) seçilmiş; المكان الـ~ sevimli, çox xoşlanılan yer; 2) muxtar; seçimi olan; ا~ könüllü olaraq
- مُخْتَارٌ [2] *c.* مَخَاتِيرُ kəndxuda
- مُخْتَارَاتٌ *c. ədəb.* seçilmiş əsərlər
- مَخْتَرَةٌ kəndxudanın olduğu yer; دار الـ~ kəndxudanın idarəsi
- مُخَيَّرٌ seçki hüququ olan; ا~ könüllü olaraq; *fəls.* iradə azadlığı olan

خَيْزُرَانٌ *topl.* hind qamışı; bambuk

- خَيْزُرَانَةٌ *c.* ات - 1) qamış, qarğı; 2) çubuq, əl ağacı

I (خيس) خَاسَ (i) خَيْسٌ üstündə durmamaq (*sözünün*); ميزان لا يشيل ولا يخيس dəqiq tərəzi

- خِيسٌ *c.* أَخْيَاسٌ yuva (*vəhşi heyvanın*)

(خيش) II خَيَّشَ qızılla naxış tikmək, naxış getmək

- خَيْشٌ giş, cod kətan, parusin
- خَيْشَةٌ *c.* ات - 1) giş, cod kətan, parusin parçası; 2) bədəvi çadırı; 3) kisə, xaşa, xaral
- مُخَيِّشٌ zərxara

خَيْشُومٌ *c.* خَيَاشِيمُ 1) burun; burun deşiyi; 2) qəlsəmə

I (خيط) خَاطَ (i) خِيَاطَةٌ tikmək; خاط الجرّاح الجراح cərrah yaranı tikdi; II خَيَّطَ = I; V تَخَيَّطَ tikilmək

- خَائِطٌ dərzi
- خَائِطَةٌ *c.* ات - dərzi qadın
- خُيَيْطَةٌ *c.* ات - kiçik lif, tel
- خِيَاطٌ iynə

- خَيَّاط dərzi
- خَيَّاطَة c. اتَ - dərzi qadın, tikişçi qadın; ~ آلَة tikiş maşını
- خِيَاطَة tikiş; dərzilik; ماكينة (مكنة) الـ~ (بالرجل، باليد، بالموتور) tikiş maşını (*ayaqla, əllə, motorla*)
- خَيْط c. خُيُوط , خُيُوطَة , أَخْيَاط 1) iplik; lif, tel; الخيوط الاصطناعيّة التركيبيّة sintetik süni lif; 2) sap; qaytan; fitil; اشعال البارود ~ Bikford fitili; الصنارة ~ tilov ipi; القنب ~ viş, ip; بكرة الـ~ sap çarxı; الشاغول ~ *yaxud* البَنَّاء ~ şaqul; باطل ~ hörümçək toru; حيك خيوط المؤامرة sui-qəsd toru qorumaq; الابيض الـ~ *yaxud* مع اول خيط الفجر الاول sübhün ilk işartıları; خيوط النهار sübh tezdən; الاسود الـ~ gecənin zülməti; أمل ~ ümid işartısı
- خَيْط c. خِيطَان dəstə, qatar (*dəvəquşu, çəyirtkə*)
- خَيْطِيّ sap -i/-ı; sapdan toxunmuş
- خُيَيْط c. اتَ - nazik lif, tel, sap
- مَخِيط , مُخَيَّط tikilmiş
- مِخْيَط = خِيَاط
- مِخْيَطَة c. اتَ - tikiş maşını

(خيف) II خَيَّفَ uzaqlaşmaq, çıxıb getmək (*haradan* عن)
- أَخْيَاف 1) müxtəlif mənşəli (*insanlar*); 2) bir anadan, ayrı-ayrı atalardan; إخوة ~ qarın-

lında təsəvvür etmək, xəyala gətirmək; xəyal etmək, düşünmək VI تَخَايَلَ 1) özündən bədgüman olmaq; özü haqqında yüksək fikirdə olmaq; 2) görünmək, xəyala gəlmək (*göz önünə* بعينيه); ağlına gəlmək (*fikir*); VIII إِخْتَالَ = VI
- إِخْتِيَال lovğalıq, təşəxxüs, təkəbbür, özü haqqında yüksək fikirdə olma
- أَخْيَل [1] lovğa, təşəxxüslü, təkəbbürlü, özü haqqında yüksək fikirdə olan
- أَخْيَل [2] c. أَخَايِل 1) göyçəqarğa; 2) yaşıl ağacdələn
- تَخَيُّل təxəyyül, təsəvvürdə canlandırma
- تَخَيُّلَات c.: ادبيّة ~ ədəbi obrazlar
- تَخَيُّلِيّ xəyali
- خَال özündənrazılıq, özündən bədgümanlıq, özü haqqında yüksək fikirdə olma
- خَيَال c. أَخْيِلَة 1) xəyal, təxəyyül, fantaziya; arzu; utopiya; ركب متن الـ~ xəyal atına minmək, xəyallara qapılmaq; 2) kölgə; siluet; əks; kabus, görüntü; 3) الظل ~ Çin kölgələri; 4) uyuq, qorxuluq
- خَيَّال c. خَيَّالَة [1] minikli, atlı, süvari
- خَيَّالَة [2] süvari qoşun
- خَيَالَة c. اتَ - 1) kölgə; siluet; 2) kino; خيالات في النظر gözə görünən görüntülər



- خَيْلُولَة 1) təxəyyül; 2) özündən bədgümanlıq, özü haqqında yüksək fikirdə olma
- خَيْلِيّ atlı, at -i/-ı
- مُخْتَال lovğa, təşəxxüslü, təkəbbürlü, özünüöyən
- مَخِيلَة c. مَخَايِل , مَخَائِل 1) keyfiyyət, ləyaqət; dəyər, qiymət; 2) əlamət, nişan; مخايل الاهتياج həyəcan əlamətləri
- مُخَيِّلَة xəyal, təxəyyül, fantaziya; هذا من ابتداع ~ـه bu onun təxəyyülünün məhsuludur

(خيم) II خَيَّمَ 1) xeymə, çadır qurmaq; xeymədə, çadırda yaşamaq; 2) çökmək (*sakitlik, qaranlıq*); örtmək, bürümək (*nəyi* على); اليأس في روحه ~ *məcaz.* onu məyusluq bürüdü; V تَخَيَّمَ xeymə, çadır qurmaq; düşərgə salmaq
- خَيَّام xeymədüzəldən, xeymə, çadır ustası
- خِيم 1) meyil; 2) qabiliyyət, təbiət, xarakter; 3) niyyət; أخذ ~ـه kimisə imtahana çəkmək
- خَيْمَة c. خِيَام , خِيَم xeymə, çadır; pavilyon; talvar
- خَيْمِيّ c. خَيْمِيَّة = خِيَام
- مُخَيَّم c. اتَ - düşərgə

خَيْنَة c. اتَ - kəmənd, tələ, cələ, duzaq

mək, özündən

- خَيَالِيّ 1) kölgə -i/-ı; المسرح الـ~ kölgə teatrı, qaragöz; 2) kölgə teatrının artisti

**د**

د (دَال) dəl (*ərəb əlifbasının səkkizinci hərfi; rəqəm mənası 4*)

د الدكتور *sözünün qısaldılmış forması*

دا *xalq dil.* bu (*kişi c.*); دي bu (*qadın c.*)

دَاءٌ *bax:* دوا

دَاتُورَةٌ *bot.* tatla, dəli bəng (*zəhərli bitki*), bihuşdarı

دَادَى dayəlik etmək; uşağa baxmaq; əzizləmək (*uşağı*)

دَادَةٌ *c.* ات - dayə; tərbiyəçi; mürəbbiyə

دَارْوِينِيٌّ darvinçi, darvinist; ـة~ الـ darvinizm

دَاغٌ *c.* ات - dağ, damğa

دَالْ delta; النهر ~ çayın deltası

دَالِيَا *bot.* georgin

دَامَا dama (*oyun*); لوحة الـ~ dama taxtası; dama qutusu; حجر الـ~ dama daşı; ~ صلع daş damaya keçdi

دَانٌ iri mirvari dənəsi

دَانَةٌ *c.* ات - qumbara, mərmi, güllə

دَانِقٌ *bax:* دنق

دَانِمَرْكِيٌّ 1. Danimarka -i/-ı; ـة~ الـ Danimarka dili; حركات ~ـة idman gimnastikası; 2. danimarkalı

دَانِيَال *xüs. ad k.* Daniil

دَاوُدُ *yaxud* دَاوُودُ *xüs. ad k.* Davud

دَايَةٌ mamaça; dayə (*xəstəxanada*)

I دَأَبَ (ə) دَأْبٌ , دُؤُوبٌ çalışmaq; səylə işləmək; səy göstərmək (*nədə* في)

دَائِبٌ 1) çalışqan, səylə işləyən; 2) qeyrətli, işə can yandıran; ardıcıl; ـان~ الـ *tasn.* gecə ilə gündüz

- دَأْبٌ 1) səy, çalışqanlıq; ~بـ səylə; çalışqanlıqla; ardıcıl olaraq; 2) vərdiş; adət; xüsusiyyət; ~ـه السكر içməyə adət edib; işi-peşəsi sərxoşluqdur

- دَأْبٌ səy, çalışqanlıq

- دَؤُوبٌ çalışqan, əməksevər, səy göstərən

- دَئِبٌ = دَائِبٌ

دَأْدَاءٌ zil qaranlıq (*gecə haqqında*)

I دَبَّ (ə/i) دَبِيبٌ 1) sürünmək; iməkləmək; دب في احشائها qarnında tərpənmək (*uşaq anasının qarnında*); 2) yavaş-yavaş hərəkət etmək; كل من هب و دب *bax:* هَبَّ; 3) nüfuz etmək (*hara* في); دب في نفسه kimisə bürümək, kiminsə qəlbinə girmək (*hiss, şübhə və s.*); 4) döyəcləmək, vurmaq; دب على صدره sinəsinə vurmaq; II دَبَّبَ itiləmək, yonmaq

- دَابٌّ sürünən

- دَابَّةٌ *c.* دَوَابُّ heyvan, dördayaqlı; minik heyvanı; *c.* iş heyvanı; الارض ~ *zool.* termit, ağ qarışqa

- دُبٌّ *c.* دِبَبَةٌ ayı; الابيض ~ الـ *yaxud* القطبي ~ الـ ağ ayı; البحر ~ dəniz pişiyi; الاكبر ~ الـ *astr.* Böyük Ayı bürcü; رجل الدب *bot.* ayıpəncəsi; شجرة الـ~ *bot.* yemişan

- دَبَّابٌ sürünən

- دَبَّابَةٌ *c.* ات - 1) tank; zirehli avtomobil; ثقيلة ~ ağır tank; 2) dəbbabə (*qədimdə şəhərlərin mühasirəsində istifadə olunan dəzgah*)

- دُبَّةٌ *c.* دِبَابٌ təpə, qum təpəsi

- دُبَّةٌ *c.* ات - dişi ayı

- دُبِّيٌّ ayı (*sif.*)

- دُوَيْبَةٌ , دُوَيْبَّةٌ *c.* ات - xırda heyvan

- دَبِيبٌ sürünən

- مَدَبٌّ *c.* مَدَابُّ su yatağı, suyun yolu; məcra

- مُدَبَّبٌ itilənmiş; iti, sivri; الذقن ~ sivriçənə, çənəsi sivri; الانف ~ sivriburun

دُبَّاخٌ atlanbac (*oyun*)

I دَبَجَ (u) دَبْجٌ 1) bəzəmək; 2) gözəl, obrazlı dildə yazmaq; II دَبَّجَ 1) bəzəmək; bər-bəzək vurmaq; 2) tərtib etmək, təlif etmək; quraşdırmaq; 3) gözəl, obrazlı dildə yazmaq



- دِيبَاجٌ ipək; zərxara

- دِيبَاجَةٌ *c.* ات - 1) dibaçə, obrazlı dildə yazılmış müqəddimə; kitabın naxışlarla bəzədilmiş ilk səhifələrindən biri; 2) *ədəb.* üslub; 3) *məcaz.* üz, sifət, sir-sifət

- مُدَبَّجٌ 1) bəzənmiş, bər-bəzəkli; 2) obrazlı dildə yazılmış

- دَبْدَبَ 1) ayaqlarını yerə vurmaq, tappıldatmaq, ayaq döymək; 2) itiləmək

- دَبْدَبَةٌ 1) ayaqlarını yerə döymə, tappıldatma; 2) itiləmə

- دَبُّوبَةٌ *c.* دَبَادِيبُ iti tərəf; uc; ağız, tiyə

I دَبَرَ (u) دُبُورٌ 1) arxa çevirmək (*kimə-nəyə*); 2) çıxıb getmək, geri çəkilmək; 3) keçmək (*vaxt*); II دَبَّرَ 1) tədbir görmək; əvvəlcədən hazırlamaq; idarə etmək; aparmaq (*təsərrüfatı*); ...لامره بحيث ~ o, işini elə qurdu ki, ...; 2) fikirləşmək, tədbir tökmək; əncam çəkmək; iş qurmaq; تهمة ~ uydurma ittiham irəli sürmək; مكيدة ~ hiylə qurmaq, tələ qurmaq; III دَابَرَ mübarizə aparmaq; müqavimət göstərmək; IV أَدْبَرَ arxa çevirmək (*kimə-nəyə*); geri çəkilmək, çıxıb getmək (*haradan* عن); V تَدَبَّرَ 1) fikirləşmək, tədbir tökmək; nəzərdən keçirmək; 2) tədbirli olmaq; tədbirlə hərəkət etmək; في النفقة ~ qənaət etmək; VI تَدَابَرَ bir-birilə ədavət aparmaq, düşmənçilik etmək, razılaşmamaq; X إِسْتَدْبَرَ 1) arxa çevirmək (*kimə-nəyə*); üz döndərmək; 2) geri çəkilmək; هاربا ~ dönüb qaçmaq

- إِدْبَارٌ geri çəkilmə, çıxıb getmə

- تَدْبِيرٌ *c.* تَدَابِيرُ 1) tədbir tökmə; idarə etmə; aparma (*məs., təsərrüfatı*); المنزلي ~ الـ ev təsərrüfatı; 2) qənaətcillik; 3) tədbir; تدابير الحيطة ehtiyat tədbirləri; ... لـ اتّخذ التدابير ...üçün tədbirlər görmək

- دَابِرٌ 1. 1) axırıncı; 2) keçən, ötən; ذهب كأمس ~ *məcaz.* yox olmaq, itmək; 2. *c.* دَوَابِرُ 1) qalıq; قطع ~ هم onların kökünü kəsmək; 2) kök

- دَابِرَةٌ *c.* دَوَابِرُ mahmız (*quşlarda*)

- دُبَارَةٌ 1) qaytan, bağ, ip; 2) hiylə, kələk, biclik, fənd

- دُبْرٌ , دُبُرٌ *c.* أَدْبَارٌ 1) arxa, ard, dal, arxa hissə; من ~ arxadan; في ~ه arxasınca; 2) sağrı, yan; ولى ~ه dönüb qaçmaq; ولى الادبار geri çəkilmək, qaçmaq; القى ~ اذنيه بنصائح nəsihətləri qulaqardına vurmaq

- دَبَرَانٌ: ~ الـ *astr.* Aldebaran

- دَبْرٌ *c.* أَدْبُرٌ , دُبُورٌ arı beçəsi

- دَبْرَةٌ [1] arı; eşşəkarısı

- دَبْرَةٌ [2] *c.* دِبَارٌ məğlubiyyət; baxtın dönüklüyü

- دَبَرِيٌّ axırıncı; sonrakı; gecikmiş, yubanmış; رأي ~ sonrakı fikir

- دَبُورٌ qərb küləyi

- دَبُّورٌ *c.* دَبَابِيرُ 1) arı; eşşəkarısı; 2) ulduzcuq (*fərqlənmə nişanı*)

- دَبُّورَةٌ 1) çəkic (*daşyonan*); فرقة الـ~ qayalıqlarda partlatma işləri aparan fəhlə briqadası; 2) ulduzcuq (*fərqlənmə nişanı*)

- دَبِيرٌ arxada olan; لا يفرق بين قبيله و ~ه o, kütbeyinin biridir; iki eşşəyin arpasını bölə bilmir

- دُبَارَةٌ = دُوبَارَةٌ

- مُدَبَّرٌ əvvəlcədən hazırlanmış, qurulmuş

- مُدَبِّرٌ 1) qənaətcil, tədbirli; 2) qurucu; təsərrüfat müdiri; rəhbər; المكايد ~ fitnəfəsadçı, intriqan

(دبس) II دَبَّسَ 1) sancmaq, taxmaq (*məs., orden*); الاوراق ~ kağızları sancaqla sancaqlamaq; 2) doşab çəkmək

- دَبَّاسٌ balsatan, doşabsatan

- دَبَّاسَةٌ *c.* ات - qısqac, sancaq

- دِبْسٌ doşab
- دَبُّوسٌ c. دَبَابِيسُ sancaq; انكليزيّ ~ ingilis sancağı; الرسم ~ dəftərxana knopkası; الشعر ~ baş sancağı; الغسيل ~ paltar sancağı
- مِدْبَسَةٌ c. مَدَابِسُ sancaq yastıqçası
دَبْشٌ köhnə şeylər, köhnə-kürüş, cır-cındır; zir-zibil
- دَبْشٌ çınqıl, qırma daş; tikinti daşı; قطعة ~الـ çay daşı, çaylaq daşı
دِبْشَكٌ qundaq; البندقيّة ~ tüfəng qundağı
I دَبَغَ (ə) دَبْغٌ aşılamaq, dabbağ etmək, emal etmək (*dərini*); VII إِنْدَبَغَ aşılanmaq
- دَبَّاغٌ dabbağ, dəriaşılayan
- دِبَاغَةٌ aşılama, dabbağ etmə
- دِبْغٌ c. أَدْبَاغٌ *yaxud* دِبْغَةٌ c. دِبَغٌ aşılayıcı maddə
- مَدْبَغَةٌ c. مَدَابِغُ dabbağxana, dəri karxanası
I دَبِقَ (ə) دَبَقٌ yapışmaq (*nəyə* بـ); II دَبَّقَ 1) tutmaq (*quşları yapışqanla*); 2) tapmaq, əldə etmək, ələ keçirmək (*nəyi* على *yaxud təs. hal*); V تَدَبَّقَ 1) tutulmaq (*yapışqana yapışmaqla-quşlar haqqında*); 2) özü üçün tapmaq, əldə etmək; VII إِنْدَبَقَ qır-saqqız olmaq, yapışmaq, əl çəkməmək, qəmiş olmaq
- دَابُوقٌ , دِبْقٌ c. أَدْبَاقٌ yapışqan (*quş tutmaq üçün*)
- دَبِقٌ 1) yapışan, yapışqan; 2) qarayaxa, zəhlətökən, qəmiş
- دِبْقٌ *bot.* bağamburc
- دَبْقَةٌ meyil, həvəs; adət, vərdiş
I دَبَكَ (i) دَبْكٌ 1) ayaqlarını yerə vurmaq, tappıldatmaq; 2) dəbkə rəqsi oynamaq
- دَبْكَةٌ 1) tappıltı; səs-küy; 2) *həmç.* رقص ~الـ dəbkə rəqsi (*Livanda rəqs*)
I دَبَلَ (u, i) دَبْلٌ gübrələmək, gübrə vurmaq
- دُبَالٌ c. أَدْبِلَةٌ gübrə, peyin, çürüntü
- دَبْلٌ c. دُبُولٌ 1) kiçik çay; 2) *tibb.* bubon (*qasıqda limfa vəzilərinin iltihabı*)

- دَبْلَانٌ ağ çit
- دِبْلَةٌ c. دِبَلٌ üzük; *həmç.* الزواج ~ nişan üzüyü
دَبْلَجَ *kino* dublyaj etmək
- مُدَبْلَجٌ dublyaj edilmiş film
- دَبْلَجَةٌ dublyaj etmə, dublyaj
- دِبْلُومٌ , دِبْلُومَةٌ c. دِبْلُومَاتٌ diplom; şəhadətnamə
- دِبْلُومَاتِيٌّ , دِبْلُومَاسِيٌّ , دِيبلُومَاسِيٌّ c. دَبَالِسَةٌ 1. diplomatik; ~ محرّر diplomatik icmalçı; 2. diplomat
- دِبْلُومَاسِيَّةٌ diplomatiya; بـ~ diplomatcasına
دَبًى *topl.* bala çəyirtkə
- دَبَاةٌ c. دَبَيَاتٌ bala çəyirtkə
I دَثَرَ (u) دُثُورٌ pozulmaq, yox olmaq, itmək; köhnəlmək; II دَثَّرَ 1) pozmaq, silmək; 2) məhv etmək; 3) örtmək, gizlətmək, örtüb basdırmaq; V تَدَثَّرَ örtülmək, sarınmaq, bürünmək (*nəyə* بـ , في); VII إِنْدَثَرَ 1) pozdurulmaq, sildirilmək; itib getmək, mövcudluğunu itirmək; 2) sönmək, sönüb getmək; 3) ötmək, ötüb keçmək; sovuşmaq; 4) köhnəlmək
- إِنْدِثَارٌ 1) itib getmə, yox olma; mövcudluğunu itirmə; 2) sönüb getmə; 3) köhnəlmə
- دَاثِرٌ 1) pozulmuş, silinmiş, itib getmiş; 2) köhnəlmiş
- دِثَارٌ c. دُثُرٌ üst paltarı; örtük; yüngül qadın xələti
- دَثْرٌ dövlət, var, sərvət; bolluq
- دُثُورٌ itib getmə, məhv olma; annigilyasiya; التجدد و ~الـ *biol.* metabolizm
(دجّ) II دَجَّجَ بالسلاح ~ başdan ayağa silahlandırmaq; V تَدَجَّجَ : بالسلاح ~ başdan ayağa silahlanmaq
- دُجٌّ qaratoyuq
- دَجَاجٌ *topl.* ev quşları; toyuq; الهند ~ *yaxud* فرعون ~ الحبش ~ hindtoyuğu; الوادي ~ *yaxud* firəngtoyuğu; الارض ~ cüllüt; الغابة ~ meşəcüllütü
- دَجَاجَةٌ c. ـات - toyuq; ~الـ *astr.* Qu bürcü



- دَجَّاجِيٌّ 1. toyuq -i/-ı; 2. toyuqsatan
- دُجَّةٌ qaranlıq, zülmət
- دُجُوجِيٌّ qaranlıq, zülmət; اسود ~ qapqara, zil qara, kömür kimi qapqara
- مُدَجَّجٌ 1.: بالسلاح ~ başdan ayağa silahlanmış; باللحم و الشحم ~ ət-piy basmış; 2. *zool.* oxlu kirpi
I دَجِرَ (ə) دَجَرٌ pərt olmaq; tutulmaq, çətin vəziyyətə düşmək, çaşıb qalmaq
I دَجَلَ (ə) دَجْلٌ yalan danışmaq, yalan demək; II دَجَّلَ 1) rəng, zər, qızıl suyu çəkmək; الارض ~ torpağı gübrələmək; 2) aldatmaq (*kimi* على)
- دِجَالٌ gübrə, peyin
- دَجَّالٌ [1] c. دَجَاجِلَةٌ yalançı; şarlatan; طبيب ~ fırıldaqçı həkim; ~الـ *yaxud* المسيح ~الـ dəccal
- دَجَّالٌ [2] 1) qızıl suyu; 2) zər
- دُجَالَةٌ qatran
- دَجَلٌ yalan, şarlatanlıq, fırıldaq
I دَجَنَ (u) دُجُونٌ 1) ələ öyrəşdirilmək, əhliləşdirilmək; 2) qara, qaranlıq olmaq; II دَجَّنَ ələ öyrəşdirmək, əhliləşdirmək; III دَاجَنَ yaltaqlanmaq, yaltaqlıq etmək; üzə gülə-gülə iş görmək; IV أَدْجَنَ qaranlıq olmaq (*gecə haqqında*)
- أَدْجَنُ *q.* دَجْنَاءُ c. دُجْنٌ qara, qaranlıq, tünd
- دَاجِنٌ c. دَوَاجِنُ 1. ələ öyrəşdirilmiş, əhliləşdirilmiş; 2. ev heyvanı; ev quşları; الحيوانات ـة ~الـ ev heyvanları; الطيور ـة ~الـ ev quşları; تربية الدواجن quşçuluq
- دَجْنٌ c. دُجُونٌ , أَدْجَانٌ bərk yağış
- دُجْنَةٌ c. ـات - dəyənək, küt adam, qanmaz adam
- دُجْنَةٌ qaranlıq, zülmət
- مُدَجَّنٌ ələ öyrəşdirilmiş, əhliləşdirilmiş; المدجّنون *tar.* müdəccənun (*İspaniya yerli əhali tərəfindən geri alındıqdan sonra orada qalıb xristianlığı qəbul etmiş ərəblər*)

I (دجو) دَجَا (u) دَجْوٌ 1) qaranlıq, zülmət olmaq; 2) yayılmaq; III دَاجَى 1) riyakarlıq etmək, yaltaqlanmaq; 2) gizlətmək (*hirsini, acığını*)
- دَاجٍ *q.* دَاجِيَةٌ qaranlıq, qara; مستقبل ~ qaranlıq gələcək
- دَجْوَةٌ qaranlıq, zülmət
- دَجْوَةٌ = دُجًى
- دَيَاجِي = دَجْوَةٌ : الليل ~ gecənin qaranlığı
- مُدَاجَاةٌ yaltaqlıq etmə, riyakarlıq etmə
I دَخَّ (ə/u) دَخٌّ gizlətmək
(دحدح) تَدَحْدَحَ ağır-ağır, axsaya-axsaya yerimək, ayaqlarını sürüyə-sürüyə yerimək
- دَحْدَحٌ c. دَحَادِحُ *yaxud* دَحْدَاحٌ c. دَحَادِيحُ pota, enlikürək
دَحْدَرَ diyirlətmək, yuvarlatmaq, üzüaşağı buraxmaq; تَدَحْدَرَ diyirlənmək, üzüaşağı düşmək, yıxılmaq
- دَحْدَرَةٌ diyirlətmə, üzüaşağı buraxma
- دَحْدُورَةٌ c. دَحَادِيرُ eniş, yamac
- دُحْدَيْرَةٌ c. دُحْدَيْرَاتٌ = دَحْدُورَةٌ
I دَحَرَ (ə) دَحْرٌ , دُحُورٌ 1) məğlub etmək, darmadağın etmək; 2) *məch.* məğlub olmaq; VII إِنْدَحَرَ darmadağın edilmək; tar-mar edilmək; məğlub edilmək
- إِنْدِحَارٌ məğlubiyyət, dağıdılma
- إِنْدِحَارِيٌّ məğlubiyyətçi
- إِنْدِحَارِيَّةٌ məğlubiyyətçilik
- مَدْحُورٌ məğlub edilmiş, darmadağın edilmiş, dağıdılmış
دَحْرَجَ diyirlətmək, endirmək; başıaşağı buraxmaq; تَدَحْرَجَ diyirlənmək, enmək, düşmək
- دَحْرَجَةٌ diyirlətmə
- دُحْرُجٌ *topl.* çölnoxudu

I نَحِسَ (ə) نَحَسٌ irinləmək, çirk eləmək (*barmaq haqqında – dırnaqda*)

- داحِسٌ, داحُوسٌ *tibb.* dolama

I دَحَشَ (ə) دَحْشٌ salmaq, taxmaq, basmaq, soxmaq, tıxamaq; VII إِنْدَحَشَ salınmaq, taxılmaq, basılmaq, soxulmaq, tıxanılmaq

I دَحَضَ (ə) دَحْضٌ rədd etmək, inkar etmək; danmaq لا يُدْحَضُ *məch.* danılmaz, inkaredilməz; II دَحَّضَ = I; IV أَدْحَضَ = I

- دَحْضٌ inkar etmə, danma; لا يقبل الـ~ ان... inkar etmək olmaz ki...

I دَحَمَ (ə) دَحْمٌ itələmək

دَحَى (ə) دَحْيٌ 1) diyirlətmək (*məs., kürəciyi*); 2) vərdənələmək; basıb hamarlamaq (*yolu*)

- مِدْحَاةٌ *c.* مَدَاحٍ 1) kürəcik (*oyun üçün*); 2) *tex.* vərdənə

I دَخَرَ *bax:* ذَخَرَ

دُخَسٌ delfin

I دَخَلَ (u) دُخُولٌ 1) girmək; 2) nüfuz etmək, keçmək (*hara* في); 3) daxil olmaq (*hara təs. hal və ya* في); tərkib hissəsi olmaq (*nəyin*), daxil edilmək (*hara* في); الجمعيّة ~ cəmiyyətə daxil olmaq; الجامعة ~ universitetə daxil olmaq; على عامه العاشر ~ on yaşına keçmək; معه في مفاوضات ~ kiminləsə danışıqlara girmək; 4) yanına keçmək, gəlmək (*kimin* على); 5) daxil etmək, içəri salmaq (*kimi* بـ); ~ـه الشكّ içinə şübhə damdı; ~ت العبارة عليه بالتركيّ o heç nə başa düşmədi (*hərf.* ona elə gəldi ki, söz türkcə deyildi); ~ في عقله *məch.* ağlı çaşıb; ~ على زوجته arvadı ilə əlaqədə olmaq; ~ قيد الخدمة (العمل) sıraya daxil olmaq, işə salınmaq (*məs., zavod*); II دَخَّلَ 1) salmaq, daxil etmək; 2) qoymaq (*tədris müəssisəsinə*); ~ـه ابوه في المدرسة atası onu məktəbə qoyub; III دَاخَلَ 1) müdaxilə etmək; 2) qatışmaq; 3) bürümək (*istək, arzu haqqında*); girmək, dammaq (*şübhə*); IV أَدْخَلَ daxil etmək; içəri salmaq; idxal etmək; ~ في الاذهان انِ... beyinlərinə yeridib ki...; V تَدَخَّلَ 1) müdaxilə etmək; girişmək (*məs., müzakirəyə*); 2) daxil olmaq (*tərkib hissəsi kimi*); VI تَدَاخَلَ 1) başqaları ilə birlikdə girmək, daxil olmaq; 2) müdaxilə etmək, girişmək; 3) dammaq, düşmək, girmək (*şübhə haqqında*); 4) qarşılıqlı surətdə nüfuz etmək, bir-birinin içinə girmək; qatışmaq (*nəyə* في); 5) çəlpəşmək, bir-birinə qarışmaq, bir-birinə dolaşmaq; qismən üst-üstə düşmək

- إِدْخَالٌ daxil etmə; idxal etmə; tərkibə salma

- أَدْخَلُ daha tez anlaşılan, daha münasib

- تَدَاخُلٌ 1) müdaxilə; intervensiya

- تَدَخُّلٌ müdaxilə; عدم الـ~ في الامور الداخليّة daxili işlərə qarışmama; الـ~ المسلّح silahlı müdaxilə, intervensiya

- دَاخِلٌ 1. 1) daxil olan; 2) daxili; 2. iç, bir şeyin daxili; داخله onun içində; داخل الظرف zərfin içində; من الـ~ içəridən, daxildən; ~ـًا a) daxilə; b) daxildə

- دَاخِلَةٌ *c.* دَوَاخِلُ 1) iç, daxili hissə; *c.* daxili vilayətlər (*ölkənin*); 2) daxili hiss, həyəcan

- دَاخِلِيٌّ daxili; تجارة ~ـة daxili ticarət; حرب ~ـة vətəndaş müharibəsi; طلب ~ internat şagirdi; ملاحة ~ـة çay gəmiçiliyi; مدرسة ~ـة *bax:* مدرسة ; وزارة الـ~ـة *yaxud* الـ~ـة daxili işlər nazirliyi

- دَاخِلِيَّةٌ iç, bir şeyin içi, daxili; البلاد ~ ölkənin daxili vilayətləri

- دَخْلٌ *c.* دُخُولٌ 1) gəlir, mədaxil; الـ~ القوميّ (الوطنيّ) milli gəlir; دخول ثابتة sabit gəlir; ضريبة الـ~ gəlir vergisi; صاحب الـ~ rantye, renta sahibi; لصحاب الدخول الكبيرة böyük gəlir



sahibləri; 2) müdaxilə; 3) dəxl, əlaqə, münasibət; كان له ~ في هذا الامر bu işin ona dəxli vardı; و ما ~ـه في هذا؟ onun buna nə dəxli var? 4) şübhə, şəkk; دخلك zəhmət olmasa!, xahiş edirəm!

- دَخَلٌ 1) ağlın çaşması; 2) qüsur, naqislik, eyb, əskiklik

- دَخْلَةٌ , دِخْلَةٌ [1] gizli fikirlər, niyyətlər; طاهر الـ~ təmiz niyyətli

- دَخْلَةٌ [2], دُخْلَةٌ giriş; ليلة الـ~ zifaf gecəsi, toy gecəsi

- دُخَّلَةٌ ötməquşu

- دُخُولٌ 1) giriş; رسم الـ~ idxal rüsumu; 2) daxil olma; 3) nüfuz etmə

- دُخُولِيَّةٌ şəhər rüsumları

- دَخِيلٌ *c.* دُخَلَاءُ 1. 1) kənar; 2) dəxil, himayə axtaran, kömək istəyən; 2. 1) gəlmə; 2) *qram.* gəlmə sözlər (*ərəb dilində*); دخيلك zəhmət olmasa! كانت ~ـة في كل بيت o, hər evə məhrəm idi (*girib-çıxan idi*)

- دَخِيلَةٌ *c.* دَخَائِلُ gizli fikir, niyyət; ~ نفسي qəlbimin sirri; دخائل المسألة (الامر) işin gizli tərəfləri

- مُتَدَاخِلٌ 1) müdaxilə edən, qarışan; 2) dərinə gedən

- مُتَدَخِّلٌ 1. müdaxilə edən, qarışan; 2. müdaxiləçi

- مُدَاخَلَةٌ müdaxilə

- مَدْخَلٌ *c.* مَدَاخِلُ 1) giriş, keçid; qapı; alaqapı (*evin*); 2) giriş (*kitaba*); 3) hərəkət tərzi, davranış

- مَدْخُولٌ 1. qeyri-normal; فيه ~ saxtalaşdırılmış; الضمير ~ vicdanı təmiz olmayan; 2. *c.* مَدْخُولَاتٌ , مَدَاخِيلُ mədaxil, gəlir

دَخْمَسَ aldatmaq

- دَخْمَسَةٌ aldatma, aldanma; kələk, fırıldaq

I دَخَنَ (ə) دَخْنٌ 1) çəkilmək, tüstülənmək, tüstülətmək; 2) tüstü iyi gəlmək, vermək; II دَخَّنَ 1) çəkmək (*tütün*); الحشيش ~ həşiş çəkmək; السيجارة ~ siqaret çəkmək; 2) hisə vermək (*əti, balığı*); 3) tüstüyə vermək (*məs., bitkiləri – təs.hal və ya* على); IV أَدْخَنَ tüstü buraxmaq, tüstüləmək, dəm çalmaq

- أَدْخَنُ *q.* دَخْنَاءُ *c.* دُخْنٌ boz, bozumtul, tüstü rəngində; tünd rəngdə

- تَدْخِينٌ 1) siqaret çəkmə; اوضة الـ~ siqaret çəkmə otağı; 2) hisə vermə; 3) tüstüyə vermə

- دَاخِنٌ tüstüləyən; tüstülü

- دَاخِنَةٌ *c.* دَوَاخِنُ baca, dudkeş

- دَخَاخِنِيٌّ *c.* دَخَاخِنِيَّةٌ tütünsatan

- دُخَانٌ , دُخَّانٌ *c.* أَدْخِنَةٌ 1) tüstü, dəm; buxar; لا ~ بلا نار و لا خبر بلا اصل *məsəl.* od olmasa tüstü çıxmaz, əsas olmasa söz yayılmaz; 2) tütün

- دَخَنٌ tüstü

- دُخْنٌ darı

- دُخْنَةٌ boz, tüstü rəngi; tünd rəng

- دُخَيْنَةٌ *c.* ـات – papiros

- مُدَخِّنٌ papirosçəkən, çəkən

- مَدْخَنَةٌ *c.* مَدَاخِنُ baca, dudkeş

دَدَنٌ zarafat, dəcəllik

(ددي) III دَادَى dayəlik etmək, əzizləmək (*uşağı*)

I دَرَّ (ə/i) دَرٌّ , دُرُورٌ 1) bol olmaq, bol-bol axmaq (*məs., süd, göz yaşları*); 2) gətirmək (*gəlir*); çoxlu miqdarda vermək (*nə kimə* على); درّت السماء بالمطر güclü yağış yağdı; درّ عليه الخير الوافر bolluca xeyir gətirmək; درّت عليه اخلاف النعم *məcaz.* o çox firavan yaşayır (*hərf.* nemət döşləri ona bolluca süd axıtdı); IV أَدَرَّ 1) bol-bol axıtmaq; bolluca süd vermək (*məs., inək*); 2) gətirmək (*bolluca gəlir*); böyük miqdarda vermək (*nə kimə* على); X اِسْتَدَرَّ 1) sağmaq, bolluca axıtmaq; الدموع ~ göz

yaşlarını sel kimi axıtmaq; 2) nəyisə çoxlu miqdarda almağa can atmaq; عطفه ~ kimdənsə mərhəmət diləmək

- إِدْرَار 1) bol-bol tökmə; 2) bərk-bərk fırlanma (*məs., vərdənənin*)

- إِدْرَارَة c. ـَات - təminat, pul, vəsait, maaş, aylıq

- دَرّ süd; لله درك a) sən nə yaxşısan!; b) sən bunu çox yaxşı etmisən!; لله درّ العلماء الذين... necə də yaxşıdırlar o alimlər ki...

- دُرّ *topl.* mirvari

- دُرَّة [1] c. دُرَر mirvari dənəsi, inci, dürr; يتيمة ~ nadir mirvari

- دُرَّة [2] c. دُرَر tutuquşu

- دِرَّة c. دِرَر 1) yelin, əmcək; 2) şallaq, qamçı

- دُرِّيّ parlaq; parıldayan; الكواكب الـ~ـة parlaq ulduzlar

- مُدِرّ 1) güclü ifrazdoğurucu, qovucu; للبول ~ sidikqovucu; للعرق ~ tərqovucu; tərçıxaran, tərlədici; 2) bol

- مِدْرَار çoxlu miqdarda tökən; bol-bol tökülən; ~ مطر şiddətli yağış, güclü yağış, leysan

دَرَابْزُون , دَرَابْزِين , دَرَبْزِين c. دَرَبْزِينَات sürahı, məhəccər; sürahıbənd

دِرَامَا , دِرَامَة c. دِرَامَات drama

- دِرَامِيّ dramatik

I دَرَأَ (a) دَرْء itələmək; uzaqlaşdırmaq; rədd etmək, dəf etmək; geri almaq (*nədən* عن); II دَرَّأَ 1) dəf etmək; geri oturtmaq; 2) uzaqlaşdırmaq; VI تَدَارَأَ bir-birini itələmək; itələşmək; dalaşmaq, savaşmaq; VII إِنْدَرَأَ üzərinə qalxmaq (*kimin*), üzərinə atılmaq, hücum etmək (*kimə* على)

- دَرْء 1) itələmə; kənar etmə; dəf etmə; 2) təzyiq, güc (*məs., selin*)

- دَرِيئَة c. دَرَايَا 1) daldalanacaq, örtü, himayə; sipər, qalxan; 2) hədəf

I دَرِبَ (a) دَرَب öyrədilmək, təlim edilmək (*nəyə*), məşq edilmək (*nədə* بـ); II دَرَّبَ öyrətmək (*nəyi* على); təlim vermək, məşq keçmək, təlimatlandırmaq (*nədə* على); rəftar etməyi öyrətmək (*nə ilə* على); V تَدَرَّبَ öyrənmək, təlim almaq, təlim keçmək; məşq etmək; öyrədilmək, alışdırılmaq (*nəyə* على)

- تَدَرُّب öyrədilmə, təlim; vərdiş; bacarıq

- تَدْرِيب c. ـَات - təlim, məşq, hazırlıq; عسكريّ ~ hərbi təlim, hərbi hazırlıq

- تَدْرِيبِيّ təlim -i/-ı; məşq -i/-ı

- دَرْب c. دُرُوب 1) dağ keçidi; cığır; 2) yol; دروب ملتوية əyri-üyrü, dolanbac yollar; خطّ ~ـه لنفسه الى... özünə harasa yol açmaq; التبّانة ~ *bax*: تَبَّانَة; 3) küçə

- دُرْبَة 1) təcrübə, vərdiş, bacarıq; 2) intizamlılıq

- مُتَدَرِّب təlim keçmiş, məşq keçmiş, öyrədilmiş

- مُدَرَّب təlim keçmiş, məşq keçmiş; təcrübəli

- مُدَرِّب rəhbər, təlimatçı, məşqçi

دَرَبْزِين *bax*: دَرَابْزُون

I دَرْبَسَ rəzəsini vurmaq, cəftələmək

- دِرْبَاس c. دَرَابِيس 1) şir; 2) rəzə, cəftə; 3) gözətçi iti

- دَرْبَسَة rəzəni vurma, cəftələmə

دَرْبَكَ səs salmaq, hay-küy qopartmaq; taqqıldatmaq

- دَرْبَكَة səs, səs-küy; taqqıltı

- دَرَبُكَّة c. ـَات - təbil, dəf, qaval

I (درج) دَرَجَ [1] (u) دُرُوج 1) ağır-ağır getmək; tədricən yerimək; yeriməyə başlamaq (*uşaq haqqında*); 2) böyümək, boy atmaq, inkişaf etmək; في بيئة عربيّة صافية ~ o, saf ərəb mühitində tərbiyə almışdır; 3) çox işlənmək, dövriyyədə olmaq; dəbdə olmaq; 4) ötmək,



keçmək; yox olmaq, itib getmək; qırılmaq; دَرَجَ [2] (u) دَرْج 1) bükmək, bürmələmək, əymək, qatlamaq; 2) daxil etmək, salmaq, yerləşdirmək; qoymaq; دَرِجَ (ə) دَرَج tədricən hərəkət etmək; pillə-pillə qalxmaq (*nəyə* الى); II دَرَّجَ 1) tədricən hərəkət etdirmək; işə salmaq, dövriyyəyə buraxmaq; 2) dərəcələmək; dərəcələrə bölmək; 3) növlərə, dərəcələrə, çeşidlərə ayırmaq; çeşidləmək; 4) pillə-pillə yerləşdirmək; 5) öyrətmək, alışdırmaq; 6) bükmək, qatlamaq; 7) adət halına salmaq (*nəyi* على); 8) elmi dərəcə vermək; IV أَدْرَجَ 1) daxil etmək; salmaq, yazmaq (*məs., siyahıya*); في جدول الاعمال ~ gündəliyə daxil etmək; 2) yerləşdirmək (*qəzetdə*); V تَدَرَّجَ 1) tədricən irəliləmək; pillə-pillə qalxmaq (*nəyə doğru* الى); 2) ardıcıllığı gözləmək (*nədə* في); tədricən keçmək (*nədən* من *nəyə* الى); 3) elmi dərəcə almaq; VII إِنْدَرَجَ 1) daxil edilmək, yerləşdirilmək; 2) ölüb getmək; X إِسْتَدْرَجَ 1) tədricən irəliləmək (*harayasa*); 2) gətirib çıxarmaq (*nəyə* الى); 3) tədricən irəlilətmək, yüksəltmək (*kimisə*); 4) aldadıb gətirmək, aldadaraq çəkmək (*haraya* الى); 5) azdırmaq, yoldan çıxarmaq; المجرم ~ cinayətkardan tədricən ifadə almaq (*istintaq vaxtı*)

- إِدْرَاج daxil etmə, salma; yazma, alma (*siyahıya*)

- تَدْرُج *topl.* c. تَدَارِج qırqovul

- تَدْرُجَة qırqovul

- تَدَرُّج 1) tədricən yüksəlmə, irəliləmə; dərəcələnmə; بالـ~ *yaxud* ~ـاً tədricən; 2) şagirdlik

- تَدْرِيج 1) tədricən irəliləmə, yüksəltmə; بالـ~ *yaxud* ~ـاً tədricən; 2) dərəcələmə, dərəcələrə bölmə; 3) pillə-pillə yerləşdirmək; 4) öyrətmə, alışdırma

- تَدْرِيجَة saçın pillə-pillə düzümü

- تَدْرِيجِيّ tədrici; ardıcıl; ~ـاً tədricən

- دَارِج 1) yeriməyə başlayan; طفل ~ yeriməyə başlayan uşaq; 2) dövriyyədə olan, işləyən, işlək; hamının işlətdiyi; 3) dəbdə olan; 4) adi; 5) xalq -i/-ı; اللغة الـ~ـة xalq dili

- دَارِجَات c. xalq dili sözləri

- دَرَّاج 1) çarx, təkər; 2) vərdənə; 3) velosipedçi

- دُرَّاج *topl.* c. دَرَارِيج *zool.* turac, qarabağır

- دُرَّاجَة c. ـَات – qarabağır

- دَرَّاجَة c. ـَات - 1) uşaqları yeriməyə öyrətmək üçün qurğu, ayaqaçdı arabası; 2) velosiped; diyircəkli araba; بخاريّة ~ *yaxud* ناريّة ~ motosikl

- دَرْج c. دُرُوج 1) lülə halında bükülmüş kağız, tumar; 2) siyahı; 3) bükük, qat, qırış; 4) tərkib (*sözün*); في الكتاب ~ kitabın içində; في ~ الكلام söz əsnasında

- دَرَج c. أَدْرَاج 1) pilləkən, nərdivan; حلزونيّ ~ dolama pilləkən; 2) yol; رجعوا ادراجهم (عادوا) onlar geri döndülər; ارتقى ادراج السماء göyün qatlarına qalxmaq; ادراج الرياح havayı, havaya, boş-boşuna, əbəs yerə

- دُرْج c. أَدْرَاج siyirtmə

- دَرَجَة c. دَرَجَات , دَرَج 1) dərəcə (*həmç. elmi*); كبيرة ~ في böyük dərəcədə; معادلة من الـ~ (الثانية) الاولى birinci (ikinci) dərəcəli tənlik; انتخابات على ~ـين ikidərəcəli seçkilər; جامعيّة ~ elmi dərəcə; الدكتوراه ~ elmlər doktoru dərəcəsi; ظفر بـ~ الماجستير magistr dərəcəsi almaq; الطول ~ uzunluq dərəcəsi; العرض ~ en dərəcəsi; الحرارة ~ hərarət dərəcəsi; الغليان ~ qaynama dərəcəsi; التجمد ~ donma dərəcəsi; 2) rütbə;

ixtisas (*məs., fəhlənin*); يعمل بـــ~ مهندس o, mühəndis dərəcəsində işləyir; 3) səviyyə, növbə; عامله معاملة ~ اولى kiminləsə yəksək səviyyədə davranmaq; بالـــ~ الاولى ilk növbədə; 4) qiymət (*məktəbdə*) بـــ~ جيّد جدّا «çox yaxşı» qiymətlə

- مُتَدَرِّج şagird, usta köməkçisi

- مَدْرَج c. مَدَارِج 1) yol; 2) başlanğıc; 3) *av.* uçuş-enmə yolu (*zolağı*)

- مُدَرَّج c. ات - 1) amfiteatr; tribunalar (*məs., stadionun*); 2) şkala, dərəcələrə bölünmüş lövhəcik; 3) *həmç.* الـــ~ الموسيقي *mus.* not şkalası, həmahəng səslər sırası, qamma; 4) *c.* pillələr

- مُدْرَجَة c. مَدَارِج kağız bağlaması

- مُنْدَرَجَات c. mündəricat, içində olanlar

دِرَخْمَة drəhmə (*xırda pul*)

I دَرِدَ (ə) دَرَد dişsiz olmaq

- أَدْرَد q. دَرْدَاء c. دُرْد dişsiz

- دُرْد çöküntü, xılt; tör-töküntü

- دَرْدَار qarağac; göyrüş, vən

دَرْدَبِيس qarı; *söyüş*: qoca kaftar

دُرْدُر c. دَرَادِير damaq

دُرْدُور burulğan, qıjov; burağan, qasırğa

دَرْدَش 1) boşboğazlıq etmək, çənə vurmaq, çərənləmək; boş-boş danışmaq; 2) internet vasitəsilə söhbləşmək, danışmaq; ~ من الفاضي و المليان boş-boş danışmaq, çərənçilik etmək

دَرْدَشَة 1) boş-boş danışma, çərənçilik, boşboğazlıq; 2) *int.* çat, söhbət

دَرْدَم torpaq töküb doldurmaq

- دَرْزِيّ = دَرْزِيَّة c. دَرْزِيّ

- دُرْزِيّ c. دُرُوز *etn.* druz

I (درس) دَرَسَ [1] (u) دَرْس yuyulmaq, itmək, yox olmaq, itib getmək; دَرَسَ [2] (u) دَرْس 1) öyrənmək, oxumaq, dərs almaq (*kimdən* على); 2) yumaq, silmək, hamarlamaq; دَرَسَ [3] (u) دَرْس , دِرَاس döymək (*taxıl*); II دَرَّسَ 1) öyrətmək, dərs demək, müəllimlik etmək; 2) diqqətlə öyrənmək; III دَارَسَ 1) birgə öyrənmək; IV أَدْرَسَ öyrətmək, dərs demək, müəllimlik etmək; VI تَدَارَسَ birgə, bir yerdə öyrənmək; VII إِنْدَرَسَ 1) silinmək, itib getmək, yox olmaq; 2) döyülmək (*taxıl*)

- إِدْرِيس *bax: əlifba sırası ilə*

- تَدْرِيس tədris, dərs demə, öyrətmə; هيأة (هيئة) الـــ~ müəllim heyəti

- دَارِس [1] c. دَوَارِس yuyulan, silinən, itib gedən; الـــ~ والحواشيّ والمهجور *qram.* işlədilməyən, aydın olmayan və köhnəlmiş sözlər

- دَارِس [2] şagird

- دَارِس [3] döyəcçi, taxıldöyən, xırmançı

- دَرَّاس çalışqan, səyli (*şagird*)

- دِرَاس döyüm, döyün; آلة الـــ~ العادية taxıldöyən maşın; آلة الحصاد والـــ~ kombayn

- دَرَّاسَة c. ات - 1) zəncir; 2) taxıldöyən maşın; ~ حصّادة kombayn

- دِرَاسَة c. ات - 1) öyrənmə, oxuma, təhsil; الـــ~ العالية ali təhsil; اتمّ ~ـــه təhsilini bitirmək; معهد الدراسات الشرقية للمجمع العلمي الوطني بآذربيجان Azərbaycan Milli Elmlər Akademiyasının Şərqşünaslıq İnstitutu; 2) etüd, kiçik araşdırma



- دُرْسَة , دُرَسَة c. ات - *zool.* tənəkquşu; ~ الثلج şimal sərçəsi

- دِرْوَاس c. دَرَاوِس *bax: əlifba sırası ilə*

- دُرُوس yuyulma, silinmə, itib getmə, yox olma, itmə

- دَرِيس quru ot; quru yonca; حمّى الـــ~ samanlıq qızdırması

- دَرِيسَة təmir briqadası (*dəmir yollarında*); عمّال الـــ~ *yaxud* عساكر الـــ~ təmir briqadasının fəhlələri; أوسطى (أسطى) الـــ~ təmir briqadasının briqadiri

- مُدَرِّس müəllim, pedaqoq

- مِدْرَس c. مَدَارِس dərslik

- مَدْرَسَة c. مَدَارِس 1) mədrəsə, məktəb; ~ ابتدائية *bax:* إِبْتِدَائِيّ ; ~ ثانوية ikinci dərəcə məktəbi, orta məktəb; ~ جامعة universitet; ~ تجارية ticarət məktəbi; ~ حربيّة hərbi məktəb; ~ خارجيّة gələnlər üçün məktəb; ~ دلخليّة internat, məktəb-internat; ~ صناعيّة sənaye məktəbi; texniki məktəb; ~ عالية ali məktəb; ~ المعلّمين pedaqoji məktəb; ~ الموسيقى العالية konservatoriya; رفيق الـــ~ məktəb yoldaşı; 2) məktəb, istiqamət (*elmdə, incəsənətdə və s.*) الـــ~ الواقعيّة الطبيعيّة realizm

- مَدْرَسِيّ 1) məktəb -i/-ı; 2) dərs, tədris -i/-ı; ~ كتاب dərs kitabı; ~ عام dərs ili; 3) sxolastik

- مَدْرَسِيَّة 1) tədris xarakteri (*məs., hansısa nəşrin*); 2) sxolastika

- مَدْرُوس öyrənilmiş, keçilmiş, tanış; ~ غير öyrənilməmiş, keçilməmiş, tanış olmayan

(درع) II دَرَّعَ 1) zirehləmək, zirehlə örtmək; 2) zireh geydirmək; V تَدَرَّعَ 1) müdafiə olun-

- دُرَّاعَة c. دَرَارِيع gödəkçə

- دِرْع q., k., c. دُرُوع , أَدْرُع 1) zireh; 2) dəmir geyim; 3) köynək

- دُوَيْرِع *zool.* armadil; ~ شعرانيّ codtüklü armadil

- مُدَرَّع 1. zirehli; سيارة ~ـــة zirehli maşın; قوّات ~ـــة zirehli qüvvələr; 2. *zool.* armadil

- مُدَرَّعَة c. ات - zirehli gəmi; xətt gəmisi

دَرَف tərəf, yan

- دَرَفَة c. دُرَف 1) yarım, yarı; qapının bir tayı; 2) pəncərə qapağı

دَرْفَلَ yaymaq (*metalı*)

- دَرْفَلَة yayma; ~ من جانب الى جانب gəminin o yan-bu yana yırğalanması

- مُدَرْفَل yayılmış; ~ حديد prokat

- مُدَرْفَلَات c. prokat (*metal məmulat*)

دَرْفِيل c. دَرَافِيل 1) delfin; ~ روسيّ nərə balığı; 2) *həmç.* ~ اسطوانيّ vərdənə, tir, dirək (*yükləri diyirlətmək üçün*); *c.* vərdənələr (*prokat dəzgahının*)

دُرَّاق , دُرَّاقِين *topl.* şaftalı (*Suriya*)

دَرَق *topl.* *c.* أَدْرَاق dəri qalxan

- دَرَقَة c. ات - 1) qalxan; 2) qın (*bağanın*); ~ ابو *zool.* qalxanburun

- دَرَقِيّ qalxanabənzər, qalxanvarı; الغدّة الـــ~ـــة *anat.* qalxanabənzər vəzi; الغضروف الـــ~ qalxanabənzər qığırdaq, xirtdənək

I (درك) II دَرَّكَ ara vermədən yağmaq (*yağış*); III دَارَكَ 1) haxlamaq, yetişib tutmaq, qovub çatmaq; 2) tərəfdar olmaq (*nəyəsə*); IV أَدْرَكَ 1) yetişmək, çatmaq, haxlamaq; ~ـــه الموت

haqqında); ـــته نوبة السعال ~ onu öskürək tutması tutdu; 6) yetkinləşmək, yetişmək, böyük olmaq; VI تَدَارَكَ 1) düzəltmək, qaydaya salmaq, yoluna qoymaq (*işi*); النقص ~ nöqsanı düzəltmək; 2) ehtiyat tədbirləri görmək, xəbərdarlıq etmək, qarşısını almaq; 3) bir-birinə yetişmək; başqaları ilə birlikdə tələsmək; انفاسها تتدارك o tez-tez nəfəs alır; 4) əvvəlcədən başa düşmək; X إِسْتَدْرَكَ 1) əldə etməyə, yetişməyə, çatmağa çalışmaq; çatmaq, yetişmək; 2) düzəltmək, yoluna qoymaq; əlavə etmək, tamamlamaq

- إِدْرَاكٌ 1) yetişmə, çatma (*nəyəsə*); 2) dərk etmək, anlama; qavrama; نفسه ~ özünüdərk; الحسّيّ ~ الـ *psixol.* persepsiya; القدرة على الـ~ qavrama qabiliyyəti; 3) ağıl, idrak; 4) şüurluluq; 5) yetişmə, yetkinləşmə; yetkinlik

- إِدْرَاكِيٌّ 1) idraki; 2) *din.* dərkedən (*sufilərdə dördüncü pillə*; I المريد , II السالك , III المجذوب)

- إِسْتِدْرَاكٌ 1) düzəltmə; 2) düzəliş; əlavə etmə, tamamlama; 3) حرف الـ~ *qram.* məhdudlaşdırıcı ədat (إلا , لكنّ , بل , أنّ , لكن , غير *və s.*)

- دَارِكٌ dayaq; dayaq nöqtəsi

- دِرَاكٌ fasiləsiz; arası kəsilməyən; ـــا~ dalbadal, bir-birinin ardınca

- دَرَكٌ[1], دَرْكٌ *c.* دَرَكَاتٌ yoxlama; gözətçi dəstəsi; رجال الـ~ a) qarovul; b) jandarmeriya; polis

- دَرَكٌ[2] yetişmə, çatma

- دَرَكٌ[3] *c.* أَدْرَاكٌ 1) tərəf, uc; وصل الى الـ~ الاسفل ən aşağı həddə çatmaq; son həddə çatmaq; ... هبط الى هذا الـ~ حتى o, o dərəcədə alçalmışdı ki...; 2) dib

- دَرَكَةٌ *c.* ات - dərəcə, qat (*aşağı enən*); هو في اقصى دركات الشقاء والفاقة o, son dərəcə yoxsulluq və ehtiyac içindədir; انهار الى هذه الـ~ o bu dərəcədə düşkünləşib

- دَرَكِيٌّ jandarm, polis

- مُتَدَارِكٌ 1. fasiləsiz, arasıkəsilməyən; 2. mütədarik (*şeir bəhri*)

- مَدَارِكُ *c.* ağıl, zəka, mənəvi qüvvələr; الـ~ الخمس beş duyğu

- مُدْرَكٌ 1. anlaşılan, ağılla dərk edilən; 2. *c.* ـــات~ anlayış, anlam

- مُدْرِكٌ 1) çatan, yetişən; 2) anlayan, qanan; dərk edən, müdrik, şüurlu; عامل ~ şüurlu fəhlə; قوى الـ~ـة dərketmə qüvvələri; 3) yetkin

- مُدْرَكَاتٌ *c.* biliklər; bilgi

I دَرِمَ (ə) دَرَمٌ düşmək (*dişlər*); II دَرَّمَ tutmaq (*dırnaq*)

- أَدْرَمُ *q.* دَرْمَاءُ *c.* دُرْمٌ dişsiz

- تَدْرِيمٌ tutma (*dırnaqları*); الاظفار والعناية بالايدي ~ manikür

I دَرِنَ (ə) دَرَنٌ çirk, kirli olmaq, çirklənmək; II دَرَّنَ vərəmli olmaq; IV أَدْرَنَ = I; V تَدَرَّنَ vərəmli olmaq, vərəmə tutulmaq

- تَدَرُّنٌ vərəm; الرئتين ~ ağciyər vərəmi

- دَرَنٌ[1] *c.* أَدْرَانٌ çirk, kir, natəmizlik

- دَرَنٌ[2] *topl. tibb.* şiş; kök şişi

- دَرَنِيٌّ 1) vərəm -i/-ı, vərəmli; 2) şiş (*sif.*)

- مُتَدَرِّنٌ vərəmli, vərəm xəstəliyi olan adam

- مِدْرَهٌ *c.* مَدَارِهُ natiq; müdafiəçi, vəkil

دِرْهَمٌ *c.* دَرَاهِمُ 1) dirhəm (*1/144 rətlə* رطل, *yaxud 16 qirata* قيراط, *yaxud 3,12 qr. bərabər çəki vahidi*); 2) dirhəm (*İraq və Küveytdə 100 filsə bərabər gümüş pul*); 3) *c.* pul; دراهم معدودة qəpik-quruş; خالى الوفاض من الـ~ والدانق cibində bir qəpiyi olmayan; لا ~ له في ... ولا دينار onun ...-a heç bir dəxli yoxdur

- دُرَيْهِمَاتٌ *c.* qəpik-quruş; اكتسب بعض الـ~ qəpik-quruş qazanmaq

دِرْوَاسٌ *c.* دَرَاوِسُ 1) buldoq; 2) şir

دَرُوبَاكٌ 1) endirim; 2) qaytarma rüsumu



دِرْوَةٌ *c.* دَرَاوَى, دِرْوَاتٌ 1) sığınacaq; 2) daldalanacaq, sipər; 3) hasar; səngər

تَدَرْوَشَ dərvişlik etmək, dərviş olmaq

- دَرْوِيشٌ *c.* دَرَاوِيشُ 1) dərviş, gəzib-dolaşan rahib; 2) sadəlövh adam

I دَرَى (i) دِرَايَةٌ bilmək, xəbərdar olmaq (*təs. hal və ya* بـ); لا يدري ما يفعل o bilmir ki, nə etsin; على التحقيق ~ yəqin bilmək; II دَرَّى 1) bildirmək, xəbərdar etmək; 2) sovurmaq (*taxılı*) (*müq. et:* ذَرَّى *bax:* ذرو); III دَارَى gizlətmək, gizli saxlamaq, sirr saxlamaq; maskalamaq, pərdələmək; yalandan etmək, riyakarlıq etmək; خجله ~ xəcalətini gizlətmək; 2) yaltaqlanmaq, qulluq göstərmək; razı salmağa çalışmaq; IV أَدْرَى bildirmək, xəbərdar etmək (*nə barədə* بـ); فما ادراك ماذا يمنعهم sən nə biləsən ki, onlara nə mane olur?

- أَدْرَى daha çox, daha yaxşı bilən, xəbərdar olan; صاحب البيت بما فيه ~ *məsəl.* evdə nə olduğunu ev sahibi daha yaxşı bilər

- أَدْرِيَّةٌ *fəls.* qnostisizm; لا~ aqnostisizm

- دَارٍ *q.* دَارِيَةٌ bilən, xəbərdar (*nədən* بـ)

- دِرَايَةٌ bilik, xəbərdarlıq, məlumatlılıq; عن ~ yaxşıca bilə-bilə

- مُدَارَاةٌ 1) gizlətmə; yalandan etmə; 2) yaltaqlıq etmə; qulluq göstərmə

- مِدْرَاةٌ 1) *c.* مَدَارٍ daraq; 2) *c.* مِدْرَيَاتٌ şana, dırmıq, yaba (*müq. et:* مِذْرَاةٌ *bax:* ذرو)

- مِدْرَةٌ yaba; المراكبيّ ~ şüvül, uzun ağac, qarmaq, dəstəli çəngəl

دِرْيَاقٌ padzəhr (*müq. et:* تِرْيَاقٌ)

دُزِّينَةٌ *c.* ات - düjün

I دَسَّ (ə/u) دَسٌّ 1) fitnə salmaq, quyu qazmaq (*kimə* على); الدسائس ~ intriqalar qurmaq; 2) soxuşdurmaq, sıramaq, gizlicə qoymaq (*kiminsə cibinə, evinə* لـ); السم في... ~ ...-a/ə gizlicə zəhər qatmaq; 3) gizlətmək, basdırmaq; انفه في كل امر ~ burnunu hər yerə soxmaq; II دَسَّسَ = I 2); V تَدَسَّسَ gizlicə, xəlvətcə girmək (*hara* في); VII إِنْدَسَّ gizlicə nüfuz etmək, girmək; qılığına girmək (*kimin* بين); dürtülmək (*hara* في); في معطفه ~ paltonunu tələsik geymək; تحت اللحاف ~ yorğanın altına girmək

- دَسَّاسٌ 1) fitnə-fəsadçı; casus; العرق ~ *məsəl.* alma ağacından alça düşməz (*hərf. cinsi bildirər*); 2) zəhərli ilan

- دَسَّاسَةٌ *c.* ات - zəhərli ilan

- دَسِيسٌ kəşfiyyatçı, casus

- دَسِيسَةٌ *c.* دَسَائِسُ intriqa, fitnə, fəsad; hoqqa, tələ; *c.* fitnələr; حاك الدسائس (ضد) hiylə qurmaq (*kimə qarşı* ضدّه)

- مَدْسُوسٌ 1) gizlicə qoyulmuş, dürtülmüş, soxulmuş, qatılmış (*məs., zəhər kimin xörəyinə* عليه ~); 2) yalandan kiminsə adına (عليه ~) çıxmaq (*məs., şeri*)

دَسْتٌ *c.* دُسُوتٌ 1) qazan; 2) dövlət vəzifəsi, mövqeyi; hökumətdə başçılıq; وزارة الداخلية ~ daxili işlər naziri vəzifəsi; تربّع في ~ السلطة *yaxud* تربّع على ~ الحكم hakimiyyət başına gəlmək; 3) kürsü; 4) qarnitur, dəst; 5) *şahm.* partiya; الـ~ لي oyun mənim xeyrimədir, mən uddum; الـ~ عليّ oyun mənim əleyhimədir, mən uduzdum

دَسْتَانٌ *c.* دَسَاتِينُ *mus.* ahəng, məqam, pərdə (*alətdə*), dil (*qarmonda*); qol (*tarda*); klaviatura

دَسْتَةٌ *c.* دَسْتَاتٌ, دُسَتٌ düjün; top (*parça*), bağlı (*kağız*); نصف ~ yarımdüjün; ورق اللعب ~ kart dəsti (*oyun kartları*)

دُسْتُورٌ *c.* دَسَاتِيرُ 1) konstitusiya, əsas qanun; 2) icazə; بلا ~ icazəsiz; özbaşına; ~ ك icazənizlə!; 3) nizam, qayda, norma; nümunə;

növbəsi; 8) sessiya; انعقاد البرلمان ~ parlament sessiyası; 9) silsilə; 10) mərhələ; 11) mərtəbə; 12) mahnı, ariya; nömrə (*konsert proqramının*); 13) rol; ...لعب دورا (كبيرا) في... -da/də (*böyük*) rol oynamaq; قام بـ~ حاسم في... -da/də həlledici rol oynamaq; اعجبه الممثّل في ~ عطيل Otello rolunu oynayan artist onun xoşuna gəldi

- دَوَرَان 1) dövri hərəkət; hərlənmə, fırlanma; çevirmə, döndərmə; dövr etmə, dolanma; tədavül; 2) dövran

- دَوْرَة c. دَوْرَات 1) dövrə; dövran; dövriyyə; رأس مال ~ kapital dövriyyəsi; الـ~ الدمويّة qan dövranı; الـ~ الدمويّة الكبرى (الصغرى) böyük (*kiçik*) qan dövranı dövrəsi; 2) dövr; الـ~ الجليديّة buzlaq dövrü; 3) silsilə; 4) növbə; 5) sessiya; ~ استثنائيّة fövqəladə sessiya; 6) növbəli əkin; ~ ثلاثيّة üçtarlalı əkin; ~ رباعيّة dördtarlalı əkin; و~ القطن دائما برسيم pambıqdan sonra həmişə yonca əkilər; 7) kurslar; 8) növbəti oyun, hoqqa; 9) *idm.* dövrə, raund; الـ~ الاولمبيّة olimpiada; ~ الماء (المياه) ayaqyolu; الـ~ الشهريّة aybaşı

- دَوْرِيّ 1) dövri; نشرة ~ـة dövri nəşr; الريح الـ~ـة musson; الحمّى الـ~ـة növbələnən titrətmə; 2) dairəvi, girdə, dairəşəkilli

- دُورِيّ *həmç.* ~ عصفور serçə

- دَوْرِيَّة c. ـات - 1) gözətçi dəstəsi, patrul, dolanma, baş çəkmə; 2) növbə (*istehsalatda*)

- دِيرَة yaşayış yeri; qaldığı yer

- مَدَار c. ـات - 1) ox, mil, qol; الخصام ~ mübahisə predmeti; المفاوضات ~ danışıqların mövzusu; 2) şanə; 3) tropik; mədar; السرطان ~ Xərçəng tropiki; الجدي ~ Oğlaq tropiki; 4) *astr.* orbit; الارض ~ Yerin orbiti; الـ~ المحسوب hesablanmış orbit; على ~ السنة bütün il boyu

- مَدَارِيّ orbital; قذائف ~ـة orbital mərmilər

- مُدَاوَرَة c. ـات - aldatma, yalan; hiylə, biclik; مباشرةً او مداورةً birbaşa *yaxud* dolayısı ilə

- مُدَوَّر girdə, dəyirmi, yumru, dairəşəkilli

- مُدِير c. مُدَرَاء 1) müdir, direktor; التشريفات ~ protokol şöbəsinin müdiri; مدير عام baş direktor; الجوقة ~ kapelmeyster, dirijor; 2) rektor; 3) müdir (*əyalətin başçısı*)

- مُدِيرِيَّة c. ـات - 1) əyalət, müdiriyyət; 2) departament, idarə (*İraq*); التربية و التعليم ~ maarif departamenti; السجون ~ həbsxanalar idarəsi

- مُسْتَدَار c. ـات - orbit

- مُسْتَدِير girdə, dairəvi; yumru

- مُسْتَدِيرَة c. ـات - *mus.* bütöv not

دَوْرَق c. دَوَارِق qrafin, su qabı

دَوْزَن sazlamaq (*musiqi alətini*)

- دَوْزَنَة , دُوزَان sazlama; شوكة (مفتاح) الـ~ kamerton

دُوزِنَة (*müq. et.* دُزَيْنَة) c. ـات – düjün

I (دوس) داس (u) دَوْس , دِيَاسَة 1) tapdamaq, tapdalamaq; ayaq basmaq; بالاقدام ~ ayaqlamaq; 2) basmaq, əzmək; رأس الافعي ~ ilanın başını əzmək; 3) döymək (*taxıl*)

- دَوَّاس 1) flaminqo; 2) şir

- دَوَّاسَة c. ـات - pedal

- دَوْس 1) tapdalama, ayaqlama; ayaq altına atma; 2) parıltı, pardax, cila, işıltı; 3) döymə, döyüm

- دَوْسَة 1) dövsə (*Livanda rəqs adı*); 2) *tar.* dini mərasim (*Qahirədə*)

- دِيَاسَة dövmə. dövüm

- دِيمَة c. دِيَم sıx meşə, orman; pöhrəlik, kolluq, cəngəllik

- مَدَاس c. أَمْدِسَة , مَدَاسَات 1) başmaq, çəkmə; 2) ayaqaltı (*çəkmətəmizləyənin*)



- مُدَاس 1) tapdalanmış, ayaq altına salınmış, pozulmuş; 2) əzilmiş

- مِدْوَاس c. مَدَاوِيس *yaxud* مِدْوَس c. مَدَاوِس 1) toxmaq, paya; 2) pedal

- مَدَاس = مَدُوس

دُوسِنْطَارِيَا dizenteriya

دُوسِيَّة c. دُوسِيَات , دُسْيَهَات iş, dosye

دُوش c. ـات - duş; أخذ ~ـا باردا soyuq duş qəbul etmək

I دَوَّش *xalq dil.* səs-küy qaldırmaq; qulaq batırmaq

- دَوْشَة səs-küy, hay-küy, qalmaqal, vəlvələ, mərəkə

- مُدَوَّش 1) hay-küy basmış, səs-küylə dolu; 2) qulağı batmış

دُوطَة cehiz

(دوغ) II دَوَّغ dağ basmaq, damğalamaq, nişanlamaq, nişan vurmaq

- دَاغ c. ـات - damğa, nişan

I (دوف) دَاف (u) دَوْف çalmaq, hazırlamaq (*dərman, macun və s.*)

I (دوق) دَاق (u) دَوْق (*müq. et:* ذَوْق); dadmaq, dadına baxmaq

- دَوْق dad

- دُوق c. ـات - hersoq

- دُوقِيّ hersoq -i/-ı

- دُوقِيَّة hersoqluq

I (دوك) دَاك (u) دَوْك ucadan, səs-küylə mübahisə etmək

- دَوْكَة hay-küy, vəlvələ, mərəkə

دُول *xalq dil.* bunlar

I (دول) دَال (u) دَوْل , دَوْلَة 1) keçmək, ötmək, ötüb keçmək; 2) öz mövcudluğunu bitirmək; دالت هذه الدولة bu dövlət öz mövcudluğunu bitirdi; 3) növbələnmək, bir-birini əvəz etmək; دالت له (عليه) الدولة tale ona yar oldu (*olmadı*); 4) yetişmək; II دَوَّل 1) beynəlmiləl etmək, beynəlmiləlləşdirmək; beynəlxalq xarakter vermək; 2) milliləşdirmək, dövlətinki etmək; III دَاوَل 1) müzakirə etmək; danışıqlar aparmaq; 2) əvəz etmək, dəyişmək; 3) növbələndirmək, bir-birini əvəz etmək; ...بين... و ~ növbə ilə birini başqası ilə əvəz etmək; بين يديه ~ bir əlindən o biri əlinə qoymaq; بين اصابعه حبّات السبحة ~ təsbehin dənələrini barmaqları arasında oynatmaq; IV أَدَال güc vermək (*kimasə başqa birisinə qarşı*); qələbəsini təmin etmək (*kimin üzərində* من); 2) ötürmək (*əldən-ələ*); 3) mövcudluğuna son qoymaq (*nəyinsə*); 4) buraxmaq, daxil etmək (*dövriyyəyə*); VI تَدَاوَل 1) tədavül etmək, tədavüldə olmaq (*pul*); 2) fikir mübadiləsi etmək, müzakirə etmək (*nəyi* في); danışıq aparmaq (*kiminlə* مع); في مشروع قانون ~ qanun layihəsini müzakirə etmək; 3) bir-birinə ötürmək, əldən-ələ vermək; 4) növbə ilə etmək (*nə isə*); növbə ilə gah bir işi, gah da başqa işi görmək; تداولته الايدي əldən ələ gəzmək; تداولته الالسن dildən-dilə gəzmək

- إِدَالَة qələbə

- تَدَاوُل 1) tədavül, işləmə, dövr etmə; 2) növbə; بالـ~ növbə ilə, bir-birinin ardınca

- تَدْوِيل 1) beynəlmiləlləşdirmə; beynəlxalq xarakter vermə; 2) milliləşdirmə

- دَوَالَيْك 1) növbə ilə; 2) dövri, vaxtaşırı; و هكذا ~ və ilaaxır

- دُوَل dəyişkənlik; tez-tez dəyişmə

- دَوْلَة c. دُوَل 1) dövlət; imperiya; اتحادية ~ *yaxud* تعاهدية ~ *yaxud* متعاهدة federativ dövlət; داخل (ضمن) ~ ~ dövlət içində dövlət; الدول غير المنحازة bitərəf dövlətlər, bloklara qoşulmayan dövlətlər; الدول الكبرى (العظمى)

böyük dövlətlər; مستقلّة ~ müstəqil dövlətlər; العليّة ~الـ Dövləti-aliyyə; ~الـ اركان dövlətin dayaqları; ~ رجل dövlət xadimi; صاحب ~الـ tar. sahibuddövlə (*baş nazirin titulu*); كانت الـ~ له tale ona yar olurdu; كانت الـ~ عليه tale ona yar olmurdu; الايّام دول zəmanə dəyişir.

- دَوْلِيّ dövlət -i/-ı
- دُوَلِيّ beynəlxalq, beynəlmiləl
- دُوَلِيَّة beynəlmiləlçilik; ~الـ İnternasional; الثالثة ~الـ 3-cü İnternasional
- دُوَيْلَة *c.* ات - dövlətcik, kiçik dövlət
- مُتَدَاوَل tədavüldə olan, dövriyyədə olan
- مُدَاوَلَة *c.* ات – 1) müzakirə; diskussiya; danışıq; غرفة الـ~ *hüq.* məşvərət otağı; 2) növbə; dəyişmə

دُولاَب *c.* دَوَالِيب 1) maşın; çarx; الكاوتشوك ~ şin (*avtomobilin*); الماء ~ suvarma çarxı; 2) şkaf, bufet; الكتب ~ kitab şkafı; الملابس ~ paltar şkafı; 3) hoqqa; ادخل المصنع ~ العمل zavodu işə salmaq; وقف (تعطّل) ~ الاعمال iş dayandı; وضع العصى في دواليب عجلة... -a/ə əngəl törətmək; و جرى ~ الزمن vaxt isə gedirdi

دُولاَر *c.* ات – dollar

دُولْمَة dolma

دُولُومِيت *min.* dolomit

I (دوم) دَامَ (u) دَوَام , دَيْمُومَة uzanmaq, davam etmək, çəkmək (*vaxt*); ما ~ حيًّا nə qədər ki, o sağdır...; II دَوَّمَ 1) hərlənmək, dolanmaq, fırlanmaq, dövrə vurmaq (*nəyin-kiminsə üzərində* فوق); 2) hərlətmək, fırlatmaq; III دَاوَمَ 1) davam etmək; 2) səy, inad, çalışqanlıq göstərmək (*nədə* على); 3) daima bir yerdə olmaq, vaxt keçirmək (*harada* في); IV أَدَامَ uzatmaq, davam etdirmək; النظر ~ uzun müddət baxmaq (*nəyə* الى); الله بقاءكم ~ Allah ömrünüzü uzun eləsin!; X إِسْتَدَامَ davam etmək, uzanmaq

- تَدْوِيم hərlətmə, fırlatma, dolama; حالة الـ~ *av.* ştopor (*təyyarəni hərləyə-hərləyə üzü-aşağı endirmə*)
- دَائِم daimi, davam edən; uzun çəkən; əbədi; *bot.* çoxillik; عمّال ~ون daimi fəhlələr; ~ـًا daim, daima; ابدا ~ـًا daima, durmadan; قهوة ~ة (qəhvəsiz olmayasız! *qəhvəyə qonaq edilərkən təşəkkür sözü*)
- دَائِمِيّ daimi (*İraq*)
- دَوَام 1) davam, sürəklilik; daimilik, davamiyyət; arasıkəsilməzlik; davamiyyət müddəti; دفتر الـ~ işə gəlib-getmənin qeydiyyat dəftəri; خارج اوقات الـ~ iş vaxtından kənar; ضرب عن الـ~ davamiyyəti kəsmək (*məs., məşğələlərə*); على الـ~ *yaxud* ~ـًا həmişə, daima; يا... لله الـ~! ey..., əbədi qalan ancaq Allahdır! (hamımız öləcəyik! *ölüm ayağında olana təskinlik sözləri*)
- دَوَامَة davamlılıq, sürəklilik, vaxtın keçməsi; في ~ المناقشات müzakirələr vaxtı
- دُوَّامَة , دَوَّامَة *c.* ات - fırfıra, fırlanğıc; الماء ~ *yaxud* المائيّة ~الـ burulğan, su burulğanı, qıjov; الهوائيّة ~الـ hava burulğanı; الذكر ~ dövrə vurub zikr edənlər, zikrə yığışanlar (*bax:* ذِكْر)
- دَوْم [1] sürəklilik, davamlılıq; əbədilik; ~ـًا daima
- دَوْم [2] *topl. bot.* 1) dom (*xurma ağacı növü*); 2) xurma növü
- دَوْمَة *c.* ات - 1) dom xurması ağacı; 2) dom xurması
- دِيمَة *c.* دِيَم uzun sürən, sürəkli yağış
- دَيْمُومَة [1] davamlılıq, sürəklilik
- دَيْمُومَة [2] *c.* دَيَامِيم səhra
- مُدَامَة , مُدَام şərab



- مُسْتَدِيم 1) daimi; 2) xroniki, uzunsürən

دُومَان sükan

- دُومَانْجِيّ *c.* دُومَانْجِيَّة sükançı

دُومِس gəminin sualtı hissəsi

دُومِنْيُون *c.* ات - dominion

دُومِين dövlət torpağı; dövlət əmlakı

دُومِينُو domino (*oyun*)

(دون) II دَوَّنَ yazmaq, yazıya almaq, qeyd etmək (*dəftərə*); qeydiyyata almaq; شرطا ~ şərt qoymaq; V تَدَوَّنَ yazılmaq, yazıya alınmaq, qeyd etmək; qeydiyyata alınmaq

- تَدْوِين qeyd, qeydiyyat
- دُونَ 1) qarşısında; tərəfində; حال ~ kiminsə qarşısında durmaq, kiməsə mane olmaq; قام ~ـه kiminsə tərəfini saxlamaq, kiməsə havadar çıxmaq; اغلق ~ـها باب العفو والغفران *məcaz.* əfv və bağışlama qapısını onun üzünə bağladı; 2) aşağı; altında; az; ليست المرأة ~ الرجل في الكفاءة qadın qabiliyyətdə kişidən aşağı deyildir; لم يكن ~ـها دهشا لدى رؤية هذا bunu görəndə o (*kişi*) heç də ondan (*qadından*) az dəhşətə gəlmədi; هو ~ عشرين سنة onun yaşı iyirmidən azdır; هذه حماقة ~ـها كل حماقة bu ən böyük axmaqlıqdır (*hərf.* bu elə axmaqlıqdır ki, onun yanında hər cür axmaqlıq kiçikdir); الاشعة ~ البنفسجيّة ultrabənövşəyi şüalar; الموجات ~ القصيرة ultraqısa dalğalar; 3) daha pis; انه ~ـنا في اكثر من ناحية o bir çox cəhətdən bizdən pisdir; 4) istisna etməklə; başqa, qeyri, savayı; ادنى تأخير ~ azacıq təxirə belə yol vermədən; اي اعتبار ~ ...ـًا a/ə heç bir etina göstərmədən; اي مبرّر ~ heç bir bəraətqazandırıcı səbəb olmadan; من ~ *yaxud* بـ~ -sız, -siz, -suz, -süz; بـ~ ان olmasın ki...; بـ~ شكّ şəksiz; ما ~ -sız, -siz, -suz, -süz; ~ـك! a) bu da sənin! al!; b) ehtiyatlı ol!; ان له ~ غيره التصرف في هذا bu, başqasının yox, ancaq onun sərəncamındadır; يتكشف هذا للقلب ~ العقل bu, ağıla deyil, qəlbə açılır; مات دون ان يكتب الوصيّة o, vəsiyyətini yazmadan öldü
- دُون aşağı, alçaq; الناس ~الـ aşağı təbəqələrdən olan insanlar
- دُونِيَّة hüquqsuz, məzlum vəziyyət
- دِيوَان [1] *c.* دَوَاوِين , دَيَاوِين 1) divan (*şerlər toplusu*); موسيقى ~ *mus.* oktava; 2) dəftərxana; dövlət müəssisəsi; idarə; رئيس الـ~ dəftərxana rəisi; الملكي ~الـ kral dəftərxanası (*Şim. Afrika*); التفتيش ~ *tar.* inkvizisiya
- دِيوَان [2] *c.* دِيوَانَات , دَوَاوِين 1) divan; taxt; 2) kupe; الحريم ~ qadınlar üçün kupe
- دِيوَانَة gömrükxana
- دِيوَانِيّ divani (*xətt növü*)
- دِيوَانِيَّة bürokratizm
- مُدَوَّنَات *c.* qeydlər
- دُونَانْمَة *c.* ات - donanma

دُونْكِيشُوتِيّ donkixotçu

- دُونْكِيشُوتِيَّة donkixotçuluq

دُونُم *c.* ات - donum (*910 $m^2$ bərabər sahə ölçüsü*)

دُونَانْمَة = دُونَنْمَة

I (دوي) دَوَى (i) دَوِيّ 1) səslənmək, səs gəlmək; uğuldamaq, fit vermək; guruldamaq; 2) yayılmaq, dolmaq (*nə ilə* بـ); دَوِيَ (a) دَوًى xəstələnmək, azarlamaq, naxoşlamaq; II دَوَّى 1) vızıldamaq, uğuldamaq; səs salmaq; 2) cingildəmək, səslənmək; III دَاوَى dava etmək, əlac, müalicə etmək; xəstəyə qulluq etmək; VI تَدَاوَى müalicə olunmaq, dava-dərman qəbul etmək

- دَاء *bax:* دواء
- دَاوٍ [1] *q.* دَاوِيَة səs-küylü; qulaqbatırıcı

- داو [2] *c.* دَوِيَّة *tar.* tampliyerlər
- دو *q.* دَوِيَّة təhlükəli, qorxulu (*xəstəlik haqqında*); bədxasiyyət (*şiş haqqında*)
- دَوَاء *c.* أَدْوِيَة dava, dərman; موضع الادوية aptek
- دَوَائِيّ 1) müalicə -i/-ı; müalicəvi; صناعة ـة~ əczaçılıq sənayesi
- دَوَاة *c.* دَوَيَات davat, mürəkkəbqabı
- دَوَايَة *c.* دَوَايَات mürəkkəbqabı
- دَوِيّ 1) səs-küy, uğultu; 2) əks-səda
- مُدَاو *q.* مُدَاوِيَة 1. müalicə edən; 2. həkim
- مُدَاوَاة müalicə, əlac, çarə; xəstəyə qulluq
- مَدْوِيّ səs-küylü, uğultulu; التصفيق الـ~ gurultulu alqışlar; شهرة ـة~ yayılmış şöhrət
- دُوَيْرِع *bax:* درع

دِيَالِيكْتِيك dialektika
- دِيَالِيكْتِيكِيّ dialektik; الطريقة الـ~ـة dialektik metod

دِيَالُوج *c.* ـات - dialoq

دِبْلُومَاسِيّ = دِيبْلُومَاسِيّ
- دِبْلُومَاسِيَّة = دِيبْلُومَاسِيَّة

دَيُّوث dəyyus

دَيْجَاة *c.* دَيَاج qaranlıq, zülmət (*müq. et:* دجو)

دَيْجُور *c.* دَيَاجِير bərk qaranlıq, zülmət
- دَيْجُورِيّ qaranlıq (*sif.*), zülmət (*sif.*)

دَيْدَبَان *c.* ـات - növbətçi, qarovul; *idm.* qapıçı; المركب ~ losman
- دَيْدَبَانِيَّة qarovulçuluq; növbə

دَيْدَن , دَيْدَان adət, vərdiş

دَيْر *c.* أَدْيَار , دُيُور , دُيُورَة , أَدْيِرَة , دِيَارَات monastır; الرهبان ~ kişi monastırı, rahiblər monastırı; الراهبات ~ qadın monastırı, rahibələr monastırı; رئيس الـ~ monastırın başçısı (*kişi*), iqumen; رئيسة الـ~ monastırın başçısı (*qadın*), iqumen
- دَيَّار 1) rahib; monastırda yaşayan; 2) kimsə
- دَيْرَانِيّ 1. monastır -i/-ı; 2. 1) Deyr əl-Qəmərdə doğulmuş; 2) rahib
- دَيْرَة *bax:* دور
- دَيْرِيّ monastır -i/-ı

دِيرِكْسِيُون sükan (*avtomobildə*)

دِيزَل dizel; مركبة الـ~ avtomatrisa; محرك الـ~ dizel mühərriki

دِيس *bot.* qamış, qarğı

دَيْسَم 1) *bot.* sabahgülü; 2) ayı balası

دِيسَمْبِر dekabr

دِيك *c.* دُيُوك , دِيَكَة xoruz; بَرِّيّ ~ qırqovul; حبشي ~ *yaxud* رومي ~ *yaxud* هندي ~ hind xoruzu; بيضة الـ~ *bax:* بَيْضَة; وزن الـ~ *bax:* وَزْن

دِيكَارْتِيّ Dekarteziançı, Dekartın ardıcılı

دِيكْتَاتُورِيَّة diktatura

دِيكْرِيتُو *c.* دِيكْرِيتَات dekret, fərman

دِيكُور *c.* ـات - dekorasiya, bəzək; مهندس ~ mühəndis-dekorator

دِيمَا , دِيمَى zolaqlı parça

دِيمَاغُوجِيّ 1. demaqoq -i/-ı; demaqoqcasına; 2. demaqoq
- دِيمَاغُوجِيَّة demaqogiya, demaqoqluq
- دِيمَاغُوغِيّ = دِيمَاغُوجِيّ

دِيمَاس *bax:* دمس

دِيمُوطِيقِيّ demotik; الكتابة الـ~ demotik yazı

دِيمُوقْرَاطِيّ 1. demokratik; لا ~ antidemokratik; 2. demokrat
- دِيمُوقْرَاطِيَّة 1) demokratiya; 2) demokratizm

دِيمُومَة *bax:* دوم

I (دين) دَان [1] (i) دَيْن 1) tabe olmaq, itaət etmək (*kimə* لـ); 2) borc almaq (*pul*); 3) borc vermək; 4) borclu olmaq (*kimə* لـ); دَان [2] (i) دِيَانَة دَيْن mühakimə etmək (*kimi*); دَان [3] (i) etiqad etmək (*hansı dinəsə* بـ); بدين الاسلام ~ islama etiqad etmək; III دَايَن borc vermək; IV أَدَان 1) ittiham etmək; məhkəməyə vermək; taqsırlı, müqəssir bilmək (*nədə* في); pisləmək; məhkum etmək (*nəyə* بـ); 2) borc vermək; V تَدَيَّن 1) etiqad etmək (*hansı dinəsə* بـ); dindar olmaq; 2) borca girmək; VI تَدَايَن bir-birindən borc almaq (*pul*); borca girmək; X إِسْتَدَان borc almaq; borca girmək; 2) borca almaq (*nəsə*)
- إِدَانَة 1) ittiham etmə; pisləmə; məhkum etmə (*nəyə* بـ); 2) taqsır, müqəssirlik, günahkarlıq
- تَدَيُّن dindarlıq; etiqadlılıq; imanlılıq
- دَائِن kreditor, kredit verən, borc verən
- دَائِنِيَّة *mühas.* kredit
- الدَّيَّان *din.* Hökm verən, Qəhr edən (Allah)
- دِيَانَة *c.* ـات - 1) diyanət, dini etiqad; 2) dini təlim; iman
- دَيْن *c.* دُيُون 1) borc; بالـ~ borca, kreditə; ارباب الديون *yaxud* اصحاب الديون kreditçilər, kreditorlar, borc verənlər; قضى ـه~ *məcaz.* o öldü; 2) istiqraz, istiqraz vərəqəsi; الـ~ الموحّد dövlət istiqrazı; عقد ~ـا istiqraz açmaq
- دِين *c.* أَدْيَان din, iman; الـ~ الحنيف islam; أصول الـ~ üsuliddin (*islamda*); katexizis (*xristianlıqda*); رجل ~ din adamı, ruhani; يوم الـ~ Din günü, Sorğu-sual günü, Qiyamət günü
- دَيِّن dindar, imanlı, mömin
- دَيْنُونَة sorğu-sual; Sorğu-sual günü, Qiyamət günü
- دِينِيّ dini; لا ~ qeyri-dini, qeyri-konfessional; allahsız, dinsiz, ateist; لا ~ـة ateizm
- مُتَدَيِّن = دَيِّن; غير ~ qeyri-mömin, qeyri-dindar
- مُدَان mühakimə olunmuş, məhkum edilmiş; pislənilmiş
- مُدَايِن kreditor, borcverən
- مَدَنِيّ *bax:* مدن
- مَدِين borclu (*kimə* لـ); هي ـة~ له o ona borcludur
- مَدِينَة *bax:* مدن
- مَدْيُون = مَدِين
- مَدْيُونِيَّة borc; *mühas.* debit

دِينَار *bax:* دنر

دِينَامُو dinamo-maşın

دِينَامِيت dinamit

دِينَامِيكَا dinamika; الحرارية ~ الـ termodinamika, istilik dinamikası; المائية ~ الـ hidrodinamika
- دِينَامِيكِيّ dinamik; الكهربائية الـ~ـة *bax:* كَهْرَبَائِيَّة
- دِينَامِيكِيَّة dinamiklik
- دِينَامِيَّة dinamika

دِيَة *c.* دِيَات qanbahası (*bax:* ودي)

دِيُورِيت diorit

# ذ

(ذَالٌ) ذ zəl (*ərəb əlifbasının doqquzuncu hərfi; rəqəm mənası 700*)

ذَا *q.* ذِي *yaxud* تَا *c.* أُولَاءِ bu; مَاذَا؟ axı nə? لِمَاذَا؟ nə üçün? مَنْ ذَا؟ axı kim? بِذَا *yaxud* لِذَا odur ki; ona görə; كَذَا belə, beləcə; كَذَا وَكَذَا belə-beləcə; bəs belə; bu belə, bu da belə; هٰكَذَا beləcə; هَا أَنَا ذَا! bu da mən!; هَا هُوَ ذَا! bu da o (*kişi*)!; هَا هِيَ ذَا! bu da o (*qadın*)!; ذَاكَ *q.* تَاكَ *c.* أُولَائِكَ o; ~ إِذْ o vaxt, onda; ذٰلِكَ *q.* تِلْكَ *c.* أُولَائِكَ o; həmin; بعد ذلك sonra, bundan sonra; sonralar; مع ذلك bununla yanaşı, buna baxmayaraq; وعلى ذلك buna görə; كَذٰلِكَ belə, beləcə, eləcə də, həmçinin, habelə; و ذلك bu da ki, məhz; yəni; odur ki; و ذلك ان لأن... odur ki...; هٰذَا *q.* هٰذِهِ *c.* هٰؤُلَاءِ bu

ذَاتٌ *c.* ذَوَاتٌ (*bax:* ذُو) 1. malik olan, sahib olan; 2. 1) malik olan, sahib olan (*qadın*); 2) sahibi olan, yiyələnmə predmeti; 3) şəxs, şəxsiyyət, subyekt; ذوات *həmç.* ذوات الحيثيّة heysiyyət sahibləri, heysiyyəti olanlar, tanınmış adamlar; ابن (بنت) الذوات tanınmış şəxslərin oğlu (*qızı*); اولاد الذوات tanınmış adamların uşaqları; atalarına (*analarına*) güvə-

özgün; بالـ~ a) məhz, tam, lap; b) mahiyyət etibarilə; c) şəxsən; ذات مرّة bir dəfə; ذات يوم *yaxud* في ذات يوم bir gün; يوم جميل ~ في gözəl bir gündə; ذات فجر bir səhər; ذات صباح bir gün səhər sübhdən; ذات صيف bir dəfə yayda; ذات عام bir il; ذات اليمين sağa; ذات الشمال sola; نفوس ~ *yaxud* صدور ~ niyyətlər, gizli fikirlər; الجنب ~ plevrit; الرئة ~ ağ ciyər iltihabı; البين ~ düşmənçilik, ədavət; ixtilaf; اليد ~ var-dövlət, əmlak; الاعجاب بالـ~ özünə-vurğunluq; انكار الـ~ özünüinkar, özünüunutma; الـ~ (حبّ) محبّة eqoizm, xudbinlik; الحيوانات ذوات الفقرات onurğalı heyvanlar; ذوات الاربع dördayaqlılar; المكان ~بـ həmin yerdə; في اليوم ~ و həmin gün; الوقت ~ في elə həmin vaxt

- ذَاتِيٌّ 1) şəxsi, xüsusi; الحكم الـ~ muxtariyyət; özünüidarə; 2) subyektiv; ~ـًا a) şəxsən; b) subyektiv olaraq; 3) avtomatik, özü...; التفريغ ~ özüboşalan; الحركة ~ özüyeriyən

- ذَاتِيَّةٌ 1) şəxs, şəxsiyyət; fərdilik; تحقيق الـ~ şəxsiyyətin müəyyən edilməsi; 2) fərdilik; müstəqillik; 3) subyektivlik; 4) əsllik; 5) subyektivizm

ذَاكَ *bax:* ذَا



I ذَلَمَ (ə) ذَلْمٌ 1) danlamaq, məzəmmət etmək; 2) xor baxmaq, nifrət etmək, zəhləsi getmək

- ذَلْمٌ 1) eyb, qüsur, nöqsan; 2) günah, pis iş

I ذَبَّ (ə/u) ذَبٌّ 1) qovmaq, qovlamaq; 2) qorumaq, müdafiə etmək (*kimi-nəyi* عن)

- ذُبَابٌ[1] *c.* أَذِبَّةٌ uc, tiyə, ağız; ülgüc; السيف ~ qılıncın tiyəsi

- ذُبَابٌ[2] *topl. c.* ذِبَّانٌ milçəklər; الخيل ~ mozalan, gikovun; مرض الـ~ *tib.* tripanosomoz

- ذُبَابَةٌ *c.* ـات 1) milçək; الخيل ~ atmilçəyi, mozalan; هندية ~ *zool.* qabarböcəyi; 2) uc, tiyə, ağız (*qılıncın* – السيف)

- مِذَبَّةٌ *c.* مَذَابُّ ,مِذَبَّاتٌ yelpik, milçəkqovan

ذُبَّانَةٌ ,ذِبَّانَةٌ *c.* ـات 1) milçək; 2) arpacıq, tüfəng qarovulu

I ذَبَحَ (ə) ذَبْحٌ ,ذِبَاحٌ 1) kəsmək; qurban kəsmək (*heyvanı*); II ذَبَّحَ kəsib doğramaq; qırıb tökmək, qılıncdan keçirtmək; VI تَذَابَحَ kəsmək, bir-birini qırmaq

- تَذَابُحٌ bir-birini qırma, qılıncdan keçirmə; qırhaqır

- ذَبِيحَةٌ = ذِبَاحٌ

- ذَبَّاحٌ qəssab, sallaq

- ذِبْحٌ qurbanlıq heyvan

- ذُبْحَةٌ ,ذُبَحَةٌ angina; صدرية ~ stenokardiya,

yırğalanmaq, titrəmək, əsmək; 2) tərəddüd etmək, qətiyyətsizlik göstərmək

- ذَبْذَبَةٌ 1) yellətmə, titrətmə, əsdirmə; 2) *c.* ذَبَاذِبُ tük qələm; qotaz, saçaq

- ذَبْذَبِيٌّ titrəyişli

- مُتَذَبْذِبٌ yellənən, əsən, titrəyən; ~ تيّار *bax:* تَيَّارٌ

I ذَبَلَ ,ذَبُلَ (u) ذُبُولٌ ,ذَبْلٌ solmaq, saralmaq, rəngi qaçmaq, süst olmaq

- ذَابِلٌ *c.* ذُبَّلٌ 1) solmuş, solğun, süst; 2) ağır, key, ölgün, yorğun

- ذَابُولٌ zabul (*mərcimək azarı*)

- ذُبَالَةٌ *c.* ذُبَالٌ fitil, piltə

- ذَبْلٌ qalxan, sipər, çanaq, qın; صناعيّ ~ süni tısbağa sümüyü; plastmas, plastik kütlə

- ذُبُولٌ solma; المتأخّر ~ الـ مرض qarğıdalı və pambıq azarının adı

ذَحْلٌ *c.* ذُحُولٌ ,أَذْحَالٌ *yaxud* ذَحَلٌ *c.* أَذْحَالٌ 1) intiqam alma, qisas alma; intiqam, qisas; 2) nifrət, intiqam ehtirası

I ذَخَرَ (ə) ذُخْرٌ toplamaq, yığmaq; tədarük görmək; II ذَخَّرَ yığmaq, ehtiyat saxlamaq, hazır saxlamaq; VIII إِذَّخَرَ *yaxud* إِدَّخَرَ yığmaq, yığıb saxlamaq; qənaət etmək, qənaət edib saxlamaq; ehtiyat saxlamaq; ...

*kils.* müqəddəs ənamlar; 3) ehtiyat; azuqə, ehtiyat ərzaq; اللغويّة ~الـ lüğət fondu, lüğət ehtiyatı; 4) *məcaz.* pay, xidmət; 5) patron, güllə; mərmi; döyüş sürsatı; حيّة ~ dolu mərmilər

- مَذْخَرٌ *c.* مَذَاخِرُ anbar, saxlanc
- مُدَّخِرٌ əmanətçi, yığan
- مُدَّخَرٌ (*həmç.* مُذَّخَرٌ) yığılan, ehtiyat üçün saxlanılan
- مُدَّخَرَاتٌ (*həmç.* مُذَّخَرَاتٌ) *c.* qənaət hesabına yığılmış şeylər; ehtiyatlar
- مَذْخُورٌ ehtiyat

I (ذرّ) ذَرَّ [1] (ə/u) ذَرٌّ sıçratmaq; səpmək, tökmək, boşaltmaq; ...ذرّ الخلاف بين... arasında çəkişmə, ixtilaf salmaq; الرماد (التراب) ~ في العيون gözə kül üfürmək; ذَرَّ [2] (ə/u) ذَرٌّ , ذُرُورٌ 1) doğmaq (*günəş haqqında*); 2) doğmaq, törəmək, əmələ gəlmək, yaranmaq, oyanmaq, meydana çıxmaq; قرن الخلاف ~ ixtilaf yarandı; قرن الازمة الاقتصاديّة ~ iqtisadi böhran başlandı; 3) cücərmək, yerdən bitib çıxmaq

- ذَرٌّ [1] *topl.* xırda qarışqalar
- ذَرٌّ [2] *topl.* toz zərrələri (*havada*)
- ذَرَّةٌ [1] xırda qarışqa
- ذَرَّةٌ [2] *c.* اتٌ - 1) hissəcik; ذرّات العرق tər damcıları; 2) toz zərrəsi (*havada*); 3) atom; بنية الـ~ atomun quruluşu; حرب الـ~ atom müharibəsi; محطمة الـ~ siklotron; مثقال ~ zərrə qədər; çox az, azacıq; bir damcı; فقد كل ~ من الحياء onun zərrə qədər həyası qalmayıb
- ذَرُورٌ 1. tozlandırılmış; 2. *c.* أذِرَّةٌ 1) toz; 2) səpmə dərman; toz dərmanı
- ذَرُورِيٌّ toz halında olan, tozaoxşar
- ذَرِّيٌّ 1. atom -i/-ı; radioaktiv; خطر ~ atom təhlükəsi; الرؤوس الـ~ـة atom başlıqları; الطاقة الـ~ـة atom enerjisi; العدد الـ~ atom sıra sayı; الغبار الـ~ radioaktiv toz; القنبلة الـ~ـة atom bombası; النظرية الـ~ـة atom nəzəriyyəsi; 2. atom mütəxəssisi
- ذَرِّيَّةٌ atomluq, valentlik
- ذُرِّيَّةٌ *c.* ذَرَارِيُّ törəmələr, uşaqlar, nəsil

I ذَرَأَ (ə) ذَرْءٌ yaratmaq, etmək

I ذَرِبَ (ə) ذَرَبٌ iti olmaq; لسانُهُ ~ dildən iti olmaq, ağzına gələni danışmaq

- ذَرَبٌ 1) çarəsiz xəstəlik; 2) ishal; 3) nalayiq, yava sözlər, ədəbsiz ifadələr
- ذَرِبٌ 1) iti; acı, zəhərli; اللسان ~ hərzə, yava-yava danışan, ağızdan yava

ذُرَّاحٌ *c.* ذَرَارِيحُ *tib.* qabarböcəyi

I (ذرع) ذَرَعَ (ə) ذَرْعٌ ölçmək (*qulacla*); بنظره ~ yaxud بعينه ~ a) diqqətlə baxmaq; göz qoymaq; b) gözləri ilə axtarmaq; الشوارع ~ على قدميه küçələri ölçmək; veyllənmək, avara gəzmək; الغرفة ذهابا و جيئة ~ otaqda o başbu başa gedib gəlmək, var-gəl etmək; ذَرِعَ (ə) ذَرَعٌ xahiş etmək (*kimdən* الى *yaxud* عند); V تَذَرَّعَ 1) bəhanə kimi istifadə etmək (*nədən* بـ); بحجّة ان... ~ belə bir dəlildən istifadə etmək ki...; 2) silahlanmaq (*nə ilə* بـ); بالصبر لـ... ~ ...üçün səbrini yığmaq; 3) əl atmaq (*nəyə* بـ); istifadə etmək (*nədən* بـ); 4) bəhanə gətirmək, özünə haqq qazandırmaq (*nə ilə* بـ); VII إنْذَرَعَ irəliləmək

- ذِرَاعٌ *q., k. c.* أذْرُعٌ , ذُرْعَانٌ 1) qol; dirsək; dirsək sümüyü; ذو ~ واحدة birqollu, təkqollu; ضيّق الـ~ əligödək, zəif; واسع الـ~ güclü; على ~ـها طفل صغير o (*qadın*) əliuşaqlıdır, əlində körpə uşağı var; فتح (مدّ) ذراعيه لـ... üçün qollarını açmaq; 2) *tex.* dəstə, sap, qulp; tutacaq; qol (*qaldırıcı kranın*); التوصيل ~ sürgü qolu; الادارة ~ çarx qolu; 3) qulac (*uzunluq*



*ölçüsü*); استنبولي ~ İstanbul qulacı (*0,66 m. bərabər uzunluq ölçüsü*); بلدي ~ bələdi qulac (*ticarətdə 0,58 m. bərabər uzunluq ölçüsü*); معماري ~ memar qulacı (*memarlıqda 0,75 m. bərabər uzunluq ölçüsü*); معماري مربّع ~ memar kvadrat qulacı (*0,5625 $m^2$ bərabər sahə ölçüsü*); معماري مكعّب ~ memar kub qulacı (*0,4218 $m^3$ bərabər həcm ölçüsü*); هاشمي ~ haşimi qulacı (*0, 64 m. bərabər uzunluq ölçüsü*); هندسة ~ həndəsə qulacı (*0,65 m. bərabər uzunluq ölçüsü*)

- ذَرْعٌ 1) uzanmış qolun uzunluğu; 2) güc; ضعيف الـ~ zəif; واسع الـ~ güclü; ضاق ~ـا zəifləmək, gücünü itirmək; ضاق بالامر ~ـا a) o buna tab gətirə bilmədi; b) onun buna gücü çatmadı; لقد ضقت بهم ~ـا onlar məni təngə gətiriblər, bezikdiriblər
- ذَرِيعٌ 1. 1) iti, sürətli, cəld, təcili; 2) qaçılmaz, labüd; خطر ~ qaçılmaz təhlükə; 2. 1) vasitəçi, araçı; 2) iltimasçı, müdafiəçi, havadar
- ذَرِيعَةٌ *c.* ذَرَائِعُ bəhanə; səbəb
- ذَرَائِعِيٌّ 1. mədhedici, müdafiəedici; 2. məddah, müdafiəçi

I ذَرَفَ (i) ذُرُوفٌ 1) axmaq, tökülmək (*göz yaşları haqqında*); 2) axıtmaq, tökmək (*göz yaşları*); ~ـت عيونه الدموع o, gözlərinin yaşını axıdır; II ذَرَّفَ 1) axıtmaq (*göz yaşları*); 2) ötmək (*nəyi* على), artıq olmaq (*nədən* على); على الخمسين ~ onun yaşı əllini ötüb, əllidən artıqdır; VII إنْذَرَفَ axmaq, tökülmək (*göz yaşları*)

I ذَرَقَ (i) ذَرْقٌ ifraz etmək (*quş haqqında*); IV أذْرَقَ = I

- ذَرْقٌ quş peyini; الطير ~ *bot.* yabanı yonca
- ذُرَقٌ = ذرق الطير *bax:* ذَرْقٌ

ذُرَةٌ qarğıdalı; رفيع ~ *yaxud* عويجة ~ *yaxud* بلدي ~ darı; kalış; بيضاء ~ darı; شاميّ ~ *yaxud* شاميّة ~ *yaxud* مصريّة ~ *yaxud* صفراء ~ qarğıdalı

I (ذرو) ذَرَا (u) ذَرْوٌ süpürüb aparmaq (*külək haqqında*); sovurmaq; dağıtmaq; səpələmək; ذَرَى (i) ذَرْيٌ = ذَرَا; II ذَرَّى = I; IV أذْرَى 1) sovurmaq, səpələmək; 2) atmaq, tullamaq; 3) axıtmaq (*göz yaşı*); V تَذَرَّى 1) sovrulmaq (*dən haqqında*); 2) qalxmaq (*zirvəyə*); 3) daldalanmaq, müdafiə olunmaq (*nə ilə* بـ); X إسْتَذْرَى himayə axtarmaq; بظلّ الشجرة ~ özünü ağacın altında kölgəyə vermək

- تَذْرِيَةٌ *geol.* süxurların parçalanması; ablyasiya
- ذَرَّايَةٌ *c.* اتٌ - (*həmç.* آلة ~) dənsovuran
- ذُرْوَةٌ , ذِرْوَةٌ *c.* ذُرًى 1) zirvə, təpə, kəllə; 2) *məcaz.* yüksəklik, ən yüksək hədd; مؤتمر الـ~ *dip.* zirvə toplantısı; فترة (أوقات) الـ~ «pik» vaxtı (*saatları*); هي في ~ جمالها o (*qız*) son dərəcə gözəldir; بلغ الـ~ في... -da/-də zirvəyə yetişmək; بلغ الـ~ الكبرى في تطوره o, inkişafının ən yüksək zirvəsinə çatmışdır; ارتفع الى ~ سامية ببطولته o öz qəhrəmanlığı ilə ən yüksək zirvəyə yüksəlmişdi
- ذَرًى sığınacaq, daladalanacaq; himayə
- مِذْرَاةٌ , مِذْرًى *c.* مَذَارٍ dənsovuran (*yaba, şana şəklində*)

I ذَعَرَ (ə) ذُعْرٌ 1) qorxutmaq, vahiməyə salmaq; 2) *məch.* qorxuya düşmək, vahiməyə düşmək; IV أذْعَرَ qorxutmaq, qorxuya, dəhşətə salmaq; VII إنْذَعَرَ qorxu hiss etmək, dəhşətə gəlmək

- ذُعْرٌ , ذَعَرٌ 1) qorxu, dəhşət; 2) təlaş, vahimə, vəlvələ, çaxnaşma
- ذُعَرَةٌ *zool.* çaydaçapan, daşadöyən
- مَذْعُورٌ qorxuya düşmüş, təlaş içində olan

ذُعَافٌ c. ذُعُفٌ öldürücü zəhər; موت ~ qəfil, gözlənilməz ölüm

I ذَعَنَ (ə) ذَعَنٌ itaət etmək, baş əymək, tabe olmaq (kimə لـ); IV أَذْعَنَ = I

- إِذْعَانٌ itaət etmə, baş əymə, tabe olma

- مِذْعَانٌ itaətkar, müti, boyun əyən, sözə qulaq asan

- مُذْعِنٌ itaətli, sözə baxan, müti

ذَفَرٌ üfunət, pis iy

ذَاقِنَةٌ c. ذَوَاقِنُ çənəaltı (skripkanın)

- ذَقَنٌ , ذَقْنٌ c. أَذْقَانٌ , ذُقُونٌ çənə; غرق حتّى الاذقان في... boğaza qədər ...-a/-ə girmək

- ذَقْنٌ q. c. ذُقُونٌ saqqal; التيس ~ keçi saqqalı; رخوة ـــه~ o, iradəsizdir, ağzıboşdur, zəif xasiyyətlidir; ... تحت ذقون رجال... nəfərlərinin gözü qabağında; ضحك على ـــه~ (ذقونهم) bığaltı gülmək

I ذَكَرَ (u) ذِكْرٌ , تَذْكَارٌ 1) yada salmaq, xatırlamaq, adını çəkmək; yadda saxlamaq; عدد يُذكر xeyli, əhəmiyyətli sayda; وهذا الامر لا يُذكر a) bu, boş şeydir; b) bunun adını çəkməyə dəyməz; الشيء بالشيء يذكر söz sözü çəkər; بالسوء ~ adını pisliyə çəkmək, dalınca danışmaq; 2) zikr etmək (Allahın gözəl adlarını çəkməklə Onu mədh etmək); 3) zikrdə iştirak etmək (bax: ذِكْرٌ); II ذَكَّرَ 1) yadına salmaq, xatırlatmaq; 2) nəsihət vermək, öyüd vermək; 3) döllәndirmək, mayalandırmaq; 4) qram. kişi cinsində vermək, kişi cinsinə salmaq; III ذَاكَرَ 1) müzakirə etmək; 2) əzbər öyrənmək, əzbərləmək (dərsi); IV أَذْكَرَ yadına salmaq, xatırlatmaq; V تَذَكَّرَ yada salmaq, xatırlamaq; VI تَذَاكَرَ 1) birgə müzakirə etmək; 2) bir yerdə yada salmaq (məs., keçmişdə olanları); 3) bir yerdə öyrənmək, təkrar etmək (dərsləri); VIII اِذَّكَرَ yaxud اِدَّكَرَ yada salmaq, xatırlamaq; X إِسْتَذْكَرَ 1) yada salmaq, xatırlamaq; yadına salmağa çalışmaq; 2) əzbər öyrənmək; əzbər yadda saxlamaq; درسه ~ dərsi əzbər öyrənmək, əzbərləmək

- تَذْكَارٌ c. ـاتٌ - 1) yada salma, xatırlama; ~ا له onu yad edərək; 2) suvenir

- تَذْكَارِيٌّ xatirəsinə həsr edilmiş; memorial; احتفال ~ yubiley; الطوابع الـ~ـة xatirə markaları; اللوحة الـ~ـة xatirə lövhəsi

- تَذْكَارْجِيٌّ c. تَذْكَارْجِيَّةٌ biletsatan; biletyoxlayan, biletəbaxan; konduktor (tramvayda, avtobusda)

- تَذْكِرَةٌ c. تَذَاكِرُ 1) bildiriş; xəbərdarlıq; 2) öyüd, nəsihət; 3) bilet; vərəqə; البريد ~ yaxud البوستة ~ poçt açıqcası; الدعوة ~ dəvətnamə; ذهاب و اياب ~ gedib-gəlmə bileti; الرصيف ~ perron bileti; السفر ~ yol bileti; العلاج ~ müalicə vərəqəsi; المرور ~ buraxılış vərəqəsi; النفوس ~ yaş kağızı, şəxsiyyət vəsiqəsi; الهويّة ~ şəxsiyyət vəsiqəsi; شبّاك التذاكر bilet kassası

- تَذْكَرِيٌّ konduktor (tramvayın, avtobusun)

- تَذْكِيرٌ 1) xatırlatma; 2) döllәmə, mayalama

- ذَاكِرَةٌ yaddaş, xatirə; سيبقى هذا في ـــه~ الى الابد bu əbədilik onun yadında qalacaqdır

- ذَكَرٌ [1] iti (qılınc)

- ذَكَرٌ [2] c. ذُكُورٌ , ذُكُورَةٌ 1) erkək; النحل ~ erkək arı; و أنثى ~ yaxud xalq dil. ذكر ونتايه a) erkək və dişi; b) çıxıntı və girinti; 2) kişi; 3) c. مَذَاكِيرُ , ذُكُورٌ anat. kişi cinsiyyət orqanı

- ذِكْرٌ c. أَذْكَارٌ 1) yada salma, xatırlama, adını çəkmə; الـ~ (سالف) متقدّم yuxarıda adı çəkilən; وعلى ~ هذا العمل نقول... bu iş barəsində danışarkən deyərik ki...; 2) yaddaş, xatir, xatirə; 3) xatirat; الـ~ سعيد yaxud الـ~ طيّب ruhu şad,



rəhmətlik (ölmüş adam haqqında danışarkən); 4) şöhrət, ad-san; 5) zikr (Allahın adını zikr etmə); حلقة الـ~ zikrə yığışanların dövrəsi; الـ~ الحكيم Quran

- ذِكْرَانِيٌّ kişi -i/-ı

- ذِكْرَةٌ , ذُكْرَةٌ 1) xatirə; 2) yaddaş, xatirə; 3) şöhrət, ad-san

- ذِكْرِيٌّ = ذُكْرَانِيٌّ

- ذِكْرَى q. c. ذِكْرَيَاتٌ xatirə; ذكريات الماضي keçmiş haqqında xatirələr; الـ~ الثالثة üçüncü ildönümü; الـ~ المئويّة yüz illik yubiley; إحياء ذكراه kiminsə xatirəsinə həsr olunmuş gecə keçirmə

- ذُكُورَةٌ kişi cinsinə mənsubluq; kişilik

- مُذَاكَرَةٌ 1) müzakirə; söhbət; 2) konfrans; 3) əzbərləmə

- مُذَكَّرٌ qram. müzəkkər, kişi cinsi

- مُذَكِّرٌ xatırladan, yada salan

- مُذَكَّرَاتٌ c. xatirat, xatirələr, qeydlər; gündəlik

- مُذَكِّرَةٌ c. ـاتٌ - 1) nota, memorandum; شفهيّة ~ dip. şifahi nota; məlumat vərəqəsi; 2) qeyd dəftərçəsi; التوقيف ~ həbs barəsində order

- مَذْكُورٌ 1) adı çəkilən, göstərilən; ادناه ~ aşağıda göstərilən; اعلاه ~ yuxarıda göstərilən; 2) əlamətdar

I ذَكَا (ذكو) (u) ذُكُوٌّ alovlanmaq, şölələnmək (alov haqqında); ذَكِيَ (ə) ذَكَاءٌ zəkalı olmaq, iti ağıl sahibi olmaq; II ذَكَّى 1) alovlandırmaq, qızışdırmaq; 2) kəsmək (qurbanlıq heyvanı); IV أَذْكَى 1) alovlandırmaq, qızışdırmaq; الحماس في النفوس ~ insanlarda ruh yüksəkliyi oyatmaq; مسدّسا ~ tapancadan atəş açmaq; 2) incələşdirmək, zərifləşdirmək; inkişaf etdirmək; X إِسْتَذْكَى şölələnmək (məs., alov) .

- ذَكَاءٌ 1) zəka, ağıllılıq, açıqgözlülük, fərasət; سرعة الـ~ tez başa düşmə, dərhal fəhm etmə; 2) ağıl

- ذَكِيٌّ [1] c. أَذْكِيَاءُ 1) zəkalı, fərasətli; 2) ağıllı; bacarıqlı; 3) dadlı

- ذَكِيٌّ [2] ətirli; iyli, raihəli; الرائحة ~ xoş raihəli, ətirli

I ذَلَّ (ə/i) ذُلٌّ alçaq, zəlil, rəzil olmaq; II ذَلَّلَ 1) alçaltmaq, zəlil etmək, hörmətdən salmaq; الفقر يذلّل كلّ جبّار kasıblıq əzəmətlini də zəlil edər; 2) aradan qaldırmaq; öhdəsindən gəlmək; الصعوبات ~ çətinlikləri aradan qaldırmaq; 3) tabe etmək, fəth etmək; 4) ram etmək (məs., atı); IV أَذَلَّ 1) zəlil etmək, alçaltmaq; 2) qalib gəlmək; 3) ram etmək (məs., atı); V تَذَلَّلَ 1) alçalmaq; yaltaqlıq etmək; 2) tabe olmaq; X إِسْتَذَلَّ 1) alçaltmaq, hörmətdən salmaq; 2) alçaq, zəlil, rəzil hesab etmək

- إِذْلَالٌ alçaltma, hörmətdən salma

- تَذَلُّلٌ özünü alçaltma, yaltaqlıq etmə, quyruq bulama

- تَذْلِيلٌ 1) alçaltma; 2) tabe etmə; 3) aradan qaldırma

- ذُلٌّ 1) zəlillik, alçaqlıq; 2) tabelik, itaətkarlıq; alçalma, köləcəsinə baş əymə, yaltaqlıq etmə

- ذَلَالَةٌ 1) zəlalət; 2) alçaqlıq

- ذِلَّةٌ alçalma, rüsvayçılıq, biabırçılıq

- ذَلُولٌ c. ذُلُلٌ minik dəvəsi

- ذَلِيلٌ c. أَذِلَّاءُ , أَذِلَّةٌ 1) zəlil, alçaldılmış; 2) müti, tabe olan; 3) alçaq, rəzil; كلب ~ söyüş. alçaq it

- مَذَلَّةٌ 1) alçalma, biabırçılıq, rüsvayçılıq; 2) alçaqlıq

I ذَلَقَ (u) ذَلْقٌ itiləmək, yonmaq

- ذَلَاقَةٌ 1) axıcılıq (nitqin); حروف الـ~ qram. süzgün, sonor, dilönü samitlər (ن، م، ب، ر، ف، ل); 2) itilik; اللسان ~ dilin itiliyi

- ذَلْقٌ 1) iti; 2) axıcı (*nitq*), süzgün; 3) zirək, canlı

- ذُلْقٌ uc (*dilin*); حروف الـ~ *qram.* = حروف الذلاقة *bax*: ذَلَاقَةٌ

- ذَلِقٌ = ذَلِيقٌ

- ذُلُقٌ = ذَوْلَقٌ

- ذَوْلَقِيٌّ dil -i/-ı; *qram.* = süzgün, dilönü; الـ~ـة الحروف = حروف الذلاقة *bax*: ذَلَاقَةٌ

ذُلْذُلٌ *c.* ذَلَاذِلُ ətək (*paltarın*)

ذلك *bax*: ذَا

I ذَمَّ (ə/u) ذَمٌّ məzəmmət etmək, danlamaq; pisləmək; II ذَمَّمَ 1) bərk məzəmmət etmək, danlamaq; pisləmək, söymək; 2) borca satmaq; V تَذَمَّمَ utanmaq; iyrənmək, özünə ayıb saymaq; VI تَذَامَّ bir-birini məzəmmət etmək

- ذِمَامٌ *c.* ـات - 1) öhdəlik; borc; حسن الـ~ düzlük, vicdanlılıq; 2) vəzifə, borc

- ذَمٌّ *c.* ذُمُومٌ məzəmmət, pisləmə; danlaq

- ذِمَّةٌ *c.* ذِمَمٌ 1) himayə; البنت على ~ـه qız onun himayəsindədəir; 2) müdafiə, mühafizə; 3) müahidə, razılaşma; 4) borc; في ~ـه onun boynunda olan (*borc*); باعه على ~... o, nəyisə ... hesabına satıb; 5) vicdan; عديم الـ~ vicdansız; في (على) ~ـي and olsun vicdanıma; 6) düzlük, vicdanlılıq; 7) məsuliyyət; 8) səlahiyyət; اهل الـ~ *tar.* əhli-zimmə (*müsəlmanların himayəsi altında olan yəhudi və xristianlar*); بالـ~ والصدق vicdanla və haqqına; اعتقل على ~ التحقيق *məch.* o, istintaq aparılmaq üçün həbs edilmişdir; اصبح في ~ التاريخ tarixin malı olmaq; هو على ~ التحقيق o, istintaq altındadır; هو في ~ المنون o ölmüşdür.

- ذِمِّيٌّ *tar.* zimmi, müsəlmanların himayəsi altında olan

- ذَمِيمٌ biabırçı, rüsvayçı; məzəmmətə layiq, töhmətə layiq, qınanılası; iyrənc, pis, xoşagəlməz

- مَذَمَّةٌ *c.* مَذَامُّ 1) pis xüsusiyyət; 2) pis hərəkət

- مَذْمُومٌ məzəmmət ediləsi, məzəmmətə layiq, töhmətləndirilən

I ذَمَرَ (u) ذَمْرٌ nərildəmək; V تَذَمَّرَ deyinmək, mırtıldanmaq, narazılıq etmək

- تَذَمُّرٌ deyinmə, mırtıldanma, narazılıq

- ذِمَارٌ 1) ən əziz şey (*müdafiə ediləsi*); 2) şərəf, ləyaqət

- مُتَذَمِّرٌ narazı

- ذَمِيلٌ yorğa yeriş (*dəvənin*)

I ذَمَى (i) ذَمْيٌ ölüm ayağında olmaq, son nəfəsini çəkmək

- ذَمَاءٌ ölümqabağı qıcolma, son nəfəsini çəkmə, can vermə

(ذنب) II ذَنَّبَ 1) cəzalandırmaq; 2) quyruq bağlamaq, quyruğ düzəltmək (*məs., çərpələngə*); IV أَذْنَبَ 1) günah işlətmək, günaha batmaq; 2) taqsırı olmaq, cinayət etmək; X إِسْتَذْنَبَ 1) günahkar hesab etmək; 2) cinayət başında tutmaq, ifşa etmək

- ذَنْبٌ *c.* ذُنُوبٌ 1) günah; 2) taqsır, qəbahət; 3) cinayət, pis iş

- ذَنَبٌ *c.* أَذْنَابٌ 1) quyruq; 2) quyruqbulayan, əlaltı; əlbir (*pis işdə*); ~ الثعلب *bot.* tülküquyruğu (*ot*); ~ الفار *bot.* amarant, siçanquyruğu; ~ القط *bot.* qızılsaç, qızılbaş, pişikquyruğu; ~ ابو *yaxud* ~ نجم ذو kometa (*quyruqlu ulduz*)

- ذَنَبِيٌّ quyruqlu

- ذُنَيْبٌ *bot.* gövdəcik, saplaq

- ذُنَيْبَةٌ züneybə (*darı növü*)

- مُذْنِبٌ 1. 1) günahlı; 2) taqsırlı; 2. 1) günahkar; 2) taqsırkar

- مُذَنَّبٌ *c.* ـات - kometa; رأس الـ~ kometanın başı



I ذَهَبَ (ə) ذَهَابٌ, ذُهُوبٌ 1) getmək; yola düşmək, yollanmaq; çıxıb getmək (*hara* الى); ~ كأمس الدابر itib-batmaq; ~ مع الريح *məcaz.* it-bat olmaq; zay olmaq; ~ ابعدَ من ذلك ...-dan/-dən uzağa getmək; ~ الى القول deməyə cəsarət etmək; ~ سدًى *yaxud* ~ عبثا boş (*əbəs*) yerə getmək; ~ ادراج الرياح *yaxud* ~ مع الرياح it-bat olmaq, zay olmaq, heçə getmək; ~ مذهبا a) bir məzhəbə tərəfdar olmaq, bir məzhəbin ardınca getmək; b) özünü aparmaq; ~ العلماء في ذلك مذاهب شتّى alimlər bu barədə müxtəlif rəylər söyləmişlər; 2) itib batmaq, heç olmaq; ~ ضياعا zay olmaq; ~ ضحية الانفجار partlayış qurbanı olmaq; 3) aparmaq, götürüb getmək (*nəyi* بـ); 4) məhv etmək, qırmaq (*nəyi* بـ); 5) inamla danışmaq, iddia etmək (*nə* الى); II ذَهَّبَ qızıla tutmaq; qızıl suyuna salmaq, qızıl suyu vermək; IV أَذْهَبَ 1) aradan qaldırmaq, yox etmək; kənar etmək; 2) aparmaq, götürüb getmək

- تَمَذْهَبَ *bax*: مذهب

- ذَاهِبٌ gedən, yox olan, gözdən itən; ~ الصبر səbrini itirmiş; ~ اللون rəngini itirmiş, solmuş

- ذَهَابٌ getmə, yola düşmə; ~ـا وايابا o başbu başa

- ذَهَبٌ qızıl; ~ خالص saf qızıl, xalis qızıl; الـ~ الاسود qara qızıl (*kömür və ya neft*); الـ~ الابيض ağ qızıl (*platin, pambıq və ya kauçuk*); ماء الـ~ qızıl suyu, zər; الـ~ السيّال neft; وقته من ~ onun vaxtı qızıldır

- ذَهَبِيٌّ 1) qızıl (*sif.*); 2) qızılı

- ذَهَبِيَّةٌ *c.* ـات - zəhəbiyyə (*Nil çayında yaşayış məqsədilə işlədilən gəmi*)

- مَذْهَبٌ *c.* مَذَاهِبُ 1) yol; hərəkət tərzi; davranış; 2) məzhəb, dini təlim; 3) əqidə məktəbi; ideologiya; nəzəriyyə; istiqamət; الـ~ العقلي rasionalizm; ~ الفرديّة fərdiyyətçilik; الـ~ المثالي idealizm; ~ النسبيّة nisbilik nəzəriyyəsi; الـ~ النقديّ التجريبيّ empiriokritisizm; الـ~ الواقعيّ realist istiqamət

- مُذَهَّبٌ qızıl (*sif.*), qızıl suyuna çəkilmiş; الـ~ـات المعلّقات Qızılı qəsidələr (*əhəmiyyətinə görə müəlləqələrdən sonra ikinci yerdə duran islamaqədərki yeddi qəsidə*)

- مَذْهَبِيٌّ 1) məzhəbə, dini təlimə aid olan; 2) ehkamlara, nəzəriyyə və məktəblərə aid olan; ideoloji; الصراع الـ~ ideoloji mübarizə

- مَذْهَبِيَّةٌ məzhəbçilik; məzhəb ayrı-seçkiliyi, məzhəb dağınıqlığı, təfriqəçilik

- مَذْهُوبٌ: ~ به ağlını itirmiş

I (ذهل) ذَهَلَ (ə) ذُهُولٌ, ذَهْلٌ unutmaq (*nəyi* عن); ذَهِلَ (ə) ذُهُولٌ özünü itirmək, pərt olmaq, utanmaq, sıxılmaq, çaşıb qalmaq; IV أَذْهَلَ 1) pərt etmək, heyrətə salmaq, təəccübləndirmək; 2) unutdurmaq (*nəyisə*); VI تَذَاهَلَ özünü (*nəyisə* عن) unutmuş kimi göstərmək; VII إِنْذَهَلَ heyrətlənmək, təəccüblənmək, özünü itirmək; pərt olmaq, çaşıb qalmaq

- ذَاهِلٌ özünü itirmiş, pərt olmuş, çaşıb qalmış

- ذَهْلَةٌ unutma anı, dalğınlıq anı

- ذُهُولٌ çaşqınlıq, pərtlik; donub qalma, quruyub qalma, mat qalma

- مُذْهِلٌ heyranedici, qeyri-adi, fövqəladə, fenomenal

- مُنْذَهِلٌ özünü itirmiş, çaşıb qalmış, donub qalmış

ذِهْنٌ *c.* أَذْهَانٌ 1) zehin, ağıl; حضور الـ~ zehinlilik, tez başa düşmə; 2) yaddaş, huş; أعاد الى الاذهان bir daha yada salmaq, xatırlatmaq; فلو عدنا باذهاننا الى... əgər fikrən ...-a/-ə qayıtsaq

- ذِهْنِيٌّ zehni, intellektual

- ذِهْنِيَّةٌ 1) zehniyyət; ağıl tərzi, dünyagörüşü; 2) ağıl səviyyəsi, əqli inkişaf, intellekt

ذُو (*yiy.h.* ذِي , *təs.h.* ذَا) *q.* ذَاتٌ (*bax: əlifba sırası ilə*) *c.* ذَوُو (*yiy.h. və təs.h.* ذَوِي) 1. malik olan, sahib olan; ذو اجنحة qanadları olan, qanadlı; ذو ضمير حيّ vicdanlı; ذو عقل ağıllı; رجل ذو قدم خشبيّة taxta ayaqlı adam; ذو عينين gözləri olan; ذو لحية saqqallı; ذو مال mal-dövlətli; المحرك ذو الاحتراق الداخليّ daxili yanacaq mühərriki; ذو معرفة bilikli, mərifətli; غير ذي معرفة biliksiz, mərifətsiz; ذوو الاقطاع feodallar; ذوو السمعة السيّئة pis ad-san sahibləri; ذوو الشأن maraqları olanlar; ذوو الكلمة söz sahibləri; ذو القربى qohum-əqrəba; من ذويها onun qohum-əqrəbası; هذا من ذي نفسه özündən; واد غير ذي زرع quru vadi; واضح لكل ذي عينين *məsəl.* gözü görən hər kəs üçün bu aydındır; 2. malik, sahib

- أَذْوَاءٌ (ذُو -*nun cəmi*) *tar.* adları ذو ilə başlanan Yəmən məlikləri

I (ذوب) ذَابَ (u) ذَوَبَانٌ ərimək, həll edilmək; يذوب قلبه الما لرؤية... görəndə onun ürəyi ağrıdan əriyir; ~ كمدا dərddən arıqlamaq, solub saralmaq; II ذَوَّبَ 1) əritmək, həll etmək; 2) yox etmək, ləğv etmək, heçə endirmək; IV أَذَابَ həll etmək, əritmək; X اِسْتَذَابَ ərtiməyə çalışmaq

- إِذَابَةٌ həll etmə; əritmə; əridilmə

- تَذْوِيبٌ 1) ərimə; əritmə; المعادن ~ metalların əridilməsi; 2) ləğv etmə

- ذَائِبٌ 1. əriyən; ərgin, ərimiş; 2. ərimiş kütlə

- ذَائِبِيَّةٌ ərimə qabiliyyəti; əriyə bilmə

- ذَوْبٌ duru, sıyıq bal

- ذَوَبَانٌ ərimə, duru hala keçmə; قابل للـ~ əriyən, əriyə bilən, əridilə bilən; həll edilə bilən

- مُذَابٌ əridilmiş, həll edilmiş

- مُذِيبٌ 1. əridən, həll edən; 2. əridici, həlledici

I (ذود) ذَادَ (u) ذَوْدٌ 1) qovlamaq (*nədən* عن); 2) müdafiə etmək (*nəyi* عن); عن حوضه ~ kimisə müdafiə etmək

- ذَائِدٌ *c.* ذَادَةٌ müdafiəçi

- ذَوْدٌ[1] müdafiə (*kimi* عن)

- ذَوْدٌ[2] *q. c.* أَذْوَادٌ kiçik sürü (*3-dən 10-a qədər dəvəsi olan*)

- ذِيَادٌ = ذَوْدٌ[1]

- مِذْوَدٌ *c.* مَذَاوِدُ təknə, çanaq, tabaq; axur

I (ذوق) ذَاقَ (u) ذَوْقٌ 1) dadmaq, dadına baxmaq; طعمه ~ tamına baxmaq; ذُقْ تَشْتَه iştaha diş altındadır (*hərf.* dadına bax-iştahaya gələrsən); 2) görmək, hiss etmək, acısını çəkmək, keçirmək; الامرّين ~ dərd-sər çəkmək; حلو الحياة و مرّها ~ həyatın şirinini-acısını görmək; مرّه وحنظله ~ *məcaz.* ağrı-acısını dadmaq; IV أَذَاقَ 1) dadızdırmaq; 2) keçirməyə məcbur etmək; dözdürmək; ـني المرّ ~ acısını dadızdırıb mənə; ـه الامرّين ~ ağrı-acı, dərd-sər çəkdirmək; V تَذَوَّقَ 1) dadmaq, dadına baxmaq, tamına baxmaq; 2) zövq almaq, zövq çəkmək

- ذَائِقٌ dadan, dadına baxan, tamına baxan; كل نفس ~ـة الموت hər bir kəs ölümü dadacaqdır (*Quran. – başdaşı yazısı*)

- ذَائِقَةٌ dad, tam; ləzzət, zövq

- ذَوَاقٌ dad, tam; ləzzət, zövq

- ذَوَّاقٌ zövqlü, yaxşı zövqü olan; الخمور ~ şərab dadıcısı, dequstatoru

- ذَوَّاقَةٌ çox xoşlayan (*nəyisə*); dadlı yemək sevən, şirniyyat sevən

- ذَوْقٌ *c.* أَذْوَاقٌ 1) dad, tam, zövq; الـ~ الحسن yaxşı zövq; الـ~ السليم sağlam zövq; الـ~ الرفيع incə zövq; حاسّة الـ~ dadbilmə; كل و ذوقه hər kəsin öz zövqü var; 2) meyil; həvəs, maraq; 3) tərz, üslub, ədəb, nəzakət, mərifət; بـ~ a) zövqlə; b) ədəblə, nəzakətlə; قلّة الـ~ zövqsüzlük, ədəbsizlik



- ذَوْقِيٌّ dadverici

- مُتَذَوِّقٌ zövq alan, ləzzət alan; متذوّقو الآداب ədəbiyyat estetləri

- مَذَاقٌ dad, tam, zövq, ləzzət; حلو الـ~ şirintam

- ذَوْلَقِيٌّ *bax:* ذلق

I ذَوِيَ (ə) ذَوًى , ذُوِيٌّ solmaq, qurumaq; IV أَذْوَى soldurmaq, qurutmaq, süst etmək

- ذَاوٍ *q.* ذَاوِيَةٌ solan, solğun, süst

ذَيَّا (ذَا -*dən kiçilt.*)

- ذَيَّاكَ (ذَاكَ -*dən kiçilt.*)

I (ذيع) ذَاعَ (i) ذُيُوعٌ yayılmaq, hamıya məlum olmaq, üstü açılmaq (*sirr haqqında*); IV أَذَاعَ 1) yaymaq (*məs., xəbərləri*); 2) göndərmək (*sərəncam və s.*); 3) elan etmək, nəşr etmək; 4) hamıya bildirmək, açıb demək; 5) xəbər vermək (*radiostansiya haqqında*)

- إِذَاعَةٌ 1) yayma, yayım; veriliş; لاسلكيّة ~ radio verilişi; 2) elan etmə, nəşr etmə

- إِذَاعِيٌّ 1. radio verilişləri ilə bağlı; الشبكة الـ~ـة radio verilişləri şəbəkəsi; خبير ~ radio verilişləri üzrə mütəxəssis; حملة ~ـة radioda aparılan kampaniya; 2. radio jurnalisti; radio verilişləri işçisi

- ذَائِعٌ 1) yayılan, verilən; 2) məlum olan; الصيت ~ çox tanınan, məşhur olan

- مِذْيَاعٌ *c.* مَذَايِيعُ 1. ünsiyyətli; çoxdanışan; 2. 1) *həmç.* كهربيّ ~ mikrofon; 2) meqafon

- مُذِيعٌ diktor

- مُذِيعَةٌ *c.* ـات - diktor (*qadın*)

(ذيل) II ذَيَّلَ 1) qurtarmaq; 2) tamamlamaq (*nə ilə* بـ); axırda əlavə etmək (*nə* بـ); son olaraq demək (*nə* بـ)

- ذَيْلٌ *c.* ذُيُولٌ , أَذْيَالٌ 1) quyruq; الفأر ~ *bot.* siçanquyruğu; الحصان ~ a) at quyruğu; b) *məcaz.* uzun saç (*qadının*); 2) son, axır; 3) ətək; şleyf; 4) əlavə; 5) nəticə; في ~ـه bilavasitə ondan sonra; طاهر الـ~ ləkəsiz, təmiz; طويل الـ~ varlı; اذيال الناس tör-töküntü, zir-zibil adamlar; جرّ اذيال الخيبة peşmançılıq çəkmək; خرج منه طاهر الـ~ sudan quru çıxmaq; سحب اذيال الخيلاء a) təşəxxüslə gəzmək; b) lovğalanmaq, təkəbbür satmaq; لاذ باذيال الفرار qaçmağa üz qoymaq; هرب يجرّ اذيال الخزي و العار rüsvayçılıqla və abrını ətəyinə alıb qaçmaq; حطّ ~ـه في اسنانه ətəyini dişinə alıb qaçmaq

- تَذْيِيلٌ əlavə

- ذَيْلِيٌّ quyruq -i/-ı

- مُذَيَّلٌ əlavəsi olan, əlavə ilə verilmiş (*məs., kitab haqqında* بـ)

I (ذيم) ذَامَ (i) ذَيْمٌ məzəmmət etmək, danlamaq

- مَذِيمٌ , مَذْيُومٌ məzəmmət edilən, danlanılan

# ر

ر (رَاءٌ) rā (*ərəb əlifbasının onuncu hərfi; rəqəm mənası 200*)

رَاتِينَجٌ qətran, kitrə

رَاجَا c. رَجْوَات raca

رَادَارٌ *radio.* radar, radiolokasiya qurğusu

- رَادَارِيٌّ radilokasiya -i/-ı

رَادِيَتَرٌ c. اتٌ - radiator

رَادِيكَالِيٌّ 1. radikal (*sif.*); 2. radikal, radikal partiya tərəfdarı

رَادِيُو 1) radio; الـ~ التلفونيّ radiotelefon; تلفونيّ ~ radiotelefon -i/-ı; الـ~ آلات radio aparatları; 2) c. رَادِيُوهَات radioqəbuledici

رَادِيُومٌ *kim.* radium; المعالجة بالـ~ radioterapiya

- رَادِيُومِيٌّ radium -i/-ı; الاشعاع الـ~ radioaktivlik

رَاشِيَتَةٌ c. اتٌ - resept, nüsxə

رَافِيَا rafiya (*xurma ağacı növü*)

رَامِي rami, Çin gicitkəni (*çatənə*)

رَهْنَامَجٌ = رَاهْنَامَجٌ

رَاوَنْدٌ ravənd (*kökündən dərman hazırlanan ot bitkisi, işlətmə dərmanı*)

رَايٌ ray (*xırda balıq növü*)

I رَأَبَ (a) رَأْبٌ 1) düzəltmək, təmir etmək; 2) nizama salmaq, sazlamaq

- تَرْوِيسَةٌ c. تَرَاوِيسُ başlıq

- رِئَاسَةٌ, رِئَاسَةٌ 1) başçılıq etmə; sədrlik etmə; prezidentlik etmə; منصب رئاسة الجمهوريّة respublika prezidenti mənsəbi, vəzifəsi; شغل كرسيّ الـ~ sədarət kürsüsünü tutmaq; rəyasət heyəti

- رِئَاسِيٌّ rəis, sədr, prezident -i/-ı; المقرّ الـ~ prezidentin iqamətgahı

- رَأْسٌ k., *nadir hal. q.* c. أَرْؤُسٌ, رُؤُوسٌ 1) baş; جلدة الـ~ baş dərisi; tükü ilə birlikdə soyulmuş baş dərisi; مرفوع الـ~ ucalmış başla; مطرق الـ~ başını aşağı salaraq; منكس الـ~ başını əyərək; وضعه على الـ~ başı üstünə qoymaq, hörmət göstərmək; عشرون ~ا من الغنم 20 baş qoyun; 2) başçı, rəis; على ~ ... başında; 3) başlanğıc; الجسر ~ *hərb.* a) körpuqabağı istehkam; b) əməliyyat meydanı; السنة ~ ilin başı, Yeni il; السلّم ~ pilləkənbaşı; الشهر القمريّ ~ qəməri ayının başı; القرن ~ əsrin əvvəli; 4) təpə, zirvə, kəllə; الزاوية ~ *riyaz.* Bucağın təpəsi; العمود ~ *memar.* sütun başlığı; 5) uc; الحربة ~ nizənin (*süngünün*) ucu; 6) burun; ~ا بـ~ başabaş (*mübadilə*); على رؤوس الاشهاد şahidlərin yanında, göz qabağında; على رؤوس الملأ açıq-aşkar, hamının gözü qabağında; على الـ~ و العين! baş üstə-göz üstə! böyük məmnuniyyətlə! على ~ !



المالي maliyyə kapitalı; المال المتبدل ~ dəyişən kapital; المال المتداول (المتحرك) ~ dövriyyə kapitalı; المال المصرفيّ ~ bank kapitalı; المال ~ المكتتب به abunə kapitalı; المال النقديّ ~ pul kapitalı, nağd kapital; المال الوهميّ ~ fiktiv kapital

- رَأْسَمَالٌ = رأس المال *bax:* رَأْسٌ

- رَأْسَمَالِيٌّ 1. kapitalist -i/-ı; المجتمع الـ~ kapitalist cəmiyyəti; غير ~ *yaxud* لا ~ qeyri-kapitalist -i/-ı; طريق التطوّر اللا~ qeyri-kapitalist inkişaf yolu; 2. kapitalist

- رَأْسَمَالِيَّةٌ kapitalizm

- رَأْسِيٌّ 1) baş (*sif.*); qabaqcıl; 2) dik, şaquli; perpendikulyar; احداثيّ ~ *riyaz.* ordinata

- رَأْسِيَّةٌ diklik, şaqulilik; perpendikulyarlıq

- رَئِيسٌ c. رُؤَسَاءُ 1. başda duran; 2. başçı, sədr, rəis; *həmç.* رَيِّسٌ kapitan (*gəminin*); *hərb.* kapitan; اركان الحرب ~ baş qərargah rəisi; اوّل ~ mayor; البلديّة ~ *yaxud* مجلس المدينة ~ bələdiyyə başçısı, mer; الجمهوريّة ~ respublika prezidenti; التحرير ~ baş redaktor; فخريّ ~ fəxri sədr; عامل ~ həqiqi (*faktik*) sədr; اللجنة التنفيذيّة ~ icraiyyə komitəsinin sədri; الوزراء ~ *yaxud* مجلس ~ الوزراء nazirlər şurasının sədri, baş nazir; الاساقفة ~ arxiyepiskop; الدير ~ iqumen; رؤساء روحانيّون ruhani başçıları, din xadimləri;

- رِئْمٌ c. آرَامٌ, أَرْآمٌ ağ ceyran

- رَؤُومٌ 1) çox sevən; الامّ الـ~ çox sevən ana; 2) əhliləşmiş, ələ öyrədilmiş

I رَأَى (a) (يَرَى) رَأْيٌ, رُؤْيَةٌ 1) görmək, sezmək; 2) *həmç.* في نومه ~ yuxuda görmək; 3) lazımlı, məqsədyönlü hesab etmək; 4) fikrində olmaq, fikirləşmək; أ تَرَانِي نسيتك؟ fikirləşirsən ki, səni unutmuşam?...نرى من الواجب ان özümüzə borc bilirik ki...; ولا اراني افشي سرًا ...اذا قلت düşünmürəm ki, ... desəm, sirr açmış olaram; رآه رأي العين *yaxud* رآه بعينيه kimisə öz gözü ilə görmək; من يعش يره yaşayan – görər; رُئِيَ ان... *məch.* belə məsləhət görüldü ki...; نور الدنيا ~ dünya işığı görmək, doğulmaq, dünyaya gəlmək; III رَاءَى *yaxud* رَآى 1) riyakarlıq etmək; yalandan özünü... göstərmək; 2) gözə çarpdırmaq üçün etmək; 3) bir-birilə görüşmək; IV أَرَى 1) göstərmək; 2) *məch.* fikirləşmək, düşünmək, fərz etmək; فأين هو يا تُرَى görəsən, o haradadır? تُرَى ماذا نفعل بهذا؟ görəsən, biz bununla nə edəcəyik; ... يا تُرَى *yaxud* (هل) تُرَانَا يا görəsən; أريه نجوما حمراء في عزّ الظهر mən onun dərsini verərəm! (*hərf.* mən ona günün günorta çağı qırmızı ulduzları göstərərəm!); V تَرَأَى hesab etmək, düşünmək, fərz etmək;

- رَأْيٌ[1] görmə, görmə qabiliyyəti; رأى رأي العين öz gözü ilə görmə

- رَأْيٌ[2] c. آرَاءٌ 1) baxış, rəy, fikir; في ~ـي fikrimcə; məncə; على ~ المثل atalar sözündə deyildiyi kimi; الـ~ العامّ ictimai rəy; تبادل الآراء fikir mübadiləsi; ذو رأيين qətiyyətsiz, ikiüzlü, riyakar; الـ~ صلب tərs, inadcıl; من ~ـه ان... onun fikri belədir ki...; لسنا من ~ـه لكن... biz onun kimi fikirləşmirik, amma...; وهل من ~ـك ان... heç fikirləşirsən ki...; ابدى ~ـه في... ...barəsində öz fikrini bildirmək; 2) ağıl, düşüncə; *fiqh.* sərbəst mühakimə, rəy; اصحاب الـ~ *yaxud* اهل الـ~ ağıl sahibləri, nüfuz sahibləri; 3) səs (*seçkilərdə*); استشاري ~ məşvərətçi səs; ابداء الـ~ بالنداء adbaad səsə qoyma; اخذ الـ~ səsə qoyma

- رَايَةٌ , رَأْيَةٌ c. ـاتٌ - bayraq

- رُؤْيَا q. c. رُؤًى 1) görmə; الهيّة ~ yuxugörmə vasitəsilə ilahi vəhy; سفر الـ~ *din.* Apokalipsis; 2) yuxugörmə, yuxu, röya

- رُؤْيَةٌ 1) görüntü; الغلسي ~ televiziya; 2) görünüş, görünmə; تعذّر الـ~ pis görünmə dərəcəsi

- رِئَاءٌ , رِيَاءٌ riya; riyakarlıq, ikiüzlülük; qeyri-səmimilik

- رِئَةٌ , رِيَةٌ *təsn.* رِئَتَانِ c. رِئَاتٌ , رِئُونَ *anat.* ağ ciyər; ذات الـ~ *yaxud* التهاب الـ~ ağciyər iltihabı; طاعون الـ~ ağciyər taunu

- رِئَوِيٌّ ağ ciyər -i/-ı; إلتهاب ~ ağciyər iltihabı

- رَئِيٌّ ruh, kabus

- مُرَاءٍ q. مُرَائِيَةٌ riyakar, ikiüzlü

- مُرَاءَاةٌ riyakarlıq, ikiüzlülük

- مِرْآةٌ c. مَرَاءٍ , مَرَايَا ayna, güzgü

- مِرْآيَةٌ c. مِرْآيَاتٌ ayna, güzgü

- مَرْأًى c. مَرَاءٍ görüntü, mənzərə; على مرأى الناس hamının gözü qarşısında; على مرأى منه onun gözü qarşısında

- مَرْئِيٌّ görünən, müşahidə olunan; غير ~ *yaxud* لا ~ görünməyən, görünməz; الجانب غير الـ~ من القمر (الشطر) Ayın gözə görünməyən tərəfi

- مَرْئِيَّاتٌ c. gözə görünənlər; علم الـ~ optika

I رَبَّ (ə/u) رَبٌّ 1) tərbiyə etmək, yetişdirmək; 2) bəsləmək, yedirtmək; II رَبَّبَ = I; V تَرَبَّبَ = I

- رَابٌّ 1) tərbiyəçi; 2) ögey ata, atalıq

- رَابَّةٌ c. ـاتٌ - 1) tərbiyəçi qadın; 2) ögey ana, analıq

- رَبٌّ c. أَرْبَابٌ 1): الربّ Rəbb; ربّاه! ya Rəbb!; رب الجنود ilah Savaof; ربّ العالمين Aləmlərin rəbbi (*Allah*); 2) ağa; 3) padşah; 4) sahib, sahibkar, başçı; ربّ العائلة ailə başçısı; ربّ العمل sahibkar, işverən; ارباب الاحتكارات monopolistlər, ihtikar sahibləri; ارباب الاقلام qələm sahibləri, yazıçılar; ارباب الاملاك mülk sahibləri, mülkədarlar; ارباب البنوك bank sahibləri; ارباب الحيثيّات yüksək məqam sahibləri; ارباب الديون kreditorlar, kredit sahibləri; ارباب الصنائع *yaxud* ارباب الحروف peşə sahibləri, sənətkarlar; ارباب المال kapitalistlər; ارباب المصانع zavod sahibləri; ارباب المعاشات təqaüdçülər; ارباب المعامل fabrik sahibləri

- رُبٌّ c. رُبُوبٌ meyvə şirəsi; mürəbbə, cem; ربّ الورق kağız kütləsi

- رُبَّ 1) tez-tez, çox vaxt, dəfələrlə; 2) olsun ki, bəlkə, mümkündür ki; رُبَّمَا a) olsun ki; b) bəzən, olur ki; و ربّ قائل يقول ان... bəlkə də kimsə deyəcəkdir ki...; ربّ ضارة نافعة şər deməsən xeyir gəlməz (*hərf. bəzən zərər mənfəətli də ola bilər*);

- رَبَابٌ , رَبَابَةٌ c. رَبَابَاتٌ rübab (*kamanla çalınan müsiqi aləti*)

- رِبَابَةٌ ağalıq



- رُبَّانٌ c. رَبَابِنَةٌ kapitan (*gəminin*); sükançı, rəhbər

- رَبَّانِيٌّ rəbbani, ilahi

- رَبَّةٌ c. ـاتٌ - 1) xanım; 2) sahibə; البيت ~ ev sahibəsi; الشعر ~ poeziya, şeriyyat ilahəsi; الجمال ~ (فينوس) gözəllik ilahəsi (*Venera*); الحسن ~ a) gözəl; b) gözəl qız

- رِبَّةٌ c. رِبَبٌ 1) xora (*çalımdan sonra bitən təzə ot*); البرسيم ~ yoncanın ikinci çalımı; 2) səpmə, səpki; qırmızı ləkələr (*bədəndə*); 3) c. رِبَبٌ , أَرِبَّةٌ *bot.* paxlalılar fəsiləsindən olan həmişəyaşıl ağac; 4) on min

- رَبُوبٌ ögey oğul, oğulluq

- رُبُوبَةٌ ağalıq, başçılıq, rəbbilik

- رُبُوبِيَّةٌ = رُبُوبَةٌ

- رِبِّيٌّ c. رِبِّيُّونَ *Quran.* rəbbpərəst, allahpərəst

- رَبِيبٌ c. أَرِبَّاءُ 1) yetişdirmə; 2) ögey oğul, oğulluq; 3) ögey ata, atalıq

- رَبِيبَةٌ c. رَبَائِبُ 1) yetişdirmə qız; 2) ögey qız, qızlıq; 3) ögey ana, analıq

- مُرَبَّةٌ c. ـاتٌ - mürəbbə; مائعة ~ marmelad

I رَبَأَ (ə) رَبْءٌ 1) boylanmaq (*yaxşı görmək üçün*); 2) izləmək (*nəyi* بـ); 3) axtarmaq (*nəyi* بـ); 4) yüksəlmək, ucalmaq (*nə üzərində* على , عن); 5) düzəltmək (*nəyi* بـ); 6) qaldırmaq (*nəyi* بـ); 7) həddən artıq hörmət etmək, uca tutmaq, yüksək qiymətləndirmək (*kimi-nəyi* بـ); اربأ بنفسي عن عمل كذا mən özümə hörməti bunu etməkdən uca tuturam; اربأ بنفسك (بك) من الجور mənim sənə o qədər hörmətim var ki, ədalətsiz olduğunu düşünə bilmərəm; نربأ بأنفسنا ان نردّ عليه بالمثل biz ona eynilə cavab verməyi özümüzə rəva bilmərik

- مَرْبَأٌ c. مَرَابِئُ müşahidə məntəqəsi

I رَبَتَ (i) رَبْتٌ vurmaq; şappıldatmaq; çırpmaq; tumarlamaq, sığallamaq; على الكتف ~ çiyninə vurmaq; II رَبَّتَ = I

- رَبْتَةٌ vurma, tumarlama, sığallama

I رَبِحَ (ə) رِبْحٌ 1) qazanc, gəlir götürmək; 2) udmaq; الوقت ~ vaxt udmaq; II رَبَّحَ 1) qazanc imkanı yaratmaq, qazandırmaq; 2) udmağa kömək etmək; IV أَرْبَحَ = I

- إِسْتِرْبَاحٌ c. ـاتٌ - tir, taxta

- رَابِحٌ 1) gəlirli, qazanclı, mənfəətli, faydalı, xeyirli; صفقة ~ـة mənfəətli sövdə; 2) udan, uduşlu; الارقام الـ~ـة uduşlu nömrələr (*lotereyada*)

- رَبَاحٌ qazanc, gəlir, mənfəət; و الصباح ~ sabaha çıxaq, baxarıq; səhərin şəri gecənin xeyrindən yaxşıdır

- رُبَّاحٌ c. رَبَابِيحُ *zool.* mandril (*Qvineya meymunu*); ~ زُرَيْقَاءُ *zool.* məməlilər fəsiləsindən olan viverra, genetta

- رِبْحٌ c. أَرْبَاحٌ 1) gəlir, qazanc; الـ~ الصافي xalis gəlir; المال ~ kapitaldan faiz; الـ~ المركّب mürəkkəb faizlər; الـ~ البسيط sadə faizlər; السهم ~ dividend; الارباح الاسطورية misli görünməmiş gəlir; الارباح الحرام haram qazanc; الارباح الفاحشة həddindən artıq gəlir, üstəlik qazanc; 2) uduş

- مُرَابَحَةٌ 1) ajiotaj; 2) birja oyunu; alıb-satma

- مَرْبَحٌ c. مَرَابِحُ qazanc, mənfəət, fayda

- مُرْبِحٌ qazanclı, faydalı, mənfəətli, gəlirli

I رَبَدَ (u) رُبُودٌ qalmaq, olmaq (*harada* بـ); V تَرَبَّدَ 1) buludla örtülüb qaralmaq (*səma*); 2) tutulmaq, tutqun, kədərli, qaşqabaqlı olmaq; IX إِرْبَدَّ boz rəng almaq, bozarmaq

- أَرْبَدُ q. رَبْدَاءُ c. رُبْدٌ boz, kül rəngində olan

- رُبْدَةٌ boz, kül rəngi

- مُرْبَدٌّ boz rəngdə olan; السحنة ~ tutqun, qaşqabaqlı, qəmgin

رَبْرَبٌ c. رَبَارِبُ sürü (*vəhşi inəklər; ceyranlar*)

I رَبَسَ (u) رَبْس vurmaq (*kimisə əllə*); ـــه بيديه kiminsə çiyninə vurmaq

I رَبَصَ (u) رَبْص güdmək, pusmaq; pusquda gözləmək (*kimi* ـــبـ); V تَرَبَّصَ pusmaq, gizlicə üzərində göz olmaq, gözdən qoymamaq (*kimi* ـــبـ, ـــلـ); به شرًا ~ kimə qarşısa şər qəsdində olmaq; به الدوائر ~ *bax*: دائرة

- مُتَرَبِّص pusan, güdən; ... كان ~ لـــ sayıq, ehtiyatlı olmaq; qulağı səsdə olmaq

I رَبَضَ (u) رُبُوض , رَبْض 1) uzanmaq, aşağı yatmaq, sərilmək; 2) pusmaq, güdmək

- رَبَض *c.* أَرْبَاض 1) ağıl; hasar, çəpər (*mal-qara üçün*); 2) ətraf, civar; kənar; ارباض القرية kəndin kənarı

- مَرْبِض *c.* مَرَابِض 1) ağıl, hasar, çəpər (*mal-qara üçün*); 2) yuva, yataq

I رَبَطَ (i, u) رَبْط 1) bağlamaq, birləşdirmək; bənd etmək; bərkitmək; saxlamaq; ـــه بقيد (بشرط) ~ kimisə hansısa bir məhdudiyyətlə (*şərtlə*) bağlamaq; لا يربط و لا يحل onun heç nəyə gücü çatmır; جأشه ~ soyuqqanlılığını saxlamaq; لسانه ~ kiminsə dilini-ağzını bağlamaq, kimisə susmağa məcbur etmək; صمتوا كأنّ ألسنتهم رُبطت الى اوتاد *bax*: وتد; 2) sarımaq (*məs., yaranı*); 3) müəyyən etmək, yazıb təsbit etmək, təyin etmək (*büdcə maddələrini, maaşı*); 4) öhdəsinə qoymaq; ödəməyə məcbur etmək (*kimi* على); 5) tutmaq (*vəzifə*); 6) *məch*. kişiliyini itirmək (*guya cadu nəticəsində*); II رَبَّطَ 1) bərk-bərk bağlamaq, bir neçə yerdən bağlamaq; 2) sarımaq (*məs.,*

...ı); III رَابَطَ 1) *hərb.* yerləşmək, mənzil ...q; yerləşdirilmək; 2) uzanmaq, yatmaq, ...b gizlənmək (*pusquda*); 3) soyuqqanlı ...q, özünü saxlaya bilmək; VI تَرَابَطَ ...-birilə bağlı olmaq; 2) sözləşmək,

sözü bir yerə qoymaq, razılaşmaq (*kimlə* مع); VII إِنْرَبَطَ əl-ayağı bağlı olmaq; buxovlanmaq, zəncirlənmək; VIII إِرْتَبَطَ bağlı olmaq, birləşdirilmək (*nə ilə* بـ)

- إِرْتِبَاط *c.* ـات - 1) bağlılıq; əlaqə, rabitə; خط الـــ ~ rabitə xətti; ضابط الـــ ~ rabitə zabiti; عن الـــ ~ *yaxud* بالـــ ~ *hüq*. dilbirlik, sözləşmə əsasında (*cinayət əməlləri*); 2) təəhhüd

- تَرَابُط 1) qarşılıqlı bağlılıq; həmrəylik, birlik; 2) qarşılıqlı əlaqə, rabitə

- رَابِط 1. bağlayan, birləşdirən; الجأش ~ soyuqqanlı, sakit; 2. rabitə, əlaqə

- رَابِطَة *c.* رَوَابِط 1) əlaqə, rabitə, münasibət; bağlayıcı halqa; تضمهم ~ واحدة onları ancaq bir şey bağlayır; 2) ittifaq, assosiasiya, liqa; الشرقية ~الـــ *tar*. Şərq liqası; 3) *c.* a) tellər; روابط لا تنفصم ayrılmaz tellər; روابط الصداقة dostluq telləri; b) *anat*. bağlar

- رِبَاط[1] *c.* رِبَاطَات , أَرْبِطَة 1) əlaqə; الزوجيّة ~ kəbin (*ər-arvadlıq*) bağları; 2) kəndir, ip; للأحذية ~ ayaqqabı bağı; 3) qısqac, sancaq; 4) *həmç.* الرقبة ~ *yaxud* العنق ~ qalstuk; 5) *c.* الجوارب ~ corabbağı, dizbağı; 6) bint, bandaj, sarğı, qurşaq

- رِبَاط[2] *c.* رُبُط , رِبَاطَات ribat, möhkəmləndirilmiş sərhəd məntəqəsi; karvansara; sufi ibadətgahı

- رَبَاطَة bağlılıq; الجأش ~ soyuqqanlılıq, sakitlik, səbir, dözüm, təmkin

- رَبْط 1) bağlama, birləşdirmə; bağ, bənd; 2) müəyyən etmə, təsbit etmə; الاجرة ~ maaş təyin etmə; الاموال ~ vergi qoyma; الميزانية ~

büdcədəki məbləğin maddələr üzrə bölüşdürülməsi; 3) *xalq dil*. bağlama (*cadu yolu ilə kişinin kişiliyini bağlama*); وحل ~ a) qadağan etmə və icazə vermə; b) hakimiyyət; c) nizam-intizam



- رِبَاط *c.* ـات - məhəllə (*şəhərdə*); şəhər kənarı (*Tunis*)

- رِبْطَة *c.* رِبَطَات , رِبَط 1) qablaşdırma, yığma, yığıb bağlama; 2) bağlı, bağlama, boğça, düyünçə; النقود ~ pul kisəsi; 3) sarıq, sarğı, bağ; الجوارب ~ corabbağı, dizbağı; الرقبة ~ *yaxud* العنق ~ qalstuk

- مُتَرَابِط 1) qarşılıqlı surətdə bağlı, əlaqəli; 2) səlis, düzgün, rabitəli

- مُرَابِط 1. keşikdə duran; الجيش الـــ ~ məhəlli ordu; 2. murabit; المرابطون *tar*. Əlmürabitilər; دولة المرابطين Əlmürabitilər sülaləsi

- مَرْبِط *c.* مَرَابِط mərək, heyvanın başını bağlamaq üçün yer; tövlə

- مَرْبُوط 1. bağlanmış, bağlı; 2. 1) büdcədə müəyyən edilmiş məbləğ; maaş, məvacib; 2) *xalq dil*. bağlanmış (*guya cadu yolu ilə kişiliyini itirmiş*)

- مُرْتَبِط bağlı, birləşdirilmiş (*nə ilə* بـ)

I رَبَعَ (ə) رَبْع 1) otlamaq (*yaz otunu*); 2) löhrəm, yortma yerişlə yerimək; 3) dördüncü olmaq; 4) nəyinsə dörddə bir hissəsini götürmək; 5) dördüncü gün təkrar olunmaq (*titrədib-qızdırma haqqında*); 6) durmaq, dayanmaq; qalmaq, gözləmək; 7) *idm*. ağırlıq qaldırmaq; II رَبَّعَ 1) dörd dəfə artırmaq, dörd dəfə çoxaltmaq; 2) *riyaz*. kvadrata yüksəltmək; 3) dördbucaqlı etmək; 4) dördqat bükmək (*nəyisə*); III رَابَعَ məhsulun dörddə birinə işləmək; V تَرَبَّعَ 1) oturmaq, oturdulmaq, əyləşdirilmək (*nəyin üstündə* على); على العرش ~ taxta çıxmaq; [illegible] ~ nə üzərindəsə başçı-

lığa nail olmaq; 2) bir ayağını o biri ayağı üstünə qoyub oturmaq; VIII إِرْتَبَعَ 1) otlamaq (*yaz otunu*); 2) yerləşmək, olmaq (*harada* في); X إِسْتَرْبَعَ bir ayağını o biri ayağı üstünə qoyub oturmaq

- أَرْبَاع *c.*: الناس ~ insan kütləsi, insan yığını, izdiham

- أَرْبَع , أَرْبَعَة dörd; اربع عشرة *yaxud* اربعة عشر on dörd; ذوات الـــ ~ dördayaqlılar; يوم الـــ ~ çərşənbə

- أَرْبِعَاء , أَرْبَعَاء : يوم الـــ ~ çərşənbə

- أَرْبَعُون qırx; الـــ ~ a) qırxıncı; b) ölümdən sonra qırxıncı gün; حلقة الأربعين kiminsə qırxı münasibətilə verilən məclis, qırx məclisi; عيد الاربعين *din. xrist*. Göyə çəkilmə bayramı; ام اربع و اربعين *zool*. qırxayaq

- أَرْبَعِينَات qırxıncı illər

- تَرْبِيع 1) dörd dəfə artırma; 2) *riyaz*. kvadrata yüksəltmə; dördə bölmə; 3) *astr*. rüb (*ayın rübü*)

- تَرْبِيعَة *c.* تَرَابِيع 1) kvadrat; 2) kaşı; üzlük daş; kafel; 3) pəncərə şüşəsi

- تَرْبِيعِيّ *riyaz*. kvadrat (*sif.*); الجذر الـــ ~ kvadrat kök

- رَابِع dördüncü; عشر الـــ ~ on dördüncü; الـــ ~ dördüncüsü

- رُبَاع dörd-dörd; dörd dəfə

- رَبَّاع ağır atlet, ağırlıq qaldıran

- رَبَاعَة löhrəm, yortma, dördəm (*yeriş*)

- رُبَاعِيّ 1. 1) dörd dəfə böyük, dörd dəfə artıq, dörddən ibarət; الاحرف ~ dördhərfli; الاضلاع ~ *riyaz*. dördtilli; الارجل ~ dördayaqlı; الهرم الـــ ~ dördbucaqlı piramida; 2) *geol*. dördüncü dövr təşkil edən; الدور الـــ ~ dördüncü dövr -i/-ı; 2. *mus*. kvartet; *ədəb*. rübai

- رَبَاعِيَة *c.* ـات - kəsici (*diş*), qabaq diş

- رُبَاعِيَّة *c.* ـات - *mus*. kvarta; *ədəb*. rübai; *riyaz*. kvaternion

- رِبْع dördgünlük müddət; حمّى الـــ ~ təkrarlanan titrədib-qızdırma

- رَبْع[1] ağırlıqqaldırma

- رَبْع [2] c. رِبَاع , رُبُوع 1) məskən, mənzil; böyük ev; yaşayış binası; 2) böyük qrup, kampaniya; 3) c. torpaq, ərazi; ربوع البلاد ölkənin ərazisi; ربوع اليمن Yəmən; ربوع العالم العربي ərəb aləmi (dünyası) əraziləri

- رَبْع [3] , رَبْعَة hamç. القامة ~ ortaboy; orta qamətli

- رُبْع c. أَرْبَاع 1) dörddəbir, dörd hissədən biri; الدائرة ~ astr., riyaz. kvadrant; 2) rüb; سنوي ~ rüblük, üçaylıq; 3) rüb (4 qədəhə قدح , yaxud 8,25 l. bərabər həcm ölçüsü)

- رُبْعَة c. رُبْعَات dörddəbir; rübə (1/4 qədəhə قدح 2, yaxud 0,5156 l. bərabər həcm ölçüsü)

- رُبْعِيّ kvartal (sif.), rüblük; مجلة ~ ـة ildə dörd dəfə çıxan jurnal, üç aydan bir çıxan jurnal

- رِبْعِيّ yaz (sif.), yazlıq

- رَبِيع c. أَرْبِعَة , رِبَاع 1) yaz, yaz fəsli; الاول ~ rəbiüləvvəl (qəməri təqviminin 3-cü ayı); الثاني ~ rəbiüssani (qəməri təqviminin dördüncü ayı); أمّ الربيعَين Ümmürrəbieyn (Mosul şəhərinin epiteti); ~ زهرة الـ bot. novruzgülü; 2) ot; 3) dost, həmtay

- رَبِيعَة c. رَبَائِع dinamometr

- رَبِيعِيّ yaz -i/-ı; الاعتدال الـ ~ gecə-gündüzün yaz bərabərliyi

- مُرَابِع yardar, məhsulun dörddəbirinə işləyən icarədar; فلاّح ~ məhsulun dörddəbirinə işləyən kəndli

- مُرَابَعَة məhsulun dörddəbirinə işləmə; نظام الـ ~ məhsulun dörddəbirinə yardarlıq

- مَرْبَع c. مَرَابِع 1) yaz mənzilgahı; yaz düşərgəsi; yaz köç yeri; الوطن ~ doğma torpaq, doğma yerlər; 2) zal, otaq; 3) çəmən, biçənək, otlaq

- مُرَبَّع 1. kvadrat; dördbucaqlı; 2. c. ـات - kvadrat; dördbucaq; şahm. dama; قائم الزاوية ~ düzbucaqlı; ~ شبه trapesoid; منحرف ~ riyaz. trapesiya; mətb. şpasiya; سحري ~ sehrli kvadrat

- مُرَبَّعَة c. ـات - məhəllə (şəhərin)

- مِرْبَعَة c. ـات - 1) qaldırıcı kran; 2) idm. ştanq

- مَرْبُوع hamç. القامة ~ ortaboylu

يَرْبُوع bax: əlifba sırası ilə

I رَبَغ (ə) رَبْغ xoşbəxt yaşamaq

- رَابِغ xoşbəxt; عيش ~ xoşbəxt həyat

- رَبَاغَة xoşbəxtlik

I رَبَق (u) رَبْق kəmənd atmaq

- رِبْقَة c. رِبَق , رِبَاق kəmənd, ilgək; حرّر الاقتصاد من ~ القيود الاستعمارية iqtisadiyyatı imperialist zəncirlərindən azad etmək; خلع ~ الطاعة لـ... kimsə qarşı üsyan etmək; هو على الحياة ~ o hələ sağdır

I (ربك) رَبَك (u) رَبْك 1) mürəkkəbləşdirmək, çətinləşdirmək, dolaşdırmaq; 2) qarışıqlıq törətmək, qarğaşalıq salmaq; 3) pozmaq; رَبِك (ə) رَبَك 1) çətinləşmək, dolaşmaq; 2) qarışıq düşmək; IV أَرْبَك qarışıqlıq törətmək, qarğaşalıq salmaq; çaşqınlıq doğurmaq; VIII إِرْتَبَك 1) dolaşmaq, çətinliyə düşmək; 2) dolaşıqlığa düşmək; çaşıb qalmaq; 3) pozulmaq, xarab olmaq, pərt olmaq

- إِرْتِبَاك 1) dolaşıqlıq, qarışıqlıq, qarğaşalıq; çətinlik; 2) çaşma, karıxma; çaşqınlıq; 3) pozğunluq, pərtlik, qanqaralıq

- رَبَك 1) çətinlik; 2) karıxma, pərtlik, çaşma

- رَبِك , مُرْتَبِك 1) dolaşıq; 2) çaşqın, pərt, karıxmış; cəsarətsiz; 3) kefi pozulmuş, pərişan

- رَبْكَة çaşma, karıxma

رَبَالَة köklük, doluluq, tosqunluq

- رَبْل c. رُبُول xora, çalımdan sonra bitən təzə ot

- رَبِل kök, dolu, tosqun

- رَبَلَة c. رَبَلَات baldır (ayağın); bud



- رَبِيل kök, dolu, tosqun

رَبُّون bax: əlifba sırası ilə

I (ربو) رَبَا (u) رُبُوّ artmaq, yüksəlmək; artıq olmaq (nədən على), ötüb keçmək (nəyi على); II رَبَّى 1) tərbiyə etmək; 2) becərmək, yetişdirmək (məs., bitki, heyvan); الفواكه بالسكر ~ cem hazırlamaq; III رَابَى böyük faizlə borca pul vermək; sələmçilik etmək; IV أَرْبَى artırmaq, ötüb keçmək (nəyi على); artıq olmaq (nədən على); V تَرَبَّى 1) tərbiyə almaq; 2) yetişdirilmək, becərilmək

- أُرْبِيَّة bax: əlifba sırası ilə

- تَرْبَوِيّ tərbiyəvi

- تَرْبِيَة 1) becərmə, yetişdirmə; الزهور ~ çiçəkçilik, gülçülük, çiçəkyetişdirmə; النباتات ~ bitkiçilik; المواشي ~ maldarlıq; الدواجن ~ quşçuluq; 2) inkişaf etdirmə; البدنية الـ ~ bədən tərbiyəsi; 3) tərbiyə; təhsil; علم الـ ~ pedaqogika; 4) tərbiyəlilik; nəzakət; قليل الـ ~ tərbiyəsiz

- تَرْبِيَوِيّ tərbiyəvi

- رَابٍ q. رَابِيَة yüksək, böyük

- رَابِيَة c. رَوَابٍ təpə, yüksəklik

- رِبًا 1) rüşvətxorluq; 2) sələmçilik; التعامل بالـ ~ müamiləçilik

- رِبَاء 1) rüşvətxorluq; 2) sələmçilik, müamiləçilik; الفاحش ~ həddən artıq faiz; اقرض الناس بالـ ~ insanlara böyük faizlə borc vermə

- رَبَاوَة c. ـات - yüksəklik, təpə

- رَبْو c. أَرْبَاء hamç. داء الـ ~ tibb. astma (sinəgir xəsətəliyi); الشعبي الـ ~ bronxial astma

- رُبْوَة , رَبْوَة c. رُبًى təpə, yüksəklik

- رِبْوَة c. رِبَوَات , رِبًى on min

- رِبَوِيّ 1) rüşvətxorluq -i/-ı; 2) sələmçilik -i/-ı

- مُرَابٍ q. مُرَابِيَة 1) rüşvətxor; 2) sələmçi, müamiləçi

- مُرَابَاة sələmçilik, müamiləçilik

- مُرَبٍّ c. مُرَبُّون mürəbbi, tərbiyəçi

- مُرَبِّيَة c. ـات - mürəbbiyə, tərbiyəçi

- مَرْبًى c. مَرَابٍ tinglik, şitillik; سمكي ~ balıqyetişdirmə müəssisəsi

- مُرَبًّى c. مُرَبَّيَات 1) mürəbbə, cem; 2) marmelad (hamç. müq. et: مُرَبَّة; bax: ربّ)

رِيبُورتَاج c. ـات - reportaj

رَبُون 1) girov, təminat; 2) beh, peşin, avans (hamç. müq. et: أُرْبُون və عُرْبُون)

I رَتّ (i/ə) رَتَت kəkələmək, pəltəkləmək, pəltək vurmaq; hıqqanmaq, dili dolaşmaq, dili tutulmaq, duruxa-duruxa danışmaq

- أَرَتّ q. رَتَّاء c. رُتّ 1. kəkələyən, pəltəkləyən; dili dolaşan; 2. kəkə, pəltək

- رُتَّة duruxma, tutulma

(رتب) II رَتَّب 1) tərtib etmək, qaydaya salmaq; nizamla düzmək; على الحروف الابجدية ~ əlifba sırası ilə yerləşdirmək; 2) hazırlamaq, yaxşı düzülmək; 3) təyin etmək; المسؤولية ~ üzərinə məsuliyyət qoymaq; 4) doğurmaq, səbəb olmaq (nəyə على); V تَرَتَّب 1) tərtib edilmək, qaydaya düşmək, yaxşı düzülmək; bir qayda ilə yerləşdirilmək; صفوفا ~ sıra-sıra düzülmək; 2) nəyinsə nəticəsində meydana çıxmaq, doğmaq; alınmaq, çıxmaq (nədən على)

- تَرْتِيب c. ـات - 1) hazırlama, yerləşdirmə; tərtib etmə; təşkil etmə; düzmə, sahmana salma; 2) tərtib, düzülüş, düzüm, yerləşmə, sahman; plan; بالـ ~ sıra ilə, tərtiblə, qayda ilə; على غير ~ qaydasız, nizamsız; هجائي ~ əlifba sırası; عدم الـ ~ nizamsızlıq, qaydasızlıq, səliqəsizlik; عديم الـ ~ nizamsız, qaydasız, səliqəsiz; التزم الـ ~ الذي... qaydanı gözləmək; 3) c. a) avadanlıq, təchizat; b) tədbirlər

- تَرْتِيبِيٌّ sıra -i/-ı; ~ عدد *qram.* sıra sayı
- رَاتِبٌ [1] düzgün, səlis, müntəzəm, monoton
- رَاتِبٌ [2] 1. düzəldilmiş, təsbit edilmiş, qoyulmuş, müəyyən edilmiş; 2. *c.* رَوَاتِبُ 1) təyin edilmiş şey, bir işi görmək üçün mükafat olaraq müəyyən edilmiş şey; الرواتب *yaxud* رواتب القرآن rəvatibi-Quran (*müəyyən günlərdə və vaxtlarda oxunan Quran ayələri və dualar*); dualar toplusu; 2) maaş, məvacib; تقاعدِيٌّ ~ təqaüd; ~الـ إمام daimi (*müəyyən mükafat müqabilində işləyən, ştatda olan*) imam; 3) ərzaq payı
- رَتَابَةٌ 1) mühafizəkarlıq, ətalət; 2) yeknəsəqlik
- رُتْبَةٌ *c.* رُتَبٌ pillə (*pilləkəndə*)
- رُتْبَةٌ *c.* رُتَبٌ 1) dərəcə; جامعيّة ~ elmi dərəcə; 2) rütbə, vəzifə, mənsəb; من نال ~ تغيّر سريعا *məsəl.* vəzifə alan tez dəyişər; 3) növ, keyfiyyət; 4) *riyaz.* mərtəbə; العشرات ~ onluqlar mərtəbəsi; المئات ~ yüzlüklər mərtəbəsi
- رَتَابَةٌ = رُتُوبَةٌ
- رَتِيبٌ 1) atil; 2) yeknəsəq, monoton; səlis, müntəzəm; ~ عيش yeknəsəq həyat
- مُرَتَّبٌ 1. hazırlanmış, tərtib edilmiş; 2. maaş, məvacib; شهرِيٌّ للطالب ~ stipendiya; ~ـا تقاضى maaş, məvacib almaq

[illegible]

mək; علیه الامر ~ çətinliyə düşmək; IV أَرْتَجَ bağlamaq, qıfıllamaq, kilidləmək; عليه ~ الكلام *məch.* çətinlik çəkə-çəkə danışmaq
- رِتَاجٌ *c.* رُتُجٌ alaqapı, darvaza
- مِرْتَاجٌ *c.* مَرَاتِيجُ taxta rəzə, cəftə, siyirmə

I رَتَعَ (ə) رُتُوعٌ 1) sərbəst otlamaq; 2) azad, sərbəst yaşamaq; nazlanmaq; atılıb-düşmək, oynayıb-gülmək (*uşaqlar haqqında*)
- مَرْتَعٌ *c.* مَرَاتِعُ 1) otlaq; 2) genişlik; sərbəstlik; 3) *həmç.* خصب ~ münasib, əlverişli zəmin (*nə üçün* لـ)

I رَتَقَ (i, u) رَتْقٌ təmir etmək, yamamaq; yamaq vurmaq, calamaq, tikmək
- رَاتِقٌ 1. yamayan, yamaq vuran; 2. yamaqçı
- رَتَقٌ 1) tikilmiş, calanmış, calanıb tikilmiş; 2) bütöv, tam

I رَتَكَ (u) رَتْكٌ yortmaq; yortma, löhrəm, yorğa qaçmaq
- مَرْتَكٌ *kim.* qurğuşun oksidi

(رتل) II رَتَّلَ oxumaq, avazla oxumaq (*Quran ayələrini*)
- تَرْتِيلٌ avazla oxuma; المزامير ~ zəburların avazla oxunması
- تَرْتِيلَةٌ *c.* تَرَاتِيلُ nəğmə; himn
- رَتَلٌ *c.* أَرْتَالٌ sıra; qatar, cərgə, düzüm; من الدبّابات ~ tank kolonnası

[illegible]



رُتُوشٌ retuş; بلا ~ bər-bəzək vurmadan
رَتِينَةٌ *c.* رَتَائِنُ *el.* metalqızdıran, metaləridən tor

I رَثَّ (i/ə) رَثَاثَةٌ köhnəlmək, dağılmaq, yırtılmaq; yeyilmək, işlənib xarab olmaq (*geyim*)
- رَثٌّ köhnəlmiş, çox geyilmiş; köhnə, yırtıq; *həmç.* الهيأة ~ üstü-başı tökülmüş
- رَثَاثَةٌ köhnəlmə, yeyilib xarab olma, dağılma, yırtılma
- رِثَّةٌ *bax:* وَرِثَ
- رِثَّةٌ *c.* رِثَاثٌ kör-köhnə, köhnə-kürüş, cırcındır; nimdaş paltar
- رَثَاثَةٌ = رُثُوثَةٌ
- رَثِيثٌ = رَثٌّ

I (رثو) رَثَا (u) رَثْوٌ , رِثَاءٌ ağlamaq, yas saxlamaq; acımaq, dərdinə şərik olmaq (*kimin* لـ); الميّت ~ ölmüş adamın üstündə ağlamaq; ه ~ بمرثاة kimin üçünsə mərsiyə deyib ağlamaq; رَثَى (i) رِثَاءٌ ağlamaq (*kimin üçünsə* لـ); halına acımaq; yasını saxlamaq; في حال يرثى له acınacaqlı halda
- رِثَاءٌ 1) ağlama, yas saxlama; 2) nekroloq; 3) mərsiyə
- رِثْيٌ 1) ağlama, yas saxlama; 2) təəssüf, acıma, dərdə şəriklik
- رَثْيَةٌ *tib.* artrit; podaqra
- مَرْثَاةٌ , [illegible]

- مُرْتَجٌّ əsən, titrəyən, silkələnən; ~ صوت titrəyişli səs

(رجا) IV أَرْجَأَ təxirə salmaq, başqa vaxta saxlamaq, möhlətini uzatmaq (*nəyə qədər* الى)
- إِرْجَاءٌ təxirə salma, möhlətini uzatma, başqa vaxta saxlama; ~الـ *tar.* mürciilər firqəsinin təlimi (*insan nəfsinin nicatı üçün təkcə imanın kifayət olması, böyük günah işlətmiş insanın isə cəzası haqqında hökmün təxirə salınması barədə*)
- مُرْجِئٌ təxirə salan; ـة~الـ *topl. tar.* mürciilər

I رَجَبَ (u) رُجُوبٌ qorxmaq (*kimdən-nədən – təs.h. yaxud* من)
- رَاجِبَةٌ *c.* رَوَاجِبُ oynaq (*əlin*)
- رَجَبٌ rəcəb (*qəməri təqviminin 7-ci ayı-30 gündür*)

I رَجَحَ (ə) رُجُوحٌ 1) ağır gəlmək, artıq gəlmək; üstün gəlmək; 2) bir şeyin ağırlığını əllə yoxlamaq (بيده); II رَجَّحَ 1) ağır, artıq gəlməyə kömək etmək; üstünlük vermək; 2) fərz, güman, təxmin etmək; fərziyyə, ehtimal irəli sürmək; ...أن يرجّح *məch.* çox güman ki..., ehtimala görə...; üstünlük vermək (*nəyə* على); yelləmək, yırğalamaq (*körpəni*); IV أَرْجَحَ tərəzinin gözünü ağır gəlməyə məcbur etmək; üstünlük vermək; V تَرَجَّحَ

[illegible]

– أَرْجَحِيَّة artıq gəlmə, ağır gəlmə, üstün gəlmə; üstünlük; artıqlama, ötüb keçmə

– أُرْجُوحَة *c.* أَرَاجِيح 1) yelləncək; 2) beşik, nənni; 3) *idm.* trapesiya

– تَرْجِيح 1) üstünlük vermə; 2) ehtimal, güman, fərz

– رَاجِح daha ağır, daha artıq, daha üstün, daha çox ehtimal olunan; والـ~ ان ehtimal ki; ~ عقل üstün ağıl

– رَجَاحَة həlimlik, mülayimlik, yumşaqlıq, sakitlik; ciddilik; العقل ~ ağıl üstünlüyü

– رُجَّاحَة 1) yelləncək; 2) beşik, nənni; 3) qamak (*tor yelləncək*)

– رُجْحَان ağır gəlmə, artıq gəlmə; üstün gəlmə

– رُجْحَانِيَّة : الـ~ *fəls.* probabilizm

– رَجِيح əla, üstün; ~ عقل üstün, sağlam ağıl

– مُرَجِّح üstünlük verən; ~ صوت həlledici səs

– مَرْجُوحَة , مَرْجِيحَة *c.* مراجيح = رُجَّاحَة

I رجد (u) رَجْد dərzləri xırmana yığmaq

رَجْرَجَ 1) əsmək, titrəmək; 2) tez hərəkət etmək; تَرَجْرَجَ 1) əsmək, titrəmək; 2) hərəkət etmək, tərpənmək

– رَجْرَاج 1) titrəyən, əsən; ~ حور ağcaqovaq; 2) hərəkət edən, oynaq, mütəhərrik; ~ بحر dalğalanan, çalxalanan dəniz

– رَجْرَجَة əsmə, titrəmə; tərəddüd etmə

(رجز) III رَاجَزَ rəcəz bəhrində şerlərilə deyişmək (*bax:* رَجَز); VIII إِرْتَجَزَ 1) rəcəz bəhrində şerləri deklamasiya etmək, oxumaq; rəcəz bəhrində şerlər yazmaq; 3) guruldamaq (*ildırım*)

– أُرْجُوزَة *c.* أَرَاجِيز rəcəz bəhrində yazılmış şer

– رَجَز rəcəz (*şer bəhri*)

– رِجْز , رُجْز *c.* أَرْجَاز 1) cəza (*Allahın göndər*[illegible]); 2) çirk, murdarlıq

I (رجس) رَجَسَ (ə) رَجِسَ yaxud رَجُسَ (u) رَجَاسَة özünü ləkələmək; çirklənmək, çirkaba batmaq; murdarlanmaq; رَجَسَ (u) رَجْس 1) bağırmaq (*dəvə*); 2) şırıldamaq (*yağış*); 3) guruldamaq (*ildırım*)

– رَجَّاس bağıran; guruldayan; şırıldayan

– رَجَس 1) çirk, kir, murdarlıq; 2) murdarlama

– رِجْس *c.* أَرْجَاس 1) çirk, kir; murdarlıq, iyrənclik; 2) çirkin hərəkət; günah iş

– مِرْجَاس *c.* مَرَاجِيس lot (*dənizin dərinliyini ölçmək üçün cihaz*)

I رَجَعَ (i) رُجُوع 1) qayıtmaq, geri dönmək; الى صوابه ~ ayılmaq, özünə gəlmək; بخفي ~ حنين *məsəl.* boş əllə qayıtmaq, damaq qalmaq; 2) yenidən başlamaq (*nəyə* الى); qaytarmaq (*nəyi* بـ); 3) müraciət etmək (*kimə-nəyə* الى); istinad etmək, əsaslanmaq (*nəyə* الى); 4) gedib çıxmaq, aid olmaq, müncər edilmək (*nəyə* الى); 5) tərk etmək, atmaq (*nəyi* عن); عن عزمه ~ əzmindən dönmək; في كلامه ~ sözündən dönmək; (اعقابه) على عقبه ~ *bax:* عقب; 6) yaxşı təsir göstərmək (*kimə* في); düşmək, faydalı olmaq (*məs., dərman – kimə* في); II رَجَّعَ 1) qaytarmaq; 2) təkrar etmək, əks etdirmək (*əks-səda*); 3) oxumaq, zü tutmaq, dəm tutmaq; III رَاجَعَ 1) bir daha qayıtmaq (*nəyəsə*); təkrar etmək; دروسه ~ dərslərini təkrar etmək; سؤاله بينه وبين نفسه ~ özü-özünə təkrar-təkrar sual vermək; 2) yenidən qaytarmaq (*nəyisə*); 3) müraciət etmək (*nəyəsə*); məsləhətləşmək, məsləhət üçün müraciət etmək (*nə barədə* في); رَاجِع (*həmçinin* إِرْجِع) *bax* (*qaynaq göstərərkən*); 4) yoxlamaq (*məs., giriş biletlərini*); 5) məlumat üçün baxmaq (*arayış kitabına*), soraqlaşmaq, soraq etmək (*nə barədə* في); 6) baxmaq,



nəzərdən keçirmək (*senzura haqqında*); 7) *hüq.* yenidən baxmaq (*işə*); 8) əks olunmaq, təkrar olunmaq (*əks-səda*); IV أَرْجَعَ 1) qaytarmaq; الشيء الى اصوله ~ təhlil etmək; 2) aid etmək, aparıb çıxarmaq (*zaman etibarilə nəyəsə* الى); izah etmək (*nə ilə* الى); 3) əl çəkməyə məcbur etmək, döndərmək (*nədən* عن); عن قراره ~ kimisə qərarından döndərmək; VI تَرَاجَعَ 1) geri çəkilmək; 2) geriləmək; VIII إِرْتَجَعَ 1) geri getmək; geri çəkilmək (*nədən* عن); 2) geri qaytarmaq, yenidən özünə qaytarmaq; X إِسْتَرْجَعَ 1) qaytarılmasını tələb etmək; geri çağırmaq; geri qaytarmaq; ذكريات ~ xatirələri canlandırmaq, yada salmaq; عافيته ~ sağalmaq, sağlamlığını bərpa etmək; دروسه ~ dərslərini təkrar etmək; 2) geri almaq; نفسه ~ özünə gəlmək (*məs., qorxudan sonra*); 3) انا لله وانا اليه راجعون «*biz Allaha məxsusuq, Onun da yanına qayıdacağıq*» sözlərini demək

– إِرْتِجَاع 1) geri qayıtma; 2) *siy.* irtica

– إِرْتِجَاعِيّ 1. mürtəce; 2. irticaçı

– إِسْتِرْجَاع nəyinsə qaytarılmasını tələb etmə; geri alma

– تَرَاجُع geri çəkilmə, dönmə; ~ خط geri çəkilmə xətti

– تَرْجِيع 1) nəqarət; 2) təkrar etmə; 3) qaytarma (*nəyisə*)

– رَاجِع qayıdan; qayıdış -i/-ı; الحمى الـ~ـة növbələnən titrədib-qızdırma

– رَجْع qayıtma, qaytarma; الصوت ~ əks-səda; البصر ~ في bir göz qırpımında

– رَجْعَة 1) qayıtma, qaytarma; [illegible] ~ لا *yaxud* لى غير ~ *yaxud* [illegible] ~ qayıtmaz, dönməz, qaytarılmaz; biryolluq, həmişəlik; 2) geri çəkilmə (*qoşunun*); ~ خط geri çəkilmə xətti; 3) *siy.* irtica; 4) qəbz; 5) *biol.* atavizm; 6) *din.* metempsixoz (*öləndən sonra qayıtma*)

– رُجْعَة *c.* رُجُعَات qəbz

– رِجْعَة *fiqh.* talağı verilmiş qadının yenidən arvadlığa qaytarılması

– رُجْعَى = رَجْع

– رَجْعِيّ 1. 1) geri qayıdan; reqressiv; 2) *siyas.* mürtəce; 3) əks təsirə malik olan (*qanun haqqında*); ~ أثر *fiqh.* əks təsir; 2. irticaçı

– رَجْعِيَّة 1) irticaçılıq, mürtəcelik; 2) *siy.* irtica; غلاة الـ~ ifrat irticaçılar; 3) *fiqh.* əks təsir

– رُجُوع qaytarma, qayıtma; müraciət etmə (*nəyə* الى); فحم ~ kül, şlak, pasa

– رَجِيع 1. qaytarılmış; qalan; فحم ~ kül, şlak, pasa; 2. peyin, ifrazat; tullantı, törtöküntü

– مُرَاجِع müfəttiş, yoxlayıcı, nəzarətçi

– مُرَاجَعَة 1) baxma, nəzərdən keçirmə; baxış; 2) yoxlama, tutuşdurma; 3) müraciət (*nəyə*); məsləhət; الـ~ كتاب arayış kitabı; 4) *fiqh.* yenidən baxma (*işə*); 5) təftiş, yoxlama, nəzarət

– مَرْجِع *c.* مَرَاجِع 1) instansiya, məqam, dairə, orqan; المراجع الرسمية rəsmi dairələr; مراجع الاختصاص səlahiyyətli orqanlar; 2) sığınacaq; 3) mötəbər mənbə; vəsait, arayış kitabı; في الحساب ~ hesab üzrə vəsait; في الجبر ~ (الهندسة) cəbr (həndəsə) üzrə vəsait; الاخير الـ~ son vasitə (*yaxasını qurtarmaq üçün*)

I رَجَفَ (u) رَجْف 1) silkələnmək; 2) sarsılmaq, silkələnmək; əsmək, titrəmək; IV أَرْجَفَ [illegible] canlı xəbərlər yaymaq, uydurmaq; pərt etmək; VIII إِرْتَجَفَ əsmək, titrəmək; [illegible] ~ soyuqdan əsmək

– إِرْجَاف [illegible] yalan xəbərlər yayma

– أَرَاجِيف *c.* إِرْجَاف yalan xəbər, [illegible] yalan-palan

- رَاجِفٌ əsən, tirtəyən; الحمّى الـ~ـة növbələnən titrədib-qızdırma
- رَاجِفَةٌ : الـ~ a) *din.* şeypurun birinci səsi (*qiyamət günü*); b) *məcaz.* hamını bürüyən bəla
- رَجْفَةٌ sarsıma; əsmə, titrəmə
- مُرْجِفٌ 1. yalan xəbərlər yayan; 2. hayküyçü, küykələkçi, küyçü, çaxnaşma salan

I رَجَلَ (ə) رَجْل ayaqla, piyada getmək; II رَجَّلَ saçını daramaq, saçını düzəltmək; V تَرَجَّلَ 1) minikdən düşmək; 2) yaşa dolmaq, yetkinləşmək, kişiləşmək; 3) kişilik etmək, özünü kişi kimi aparmaq (*qadın haqqında*); VIII إِرْتَجَلَ improvizə etmək; döşdən, sinədən demək; qabaqcadan hazırlaşmadan bir iş görmək, bədahətən demək; X إِسْتَرْجَلَ 1) yaşa dolmaq, yetkinləşmək, kişiləşmək; 2) kişilik etmək, özünü kişi kimi aparmaq (*qadın haqqında*)
- إِرْتِجَالٌ improvizasiya; بـالـ~ birdən, hazırlıqsız, irticalən, bədahətən, döşdən
- إِرْتِجَالِيٌّ : بـالـ~ birdən, hazırlıqsız, irticalən, bədahətən, döşdən
- رَاجِلٌ 1. ayaqla gedən; بـالـ~ ayaqla, piyada; 2. *c.* رَجَّالَةٌ piyada
- رَجَاجِيلُ *c.* piyada əsgərlər
- رِجَالاَتٌ *c.* xadimlər
- رَجَّالَةٌ *c.* piyadalar
- رِجَالِيٌّ kişi -i/-ı; kişilər üçün (*geyim*)
- رَجْلٌ [1] 1. ayaqla gedən; *topl.* ayaqla gedənlər; 2. piyada; *topl.* piyadalar
- رَجْلٌ [2], رَجِلٌ dalğalı (*saçlar*)
- رَجُلٌ *c.* رِجَالٌ 1) kişi; ər; 2) adam, insan; الـ~ العادي adi insan; الـ~ القوي qüvvətli insan; ~ الدولة dövlət xadimi; رجال الاذاعة والسينما والتلفزيون radio, kino və televiziya xadimləri; رجال الاعمال iş adamları; رجال البوليس polis nəfərləri; رجال التعليم pedaqoqlar; رجال السلطة hakimiyyət nümayəndələri; رجال السلك الدبلوماسي diplomatlar, diplomatik korpus; رجال السياسة siyasətçilər, siyasət adamları; رجال الصحافة jurnalistlər; رِجَالاَتٌ *c.* xadimlər; رجال الفكر والعلم والأدب mütəfəkkirlər, elm və ədəbiyyat xadimləri; رجال اللاهوت ilahiyyatçılar; رجال نكرات naməlum adamlar; 3) *kart* kral; جميعهم عند الشدائد ~ واحد وقلب واحد çətin vaxtlarda onlar hamı bir adam kimi olurlar
- رِجْلٌ [1] *c.* أَرْجُلٌ ayaq; dal ayaq; رجلا البنطلون şalvarın ayaqları; ~ الارنب *bot.* tarla (*şum*) yoncası; ~ الجوزاء *astr.* Ricl, Covza ayağı (*işıqlılığı Günəşinkindən 23 min dəfə çox olan göyümtül-ağ rəngdə ulduz*); ~ على وقف على الدنيا واقفة (قائمة) dünya ayağa qalxıb; رجليه *məcaz.* ayağı yer tutmaq, möhkəmlənmək; قطع ~ـه من بيتهم o, ayağını onların evindən kəsib, onlara get-gəli yoxdur; ~ـه والقبر bir ayağı gordadır
- رِجْلٌ [2] *c.* أَرْجَالٌ 1) dəstə, qatar, bulud (*çayirtkə*); 2) karvan (*balıq*)
- رِجْلَةٌ *bot.* pərpərəng; kasnı
- رُجُولِيَّةٌ, رُجُولَةٌ 1) kişilik, kişi ləyaqəti; kişiləşmə; بلغ درجة الـ~ kişilik həddinə yetişmə; 2) cəsarət, qoçaqlıq, igidlik
- مُرْتَجَلٌ improvizə edilmiş, hazırlıqsız, bədahətən
- مِرْجَلٌ *c.* مَرَاجِلُ qazan, tiyan, soba; ~ كهربائي elektrik sobası; ~ للصهر marten sobası; غرفة الـ~ qazanxana; ~ـه يغلي *yaxud* ~ يحتكم بين جنبيه o, qəzəbindən qaynayır

I رَجَمَ (u) رَجْمٌ 1) daşqalaq etmək (*şeytanı, zinaya yol vermiş qadını*); 2) lənətləmək; ~ بالغيب a) zənn ilə danışmaq, bilmədiyini danışmaq; b) tutar-tutmazına etmək; II رَجَّمَ



zənn etmək, güman etmək, ehtimal etmək (*nəyi* بـ)
- رَجْمٌ [1] daşqalaq etmə; ~ بالغيب zənn, güman, ehtimal; ~ـا بالغيب hər nə cür gəldi, qarasına, bəxtə-bəxt; قذف حصاة ~ـا بالغيب nişan almadan daş atmaq, daşı vızıldatmaq
- رَجْمٌ [2] *c.* رُجُومٌ atma mərmi
- رَجْمٌ [3] *c.* رُجُمٌ meteor, axan ulduz
- رَجْمَةٌ daşla vurma; رجمة بالغيب hər nə cür gəldi; qarasına, bəxtə-bəxt
- رُجْمَةٌ *c.* رُجَمٌ, رِجَامٌ 1) daş qalağı; 2) qəbirüstü daş, başdaşı
- رَجِيمٌ 1) daşqalaq edilən; 2) lənətə gəlmiş (*şeytanın epiteti*); الشيطان الـ~ lənətə gəlmiş şeytan
- مُرَجَّمٌ şübhəli, az ehtimal olunan, gümana gəlməyən; مرجمات الظنون *c.* şübhəli gümanlar

رجيم rejim; pəhriz

رَجِينَةٌ *c.* رَجَائِنُ ağac qətranı, kitrə
- مَرْجُونَةٌ *c.* مَرْجُونَاتٌ, مَرَاجِينُ səbət

I رَجَا (رجو) (u) رَجَاءٌ 1) ümid etmək, ümid bəsləmək; 2) rica etmək; يُرْجَى إِرْسَالُ المواد الى... *məch.* materialların ...-a/-ə göndərilməsi rica olunur; 3) arzu etmək (*kimə* لـ); ~ له خيرا ona xeyir arzu etmək; رَجِيَ (ə) رَجًا susmaq, səsini kəsmək; رُجِيَ عليه (الكلام) *məch.* o daha danışa bilmədi; V تَرَجَّى 1) ümid etmək, ümid bəsləmək; 2) istəmək, rica etmək; VIII إِرْتَجَى gözləmək, almağa ümid etmək (*nəyisə kimdən* من)
- رَاجٍ *q.* رَاجِيَةٌ ümid edən; ümidvar
- رَجًا *c.* أَرْجَاءٌ 1) son, ayaq, qurtaracaq; 2) guşə; واسع الارجاء böyük, geniş; في أرجاء البلاد ölkə hüdudlarında, bütün ölkə üzrə
- رَجَاءٌ *c.* رَجَوَاتٌ 1) ümid, gözlənti; قطع الـ~ ümidini kəsmək; 2) xahiş, rica; عدم الـ~ التخلّف لاهمّيّة... ...əhəmiyyət daşıdığından gəlməyiniz rica olunur; نزل على ~ـه kimdənsə rica etməyə qədər alçalmaq
- رَجَاةٌ ümid, gözləmə, gözlənti
- رَجِيَّةٌ gözlənilən şey, ümid yeri
- مَرْجَاةٌ = رَجَاةٌ
- مَرْجُوٌّ 1) gözlənilən; rica edilən; الـ~ ان rica olunur ki...; وفي ~نا ان... ümid edirik ki...

أَرَحُّ *q.* رَحَّاءُ *c.* رُحٌّ ayağının altı yastı olan

I رَحُبَ (رحب) (u) رَحْبٌ (u) رُحْبٌ *yaxud* رَحِبَ (a) رَحَبٌ geniş olmaq; II رَحَّبَ salamlamaq (*kimi* بـ); ~ بالضيوف بلسان الشعب qonaqları xalqın adından salamlamaq; V تَرَحَّبَ = II; VI تَرَاحَبَ tədricən genişlənmək
- تَرْحِيبٌ, تَرْحَابٌ 1) salamlama; خطاب الـ~ salamlama nitqi; 2) üzügülərlik; بـ~ xoş üzlə, gülər üzlə
- تَرْحِيبِيٌّ salamlama -i/-ı; خطبة ~ـة salamlama nitqi
- رَحَابَةٌ genişlik, ənginlik, açıqlıq; ~ ارضيّة ərazi genişliyi; ~ الصدر ürək açıqlığı, ürək genişliyi; على الـ~ والسعة! xoş gəlmişsiniz!
- رَحْبٌ gen, geniş, əhatəli; ~ الباع əliaçıq, səxavətli; ~ الصدر a) açıq ürəkli, geniş ürəkli, alicənab, comərd; b) dözümlü, səbirli; ~ الذراع a) səxavətli; b) dözümlü, səbirli
- رُحْبٌ = رَحْبٌ
- رُحْبٌ genişlik, ənginlik; على الـ~ والسعة! xoş gəlmişsiniz!; استقبله على ~ وسعة kimisə xoş üzlə qarşılamaq, qəbul etmək
- رَحْبَةٌ *c.* رَحَبَاتٌ, رِحَابٌ 1) boş yer, məkan; رحاب الكون (الفضاء) dünya məkanı, kosmosun ənginlikləri; 2) meydança, meydan; park (*maşınlar üçün*); 3) həyət (*məscidin*); الرحاب الكنيسة ~ kilsənin orta hissəsi; فتحت له الرحاب الفسيحة onun qarşısında geniş imkanlar açıldı

- رَحْبٌ = رَحِيبٌ

- مَرْحَبٌ genişlik; اهلا وسهلا yaxud ~ـا بك! ~ـا و~ـا! xoş gəlmişsiniz!; ~ـا بالصديق! xoş gəlmişsən, dost!

رَخْرَخَ genişləndirmək; yaymaq (*xəmiri*); yastılamaq; nazikləşdirmək; بالكلام ~ eyhamla, ikibaşlı danışmaq

- رَخْرَاخٌ yastı; meyilli, əydəmli, yamaclı (*sahil*); rahat, sərbəst (*həyat*)

- رَخْرَاخٌ = رَخْرَخٌ

- رَخْرَخَةٌ 1) yayma (*xəmiri*); 2) hamar üz; بالكلام ~ eyhamlı, ikibaşlı danışma

- مُرَخْرَخٌ 1) hamar, yastı; meyilli; بَتُّو ~ qarğıdalı kökəsi; 2) nazik

I رَحَضَ (a) رَحْضٌ yumaq; yaxalamaq

- مِرْحَاضٌ c. مَرَاحِضُ ayaqyolu, subaşı

رَحِيقٌ , رُحَاقٌ 1) köhnə çaxır; 2) الزهر ~ abhəyat, nektar; امتصّ ~ الحياة həyat şirəsini sormaq

- رُحَاقِيٌّ şirəayıran

- رُحَاقِيٌّ = رَحِيقٌ

- رُحَاقِيٌّ = رَحِيقِيٌّ

مَرْحَقَةٌ *bot.* nektarin

I رَحَلَ (a) رَحِيلٌ yola düşmək, yollanmaq (*haradan* عن , من); ~ من (عن) الوطن mühacirət etmək; ~ عنا yaxud ~ عن هذا العالم (الدنيا)

- تُرَاحِيلُ c. أعمال الـ~ göndərilmə, göndərmə; daşınma, aparılma; عمّال الـ~ mövsüm işləri; mövsüm işlərində çalışan fəhlələr

- تَرَحُّلٌ yola düşmə, getmə; هذا جعله بين حل و~ bu onu tez-tez bir yerdən başqa yerə köçməyə məcbur edirdi

- تَرْحِيلٌ c. تَرَاحِيلُ yola düşmə, yola salma; الحسابات ~ *maliy.* hesabların köçürülməsi

- رَاحِلٌ [1] 1. 1) ölmüş, rəhmətə getmiş; 2) getmiş; 2. mühacir

- رَاحِلٌ [2] c. رُحَّالٌ , رُحَّلٌ köçəri; العرب الرحّال köçəri ərəblər

- رَاحِلَةٌ c. رَحَائِلُ minik dəvəsi

- رَحَّالٌ c. رَحَّالَةٌ 1. 1) köçən; 2) köçəri; 3) çox səyahət edən; 2. səyyah, səyahətçi

- رَحَّالَةٌ səyyah (*tədqiqatçı*)

- رَحْلٌ c. رِحَالٌ 1) yəhər; شدّ ~ـه (رحاله) yola düşmək (*harasa* الى); حطّ ~ـه (رحاله) في... gəlib çatmaq (*harasa*); حطّ (القى) ~ـه (رحاله) عند... ...yanında mənzil salmaq, dayanmaq, düşmək

- رَحْلَةٌ c. رَحَلَاتٌ parta (*Suriya*)

- رُحْلَةٌ 1) hədəf (*səyyahın*); 2) can atılan yer

- رِحْلَةٌ c. رِحْلَاتٌ , رِحَلٌ səyahət; səfər; قصيرة ~ ekskursiya; جوّيّة ~ hava səyahəti; uçuş

- رَحِيلٌ 1) yola düşmə, çıxıb getmə; 2) الـ~ عن الحياة ölmə, həyatdan köçmə

- مُرَحَّلٌ *maliy.* köçürmə, sal...



V تَرَحَّمَ 1) rəhm etmək, mərhəmət göstərmək (*kimə* على); رحمة الله عليه! deyə, kiməsə (على) rəhmət diləmək; VI تَرَاحَمَ bir-birinə mərhəmət göstərmək; X إِسْتَرْحَمَ rəhmət, mərhəmət diləmək; yalvarıb-yaxarmaq

- رَحْمٌ , رِحْمٌ , رَحِمٌ k. q. c. أَرْحَامٌ 1) *anat.* uşaqlıq, balalıq; عنق الـ~ uşaqlıq boynu; حمل خارج الـ~ uşaqlıq xaricində olan hamiləlik; 2) qohumluq; صلة الـ~ qan qohumluğu; ذو الـ~ qohum (*ana tərəfdən*); 3) iç (*nəyinsə*); c. alt, yerin təki, dərinlik

- الرَّحْمٰنُ , الرَّحْمَانُ : Rəhman (*Allahın gözəl adlarından biri – bu dünyada rəhməti hər şeyi bürüyən*)

- رَحْمَةٌ rəhmət, mərhəmət; lütf; بلا ~ ولا شفقة rəhmsizcəsinə; عديم الـ~ rəhmsiz, mərhəmətsiz; هو تحت ~... o (*kiminsə*) rəhməti altındadır, (*kimdənsə*) asılıdır; الفلاّح تحت ~ السماء kəndli havadan (*hərf.* göydən) asılıdır; تركهم تحت ~ الجوع والفاقة o onları çörəksiz və evsiz-eşiksiz qoyub gedib; بساط الـ~ rəhmət örtüyü

- رَحُومٌ mərhəmətli, rəhmli, şəfqətli

- رَحِيمٌ : الـ~ Rəhim (*Allahın gözəl adlarından biri – axirətdə Rəhməti çox olan*)

- مَرْحَمَةٌ c. مَرَاحِمُ mərhəmət, şəfqət; lütf

- مَرْحُومٌ 1) mərhəmət göstərilmiş; 2) ölmüş,

I رَخَّ (a/u) رَخٌّ qatmaq, qarışdırmaq, su qatmaq; ~ـت السماء bərk yağış yağdı

- رُخٌّ c. رِخَاخٌ , رِخَخَةٌ 1) *həmç.* طائر الرخ rux quşu (*nağıllardakı quşun adı*); رخ مصريّ *zool.* keçəl kərkəs; *şahm.* top

- رَخَاخٌ 1) rahat, münasib; firavan; 2) yumşaq

- رَخَّةٌ c. ـات - şiddətli yağış, yağmur, leysan

رَخْر , رَاخِر q. رُخْرَى *xalq dil.* başqa; هو راخر o (*kişi*) da; هي رخرى o (*qadın*) da

رَخْرَخَ boşaltmaq, zəiflətmək; تَرَخْرَخَ boşalmaq, zəifləmək

- رَخْرَخَةٌ boşalma, zəifləmə

- مُرَخْرَخٌ boşalmış, zəifləmiş, dartılmamış

I رَخُصَ (u) رُخْصٌ , رَخَاصَةٌ 1) ucuz olmaq, ucuzlaşmaq; aşağı düşmək (*qiymətlər*); 2) yumşaq, zərif, təzə olmaq; 3) aşağı olmaq (*məs., keyfiyyətcə*); II رَخَّصَ 1) ucuzlaşdırmaq; 2) rüxsət, icazə, səlahiyyət vermək (*kimə* لـ *nəyə* بـ , في); IV أَرْخَصَ 1) ucuzlaşdırmaq, aşağı salmaq (*qiyməti*); 2) ucuz tutmaq (*nəyisə*); V تَرَخَّصَ 1) ucuz olmaq, ucuzlaşmaq; 2) rüxsət, icazə verilmək; yol verilmək; 3) iltifat, yumşaqlıq göstərmək; güzəştə getmək (*kimə* مع *nədə* في); icazəli, rüxsətli saymaq; 4) əl çəkmək, keçmək (*nədən* في); VIII إِرْتَخَصَ ucuz olmaq; ucuzlaşmaq; X إِسْتَرْخَصَ 1) ucuz

- رَخِيصٌ c. رِخَاصٌ 1) təzə; 2) zərif; 3) ucuz; aşağı (qiymət); ~ رجل ucuz, alçaq adam

- مُرْتَخِصٌ ucuz; بذل كلّ ~ وغال في سبيل شيء *məcaz.* nəyinsə yolunda mümkün olan hər

[redacted]

رَخَا ، رَخَاءً = رَخُوَ; IV أَرْخَى 1) zəiflətmək, boşaltmaq; 2) sallamaq, aşağı salmaq; الليل ~ سدوله على القافلة *məcaz.* gecə karvanı bürüdü (*gecə örtüyünü karvanın üzərinə çəkdi*); 3) saxlamaq (*saqqal*); VI تَرَاخَى 1) zəifləmək, süstləşmək; zərif, nərmə-nazik olmaq; zəiflik göstərmək; yarıtmazlıq, səhlənkarlıq, başısoyuqluq göstərmək; 2) uzaq olmaq (*zaman etibarilə – nədən* عن); لم يتراخ لمدّه bir az bundan qabaq; 3) düşmək; enmək (*məs., qiymətlər*); 4) ağırlıq, lənglik, astagəllik göstərmək (*nədə*); ləngitmək, yubatmaq, uzatmaq (*nədə* عن); VIII إِرْتَخَى zəifləmək, süstləşmək, nərmə-nazik olmaq;

[redacted]

- رَخْوِيَّات c. onurğasız yumşaqbədənlilər

- رَخِيٌّ 1) zəif, süst; 2) boş, yumşaq; 3) rahat, firavan; ~ عيش firavan həyat; البال ~ qayğısız, başısoyuq

- مُتَرَاخٍ q. مُتَرَاخِيَةٌ 1) zəif, süst; 2) qayğısız, başısoyuq

I رَدَّ (a/u) رَدٌّ 1) qaytarmaq, geri vermək; əks etdirmək (*işığı, səsi*); ردّ الدين borcu qaytarmaq; ردّ الاعتبار etibarı qaytarmaq, bəraət qazanmaq; ردّ العدل الى نصابه ədaləti bərpa



etmək; ما يَرُدُّ هذا عليك شيئًا bu sənə heç nə verməyəcək, kömək etməyəcək; ردّ الباب qapını bağlamaq; ردّ النور işığı əks etdirmək; 2) itələmək; rədd etmək; ردّه عن الحكم

[redacted]

olunmaq; 6) səkdirmək (*nədən* من ~ *güllə haqqında*); X إِسْتَرَدَّ 1) geri almaq, qaytarmaq; 2) dəf etmək; 3) geri qaytarılmasını xahiş etmək, geri istəmək; انفاسه ~ nəfəsini dərmək

- إِرْتِدَادٌ 1) geri çəkilmə; 2) qopma; 3) mürtədlik, dönüklük; reneqatlıq; عن الدين ~ dindən dönmə; 4) geriləmə, tənəzzül

- إِسْتِرْدَادٌ 1) qaytarma, geri alma; رسوم الـ~ qaytarma rüsumu; 2) geri qaytarma tələbi; دعوى ~ الحيازة *hüq.* mülkiyyət haqqının bərpa edilməsi barədə iddia

- تَرْدَادٌ 1) təkrar etmə; 2) tez-tez gedib-gəlmə

- تَرَدُّدٌ 1)

[redacted]

- مُتَرَدِّدٌ tərəddüd edən; الفكر ~ qətiyyətsiz

- مُرْتَدٌّ mürtəd, dinindən dönən, dönük

- مَرَدٌّ 1) qayıtma yeri; 2) dəf etmə; لا ~ له dəfedilməz, labüd, qaçılmaz; ~ه الى... bu onunla izah edilir ki...

- مُرَدِّدٌ təkrar edən, başqasının dediklərinə bəli-bəli deyən

- مَرْدُودٌ 1. 1) dəf edilən, geri oturdulan; 2) qaytarılan; 3) bağlı, bağlanmış; باب ~ شرّ مطرود *At. sözü.* bağlı qapı şəri dəf edər;

2. 1) gəlir, fayda; 2) məhsuldarlıq; 3) vermə, faydalı iş əmsalı; çıxma, buraxma; buraxılış (*məhsul*); العمل ~ əmək məhsuldarlığı; الماكنة ~ maşının istehsal gücü (*faydalı iş əmsalı*); رفيع الـ~ yüksək istehsal gücü olan

I (ردأ) رَدَأَ (ə) رَدْءٌ 1) dayaq vurmaq (*məs., divara*); 2) dəstəkləmək, kömək etmək; رَدُؤَ (u) رَدَاءَة pis olmaq, korlanmaq; IV أَرْدَأَ korlamaq, pisləşdirmək; V تَرَدَّأَ pisləşmək, korlanmaq

- رَدَاءَة 1) pis vəziyyət, pis keyfiyyət; الطقس ~ pis hava; 2) qüsurluluq, pislik, qərəzlilik

- رِدْءٌ c. أَرْدَاءٌ 1) dayaq, kömək, dəstək, 2) köməkçi

- رَدِيءٌ c. أَرْدِيَاءُ 1) pis, yaman, bəd, bərbad, xarab; التربية ~ pis tərbiyə görmüş; الطبع ~ bədxasiyyət; 2) qüsurlu, nöqsanlı, qərəzli

رَدْب c. رُدُوب dalan (*küçə*)

I ردح (ə) رَدْح söymək, danlamaq; III رَادَحَ cavab qaytarmaq; mübarizə aparmaq, müqavimət göstərmək

- رَدَّاح ağzısöyüşlü; çox söyüş söyən

- رَدْح nasazlıq, kefsizlik, naxoşluq

- رَدْح sürəkli zaman; طويلا ـــ~ *yaxud* ـــ~ من الدهر uzun zaman, uzun müddət

- رُدْحَة pərdə, örtük (*çadırda yataq yerini ayırmaq üçün*)

I ردس (u, i) رَدْس tapdalamaq; döyəcləyərək, vərdənələyərək hamarlamaq; toxaclamaq, döyəcləmək

- مِرْدَاس c. مَرَادِيس *yaxud* مِرْدَس c. مَرَادِس toxaclama, döyəcləyib bərkitmə

I ردع (ə) رَدْع 1) saxlamaq; çəkindirmək (*nədən* عن); cilovlamaq; 2) itələmək, uzaqlaşdırmaq (*nədən* عن); VIII إِرْتَدَعَ 1) özünü qorumaq, saxlamaq (*nədən* عن); 2) saxlanılmaq, çəkindirilmək (*nədən* عن); 3) imtina etmək, əl çəkmək (*nədən* عن)

- رَادِع c. رَوَادِع çəkindirən, saxlayan şey; لا رادع لهم ولا زاجر onlar özlərini saxlaya bilmirlər, heç nədən çəkinmirlər; ~ بغير heç nədən çəkinmədən, utanmadan, həya etmədən

- رَدْع çəkindirmə, saxlama, qarşısını alma; سياسة الـ~ çəkindirmə, qarşısını alma siyasəti

رَدَغَة ، رَدْغَة c. رِدَاغ palçıq, zığ, lil

I ردف (u) رَدْف izləmək, ardınca gəlmək (*kimin-nəyin*); III رَادَفَ 1) minik heyvanının tərkinə minmək; atın tərkində oturmaq; 2) sinonim olmaq; IV أَرْدَفَ 1) öz arxasında oturtmaq, tərkinə almaq, tərkinə mindirmək; 2) müşayiət etmək (*nə ilə* بـ); əlavə etmək, üstünə gəlmək (*nə* بـ); VI تَرَادَفَ 1) bir-birinin ardınca gəlmək; 2) sinonim olmaq

- تَرَادُف sinonimlik

- رَادِف ardınca gələn (*kimin-nəyin*); الـ~ة *din.* şeypurun ikinci səsi

- رِدَاف sağrı, tərk

- رِدْف c. أَرْدَاف 1. 1) dal, daldakı, arxadakı; 2) atın tərkində oturan; 2. dal, arxa, tərk, sağrı; الـ~ان gecə və gündüz

- رَدِيف c. رُدَافَى 1. 1) ardınca gələn (*nəyin* لـ); الـ~ ardınca (*nəyinsə* لـ); 2) atın tərkində oturan; 2. *hərb.* ehtiyat

- مُرَادِف c. ات - ، مُتَرَادِفَة sinonim

I (ردم) رَدَمَ (i) رَدْم 1) töküb doldurmaq, qumla doldurmaq (*məs., çalanı*); 2) yamamaq; رَدِمَ (u) رَدَم davam etmək; II رَدَّمَ yamamaq; IV أَرْدَمَ davam etmək, arası kəsilməmək; V تَرَدَّمَ 1) köhnəlmək, yamaqlanmalı olmaq; 2) yamamaq, yamaq vurmaq

- رَدْم[1] doldurma, torpaqla doldurma (*məs., çalanı*)



- رَدْم[2] 1) torpaq (*qazılıb çıxarılmış*); 2) qırıntı; zibil; 3) xarabalıq

- رَدِيم 1) doldurulmuş, örtülüb basdırılmış; القديم عليه الـ~ olan olub, keçən keçib; 2) geyilmiş, köhnəlmiş (*paltar*)

- مُتَرَدَّم yamaqlanmalı (*paltar*); هل غادر الشعراء من ~ artıq hər şey edilib və ya hər şey deyilib (*hərf.* şairlər yamaq vurulası bir şey qoyublarmı)

I رَدَنَ (i) رَدْن 1) əyirmək; 2) mırıldamaq; 3) mırtıldamaq, deyinmək, donquldamaq (*kimə* على)

- رُدْن c. أَرْدَان qol

- مِرْدَن c. مَرَادِن iy (*iplik əyirmək üçün*)

رَدْهَة c. رَدَهَات zal; vestibül; foye

I رَدِيَ (ə) رَدًى məhv olmaq, həlak olmaq, puç olmaq; II رَدَّى 1) yerə yıxmaq, yerə sərmək; 2) vurub yıxmaq; IV أَرْدَى 1) yıxmaq, vurub yıxmaq; məhv etmək, tələf etmək; أرداه قتيلا ölüsünü yerə sərmək; V تَرَدَّى 1) yıxılmaq; düşmək, sərilmək; في الهوة من القمار و الخمر ~ *məcaz.* qumara və içkiyə qurşanmaq; 2) əyninə geymək (*paltarı*); 3) تَرَدَّى (*müq. et:* تَرَدَّأَ) pisləşmək, korlanmaq; VIII إِرْتَدَى geymək, əyninə geymək; geyinmək (*paltar*); اهمية ~ كبرى çox böyük əhəmiyyət kəsb etmək; طابعا مهمًا ~ mühüm xarakter almaq; مختلف ~ الاشكال müxtəlif formalar almaq (*məs., suiqəsd haqqında*)

- رِدَاء c. أَرْدِيَة plaş, bürüncək, əba; paltar

- رَدًى həlak olma, puç olma, ölüm

- مُرْدِي *bax:* مرد

I رَذَّ (u) رَذَاذ رذت السماء çisəmək, çiskinləmək, narın-narın yağış yağmaq; IV أَرَذَّ: ~ت السماء = I

- رَذَاذ narın yağış

I (رذل) رَذُلَ (u) رَذَالَة rəzil olmaq; رَذَلَ (u) رَذْل 1) rədd etmək; bəyənməmək, təqdir etməmək; 2) həqarətlə baxmaq; 3) söymək; danlamaq; II رَذَّلَ danlamaq; söymək; IV أَرْذَلَ = II; VI تَرَاذَلَ rəzillik etmək, alçaqlıq etmək; X إِسْتَرْذَلَ xor baxmaq, həqarətlə baxmaq

- رَذَالَة 1) rəzalət, rəzillik, alçaqlıq; 2) pislik, pozğunluq

- رَذْل 1) rəzil, alçaq; 2) pozğun, korlanmış

- رَذِيل c. رُذَلَاءُ = رَذْل

- رَذِيلَة c. رَذَائِل 1) rəzalət; 2) pis, alçaq hərəkət; pislik

- مَرْذُول 1) rəzil, alçaq; 2) pozğun

I رَزَّ (ə/u) رَزّ sancmaq, batırmaq, soxmaq; keçirtmək; II رَزَّزَ 1) parıldatmaq, pardaxlamaq, cilalamaq; 2) düyü vurmaq, düyü əlavə etmək (*xörəyə*); IV أَرَزَّ telefonla zəng vurmaq

- إِرْزِيز telefon

- رُزّ düyü (*müq. et:* أُرْز); بلبن ~ *yaxud* مفلفل ~ plov; بلبن ~ südlü düyü sıyığı; عصفور الـ~ düyü sərçəsi

- رَزَّاز düyüsatan

- رَزَّة c. رِزَز rəzəli mismar, rəzə; cəftə, dəmir qarmaq; مغلق بالف ~ min cəftə ilə cəftələnmiş

- رُزَّة c. ات - düyü dənəsi

I رَزَأَ (ə) رُزْء üz vermək (*bəla, bədbəxtlik*); رُزِئَ *məch.* məruz qalmaq; məhrum olmaq (*kimdən-nədən* بـ), itki vermək

- رُزْء c. أَرْزَاء bəla, bədbəxtlik; müsibət, böyük zərər

- رَزِيئَة ، رَزِيَّة c. رَزَايَا = رُزْء

- مَرْزِئَة c. مَرَازِئ böyük zərər; bəla, müsibət; علیك فيه! ~ لا هنئ ما nəyə heyfin gəlmirsə ver mənə

I رزب (u) رَزْب qalmaq (*yerində*)

- مرقم c. مَرَاقِم 1) numerator, nömrəvuran; 2) pastel, əlvan karandaşlar
- مَرْقُوم 1) yazılmış; rəqəmlərlə yazılmış; ~ مبلغ rəqəmlərlə göstərilmiş məbləğ; 2) ... nömrəli; ... بشارع ... رقم ~ ... küçəsindəki ... nömrəli

(رقن) II رَقَّن 1) ştrixləmək; pozmaq, qaralamaq, silmək; 2) gözəl, yığcam (*sıx*) yazmaq; 3) diakritik işarələr qoymaq (*ərəb hərflərinin altında və ya üstündə*)
- تَرْقِين 1) ştrixləmə; pozma, qaralama, silmə; 2) kalliqrafik yazı; 3) diakritik nöqtələri yazma

رُقْوَة c. رُقًا ovsun, cadu, sehr
- رَقْوَانِيّ c. رَقْوَانِيَّة ovsunçu, cadugər, sehrçi

رَقُون yenot

رَقِّيّ qarpız (*İraq*)

I (رقى) (i) رَقْي, رُقْيَة ovsunlamaq (*məs. ilan sancmasından və s.*); رَقِيَ (a) رُقِيّ 1) qalxmaq, çıxmaq, doğmaq; 2) irəliləmək, tərəqqi etmək; II رَقَّى 1) qaldırmaq, yüksəltmək; 2) irəlilətmək, irəli çəkmək, inkişaf etdirmək; yaxşılaşdırmaq; 3) növbəti rütbə vermək; vəzifəsini yüksəltmək; ~ بيدقا الى فرزان *şahm.* piyadanı vəzirə çevirmək; 4) *riyaz.* qüvvətə yüksəltmək; V تَرَقَّى 1) yüksəlmək; 2) irəliləmək; inkişaf etmək, tərəqqi etmək; 3) vəzifədə yüksəlmək; VIII إِرْتَقَى 1) qalxmaq, çıxmaq, doğmaq; 2) tədricən inkişaf etmək, təkamül etmək
- إِرْتِقَاء tədrici inkişaf, artım, təkamül
- تَرَقٍّ yaxşılaşma, tərəqqi
- تَرْقِيَة 1) yaxşılaşdırma; 2) irəli çəkmə; inkişaf etdirmə; 3) vəzifədə, rütbədə yüksəltmə; ~ بيدق الى فرزان *şahm.* piyadanı vəzirə çevirmə; 4) *riyaz.* qüvvətə yüksəltmə
- رَاقٍ¹ c. رُقَاة ovsunçu (*ilan*)
- رَاقٍ² q. رَاقِيَة 1) qalxan; ucalan; 2) irəlidə gedən; inkişaf etmiş; mədəni
- رَقَّاء ovsunçu, sehrbaz
- رُقِيّ, رَقْي 1) qalxma; irəli getmə, irəliləmə, tərəqqi etmə; 2) ovsunlama; tilsim, həmayil, gözmuncuğu
- رُقْيَة c. رُقًى 1) ovsun (*məs.*, باسم الله ارقيك من كل شيء يؤذيك و من كل عين حاسد *yaxud* باسم الله ارقيك والله يشفيك من كل نفس او عين); 2) tilsim, cadu, sehr
- مُرْتَقٍ q. مُرْتَقِيَة yüksək; inkişaf etmiş, mədəni
- مِرْقَاة c. مَرَاقٍ 1) dərəcə; pilləkən; 2) lift

I (ركّ) (رك) رَكَّ¹ (i/u) رَكّ 1) zəif, cüzi olmaq; 2) qüsurlu olmaq (*nitq barəsində*); pozuq olmaq (*dil, tələffüz*); رَكَّ² (a,u) رَكّ tapşırmaq; ~ الامر في عنقه boynuna qoymaq (*kiminsə*)
- رَكّ əsas, təməl; dayaq ! رَكّك على الفلوس sənə ancaq pul kömək edər; sənin işin qalıb pula; ... حط الرك على ... -a/-ə ümid etmək
- رِكّ c. رِكَاك, أَرْكَاك zəif yağış
- رُكَاك = رَكِيك
- رَكَاكَة 1) zəiflik; cüzilik, naqislik; 2) pozğunluq, qüsurluluq (*dildə, tələffüzdə*)
- رُكَّة c. ـات - cəhrə; ~ طب الـــ *xalq dil.* ovsunla müalicə, türkə-çarə
- رَكِيك 1) zəif; pis; yazıq, biçarə; 2) pozğun (*nitq*); qüsurlu (*dil, tələffüz*)

I رَكِبَ (ə) رُكُوب 1) minmək (*ata, qatara, avtomobilə və s.*); getmək (*at üstündə, qatarda, avtomobildə və s.*); 2) etmək, işlətmək (*məs., günah və s.*); ~ ـــه بالدعابة القاسية kiminləsə kobud zarafat etmək; ~ البحر gəmidə getmək; (القلق) الحزن ~ ـــه onu kədər bürüdü; (الخوف) الذعر ~ ـــها onu qorxu bürüdü; ~ رأسه a) baş alıb getmək; hara getdiyini bilməmək; b) başını itirmək (*məs., qəzəbdən*);



özbaşınalıq etmək; ~ الشطط ifrata varmaq; ~ الغرور رأسه təhlükəyə məruz qalmaq; ~ رأسه lovğalanmaq, təşəxxüslənmək; ~ المغامرات başına sərgüzəştlər gəlmək; ~ الهواء təyyarə ilə uçmaq; ~ هواه istəyinə uymaq; II رَكَّب 1) mindirmək, oturtmaq; qurmaq (*məs., dəzgahı*); 2) tərtib etmək, yaratmaq, toplamaq, quraşdırmaq; 3) birləşdirmək, sintez etmək; 4) qurmaq, düzəltmək; 5) salmaq, taxmaq (*qiymətli daş*); 6) dartmaq, gərmək, çəkmək (*məs., simi*); IV أَرْكَبَ oturtmaq, mindirmək; V تَرَكَّبَ tərtib edilmək, ibarət olmaq (*nədən* من); VI تَرَاكَبَ 1) sıx oturmaq; *məcaz.* bir-birinin üstündə oturmaq; 2) üst-üstə qalanmaq, üst-üstə yığılmaq, tığ vurulmaq; VIII إِرْتَكَبَ etmək, işlətmək (*günah, cinayət və s.*); ~ عملا شائنا ayıb iş tutmaq; X إِسْتَرْكَبَ minmək istəmək; mindirilməsini xahiş etmək
- إِرْتِكَاب etmə, işlətmə, tutma (*məs., günah iş*)
- تَرَاكُب üst-üstə qalanma, yığılma; tığ vurma
- تَرْكِيب c. تَرَاكِيب 1) quraşdırma, yığma; 2) konstruksiya, quruluş; tərkib; ~ الذرة atomun quruluşu; 3) söz birləşməsi, tərkib; ifadə; ~ اسنادي predikativ söz birləşməsi, cümlə; 4) quruluş; ~ الجسم bədən quruluşu; 5) sintez; 6) *şahm.* kombinasiya
- تَرْكِيبَة c. ـات 1) quruluş, düzülüş, tərtib, konstruksiya; c. laylar, təbəqələr; تركيبات جيولوجية geoloji çöküntülər; 2) tərkib (*məs., hökumətin*)
- تَرْكِيبِيّ 1) konstruktiv, struktural; 2) sintetik; الـــة الألياف sintetik liflər
- رَاكِب c. رُكْبَان, رَكْب, رُكَّاب 1. minikdə gedən; ~ درّاجة velosipedçi; ~ درّاجة نارية motosikletçi; 2. 1) atlı, süvari; 2) sərnişin
- رِكَاب¹ c. رَكَائِب, رُكُب 1) minik *və ya* yük dəvələri; 2) yeriş, mərasim; qatar, nümayiş; ~ الاستعمار imperializmin arabası; سار في ~ ـه kiminsə dalınca sürünmək, müticəsinə getmək
- رِكَاب² *təsn.* رِكَابَانِ c. رُكُب üzəngi; *anat.* üzəngi sütunu; ... شدّ ~ ـه الى harasa yola düşmək; حط ~ ـه في مكان haradasa dayanmaq, yerləşmək, mənzil salmaq
- رِكَابِيّ üzəngi -i/-ı; ~ العظم الـــ *anat.* üzəngi sütunu
- رَكَّاب jokey, sürücü, minici, atlı
- رَكْب c. أَرْكُب 1) karvan; atlılar dəstəsi; ~ الحجيج həccə gedən zəvvarların karvanı; 2) gediş, yürüş, nümayiş; ~ الحضارة تخلف عن mədəni cəhətdən qabaqcıl ölkələrdən geridə qalmaq; 3) şəxsi heyət; ekipaj (*təyyarənin, tankın və s.*)
- رُكْبَان minik atları, minik dəvələri; karvan; يسير بذكره الـــ~ hamı onun haqqında danışır
- رُكْبَة c. رُكَب diz; dirsək; ~ ابو *bot.* kolrabi, kələm fəsiləsindən olan ikiillik bitki; ابو الركب *tibb.* 1) titrədib qızdırma; 2) qrip
- رِكْبَة minik (*yollanmaq üçün*)
- رُكُوب getmə, gəlmə, sürmə; ~ الخيل at sürmə; ~ البحر dəniz səfəri; ~ الهواء uçma, uçuş
- رَكُوبَة c. رَكَائِب minik heyvanı
- مَرَاكِبِيّ c. مَرَاكِبِيَّة qayıqçı
- مَرْكَب c. مَرَاكِب 1) minik, nəqliyyat vasitəsi; 2) gəmi, qayıq; minik heyvanı; ~ بخاري buxar gəmisi; ~ جوّال müəyyən reysi olmayan gəmi; ~ حربي hərbi gəmi; ~ خطّي xətt gəmisi; ~ دوري gözətçi gəmisi; ~ ساحب yedək gəmisi; ~ سريع العدو itigedən gəmi; ~ شراعي yelkənli gəmi; ~ الصيد balıqçı gəmisi; ~ النقل nəqliyyat gəmisi; ~ ركب اقبح ədəbsizlik

etmək, qəbahət işlətmək; ركب ~ الحماقة axmaqlıq etmək; ركب ~ الطيش yüngüllük etmək; ركب ~ الهوس والجنون dəlilik, ağılsızlıq etmək; ركب مراكب الزلل tez-tez çaşmaq, səhvə yol vermək

- مُرَكَّب 1. 1) mürəkkəb; ibarət (*nədən*); ربح ~ mürəkkəb faizlər; عدد ~ a) *riyaz.* kompleks ədəd; b) mürəkkəb ədəd; 2) salınmış, taxılmış; 3) yığılmış, quraşdırılmış; جهل ~ tam cəhalət; 2. *c.* ات - 1) mürəkkəb tərkib, mürəkkəb birləşmə; 2) mürəkkəb cisim; kompleks; 3) dərman tərkibi; كيميائي ~ kimyəvi birləşmə

- مَرْكَبَة *c.* ات - 1) araba; ekipaj; الفضاء ~ kosmik gəmi; القمرية ~الـ aygəzər; 2) vaqon; الامتعة ~ (العفش) yük vaqonu

- مُرَكِّبَة *c.* ات - 1. tərtibedici; təşkiledici; 2. tərkib hissəsi, tərkib elementi; komponent

- مَرْكَبِيّ *c.* مَرْكَبِيَّة = مَرَاكِبِيّ

- مَرْكُوب *c.* مَرَاكِيب çəkmə; çəkələk; ابو ~ leylək, hacıleylək

I رَكَدَ (u) رُكُود 1) uzun zaman hərəkətsiz, durğun, axmaz qalmaq (*su haqqında*); 2) süst, durğun, kəsalətli olmaq (*ticarət haqqında*); 3) sakitləşmək, yatmaq (*külək haqqında*)

- رَاكِد 1) süst, kəsalətli (*ticarət*); 2) durğun, axmaz (*su*)

- رُكُود durğunluq, geriləmə, tənəzzül, depressiya

I رَكَزَ (u) رَكْز 1) sancmaq; taxmaq; dikəltmək; bərkitmək; 2) dayanmaq, durmaq, yerləşmək; II رَكَّزَ 1) bir yerə yığmaq, cəmləşdirmək, mərkəzləşdirmək; اهتمامه ~ diqqətini cəmləşdirmək (*nə üzərində* على); 2) qatılaşdırmaq (*südü*); 3) zənginləşdirmək (*filizi*); IV أَرْكَزَ 1) qoymaq, quraşdırmaq; 2) qızıl və ya gümüş ehtiva etmək, tərkibində qızıl və ya gümüş olmaq (*süxur haqqında*); 3) qızıl və ya gümüş ehtiyatları kəşf etmək; V تَرَكَّزَ bir yerə toplanmaq, cəmləşmək, mərkəzləşmək; VI تَرَاكَزَ ümumi mərkəzə malik olmaq, konsentrik olmaq; VIII إِرْتَكَزَ 1) söykənmək, istinad etmək, arxalanmaq (*nəyə* على); 2) cəmləşmək, mərkəzləşmək (*harada* في); 3) dayanmaq, yerləşmək, olmaq (*harada* في)

- إِرْتِكَاز istinad; نقطة الـ~ istinad nöqtəsi

- تَرَاكُز konsentriklik

- تَرْكِيز 1) mərkəzləşdirmə, cəmləşdirmə; 2) qatılaşdırma (*südü*); 3) zənginləşdirmə (*filizi*)

- رَكَاز bərk, möhkəm, sakit, arxayın, soyuqqanlı

- رِكَاز *c.* أَرْكِزَة , رِكْزَان 1) qızıl, gümüş *və ya* uran filizi; 2) xəzinə, dəfinə

- رَكْز bərklik; sakitlik, arxayınlıq

- رِكْز *c.* رُكُوز , أَرْكَاز yüngül səs

- رَكْزَة *c.* رَكَزَات dayanma; fasilə; sükut

- رَكِيزَة *c.* رَكَائِز 1) dayaq, istinad; təməl, özül; زعزع ركائزه nəyinsə təməlini sarsıtmaq; 2) dirək, dəstək, altlıq; 3) ayaq (*mebelin*); 4) paya; 5) damar (*məs., qızılın*); 6) *hərb.* top qundağı, top altlığı

- مُتَرَاكِز konsentrik

- مُرْتَكَز *c.* ات - 1) dayaq; dayaq məntəqəsi; 2) əsas, təməl, özül

- مَرْكَز *c.* مَرَاكِز 1) mərkəz; الثقل ~ ağırlıq mərkəzi; الدائرة ~ çevrə mərkəzi; الجذب ~ cazibə mərkəzi; الادارة ~ baş idarə; كهربائي ~ elektrosentral; كهرحراري ~ istilik-elektrik mərkəzi; كهرمائي ~ hidroelektrosentral; مائي ~ hidrosentral; هاتفي ~ telefon stansiyası; هذا الواقع في اهتمام الرأي العام العالمي ~ bu fakt dünya ictimai



rəyinin diqqət mərkəzindədir; 2) ... olduğu yer; الداء ~ xəstəlik ocağı; الرياسة ~ *hərb.* qərargah; 3) mövqe; 4) yer, post, məntəqə; للاستعلام ~ arayış (*məlumat*) məntəqəsi; الاسعاف ~ ilk yardım məntəqəsi; البوليس ~ (الشرطة) polis sahəsi; السكة الحديدية ~ dəmiryol qovşaq stansiyası; القيادة ~ idarəetmə (*komanda*) mərkəzi; 5) *qram.* dayaq (*diakritik nöqtələr üçün*); 6) mərkəz (*Misirdə inzibati vahid*); مأمور الـ~ mərkəz rəisi

- مُرَكَّز 1) mərkəzləşdirilmiş, cəmləşdirilmiş, yerləşdirilmiş; 2) qatılaşdırılmış (*süd*); 3) zənginləşdirilmiş (*filiz*)

- مُرَكِّز mərkəzləşdirici, cəmləşdirici; النور ~ projektor

- مَرْكَزِيّ mərkəzi; اللجنة الـ~ـة mərkəzi komitə; لا ~ ekssentrik, ümumi mərkəzi olmayan; desentralizasiya edilmiş

- مَرْكَزِيَّة mərkəzdə olma, mərkəziyyət, sentralizm; sentralizasiya; لا ~ desentralizasiya

I رَكَسَ (u) رَكْس aşırmaq, çevirmək, alt-üst etmək; VIII إِرْتَكَسَ 1) yenidən düşmək, bir daha düşmək (*çətin vəziyyətə*); 2) aşırılmaq, çevrilmək, qaytarılmaq (*əvvəlki vəziyyətə*); geri düşmək, geri oturulmaq

I رَكَضَ (u) رَكْض qaçmaq; səyirtmək, yüyürmək, atılmaq, sıçramaq; çapmaq, çaparaq getmək; الفرس برجله ~ atı mahmızlamaq; قلبه بين جنبيه ~ onun ürəyi döyündü, çırpındı; III رَاكَضَ qaçışda yarışmaq; VI تَرَاكَضَ 1) qaçışda yarışmaq; 2) bir yerdə qaçmaq; qaçışıb gəlmək, yüyürüşüb gəlmək (*nəyə tərəf* الى); VIII إِرْتَكَضَ 1) hərəkət etmək; tərpənmək (*ana bətnində döl haqqında*); 2) həyəcanlanmaq

- رَكْض qaçış; at çapışması; dördayaq at yerişi; اتاه ~الـ kiminsə yanına qaçaraq gəlmək, qaça-qaça gəlmək; وراء الارباح ~الـ gəlir dalınca qaçma; وراء التسلّح ~الـ qızğın silahlanma

- رَكَّاض qaçıcı

- رَكُوض 1. iti, yeyin, bərk, sürətli (*qaçışda*); 2. qaçıcı

I رَكَعَ (a) رُكُوع baş əymək, əyilmək, bel bükmək; rüku etmək, rükuya getmək (*əlləri dizlərin üstünə qoyaraq baş əymək namazda*); امامه ~ kiminsə-nəyinsə qarşısında baş əymək; امام جبروته ~ kiminsə əzəməti qarşısında diz çökmək; على الركب امامه ~ kiminsə qarşısında sürünmək, quyruq bulamaq; II رَكَّعَ diz çökdürmək; IV أَرْكَعَ diz çökdürmək

- رَاكِع *c.* رُكَّع rüku edən, rükuya gedən; namaz qılan

- رَكْعَة *c.* رَكَعَات 1) rüku (*namazda*); baş əymə; 2) rəkət (*namazın bir rüku və iki səcdədən ibarət bir hissəsi*); ادّى ركعتين iki rəkət namaz qılmaq

- رُكُوع rüku, baş əymə

I رَكَلَ (u) رَكْل itələmək, təpikləmək, təpiklə vurmaq; təpik atmaq, şıllaq atmaq; VI تَرَاكَلَ bir-birinə təpik atmaq, bir-birini şıllaqlamaq, təpikləmək

- رَكْلَة *c.* رَكَلَات təpikləmə, ayaqla vurma, təpik

I رَكَمَ (u) رَكْم 1) yığmaq, üst-üstə qalamaq; 2) toplamaq, qalaqlamaq; VI تَرَاكَمَ toplanmaq, qalanmaq, üst-üstə yığılmaq; qatılaşmaq, sıxlaşmaq (*duman*); VIII إِرْتَكَمَ yığılmaq, toplanmaq, tığlanmaq, toplaşmaq

- تَرَاكُم yığma, toplama; yığım; الثروة ~ sərvət yığımı; المالي ~الـ maliyyə yığımı

- رُكَام 1) yığın, təpə, qalaq; *geol.* daş töküntüsü, çınqıllıq; الناس ~ kütlə, izdiham; انبعث

~ـها المدينةَ من şəhər xarabalıqlardan baş qaldırdı; 2) buludlar, kəsif buludlar, bulud topası

- رُكَامِيٌّ : ~ مُزْن qara buludlar
- رَكْمٌ bulud topası, kəsif buludlar
- مِرْكَمٌ c. مَرَاكِمُ el. akkumlyator

I رَكَنَ (u) رُكُونٌ yaxud رَكِنَ (ə) رَكْنٌ 1) söykənmək; 2) bel bağlamaq (*kimə*), etibar etmək (*kimə* الى); 3) uymaq, aludə olmaq (*nəyə*); meyil etmək (*nəyə* الى); ~ الى الهدوء sakitliyə qapılmaq; sükuta dalmaq; 4) gizlənmək, daldalanmaq (*harada*); çəkilmək (*hara* الى); ~ في المنزل evdə oturmaq, evdən bayıra çıxmamaq; يُرْكَنُ اليه *məch.* etibar ediləsi, bel bağlanası kəs; etibarlı; 5) bir kənara qoymaq; ~ على الرف süründürməyə salmaq; II رَكَّنَ 1) bərk-bərk gizlətmək; 2) paltar şkafına yığmaq (*paltarı*); IV أَرْكَنَ 1) etibar etmək (*kimə* الى), bel bağlamaq (*kimə*); üz qoymaq, əl atmaq (*nəyə* الي); ~ الى الفرار qaçmağa üz qoymaq; VIII إِرْتَكَنَ söykənmək (*nəyə* الى); dirənmək, dayanmaq (*nəyə* على)

- إِرْكَانٌ etibar, əminlik, arxayınlıq (*kimə* الى)
- رَكَانَةٌ ciddilik, təmkinlilik, mötəbərlik, ağırlıq; görkəm
- رُكْنٌ c. أَرْكَانٌ 1) sütun; dayaq; 2) künc; 3) başlıca tərkib hissəsi; 4) əsas; اركان الحرب *hərb.* baş qərargah; رئيس (هيأة) اركان الحرب baş qərargah rəisi; اركان الحرب للقوّات المسلّحة silahlı qüvvələrin qərargahı; اركان المفوّضيّة səfirliyin nümayəndələri; اركان الحياة الاقتصاديّة iqtisadi həyatın əsasları; اركان البلاد dövlət həyatının dayaqları; اركان الدين dinin əsasları; 5) guşə, bölmə (*jurnalda, radio verilişində*)
- رُكْنَةٌ guşə; künc
- رُكْنِيٌّ künc -i/-ı; ضربة ~ـة *idm.* künc zərbəsi
- رُكُونٌ etibar
- رَكِينٌ 1) möhkəm, bərk; 2) etibarlı, ciddi, mötəbər, mühüm; 3) əsas
- مُرَاكَنَةٌ nişanlama, adaxlama (*Əlcəzair*)
- مِرْكَنٌ c. مَرَاكِنُ tas, ləyən, teşt

I (ركو) رَكَا (u) رَكْوٌ 1) qazmaq; 2) qalmaq, olmaq (*harada* بـ , في); II رَكَّى söykəmək, dayamaq, möhkəm quraşdırmaq; ~ مرفقيه على... dirsəklənmək (*nəyəsə*); VI تَرَاكَى körpüyə yan almaq

- رَكْوَةٌ c. رَكَوَاتٌ qəhvədan; qəhvəbişirən
- رَكِيَّةٌ c. رَكَايَا quyu

I (رم) رَمَّ[1] (a/u) رَمٌّ düzəltmək, təmir etmək; لا يُرَمُّ *məch.* düzəlməz, islaholunmaz; رَمَّ[2] (a/i) رِمَّةٌ çürümək, korlanmaq, xarab olmaq; II رَمَّمَ 1) = رَمَّ[1]; 2) surətini çıxarmaq (*şəffaf kağız və ya kalka vasitəsilə*); IV أَرَمَّ = رَمَّ[2]; V تَرَمَّمَ düzəldilmək, təmir edilmək; X إِسْتَرَمَّ təmirə, düzəldilməyə ehtiyacı olmaq

- تَرْمِيمٌ 1) təmir etmə, düzəltmə; 2) surətini çıxarma
- تَرْمِيمَاتٌ c. təmir işləri
- رُمَامٌ çürük; çürümüş, külə dönmüş
- رَمٌّ çürümə, xarab olma
- رُمَّةٌ c. رُمَمٌ , رُمٌّ 1) ip, kəndir; 2) məcmu; بـ~ـه bütövlükdə, tamamilə
- رِمَّةٌ c. رِمَمٌ , رِمَامٌ 1) çürümüş sümüklər; 2) meyit; cəmdək, leş
- رَمِيمٌ 1. çürük, çürümüş; külə dönmüş; 2. çürümüş sümüklər
- مُرَمِّمٌ 1. təmir edən; 2. təmirçi
- مَرَمَّةٌ təmir

رَمَثٌ c. أَرْمَاثٌ , رِمَاثٌ sal, körpücük

I رَمَحَ (ə) رَمْحٌ 1) nizə ilə vurmaq, nizələmək; 2) şıllaq atmaq; 3) çapmaq (*dördayaq -at*); 4) atılmaq, cummaq, can atmaq (*hara*



الى); 5) azğın, coşqun olmaq, coşub özündən çıxmaq; II رَمَّحَ 1) dördayaq çapmaq, səyirtmək (*atı*); 2) nizə düzəltmək; ~ وصفح *məcaz.* silah düzəltmək

- رَامِحٌ nizəli; السماك الـ~ *astr.* Arktur (*şimal yarımkürəsində ən parlaq ulduz – həmç. bax:* سِمَاكٌ)
- رَمَّاحٌ c. رَمَّاحَةٌ nizəli əsgər, silahdaşıyan
- رِمَاحَةٌ qaçış; dördayaq yeriş
- رُمْحٌ c. أَرْمَاحٌ , رِمَاحٌ nizə; mızraq
- مِرْمَاحٌ c. ـاتٌ 1) səhnə, meydan, sirk; 2) cıdır meydanı
- مَرْمَحٌ = مِرْمَاحٌ

(رمخ) VIII إِرْتَمَخَ tükənmək, zəifləmək, gücdən düşmək

I رَمِدَ (ə) رَمَدٌ 1) ağrımaq (*gözlər*); 2) göz xəstəliyinə tutlmaq; II رَمَّدَ 1) külün içinə qoymaq; 2) yandırmaq, külə döndərmək; ~ الجثة meyiti yandırmaq; IV أَرْمَدَ ağrımaq (*göz*); V تَرَمَّدَ 1) külə dönmək; 2) küllə örtülmək; 3) oftalmiyaya, göz xəstəliyinə tutulmaq

- أَرْمَدُ q. رَمْدَاءُ c. رُمْدٌ 1) oftalmiyalı xəstə; 2) kül -i/-ı
- تَرْمِيدٌ yandırma, külə döndərmə; ~ الموتى (الجثث) meyitləri (*cəsədləri*) yandırma
- رَمَادٌ c. أَرْمِدَةٌ kül; ~ ذرّي radioaktiv kül; ~ الجثة المحروقة yandırılmış cəsədin külü; ماء الـ~ torta; ذرّ الـ~ في العيون gözə kül üfürmək; تنفخ في الـ~ *At. sözü.* özünə ziyan vurursan (*hərf.* külü üfürürsən)
- رَمَادِيٌّ kül rəngi; ~ حزن *məcaz.* dərin hüzn
- رَمَدٌ *tibb.* oftalmiya; الـ~ الحبيبيّ traxoma
- رَمِدٌ , رَمْدَانُ oftalmiyalı xəstə
- رَمَدِيٌّ *həmç.* ~ طبيب okulist, göz həkimi

رمزم əlinə düşəni yemək, hər nə gəldi yemək

- رَمْزَمَةٌ əlinə düşəni yemə, hər nə gəldi yemə
- رَمْزَامٌ əlinə düşəni yeyən, hər nə gəldi yeyən

I رَمَزَ (u, i) رَمْزٌ 1) işarə etmək, nişan vermək, göstərmək (*nə ilə* بـ); 2) rəmzi olaraq göstərmək (*nəyi* الى , لـ *nə ilə* بـ); 3) əlamətdar olmaq, dəlalət etmək, təmsil etmək, bir şeyin rəmzi olmaq; VIII إِرْتَمَزَ əlamətdar olmaq (*nə ilə* بـ)

- رَامُوزٌ c. رَوَامِيزُ nümunə, örnək; faksimile
- رَمْزٌ c. رُمُوزٌ 1) işarə, rəmz, nişan, simvol; 2) işarə, eyham; 3) təxəllüs
- رَمْزِيٌّ 1) rəmzi, simvolik; هديّة ~ـة simvolik hədiyyə; 2) şifrli, şifrlənmiş
- رَمْزِيَّةٌ : الـ~ simvolizm

I رَمَسَ (u) رَمْسٌ 1) dəfn etmək; basdırmaq; 2) gizlətmək; VIII إِرْتَمَسَ baş vurmaq, başa qədər girmək, başını suya salmaq, irtimas etmək

- رَامُوسٌ c. رَوَامِيسُ qəbir
- رَمْسٌ c. رُمُوسٌ , أَرْمَاسٌ qəbir, qəbirin üstünə yığılmış torpaq

I رَمَشَ (u) رَمْشٌ 1) barmaqlarının ucu ilə götürmək; 2) göz qırpmaq, göz vurmaq

- رَمَشٌ göz qapağının iltihabı, konyunktivit
- رِمْشٌ c. رُمُوشٌ kirpik
- رَمْشَةٌ c. رَمَشَاتٌ göz qırpma, göz vurma; بـ~ العين bir göz qırpımında

I رَمِصَ (ə) رَمَصٌ irinləmək, çirk gəlmək (*göz*)
- رَمَصٌ 1) irin, çirk (*gözdə*); 2) yuxulu görkəm

I رَمِضَ (ə) رَمَضٌ isti, qızmar olmaq; IV أَرْمَضَ 1) qızdırmaq, yandırmaq (*günəş*); 2) ağrıtmaq, incitmək, əziyyət vermək; 3) zərərli, öldürücü təsir göstərmək; ~ـه التعب yorğunluq onu əldən salıb, o bərk yorulub

- رَمَضٌ *tib.* insolyasiya, günəş işığı ilə müalicə; günvurma
- رَمْضَاءُ qızmar isti, bərk isti; كالمستجير من الـ~ بالنار *məcaz.* yağışdan çıxıb yağmura düşmək (*hərf.* o, qızmar istini görüb oddan kömək istəyənə oxşayır)
- رَمَضَانُ ramazan (*qəməri təqviminin 9-cu ayı – 30 gündür*)
- رَمَاغٌ: داء الـ~ *tib.* qansızlıq (*qadınlarda qanazlığı xəstəliyi*)

I رَمَقَ (u) رَمْقٌ baxmaq; gözlərini, nəzərlərini dikmək, nəzər salmaq; ~ـه بنظرات سيئة النيّة kiməsə kinli nəzər salmaq, pis niyyətlə baxmaq; II رَمَّقَ 1) gözünü dikmək, diqqətlə baxmaq; gözünü çəkməmək; 2) atüstü, necə gəldi etmək; b [redacted]

- رَمَّالٌ rəmmal, qum üstündə fala baxan
- رَمَلٌ rəməl (*əruz vəznində hər misrası üç «failatün» və bir «failat», yaxud «failün»-dən ibarət bəhr*)
- رَمْلٌ *c.* رِمَال qum; أمّ رمال kaftar, goreşən; الـ~ البولي *tibb.* sidik qumu; daş xəstəliyi; (كالنعامة) ~ أخفى (وضع) رأسه في الـ~ *məcaz.* başını quma soxub gizlətmək (*dəvəquşu kimi*); بناء على الـ~ nəyisə qum üstündə qurmaq; ضَرْب (علم) الـ~ qumla fala baxma
- رَمْلَة qumluq; qumsallıq; qumlu sahə
- رَمْلِيٌّ 1) qum -i/-ı; ساعة ~ـة qum saatı; 2) qumlu, qumsal; العاصفة الـ~ـة qum qasırğası
- مِرْمَلَة qumqabı

رُمَّانٌ *topl. bot.* nar (*ağacları və meyvələri*)

[redacted]



uzanıb getmək; 3) bir-birinə atmaq (*nə*); atışmaq (*nə ilə* بـ); 4) gəlib çatmaq (*kiməyə* الى); ... اليه ان ~ ona xəbər çatdı ki...; ... الى اذنيه ان ~ qulağına dəyib, çatıb ki...; VIII إِرْتَمَى 1) atılmaq; 2) atılıb qalmaq; 3) üstünə atılmaq (*kimin* على); 4) düşmək, yıxılmaq; على الارض ~ torpağa düşmək, yerə düşmək; على قدميه ~ kiminsə ayaqlarına düşmək
- تَرَامٍ dağınıqlıq; تَرَامِي الاطراف genişlik
- رَامٍ *q.* رَامِيَة *c.* رُمَاة 1. atan, nişan alan; رامي القرص *yaxud* رامي المطلة *idm.* diskobol, diskatan; 2. atıcı; الرامي *astr.* Oxatan; سهم الرامي *astr.* ox
- رِمَايَة atış, güllə atma; على الاطباق الـ~ *idm.* qablara güllə atma

[redacted]

- مَرْمِيٌّ atılan, mərmi
- مَرْمِيَّات *c. idm.* atma mərmilər

I رَنَّ (a/i) رَنِين , رَنٌّ 1) səslənmək, cingildəmək; cingildətmək (*məs., əldə metal pulları*), gurultu salmaq; البرميل الفارغ يرنّ *məsəl.* boş çəllək guruldar; 2) əks-səda vermək
- رَنٌّ cingilti, şaqqıltı, taqqıltı
- رَنَّانٌ 1. cingiltili, gur; təmtəraqlı; gurultulu (*nitq*); 2. kontralto
- رَنَّة [1] *c.* ـات – cingilti; əks-səda; inilti
- رَنَّة [2] *c.* ـات – maral
- رَنِين 1) səslənmə, cingilti; inilti; 2) gurultu; 3) əks-səda; rezonans
- رَنِينِيٌّ rezonans -i/-ı
- مُرِنٌّ səsli, cingiltili

[redacted]

(رنق) II رَنَّقَ 1) gözünü dikmək, diqqətlə baxmaq; النظر إليه ~ kiməsə diqqətlə nəzər salmaq; بالمكان ~ yerində qalmaq; *məcaz.* göz qabağından çəkilməmək; 2) süzmək, uçmaq (*quş*); 3) bulandırmaq (*məs., suyu*); 4) pozmaq (*sakitliyi*); IV أَرْنَقَ bulandırmaq (*məs., suyu*)

- رَنْقٌ , رَنَقٌ bulanıq

رَنْكٌ *c.* رُنُوكٌ gerb

رَنْكَةٌ *c.* رَنْكَاتٌ siyənək

I رَنَمَ (ə) رَنِيمٌ mahnı oxumaq, tərənnüm etmək; II رَنَّمَ cəh-cəh vurmaq, zəngulə vurmaq; V تَرَنَّمَ mahnı oxumaq, tərənnüm etmək (*nəyi* بـ)

- تَرْنِيمَةٌ *c.* تَرْنِيمَاتٌ , تَرَانِيمُ mahnı; himn; تَرَانِيمُ *c.* dini nəğmələr

I (رنو) رَنَا (u) رُنُوٌّ diqqətlə baxmaq (*kimə*); nəzər salmaq (*kimə* إلى); II رَنَّى 1) şənləndirmək, ürəyini açmaq; 2) mahnı oxumaq

I رَهِبَ (ə) رَهْبٌ qorxmaq, dəhşətə gəlmək; II رَهَّبَ qorxutmaq, dəhşətə gətirmək; IV أَرْهَبَ qorxutmaq, terrorizə etmək; V تَرَهَّبَ 1) hədələmək, təhdid etmək, qorxutmaq; 2) rahibliyi qəbul etmək; VI تَرَاهَبَ bir-birindən qorxmaq

- إِرْهَابٌ 1) qorxutma; 2) *həmç.* قوة الـ~ terror; الـ~ الابيض ağ terror; الـ~ الاسود qəddar (*qanlı*) terror

- إِرْهَابِيٌّ 1. terror -i/-ı; الاجراءات الـ~ـة terror tədbirləri; 2. terrorçu

- تَرَهُّبٌ 1) qorxutma; 2) rahibliyi qəbul etmə, rahiblik; عيشة الـ~ rahib həyatı; حديث الـ~ rahibliyə hazırlanan adam

- تَرْهِيبٌ qorxutma

- رَاهِبٌ *c.* رُهْبَانٌ rahib; إبرة الـ~ *bot.* ətirşah

- رَاهِبَةٌ *c.* ـَاتٌ – rahibə

- رَهَابَةٌ , رُهَابَةٌ *c.* رُهَابٌ *anat.* döş sümüyünün alt hissəsi

- رَهْبَةٌ qorxu, dəhşət; رَهْبَةً او رَغْبَةً qorxudan və ya könüllü olaraq; istər-istəməz

- رُهْبَى , رَهْبَى qorxu, hürkü, vahimə

- رَهَبُوتٌ qorxu, vahimə, dəhşət

- رَهِيبٌ qorxulu, qorxunc, dəhşətli; ايفان الـ~ *tar.* İvan Qroznı

(رهبن) تَرَهْبَنَ rahib olmaq

- رَهْبَانِيٌّ rahib -i/-ı; rahiblik -i/-ı

- رَهْبَانِيَّةٌ rahiblik

- رَهْبَنَةٌ 1) rahibliyi qəbul etmə; 2) rahiblik

(رهج) IV أَرْهَجَ 1) toz qaldırmaq; 2) təfriqə, nifaq, hərc-mərclik salmaq (*kimin arasında* بين)

- رَهَجٌ , رَهْجٌ 1) toz (*havada*); 2) topa-topa buludlar; 3) təfriqə, nifaq, hərc-mərclik

(رهش) VIII إِرْتَهَشَ *bayt.* topuq vurmaq, ayağını yaralamaq (*at haqqında*)

- رَاهِشٌ , رَاهِشَةٌ *c.* رَوَاهِشُ qan damarı, şah damar (*əlin nəbzin yoxlanıldığı yerində*)

I رَهَصَ (ə) رَهْصٌ təməlini, özülünü, binövrəsini qoymaq; IV أَرْهَصَ 1) əsasını, təməlini qoymaq; 2) əsaslandırmaq; 3) hazırlamaq, kömək etmək; 4) qabaqcadan bildirmək, qabaqcadan göstərmək (*nəyi* بـ)

- إِرْهَاصٌ 1) əsas, təməl; 2) müqəddəm şərt; 3) *c.* ـَاتٌ - qabaqcadan bildirən əlamət, nişanə

- إِرْهَاصَاتٌ *c.* təmayül, qabiliyyətin ilkin əlamətləri

- رَاهِصَةٌ *c.* رَوَاهِصُ *geol.* süxur; brekçiya (*mineral maddələrlə bir-birinə yapışmış qırıntılardan ibarət süxur*); بركانية ~ aqlomerat

- رَهْصٌ divarın dibi, altı

I رَهَطَ (ə) رَهْطٌ acgözlüklə yemək, basıb yemək, təpişdirmək

- رَهْطٌ¹, رَهَطٌ *c.* أَرْهَاطٌ 1) bir neçə (*ona qədər*); 2) kütlə; grup; 3) qohum-əqrəba



- رَهْطٌ² *c.* رِهَاطٌ bel sarğısı

I (رهف) رَهُفَ (ə) رَهَفٌ itiləmək; رَهُفَ (u) رَهَافَةٌ 1) iti, kəsici olmaq; 2) olmaq; 3) kəskin, gərgin olmaq; IV أَرْهَفَ 1) itiləmək; 2) kəskinləşdirmək, gərginləşdirmək; diqqətlə etmək (*qulaq asmaq, baxmaq*); اذنيه ~ qulaqlarını şəkləmək, diqqətlə qulaq asmaq; V تَرَهَّفَ nərmə-nazik olmaq; zərif, incə olmaq

- رَهَافَةٌ 1) itilik; 2) kəskinlik, gərginlik; الحس ~ iti hissiyyat

- رَهِيفٌ 1) iti; 2) incə; zərif; 3) boy-buxunlu, qədd-qamətli

- مُرْهَفٌ 1) kəskin, gərgin; iti; 2) incə, həssas; الحس الـ~ iti hissiyyat; hiss itiliyi

I رَهِقَ (ə) رَهَقٌ 1) ədalətsizlik etmək, sıxışdırmaq, zülm etmək; 2) haxlamaq, yaxalamaq; III رَاهَقَ yetkinlik yaşına çatmaq, böyümək, yaşa dolmaq; IV أَرْهَقَ zəhmət vermək, əziyyət vermək, yormaq; sıxışdırmaq, zülm etmək; الاعصاب ~ əsəblərinə təsir göstərmək; الذاكرة ~ yaddaşına güc vermək

- إِرْهَاقٌ zülm etmə, sıxışdırma; əziyyət vermə, zəhmət vermə, yorma

- رَهَقَانٌ *tib.* ankilostoma, Misir qanazlığı

- مُرَاهِقٌ gənc, cavan oğlan

- مُرَاهِقَةٌ *c.* ـَاتٌ - gənc, cavan qız

- مُرَاهَقَةٌ yetkinlik, həddi-büluğa çatma, yaşa dolma

- مُرْهِقٌ yorucu; əziyyətli, zəhmətli; əzici

I رَهِلَ (ə) رَهَلٌ süst, taqətsiz, şişkin olmaq; V تَرَهَّلَ 1) süstləşmək; taqətdən düşmək; şişkinləşmək; 2) boş, bürüşük, solğun olmaq; sallanmaq

- تَرَهُّلٌ 1) süstlük, taqətsizlik; الروحي الـ~ mənəvi düşkünlük; 2) bürüşüklük, solğunluq, şişkinlik

- رَهِلٌ süst, taqətsiz

- مُتَرَهِّلٌ bürüşük, zəif, solğun

رِهْمَةٌ *c.* رِهَمٌ , رِهَامٌ çiskin, çisək, narın yağış

- مَرْهَمٌ *c.* مَرَاهِمُ 1) mərhəm, sürtmə dərmanı, krem, kosmetik yağ; məlhəm; بنسلين ~ penisilin yağı; 2) balzam

I رَهَنَ (ə) رَهْنٌ , رُهُونٌ 1) sürəkli olmaq; uzun sürmək; 2) dayanmaq, düşmək, qalmaq (*harada* بـ); 3) girov qoymaq, girov vermək; III رَاهَنَ mərc qoşmaq, mərc gəlmək, mərcləşmək; على... ~ -a/-ə pul qoymaq, pul atmaq (*qumarda*); IV أَرْهَنَ girov qoymaq, girov vermək; VI تَرَاهَنَ bir-birilə mərcləşmək; VIII إِرْتَهَنَ 1) üzərinə öhdəlik götürmək; etməyə söz vermək (*nə* بـ); boynuna götürmək (*nəyi* بـ); 2) girov almaq, beh almaq; 3) girov qoymaq; 4) *məch.* girov olmaq; girov qoyulmaq; 5) asılı olmaq (*kimdən-nədən* بـ , على); X إِسْتَرْهَنَ girov tələb etmək

- رَاهِنٌ¹ girov qoyan

- رَاهِنٌ² 1) müasir; indiki; mövcud; الحالة الـ~ـة mövcud vəziyyət, status-kvo; في الظروف الـ~ـة indiki şəraitdə; 2) gerçək, real; 3) hazır, sabit, davamlı; 4) sarsılmaz, pozulmaz; tutarlı, mühüm; حقيقة ~ـة əsil həqiqət

- رِهَانٌ mərc qoşma; girov; كسب الـ~ mərci udmaq; ~ خيل cıdır atı; محل الـ~ cıdır meydanı; ~ هما كفرسي hər ikisi tamamilə eynidir, bərabərdir; ~ وقد كان وإياه كفرسي hər ikisi bərabər yarışırdı

- رَهْنٌ 1. asılı; 2. *c.* رُهُونٌ , رُهُونَاتٌ , رِهَانٌ girov

- رَهْنَ mövzuda (*nə*); ta...qədər; altında; ...-dan/-dən asılı olaraq; ...-dan/-dən bəri; بقاء الكتب ~ بما حوت من منفعة kitabların həyatı nə qədər faydalı olduqlarından asılıdır; لا تزال هذه المسائل ~ البحث bu məsələlər hələ də

tədqiqat mövzusudur; نضع انفسنا ~ اوامرك biz sənin sərəncamındayıq; إنّي ~ اشارتك mən sənin işarənə bəndəm; هو ~ التحقيق o, istintaqdadır; هم ~ الاعتقال onlar həbsdədirlər; وضع شيئا ~ ما يتطلبه bir şeyi nə tələb olunacağından asılı olaraq qoymaq

- رَهْنِيَّة *c.* ات - girov kağızı
- رَهِين 1. 1) girov qoyulmuş; 2) asılı; 2. girov qoyulmuş şey; قضى نصف عمره ~ اسوار السجن *məcaz.* o, ömrünün yarısını həbsdə keçirib; الرجل ~ اعماله *məsəl.* insan öz əməllərinin girovudur (*insan haqqında əməllərinə əsasən fikir yürüdürlər*)
- رَهِينَة *c.* رَهَائِن 1) mərc, girov qoyulmuş şey; 2) girov; رهائن الملاجئ sığınacaqlarda yaşayanlar; كانت ~ المطبخ onun yeri mətbəx idi, o, mətbəxdən çıxmaq bilmirdi.
- مُرَاهَنَة *c.* ات - mərc, girov, çəkişmə
- مُرْتَهِن girov alan
- مَرْهَن *c.* مَرَاهِن lombard
- مَرْهُون 1) girov qoyulmuş; 2) asılı (*nədən*), şərtləndirilən (*nə ilə*); bağlı (*nə ilə* بـ); حل الوقت الـ~ للاتفاق ittifaq bağlamaq üçün şərtləndirilmiş vaxt gəlib çatdı; الامور ~ـة باوقاتها hər şeyin öz vaxtı var

رَهْنَامَج gəmi jurnalı

I (رهو) رَهَا (u) رَهْو yorğa yerimək

- رَهْو[1] *c.* رِهَاء *zool.* durna
- رَهْو[2] sakit, dinc

- رَائِب çürümüş, turşumuş (*süd*)
- رَوْب çürümüş, turşumuş süd
- رُوب *c.* رُوبَات , أَرْوَاب paltar; əba; mantiya; المحاماة ~ vəkil mantiyası
- رَوْبَة qursaq mayası
- رُوبَة 1) qursaq mayası; 2) münbit torpaq sahəsi
- مُرَوَّب = رَائِب

رَوْبَصَة lunatizm (*yuxulu halda gəzməkdən ibarət xəstəlik*)

- مُتَرَوْبِص lunatik (*yuxuda durub gəzən adam*)

رُوبِل *c.* ات - rubl

رُوبُوط robot

رُوبِيز *geod.* reper, əlamət, nişan

رُوبِيَّة *c.* ات - rupiyə

رُوتِين köhnəpərəstlik; mühafizəkarlıq

- رُوتِينِيّ mühafizəkar -i/-ı; بصورة ~ـة mühafizəkarcasına

I (روث) رَاثَ (u) رَوْث peyin ifraz etmək (*heyvan*)

- رَوْث *c.* أَرْوَاث peyin

I (روج) رَاجَ (u) رَوَاج 1) yayılmaq; 2) tez satılmaq, çox işlənmək, rəvac tapmaq; ~ـت سوقه bazarı rəvac tapdı; 3) tədavüldə olmaq (*pul haqqında*); 4) qızğın olmaq (*bazar*); II رَوَّجَ 1) yaymaq; 2) satmaq; 3) tədavülə buraxmaq; 4) irəlilətmək, irəli aparmaq, inkişaf etdirmək; təbliğ etmək

- تَرْوِيج [illegible]



I (روح) رَاحَ (u) رَوَاح 1) getmək, yola düşmək; çıxıb getmək; 2) axşam qayıtmaq; غدى وراح səhər gedib axşam gəlmək; 3) başlamaq; nəyisə etməyə hazır olmaq; يكتب ~ yazmağa başlamaq; راح يموت *xalq dil.* o indicə öləcək; ضحيّة ~ nəyinsə qurbanı olmaq; II رَوَّحَ[1] 1) evə qayıtmaq; 2) dinclik vermək; yüngülləşdirmək; 3) sərinləşdirmək, havasını təmizləmək; بالمروحة ~ özünü yelpiklə yelləmək; وجهه بمنديل ~ üzünü yaylıqla yelləmək; عن ~ نفسه *yaxud* عن صدره ~ əylənmək; istirahət etmək; 4) havasını təmizləmək, havasını dəyişdirmək; II رَيَّحَ[2] 1) dinclik vermək, dincəlməyə imkan vermək; 2) çökmək (*məs., bina*); III رَاوَحَ 1) növbələmək, növbə ilə dəyişdirmək (*nəyi* بين); في مكانه ~ yerində saymaq; irəli getməmək; غادى و~ o baş – bu başa gedib gəlmək, dala-qabağa gedib gəlmək; 2) axşam getmək (*kiminsə yanına*); اغاديه و اراوحه səhər də, axşam da onun yanına gedirəm; IV[1] أَرَاحَ dinclik vermək, istirahət vermək; yüngüllük gətirmək; canını qurtarmaq (*nədən* عن , من); رأسه على... ~ başını ... üstünə qoymaq, başını ... söykəmək; نفسه ~ dincəlmək (*kimdən* من); لم يرح احدا ولم يسترح o heç kəsi dincəlməyə qoymur, özü də dincəlmirdi; IV[2] أَرْوَحَ pis iy vermək; V تَرَوَّحَ 1) iylənmək, qoxulanmaq; 2) yellənmək; بالمروحة ~ yelpiklə yellənmək; VI تَرَاوَحَ [illegible]

etmək (*kimə* الى , *nəyi* في), bel bağlamaq (*kimə* الى *nədə* في); *hərb.* إسترح! azad!; X[2] إِسْتَرْوَحَ 1) iy, qoxu hiss etmək; iyindən bilmək; 2) hava almaq, nəfəs almaq

- إِرْتِيَاح razılıq, məmnunluq; sevinc; عدم الـ~ narazılıq, razı olmama; təqdir etməmə; ادخل الـ~ الى قلوب الناس insanlara arxayınlıq bəxş etmək, ürəkləri sevindirmək
- أَرْيَحِيّ səxavətli, comərd
- أَرْيَحِيَّة səxavət, comərdlik
- إِسْتِرَاحَة *c.* ات - 1) istirahət; 2) dinclik; rahatlıq; 3) fasilə (*iclaslar arasında*); 4) səfərdə olanlar üçün düşəcək yer, mehmanxana
- تَرْوِيح havanı dəyişdirmə, havanı təmizləmə; النفس ~ dincəlmə, gəzişmə, nəfəsini dərmə
- تَرْوِيحَة *c.* تَرَاوِيح 1) rahatlanma; 2) *həmç.* صلاة التراويح əlavə namazlar, təravih namazı (*ramazan günlərində*)
- تَرْيِيح çökmə, oturma (*məs., binanın*)
- رَائِح 1) çıxıb gedən; keçib gedən, yoldan ötən; 2) gələcək; كل ~ وغاد hər yoldan ötən; qarşıya çıxan ilk adam; من اليوم و~ـا bundan belə, bundan sonra, bu gündən etibarən
- رَايِح 1) gedən; 2) *dialektdə gələcək zamanı bildirmək üçün işlədilən və gələcək zaman ədatına çevrilmiş* حـ *və ya* ـحـ *sözü*; انا ~ آكل *yaxud* انا حاكل mən yeyəcəyəm
- رَائِحَة *c.* رَوَائِح raihə, yaxşı qoxu, iy, ətir;

bax: سَبَب ; دار الـ~ istirahət evi; وفّر سُبُل الـ~ istirahət üçün zəruri olan hər şeyi təmin etmək; 2) rahatlıq; اليد ~ ovuc, ovucun içi; القدم ~ ayağın altı; الحلقوم ~ rahətülhülqum; بيت الـ~ ayaqyolu; الرى بالـ~ əllə suvarma

- رَوَاح 1) getmə, yola düşmə; axşam yola düşmə, axşam qayıtma; 2) axşam, axşam vaxtı; 3) rahatlıq, sakitlik

- رُوح q. nadir hal. k. c. أرْوَاح 1) ruh; الـ~ العامّة ümumi əhval-ruhiyyə; العصر ~ əsrin, zamanın ruhu; الـ~ المعنويّ əhval-ruhiyyə; الـ~ الانتقام ~ intiqam ruhu, revanşizm; الـ~ والمادّة ruh və materiya; سادت المؤتمر ~ التعاون konfransda əməkdaşlıq ruhu hökm sürürdü; القُدُس ~ Ruhulqüds, Müqəddəs Ruh - din. a) İsa; b) baş mələk Cəbrail; həmç. الـ~ الامين Ruhuləmin - baş mələk Cəbrail; 2) can; خفيف الـ~ şən, xoşxasiyyət; طويل الـ~ dözümlü, səbirli; سلّم الـ~ لخالقه o öldü, ruhunu Xaliqinə təslim etdi; 3) ruh, kabus; شرّير ~ şər ruh; به ~ شرّير o, cinlidir; استحضار (مخاطبة) الارواح spiritizm; 4) həyat; خسارة في الارواح canlı qüvvə itkiləri; insan qurbanları; قتل ~ـه o özünü öldürdü; 5) spirt, araq, cövhər, essensiya; 6) məğz, mahiyyət; الافيون ~ tiryək arağı; ابن ~ـه öz gücünə irəliləyən, özünə yol açan; بندقيّة بـ~ـين qoşalülə tüfəng; فرد بسبعة ارواح yeddigülləli tapanca; عمل بـ~ـين iki nəfərin yerinə işləmək

- رَوْح [1] 1) rahatlıq, dinclik; 2) sevinc

- رَوْح [2] lütf

- رُوحَانِيّ 1. ruhani, lətif mənzərəli, ruhu oxşayan; 2. ruhani şəxs, din xadimi

- رُوحَانِيَّة ruhanilik, mənəvi tərəf; ruh yüksəkliyi

- رَوْحَة c. ات - axşam qayıtma; رافقه في غدواتهم وروحاتهم kimisə hər yerdə müşayiət etmək

- رُوحِيّ 1) ruhi, mənəvi; سلطة ~ـة mənəvi hakimiyyət; 2) spirtli; مشروبات ~ـة spirtli içkilər

- رُوحِيَّة 1) ruhanilik, ruhaniyyət, mənəvi tərəf; 2) əhval-ruhiyyə; 3) spiritizm; fəls. spiritualizm

- رَيَّاح c. ات - əsas kanal, suvarma magistralı

- رِيح q. c. رِيَاح 1) külək, yel; المراكب التى فوق الـ~ يجب ان تخلى الطريق التى تحت الـ~ küləkdöyən tərəfdən gələn gəmilər külək tutmayan tərəfdən gələn gəmilərə yol verməlidirlər; دوّارة الـ~ yelqovan; طاحون الـ~ yel dəyirmanı; ذهب على متن الـ~ o, təyyarə ilə uçub; ابو رياح a) yelqovan; b) uyuq; 2) iy, qoxu; 3) qüdrət, qüvvət; ذهبت ~ الدولة dövlət əvvəlki qüdrətini itirdi; 4) bağırsaq qazı, qarından çıxan yel; اخرج ~ـا yel buraxmaq

- رَيِّح küləkli (hava)

- رَيْحَان topl. c. رَيَاحِين bot. 1) ətirli bitki; 2) reyhan; شاميّ ~ mərsin; قلم الـ~ yaxud القلم الـ~ـيّ reyhani (xətt)

- رِيحَة iy, qoxu

- مَرَاح 1) axşamlar gedilən yer (məs., kino, qonaqlıq və s., müq et: مَغْدًى); 2) axşam vaxtı, axşam

- مُرَاح c. مُرُح tövlə; pəyə; الغنم ~ mal-qara ağılı

- مُرْتَاح razı; xoşhal, şad, məmnun; البال ~ arxayın; الضمير ~ təmiz vicdanla, alnıaçıq

- مِرْوَاح c. مَرَاوِيح yelpik, milçəkqovan

- مِرْوَحَة c. مَرَاوِح 1) yelpik; الخيش ~ asılı milçəkqovan; 2) havadəyişən; كهربائيّة ~ elektrik havadəyişəni; 3) propeller, pər; gəmi pəri

- مِرْيَاح yel əmələ gətirən

- مُرِيح 1) rahat; 2) köplü (qarın), yel əmələ gətirən

- مَرُوح cinli, dəli



- مُسْتَرَاح c. ات – ayaqyolu

- مُسْتَرِيح 1) dincələn, istirahət edən; 2) həmç. البال ~ sakit, arxayın

I (رود) رَادَ (u) رِيَاد 1) öyrənmək, tədqiq etmək; 2) axtarmaq; 3) var-gəl etmək, o baş-bu başa gedib gəlmək; III رَاوَدَ 1) israrla xahiş etmək; 2) tovlamaq, yoldan çıxarmaq; عن نفسها ~ qadını yoldan çıxarmaq; 3) çulğamaq, bürümək, əhatə etmək; ان افكارًا مبهمة تراوده onu mübhəm fikirlər bürüyür; الشعور بالندم ~ه onu ... görə peşmançılıq hissi bürüdü; على ... IV أرَادَ 1) istəmək, arzulamaq; ام لم يرد ~ istər-istəməz; به خيرا ~ kiməsə xeyir arzulamaq; 2) nəzərdə tutmaq; 3) təhrik etmək (kimi nəyə على); VIII إرْتَادَ 1) araşdırmaq, öyrənmək; kəşfiyyat aparmaq; 2) axtarmaq; 3) gəlmək; 4) gəlib getmək, baş çəkmək; X إسْتَرَادَ nail olmağa, əldə etməyə çalışmaq, axtarmaq

- إرَادَة 1) niyyət; istək, həvəs, meyil; iradə; الطيّبة ~ الـ xoş məram; حسب الـ~ öz istəyi ilə, istəyə görə; تغلب على ... بقوّة ~ لا تنثنى sarsılmaz iradə qüvvəsi sayəsində ... -a/-ə qalib gəlmək; 2) dekret, fərman; ملكيّة ~ kral fərmanı

- إرَادِيّ 1) iradi, könüllü; 2) azad, sərbəst; لا ~ yaxud غير ~ qeyri-iradi, qeyri-ixtiyari, özündən asılı olmayaraq

- إرْتِيَاد 1) araşdırma, öyrənmə; kəşfiyyat aparma; hərb. kəşfiyyat; 2) axtarış; 3) gəlib getmə, baş çəkmə; المخازن ~ mağazaları gəzmə; المحيط ~ okeanda üzmə

- رُوَيْدَة c. رُوَيْدَات kiçik mahnı

- رَائِد c. رُوَّاد 1) tədqiqatçı; pioner; bir işə ilk başlayan, bir işin təşəbbüsçüsü; سبّاق ~ ilk tədqiq edən, (nəyisə); الفضاء ~ kosmonavt; 2) axtaran, arayan, axtarıcı; kəşfiyyatçı; 3) gəlib-gedən (harasa); 4) rəhbər; yolgöstərən, bələdçi; 5) rəhbər ideya; 6) hərb. mayor, minbaşı; قوّة ~ة rəhbər, aparıcı qüvvə

- رَوْد [1] yüngül, sakit (məs., külək)

- رَوْد [2] 1) öyrənmə, tədqiq etmə; 2) axtarma, araşdırma

- رُوَيْد yavaşlıq, astalıq; على الـ~! yavaş!, tələsmə!

- رُوَيْدًا sakit, yavaş, yavaşca

- رِيَادَة 1) öyrənmə, tədqiq etmə; gəzmə (tədqiq etmək məqsədilə); 2) axtarma, araşdırma; روح الـ~ axtarış ruhu, araşdırıcılıq ruhu

- مَرَاد məkan, sahə, meydan

- مُرَاد murad, arzu, istək, dilək, kam

- مُرْتَاد 1. tədqiq edən, araşdıran, öyrənən; 2. 1) gəlib gedən; 2) gəliş-gediş yeri

- مِرْوَد c. مَرَاوِد , مَرَاوِيد 1) qələm (gözə çəkmək üçün); 2) sancaq; 3) ox, mil, qol; محوريّ ~ mehvər birləşməsi

- مُرِيد 1) ardıcıl, şagird; 2) aspirant; 3) mürid, sufi şeyxinin şagirdi (sufiliyin birinci pilləsi)

I (روز) رَازَ (u) رَوْز nəyinsə çəkisini yoxlamaq, çəkisini gözəyarı müəyyən etmək, çəkmək; II رَوَّزَ = I

- رَائِز memar

- رَاز c. رَازَة daşyonanların başçısı, ustabaşı; bənna

- رِيَازَة 1) daşdüzmə üsulu; 2) tikintiyə rəhbərlik

رُوزْنَامَجَة c. ات - təqvim

رُوزْنَامَة c. ات - təqvim

(روس) II رَوَّسَ ruslaşdırmaq

- رُوَيْسَة bax: رأس

- رُوس topl. ruslar

- رُوسِيّ rus; الـ~ـة rus dili

رُوسْتُو qızartma, qovurma

2) rumın; ~ اللّغة a) latın dili; b) rumın dili; 2. 1) romalı; 2) rumın

- رُومِيّ 1. Bizans -i/-ı; yunan; ~ ديك loş, hind xoruzu; ~ دجاج hind toyuğu; 2. bizanslı, yunan

- مَرَام c. ات - məram, istək

رُومَاتِزْم revmatizm

- رُومَاتِزْمِيّ revmatik

رُومَانْسِيّ romantik

- رُومَانْسِيَّة : ~ الـ romantizm

رُومَانْطِيقِيّ romantik

رُومَانْطِيقِيَّة : ~ الـ romantizm

رُومِس c. رَوَامِس sal

رُونْ vilayət, nahiyə; məkan; ərazi

رَاوَنْد = رَوَنْد

رَوْنَق rövnəq, parıltı, gözəllik

رُونِيُو : آلة الـ ~ surətçıxaran (*çoxaldıcı*) cihaz

I (روى) رَوَى (i) رِوَايَة 1) rəvayət etmək, xəbər vermək; ötürmək (*kiminsə dediklərinə istinadən* عن); 2) su vermək, suvarmaq, içirtmək (*nə* بـ); رَوِيَ (a) رَيّ , رِيّ 1) su içmək; suvarılmaq; 2) yanğısını söndürmək; II رَوَّى 1) su vermək, su içirtmək; 2) su ilə təmin etmək, suvarmaq, su çıxartmaq; IV أَرْوَى suvarmaq, su tökmək, su vermək; V تَرَوَّى 1) su içmək; suvarılmaq; 2) fikirləşmək, düşünmək; VIII اِرْتَوَى 1) su içmək, suyu canına çəkmək; suvarılmaq; 2) yanğısını söndürmək, susuzluğunu yatırmaq

- إِرْوَاء suvarma; ~ بالراحة əllə suvarma

- إِرْوَائِيّ suvarma -i/-ı

- تَرَوٍّ 1) fikirləşmə, düşünmə; 2) ağıl, kamal, tədbirlilik

- تَرْوِيَة su ilə təmin etmə, su vermə; يوم الـ ~ tərviyə günü (*zülhiccə ayının 8-ci günü, Mina vadisinə yola düşməzdən qabaq zəvvarlara su paylanması günü*)

- رَاوٍ c. رُوَاة q. رَاوِيَة c. رَاوِيَات ravi; hədis, şeir ötürücüsü

- رَاوِيَة c. رَوَايَا 1) raviyə; 2) hədis, şeir ötürücüsü; الماء ~ su, su qabı

- رَآيَة bax: رأى

- رَوَاء şirin su

- رُوَاء gözəl görkəm; forma gözəlliyi

- رِوَائِيّ 1. hekayə -i/-ı; ~ طريقة hekayə üsulu 2. 1) romançı; 2) dramaturq

- رِوَايَة c. ات - 1) hekayə, povest; roman; əfsanə; ~ بوليسيّة detektiv roman; ~ خياليّة (قصصيّة) roman; 2) pyes; ~ تمثيليّة غنائيّة opera; ~ هزليّة غنائيّة operetta; ~ مضحكة *yaxud* ~ هزليّة komediya, məzhəkə; ~ مسرحيّة tamaşa, pyes; ~ محزنة faciə; drama; ~ سينمائيّة kinofilm; ~ ناطقة səsli film; 3) rəvayət, xəbər

- رَوِيّ 1. 1) bol, dolu; 2) susuzluğu yatıran (*su haqqında*); 2. *poez.* hecanın samit səsi

- رَوِيَّة 1) fikir, düşüncə; nəzər, rəy; 2) anlaq, dərrakə, qanacaq; ~ في *yaxud* ~ عن şüurlu şəkildə, düşünərək, düşünülərək; ~ عن غير düşünmədən

- رَيّ suvarma, irriqasiya; الريّ بالراحة bax: رَاحَة ; الريّ بالآلات mexanizmlərlə suvarma; ري الحياض hövzə suvarması

- رِيّ 1) susuzluğu yatırma; 2) = رَيّ

- رَيَّا ətir, rayihə

- رِيَاء bax: رأى

- رَيَّان q. رَيَّا c. رِوَاء 1) yaxşı suvarılmış; içirdilmiş, doldurulmuş; 2) şirəli, sulu

- رَيَّة c. رَيَّات bir dəfə suvarma, suvarılma; ~ الزراعة səpindən sonra suvarma; ~ الحماية qurumaqda olan torpağın suvarılması (*səpindən 20-25 gün sonra*)

- رِئَة = رِيَة bax: رأى

- مَرْوًى c. مَرَاوٍ suvarma kanalı, arx



- مُرْوِيّ 1. 1) suvarılan; ~ اراض suvarılan torpaqlar; ~ اراض بعليّة təbii suvarma ilə suvarılan torpaqlar; 2) şifahi; şifahi yolla ötürülən; 2. c. مَرْوِيَّات rəvayətlər, ötürülən hekayətlər, xəbərlər

I (ريب) رَابَ (i) رَيْب , رِيبَة 1) şübhə, inamsızlıq doğurmaq; 2) pərt etmək; IV أَرَابَ = I; V تَرَيَّبَ şübhə etmək (*nəyə* بـ , في); VIII اِرْتَابَ 1) şübhə etmək (*nəyə* في); inanmamaq, şübhə ilə yanaşmaq (*nəyə*), şübhələnmək (*nədən* في); 2) pərt olmaq; X اِسْتَرَابَ şübhə etmək (*nəyə* بـ)

- اِرْتِيَاب 1) şübhə; inamsızlıq, etibarsızlıq; şübhələnmə, 2) pərtlik

- اِرْتِيَابِيّ skeptik

- اِرْتِيَابِيَّة skeptisizm

- رَيْب şübhə; inamsızlıq, etibarsızlıq; ~ بلا şübhəsiz; ~ لا فيه şübhəsiz; ~ لا في ان... şübhə yoxdur ki...; مسلك الـ ~ والشك skeptisizm; ~ اثار kimdəsə şübhə doğurmaq; ~ الزمان (المنون) baxtın dönüklüyü

- رِيبَة = رَيْبَة

- رِيبَة c. رِيَب şübhə; şübhələnmə, ehtiyatlanma

- مُرْتَاب 1. şübhələnən; 2. skeptik

- مُرِيب 1. şübhə doğuran; 2. 1) şübhəli; 2) etibar doğurmayan

رِيبُورْتَاج c. ات – reportaj

رَيْت *xalq dil.* = لَيْت ; يا ~! kaş ki…

(ريث) رَاثَ (i) رَيْث ləngitmək, yavaş hərəkət etmək; V تَرَيَّثَ ləng tərpənmək, gözləmək

- رَيْثَمَا nə qədər ki, nə qədər ki… -ma/-mə

رِيجِي monopoliya

ريح bax: روح

رَيْد c. رُيُود kəllə, təpə, baş (*dağın*); üst, üst tərəf (*damın*) .

رَيِّس c. رُؤَسَاء 1) rəis, başçı; 2) kapitan (*gəmidə*)

I (ريش) رَاشَ (i) رَيْش 1) tüklənmək, lələklənmək; 2) lələk vurmaq (*oxa*), lələklə bəzəmək; 3) varlanmaq; هو لا يريش ولا يبرى *məsəl.* nə qapıda hürəndir, nə qoyun güdən (*hərf.* filankəsdən nə zərər görərəsən, nə də bir fayda); II رَيَّشَ tüklənmək, lələklənmək; lələk vurmaq (oxa); IV أَرَاشَ lələk vurmaq; V تَرَيَّشَ varlanmaq; zinət içində yaşamaq

- رِيَاش c. qiymətli avadanlıq, mebel

- رِيش *topl.* tük, lələk; النعام ~ dəvəquşu lələyi

- رِيشَة c. ات - 1) lələk (*yazmaq üçün*), qələmucu; 2) firça (*rəssamın*); المحراك ~ kotanın qolları; 3) *mus.* mizrab; 4) ~ فصادة lanset, cərrah bıçağı; 5) qanad, pər (*turbinin və s.*)

- رِيشِيّ 1) tüklü, lələkli, qanadlı; 2) lələyə oxşar, lələkvari

- رَيُّوش *bot.* agot, ceyranotu

ريض bax: روض

I (ريع) رَاعَ (i) رَيْع , رُيُوع , رِيَاع artmaq, böyümək, güclənmək, qüvvətlənmək; II رَيَّعَ sələmlə, faizlə, müamiləyə (*pul*) vermək

- تَارِيع bax: *əlifba sırası ilə*

- رَيْع 1) ən yaxşı dövr, çiçəklənmə; 2) böyümə, yüksəlmə; 3) artım, gəlir; renta; ~ الـ المطلق mütləq renta

- رَيْعَان , رِيعَان 1) sağlam doluluq (*bədənin*); 2) çiçəklənmə dövrü; ~ في الشباب gəncliyin ən gözəl çağında

- مُرِيع 1) məhsullu; 2) gəlirli, qazanclı, rentabelli

رِيف c. أَرْيَاف 1) sahil; münbit sahilboyu ərazi; 2) kənd, əyalət

- رِيفِيّ 1. kənd -i/-ı; əyalət -i/-ı; ~ بيت kənd evi, bağ evi; 2. kənd əhli, əyalət əhli

(ريق) I رَاقَ (i) رَيْق 1) axmaq, tökülmək; 2) parıldamaq, işıq saçmaq; IV أَرَاقَ axıtmaq, tökmək

- إِرَاقَةٌ axıtma, tökmə; ادّى الى ~ الدماء qan tökülməsinə gətirib çıxarmaq

- رَائِقٌ bax: روق

- رَيْقٌ , رَيِّقٌ 1) çiçəklənmə; في ~ العمر ömrün çiçəklənən dövrü; 2) parıltı; 3) gözəllik

- رِيقٌ ağız suyu; ~ على الـ ac qarına; اجرى الـ~ ağzının suyunu axıtmaq, iştah doğurmaq, iştaha gətirmək; ازدرد ~ــه فَرَقًا məcaz. bərk qorxmaq; بلع ~ــه bax: بلع ; جرى ~ــه عليه bunu görəndə ağzının suyu töküldü; جف له ~ــه dili-dodağı qupquru qurudu; غيّر ~ــه على... qəlyanaltı eləmək (nə ilə); كسر الـ~ azacıq yemək, ağzına bir şey atmaq; gözünün qurdunu öldürmək

- رِيقَةٌ ağız suyu, tüpürcək

I (ريل) رَالَ (i) رَيْلٌ ağzının suyunu axıtmaq;

II رَيَّلَ = I

- رِيَالٌ ¹, رِيَالَةٌ ağız suyu, tüpürcək

- رِيَالٌ ² c. ات real (Misirdə 20 qirşə bərabərdir); ماريا تريزا ~ Mariya Tereza taleri

- مَرْيَلٌ , مَرْيَلَةٌ c. مَرَايِلُ önlük, döşlük

I (ريم) رَامَ (i) رَيْمٌ qoymaq, tərk etmək, atıb getmək (nəyi-tas. h. və ya من); ما ~ فراشه yataqdan qalxmamaq (xəstə haqqında); ما ~ من مكانه yerindən tərpənməmək; II رَيَّمَ 1) qalmaq (harada بـ); 2) başını tovlamaq (kimin على); aldatmaq, oynatmaq (kimi على)

- رَيْمٌ 1) qəbir; 2) təpəcik

- رِيمٌ ¹ ağ antilop, qəzal

- رِيمٌ ², رِيمَةٌ 1) köpük, kəf, ərp; 2) yanıq dəmir, şlak, pasa

- رِيمَةٌ xüs. ad Rima; رجعت (عادت) الى ~ عادتها القديمة məsəl. Rima yenə də öz köhnə adətinə qayıdıb

I (رين) رَانَ (i) رَيْنٌ 1) örtmək, üstünə salmaq (nə tas. h. yaxud على və ya بـ); 2) əhatə etmək, bürümək (nə ilə على); الصمت ~ sükut çökdü; ~ على جفنه الكرى فنام mürgü onun kipriklərini qapadı və o yuxuladı

(ربى) IV أَرْبَى sancmaq, dikəltmək

- رَايَةٌ c. ات - bayraq; həmç. müq. et: رَأْيَةٌ



# ز

ز (زَاءٌ və ya زَايٌ) zeyn (ərəb əlifbasının on birinci hərfi, rəqəm mənası 7)

زَاجٌ kuporos; ابيض ~ sink kuporosu, ağ kuporos; ازرق ~ mis kuporosu, göy kuporos; اخضر ~ dəmir kuporosu, yaşıl kuporos; زيت الـ~ kükürd turşusu, kuporos yağı

زَاجُورَةٌ zacura (pambıq sortu)

زَارٌ 1) şər qüvvə; 2) qadın ovsunçuların şər qüvvələri ovsunlama ayini (Misirdə)

زَاقُولٌ c. زَوَاقِيلُ oğru

زَانٌ fıstıq, fıstıq ağacı; اخشاب الـ~ fıstıq ağacından meşə materialı; ثمر الـ~ fıstıq qozası; القفز العالى بعصا الـ~ idm. tirlə tullanma

- زَانَةٌ c. ات - fıstıq tir, şüvül; القفز (الوثب) بالـ~ idm. tirlə tullanma

زَاوُوقٌ , زَاوُقٌ civə

زَايِرْجَةٌ , زَايِرْجَا fal taxtası (yüz daması olur, hər damada bir hərf göstərilir)

زَأْبَرَ daramaq, darayıb təmizləmək, xovlu etmək (parçanı)

- زِئْبِرٌ xov, zərif tük

- زَأْبَرَةٌ darama

زَأْبَقَ civə çəkmək, civələmək

- زِئْبَقٌ civə

- زِئْبَقِيٌّ 1) civə -i/-ı; ترمومتر ~ civə termometri; 2) civəyəbənzər

I زَأَرَ (ə) زَئِيرٌ bağırmaq; nərildəmək, böyürmək, anqırmaq

- زَئِيرٌ bağırtı, nərilti, böyürtü, anqırtı; المدافع ~ məcaz. topların gurultusu

I زَأَطَ (ə) زِئَاطٌ səs salmaq, qışqırmaq

زُؤَامٌ : موت ~ qəfil, gözlənilməz ölüm; qətl, öldürmə

زُؤَانٌ topl. alaq otları, dəlicə buğda; vələmir

(زبّ) II زَبَّبَ üzümü qurutmaq, kişmiş eləmək; V تَزَبَّبَ qurumaq, kişmişə dönmək (üzüm)

- أَزَبُّ q. زَبَّاءُ c. زُبٌّ tüklü, qıllı, pırtlaşıq saçlı

- زُبٌّ c. أَزْبَابٌ anat. kişi cinsiyyət orqanı

- زَبِيبٌ topl. kişmiş; رومي ~ yunan kişmişi; عرقي ~ yerli araq

- زَبِيبَةٌ c. ات - üzüm giləsi, bir gilə kişmiş; عمل من الـ~ خمّارة milçəkdən fil düzəltmək (hərf. bir gilə üzümdən çaxır dükanı düzəltmək)

I زَبَدَ (u) زَبْدٌ çalmaq (yağ); II زَبَّدَ qaymaqla, köpüklə örtülmək (süd); IV أَزْبَدَ köpüklənmək, köpük buraxmaq, qaynamaq, coşmaq; ~ و ارغى qeyzlənmək, özündən çıxmaq; حقدا ~ acığından partlamaq, qəzəbindən zəncir çeynəmək

- زَبَادٌ müşk; قط الـ~ zool. çölpişiyi

- زَبَادِيٌّ həmç. لبن الـ~ qatıq

- زَبَدٌ c. أَزْبَادٌ 1) köpük; 2) dəmir yanığı, şlak, pasa; الجبال ~ aşınma məhsulları (dağ selləri ilə gətirilən); البحر ~ min. dəniz penkası; pemza, süngər daşı

- زُبْدٌ topl. yağ (kərə)

- زُبْدَةٌ yağ (kərə); طازه ~ təzə kərə yağı; مسيّحة ~ ərinmiş yağ; مملّحة ~ duzlu yağ; صناعيّة ~ marqarin; 2) qaymaq; 3) mahiyyət, cövhər; kvintessensiya

- زِبْدِيَّةٌ c. زَبَادِيُّ , ات - küpə, güvəc

- زُبَيْدَةٌ 1) bot. gülünbahar; 2) xüs. ad. Zübeydə

I زَبَرَ (u, i) زَبْرٌ 1) yazmaq, üzünü köçürmək; 2) söymək, danlamaq; üstünə qışqırıb qovlamaq (məs., dilənçini); II زَبَّرَ = I

- زَبْرٌ = زُبٌّ

- زُبْرَةٌ c. زُبَرٌ (həmç. الحديد ~) dəmir tir; ارادة من زبر الحديد dəmir iradə

- زَبُورٌ zəbur

